**Nağdəli Zamanov**

# HEYDƏR ƏLİYEV VƏ AZƏRBAYCAN NİTQ MƏDƏNİYYƏTİ

**"Elm və təhsil"**
**Bakı-2013**

Elmi redaktor: **Məsud Mahmudov**
*filologiya elmləri doktoru, professor*

Rəyçilər: **Nadir Məmmədli**
*filologiya elmləri doktoru, professor*

**İlham Tahirov**
*filologiya elmləri doktoru*

**Nağdəli Zamanov**
**Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti (I kitab).**
**Bakı, "Elm və təhsil", 2013, 480 səh.**

Monoqrafiyada Azərbaycan nitq mədəniyyətinin inkişafında, təşəkkül tapmasında Ulu Öndər Heydər Əliyevin nitq və çıxışları kompleks şəkildə araşdırılmışdır. Heydər Əliyev nitqində girişlər və sonluqlar, fəlsəfilik, səmimiyyət, qətiyyət, nikbinlik, poetizm, proqnozlar kimi elementlər, eləcə də onun fərdi üslubu dərindən araşdırılmışdır.

Monoqrafiya siyasət, dilçilik, diplomatiya, jurnalistika, ədəbiyyat və digər sahələrdə fəaliyyət göstərən və təhsil alanlar üçün dəyərli vəsaitdir.

**ISBN 978-9952-8176-8-3**

# I FƏSİL

## HEYDƏR ƏLİYEV AZƏRBAYCAN DİLİNİN MÜDAFİƏSİNDƏ

Ümummilli lider Heydər Əliyev ana dili məsələsinə çox böyük diqqətlə, soyuqanlılıqla, hissiyyata qapılmadan yanaşır və tövsiyə edir ki, dil məsələlərinə cılız yanaşmaq olmaz: "Təəssüf ki, son illərdə respublikamızda bəzi emosional, hissiyyata qapılan çıxışlar və sairə müvəqqəti olaraq müəyyən bir auditoriyanı ələ alıb, ona təsir göstərib. Bunlar hamısı müvəqqəti şeylərdir. Amma bizim mənəvi dəyərlərimiz daimi xarakter daşıyır, onlar bəşəridir. Ona görə də bu işlərə cılız yanaşmaq olmaz" [IVc.s.447].[1]

Heydər Əliyevin istər Sovet imperiyası, istərsə də müstəqillik dövründə Azərbaycan dili uğrunda apardığı mübarizəni, bu dilin müdafiəsinə yönələn mücadiləni dərk etmək üçün onun Azərbaycan Respublikasının Yeni Konstitusiya layihəsinin dövlət dili haqqında maddəsinin geniş müzakirəsində söylədiyi nitqinə diqqət yetirmək yerinə düşər. Hələ Sovetlər dövründə ulu öndərin Azərbaycan dövlət dilinin Azərbaycan dili olması uğrunda apardığı mübarizənin şahidi oluruq: "1977-78-ci illərdə biz yeni konstitusiyanı qəbul edərkən bu məsələ, şübhəsiz ki, əsas məsələlərdən biri idi. Biz yeni konstitusiyada Azərbaycanın dövlət dilinin Azərbaycan dili olması barədə maddə hazırladıq. Ancaq bu maddə Moskvada çox böyük etiraza səbəb oldu. Belə izah edirlər ki, başqa respublikalarda bu yoxdur, buna ehtiyac yoxdur. Mən indi sizin vaxtı-

---

[1] Bu və bundan sonrakı bu tip sitatların hamısı "Müstəqilliyimiz əbədidir" kitablarından götürülmüşdür.

nızı alıb bunların hamısını geniş danışmağa ehtiyac duymuram. Ancaq o vaxt mən Sovetlər İttifaqının rəhbərləri ilə, Kommunist Partiyasının rəhbərliyi ilə çox gərgin danışıqlar apardım. Sübut etməyə çalışdım ki, bizim dövlət dili Azərbaycan dili olduğunu öz konstitusiyamıza yazmalıyıq və yazacağıq" [IVc.s.427-428].

Dilimizi mənimsəməyi, öyrənməyi və sevməyi tövsiyə edən ulu öndər ağsaqqal ata obrazında çıxış edir, "bu dili bilməyə-bilməyə dünyadan çıxıb getməyi" rəva bilmir. "Axı" qüvvətləndirici, "məgər" sual ədatlarının vasitəsilə nitqin ekspressivliyini yüksəldərək dilin qorunması yolunda gözəl bir nitq ortaya qoyur: "Yenə də deyirəm, əgər keçmişdə bəziləri buna ehtiyac duymayıblarsa, amma indi bu ehtiyac var axı! Oturun, müəllim tutun, bu dili öyrənin. Axı nə qədər olar, məgər elə dünyadan bu dili bilməyə-bilməyə çıxıb gedəcəksiniz? Axı belə şey olmaz" [Vc.s.257]. Dili öyrənməyin çətinliklərini ulu öndər yaxşı başa düşür, ona görə də öncə ağsaqqal öyüdü verir, sonda isə sərt təpki ilə məmurlar ordusunu səfərbər edir, onları hərəkətə gətirir, öz məsuliyyətlərini dərk etməyə çağırır: "Ona görə də, mən indiyədək bunu deməmişəm, ancaq bu gün mütləq deməliyəm: dövlət dilini yaxşı bilməyən adamlar məşğul olsunlar, müəllim tutsunlar, kitab oxusunlar, başqa yollarla dövlət dilini öyrənsinlər. Mən demirəm bu gün, sabah, bir aya, iki aya, amma qısa bir müddətdə bizim hamımız bütün müzakirələri dövlət dilində aparmalıyıq" [Vc.s.258].

Heydər Əliyevin 2 fevral 1996-cı il tarixdə Müstəqil Azərbaycan Respublikası gənclərinin Respublika Sarayında keçirilən birinci forumundakı çıxışı ana dilini bilməməyin hansı fəsadlara, ağırlaşmalara, müsibətlərə, fəlakətlərə səbəb ola biləcəyini başa düşməyənlərə cavabdır: "Öz dilini bilməyən, öz dilini sevməyən adam öz tarixini yaxşı bilə bilməz.

Xatirimdədir, 70-ci illərdə mən bir neçə dəfə çox narahatçılıqla göstərişlər verdim ki, rus dilli məktəblərdə Azərbaycan ədəbiyyatına çox yer verilsin. Azərbaycan ədəbiyyatını, ana dilini bilməyən gənc Nizamini oxuya bilməz, Füzulini oxuya bilməz, Nəsimini oxuya bilməz, Vaqifi oxuya bilməz, Sabiri oxuya bilməz, Cəlil Məmmədquluzadəni oxuya bilməz və digərlərini oxuya bilməz. Əgər onları oxuya bilməsə, o, tariximizi bilməyəcək; onları oxuya bilməsə, bizim mədəniyyətimizi bilməyəcək, mədəni köklərimizi bilməyəcək, milli-mədəni ənənələrimizi bilməyəcək. Onları bilməsə, o, vətənpərvər olmayacaq, onda milli vətənpərvərlik duyğuları, hissiyyatı olmayacaqdır"[Vc.s.320].

Azərbaycan Respublikasının ilk konstitusiyasına uyğun olaraq icra və idarəetmə işlərinin təkmilləşdirilməsi ilə bağlı Respublika Nazirlər Kabinetinin 8 yanvar 1996-cı il tarixli ilk iclasında "ancaq xəbərdarlıq edirəm" qətiyyəti ilə Azərbaycan dilini öyrənməyin vaxtının çoxdan çatdığını göstərir. Keçmişinə görə insanları günahlandırmayan Heydər Əliyev dövlət dilinə münasibətdə güzəştin də bir həddi olduğunu vəzifəli şəxslərə çatdırır. Keçid dövrü, bu dövrün yaratdığı problemlər, keçid dövrünün özünəməxsusluğunun filosofcasına araşdırılması, bu dövrün çətinliklərinin təbii qəbul olunması məhz Heydər Əliyev dühasına xas olan xüsusiyyətdir: "Biz keçid dövründə yaşayırıq. Artıq dörd ildir ki, müstəqil dövlətik. Beşinci ildir ki, müstəqillik şəraitində yaşayırıq. Mən bunu dəfələrlə demişəm: biz danışanda, müzakirə aparanda şübhəsiz ki, Azərbaycan dilindən savayı rus dilindən də istifadə etmək olar. Ancaq bunun da bir müddəti olmalıdır. Ona görə də mən indi də və bundan sonra da etiraz etməyəcəyəm ki, bizim ana dilimizi bilməyən adamlar hələ ki, məruzələrini rus dilində etsinlər. Ancaq xəbərdarlıq edirəm, – artıq vaxt, illər keçir, di-

li öyrənmək lazımdır. İndi mən heç kimi günahlandırmıram. Keçmişdə ümumi işimiz belə olubdur ki, vəzifəli şəxslərin çoxu rus dilində təhsil alıb, işlərini rus dilində aparıblar. Mən bunların heç birisini günah hesab etmirəm. Keçid dövründə insanlar müəyyən qədər bu keçid prosesində yaşayırlar, bu da təbiidir, ancaq nə qədər, neçə il lazımdır ki, vəzifəli şəxslərimiz dövlət dilimizi öyrənsinlər və biz müzakirələri də bu dildə aparaq?" [Vc.s.257].

Dil problemlərini təfərrüatlarınadək bilən ulu öndər bu bilikləri ilə auditoriyaları təəccüb qarışıq heyranlıqda qoyur. Auditoriya öz qarşısında Azərbaycan dilinin problemlərinə dərindən-dərinə bələd olan bir dilçi alim görür: "Məsələn ordumuzda da vəziyyət belədir. Çünkü keçmişdə Sovet ordusunda olan terminlərin və s. əksəriyyəti dilimizə o qədər də çevrilməyib. Amma mən müdafiə nazirinə də göstəriş vermişəm ki, artıq vaxt keçib, təhsili də, ordunun idarəsini də, başqa şeyləri də tədricən dövlət dilimizə, Azərbaycan dilinə çevirmək lazımdır" [Vc.s.258].

Azərbaycan dilinin gələcəyi haqqında Heydər Əliyevin fikirləri nikbindir. O, Azərbaycan dilinin dünya durduqca yaşayacağına əmindir. Lakin bu əminliyin içində dilimizin taleyi ilə bağlı heç bir güzəştə getməyəcəyini də anladır: "O ki qaldı reklamlar və şəhərdə başqa dillərdə olan yazılara və yaxud da ki, respublikamızda hansısa kolleclərdə ingilis dilində dərs keçilir, – bunların hamısına baxmaq lazımdır. Ancaq bu məsələdən bir o qədər narahat olmaq lazım deyil. Siz ingilis dilində dərs keçilən kolleclərin sayını götürsəniz və bizim Azərbaycan dilində dərs keçilən məktəblərin sayı ilə müqayisə etsəniz, görərsiniz ki, bu kolleclər azlıq təşkil edir. Amma, mən bu barədə mübahisə etmək istəmirəm. Bir halda ki, burada belə bir

fikir söylənibdir, buna diqqət yetirmək lazımdır. Reklam və məktəb məsələlərinə diqqət yetirmək lazımdır” [XIIIc.s.135].

Azərbaycan dilinin hakim mövqe tutması yolunda Heydər Əliyev qətiyyəti tam ciddiyyəti ilə işə düşür. Qətiyyətlə dolu ifadələr: “hakim dil etməliyik”, “öz ana dilini bilməlidir”, “səlis danışmalıdır”, “bu dili sevməlidir”, “mütləq öyrənməlidirlər”, “birinci növbədə öz ana dilini bilməlidirlər”, “Azərbaycan dilini öyrənin”, “öyrənməsəniz işdən çıxaracağam” – dil məsələlərində sərt bəyanat kimi qulaqlarda səslənir, dilimizə ögey münasibət bəsləyənlərə ciddi xəbərdarlıq edir, dil məsələlərinə münasibətdə Heydər Əliyev xarakteri milyonlarla insana açılır: “Ancaq biz dünyada öz dilimizlə tək yaşayırıq. Bizim birinci nailiyyətimiz o olmalıdır ki, öz dilimizi Azərbaycanda hakim dil etməliyik. Hər azərbaycanlı öz ana dilini bilməlidir, bu dildə səlis danışmalıdır və bu dili sevməlidir. Bununla yanaşı biz çalışmalıyıq ki, məktəblərimizdə, universitetlərimizdə gənclər bir neçə dil öyrənsinlər. Mütləq öyrənməlidirlər. Biz artıq dünyaya qarışmışıqsa, Dünya Birliyinə daxil olmuşuqsa, gərək insanlarımız bir neçə dil bilsinlər – ingilis dilini də bilsinlər, rus dilini də bilsinlər, fransız dilini də bilsinlər. Bunu yasaq etmək olmaz, bunun qarşısını almaq lazım deyil. Ancaq birinci növbədə ana dilini bilməlidirlər. Bəli, Azərbaycanda indi də elə insanlar var ki, əsasən rus dilində danışırlar, Azərbaycan dilində danışmırlar. Bizim dövlət orqanlarında da beləsləri var. Mən dəfələrlə xəbərdarlıq etmişəm ki, Azərbaycan dilini öyrənin, öyrənməsəniz işdən çıxaracağam [XIIIc.s.136].

Dilimizin inkişafı məsələlərində də o, nikbindir. Bu nikbinlik, bu öncəgörmə bu gün ölkə prezidenti İlham Əliyevin sərəncamlarında da özünə yer tapır: “Ümidvaram ki, – bu gün məndə bu ümidlər daha da çoxaldı, – bizim gənclərimiz bun-

dan sonra tariximizi daha da yaxından öyrənəcək, doğma Azərbaycan dilimizi mənimsəyəcək və bunlar hamısı hər bir gənc Azərbaycan övladında yüksək vətənpərvərlik hissləri yaradacaqdır" [Vc.s.321].

Müstəqilliyə qovuşduğumuz ilk illərdə tarix fəlsəfəsinə söykənən ulu öndər sovetlər dönəmində Azərbaycan dilinin ağır mərhələlərdən keçməsinə baxmayaraq nəinki "yaşamasını", hətta inkişaf edib zənginləşməsini xarici ölkələrdə yada salmaqla, auditoriyaları bu dilin həyatın bütün sahələrində özünü doğruldan təkmil dil olduğunu bir daha inandırır: "Bir təsəvvür edin, 70 il ərzində Azərbaycan Sovetlər Birliyinin tərkibində olmuş, Kommunist ideologiyası ilə yaşamış, sosializm qurmağa çalışmışdır. Buna baxmayaraq, bütün bu illər ərzində Azərbaycan xalqının dili nəinki yaşamış, hətta inkişaf edib zənginləşmişdir. Mədəniyyətimiz yüksək zirvələrə qalxmışdır" [Ic.s.382].

6 noyabr 1996-cı il tarixdə Türk dünyası yazıçılarının III qurultayındakı nitqində Heydər Əliyev Azərbaycan dili haqqında öz parlaq fikirlərini irəli sürür, bu dilin türkdilli xalqların dilləri arasında zənginliyi və inkişafı ilə seçilməsindən danışır. Dilimizin bu səviyyəyə çatmasında rolları olan insanların xidmətlərini xüsusi qeyd edir: "Şübhəsiz ki, bizim xalqlarımızın dilləri bir kökdən olaraq, hərəsi öz tarixi yolu ilə gedərək böyük inkişaf dövrü keçmişdir. Ancaq mən Azərbaycan dili haqqında danışarkən deyə bilərəm ki, bizim Azərbaycan dilimiz XX əsrdə çox inkişaf etmiş, çox zənginləşmişdir. Mən fəxr edirəm ki, türk dillərinə mənsub olan Azərbaycan dili bu qədər zəngindir, bu qədər bədii ifadələrlə doludur və biz həyatın bütün sahələrinə aid olan fikirlərimizi öz ana dilimizdə ifadə edə bilirik. Burada mən Azərbaycan yazıçılarının, dilçi-

lərinin, ədəbiyyatşünaslarının xidmətlərini xüsusi qeyd edirəm” [VIIIc.s.11].

Heydər Əliyevin doğma ana dilimizə olan sevgisi o qədər böyükdür ki, nitqlərində arzu ədatlarının demək olar ki, təsadüf etmədiyi halda dil məsələlərində o arzu edir: “Mən arzu edirəm ki, Azərbaycan gənci Şekspiri ingilis dilində oxusun, Puşkini rus dilində oxusun, Nizamini, Füzulini, Nəsimini isə Azərbaycan dilində oxusun” [Vc.s.321].

Ölkə əhalisinin rifahı naminə iqtisadi problemlərin qısa müddətdə çözülməsi nə qədər vacibsə də, dilimizin mənimsənilməsi məsələləri Heydər Əliyev üçün ondan da vacibdir: “Mən buraya gələndən iki il yarımdır ki, bir yerdə işləyirik, – hesab edirəm insanlara sərbəstlik vermək lazımdır. Mən də bu şəraiti yaradıram ki, kim öz fikrini hansı dildə izah edə bilirsə, etsin. Ancaq heç kəs bunu daimi bir proses kimi qəbul etməsin, bu keçid dövrümüzün müəyyən bir elementidir. Ancaq keçid dövrünü əgər iqtisadiyyatda qısaltmaq istəyiriksə, dili mənimsəməkdə daha da qısaltmaq lazımdır” [Vc.s.257-258].

Bəzi adamların “dilimiz türk dilidir” deyərək Azərbaycan dilini başqa dillər içində əridib “horraya” döndərməsini qətiyyən qəbul etmir. Bugünkü türk dilli xalqların dillərini bir kökün şaxələri kimi qəbul edən Heydər Əliyev yaradılış baxımından müxtəlifliyin əleyhinə getməməyi tövsiyə edir.

Rəngarəngliyin daha məqsədəuyğunluğunu, ümumi gücümüzün, qüvvətimizin yüksəlməsinə xidmət etdiyini göstərir. 1 iyul 1996-cı ildə, Bonn şəhərindəki Almaniya cəmiyyətinin sədrləri və Azərbaycan cəmiyyətləri federasiyasının nümayəndələri ilə görüşdəki çıxışında Azərbaycan dilinin türk dilləri qrupuna aid olan bir dil olduğunu təmkinlə, səbrlə auditoriyaya – soydaşlarımıza öyrədir: “Siz bir məsələni də bilməlisiniz ki, Azərbaycanda son illər bəzi adamlar deyirlər ki, biz

türkük, dilimiz də türk dilidir. Biz bir kökdənik, amma bu bir kökdən neçə budaq gedib. Anadoluda yaşayanlar da, Özbəkistanda da, Qazaxıstanda da, Türkmənistanda da, Dağıstanda da, Qırğızıstanda da yaşayanlar türkdülər. Çində yaşayan Uyğurlar da türkdülər. Amma onlar bir kökün hərəsi bir şaxəsidir. O şaxəni itirmək lazım deyil. Necə deyərlər, onların hamısını bir rəngdə rəngləmək lazım deyil. Yenə də deyirəm, kök birdir. Respublikamızda demişik, biz Azərbaycanlıyıq. Dünyada bir kökdən olan nə qədər millət var. Bu, öz rəngarəngliyini nə qədər göstərsə, o qədər də güclü olacaq. Amma bir dili başqa dilin içərisində əritsək, necə deyərlər, horra çıxacaq. Horradan da bir şey çıxmaz" [VIIc.s.22].

Elə bu məqamda, ulu öndərin XX əsrdə sevdiyi şairlərdən sayılan Ulu Şəhriyarın misraları yada düşməyə bilmir: "Türkün dili tək sevgili dil ola bilməz".

Azərbaycan dilinin dövlət dili səviyyəsinə yüksəlməsində ciddi addımların da müəllifi yenə də Heydər Əliyevdir. Səmimiyyət və təvazökarlıq mücəssəməsi sayılan ulu öndər burada da xidmətlərini qabartmır, gördüyü işləri adi heab edir: "Yadımdadır, ilk dəfə Yazıçılar İttifaqının qurultayında mən Azərbaycan dilində nitq söyləyəndən sonra tənəffüsə çıxdıq. Hamı gəlib məni təbrik edirdi. Ona görə ki, mən orada birinci növbədə Azərbaycan dilində danışdım. Dedim ki, əziz qardaşlar, axı burada elə bir şücaət yoxdur. Bu, bizim öz dilimizdir. Mən bunu anladım. Çünkü dövlət adamları Azərbaycan dilində danışmamışdılar. Bu dil məişət dili olmuşdu və bir də ədəbiyyatın dili olmuşdu. Amma dövlət dili olmamışdı" [XIIIc.s.134].

Heydər Əliyev üçün ən çox fəxr olunan Azərbaycan dilidir. O, bu dilin XX əsrin əvvəlindəki vəziyyəti ilə sonundakını müqayisə edir. Əsrin sonunda "qat-qat yaxşı", "qat-qat təmiz", "qat-qat mükəmməl" olan dilin inkişafında xidmətləri

olan insanları sıralayır. Xalqın, millətin formalaşması prosesinin dillə bağlılığını auditoriyaya çatdırır: “Bu gün müstəqil bir dövlət kimi ən çox fəxr etdiyimiz bir də odur ki, bizim gözəl Azərbaycan dilimiz var. Azərbaycan dilinin formalaşmasında, inkişaf etməsində, bugünkü səviyyəyə çatmasında yazıçılarımızın, şairlərimizin, ədəbiyyatşünasların, dilçi alimlərin böyük xidməti var. Bu gün danışdığımız dil 20-ci illərdə danışılan dil deyil. Elədir, yoxsa yox? Bəli, əsrin əvvəlindəki dil deyil. Amma ondan qat-qat yaxşı dildir, ondan qat-qat təmiz dildir, ondan qat-qat mükəmməl dildir. Bu, bizim ən böyük sərvətlərimizdir. Xalqı xalq edən, milləti millət edən onun ana dilidir. Layiqli ana dili olmayan, ana dilindən istifadə edə bilməyən, ana dilindən bəhrələnə bilməyən xalq, millət, xalq millət ola bilməz” [XIIIc.s134].

Azərbaycan dilinin saflığının qorunması ilə yanaşı dilimizə daxil olan sözlərin fəlsəfi mənasını dəyərləndirən böyük natiq dilin qorunması yolunda ciddi-cəhdlə çalışır. “Heç bir xalqı az hesab etmək olmaz” yaxud “böyük xalq, kiçik xalq anlayışı yoxdur” fəlsəfi fikirləri ilə Azərbaycan dilinə sonsuz məhəbbətini izah edir. 20 fevral 1995-ci il tarixdə, Prezident sarayında respublikada yaşayan ləzgi ictimaiyyətinin nümayəndələri ilə görüşündəki çıxışı bu qəbildəndir: “Professor Əli Musayev 1992-ci ildə prezidentin azsaylı xalqlar haqqında verdiyi fərmanın həyata keçirilməsi ilə bağlı məsələyə də toxundu. Bilirsiniz, doğrusu, mən bu fərmanı görməmişəm, onun barəsində də bir şey deyə bilmərəm”. “Azsaylı xalqlar” ifadəsini kimin dilə daxil etdiyini bilmirəm, ancaq mən də belə bir fikirdəyəm ki, “azsaylı”, “çoxsaylı” ifadələrinə baxmaq lazımdır, məsələləri həll etmək lazımdır” [IIIc.s.205].

Türkiyədə 9 fevral 1997-ci ildə Bilkənd Universiteti idarə heyətinin sədri İhsan Doğramaçı ilə görüşdə Heydər Əliyev

Azərbaycan dili ilə türk dili arasındakı yaxınlıqları qeyd etməklə yanaşı, iti məntiqə, dərin təfəkkürə əsaslanan bir analizlə bu dillər arasındakı oxşarlıq və fərqləri izah edir. Elə bu izahla da ölkələrimiz arasındakı münasibətlərə aydınlıq gətirir və bu münasibətlərin tarixi köklərini auditoriyalara açıqlayır: "Bizim Azərbaycan dili, ana dilimiz cari əsrdə çox zənginləşmiş, çox inkişaf etmişdir. Türk ləhcəsi ilə Azərbaycan ləhcəsi arasında bəzi fərqlər var. Bu fərqləri siz bilirsiniz. Bir tərəfdən siz öz dilinizi modernləşdirmisiniz, digər tərəfdən isə bizim dilimiz müəyyən qədər təkmilləşmişdir. Fərqlər də buradan gəlir. Ola bilsin ki, 60-70 il öncə bu fərqlər az idi. Lakin elə indi də türk xalqlarından heç birinin dili Azərbaycan və Türk dilləri qədər bir-birinə yaxın deyildir. Bütün bunlar onu göstərir ki, dostum İhsan bəyin qeyd etdiyi kimi, ölkələrimiz ayrı olsalar da, xalqlarımız birdir və bir olacaqdır. Buna heç bir şübhə ola bilməz" [Vc.s.382].

Dilimizlə bağlı hər bir məqamda Heydər Əliyev nitqi işə düşür, Azərbaycan dilinin kütlələr arasında təbliği başlayır. 28 dekabr 1994-cü il tarixdə, Respublika Sarayında böyük Azərbaycan yazıçısı Cəlil Məmmədquluzadənin anadan olmasının 125 illiyinə həsr edilmiş yubiley gecəsində Heydər Əliyev ədibin "Anamın kitabı" əsəri üzərində Azərbaycan dilinin dünəni və bu gününü bir ədəbiyyat tənqidçisi kimi təhlil edir: "Cəlil Məmmədquluzadənin fəaliyyətində ən dəyərli cəhətlərdən biri də Azərbaycan xalqının, dilinin inkişafı üçün göstərdiyi xidmətlərdir. Onun daim işlətdiyi "Vətən, Vətən, Vətən! Millət, millət, millət! Dil, dil, dil!" sözləri xalqımızın, millətimizin fikirlərini, arzularını ifadə edir. Ədibin ana dilinə, Azərbaycan dilinə böyük diqqəti, ana dilni təbliğ etməsi, insanların hamısını ana dilini bilməyə dəvət etməsi və ana dilinin, Azərbaycan dilinin hər yerdə hökm sürməsinə dair fikir-

ləri, yazıları o vaxt üçün çox vacib idi, bu gün üçün də çox aktualdır. “Anamın kitabı” əsəri Azərbaycan üçün çox dahiyanə əsərdir. Çünkü bizim xalqımız, respublikamız Şərqin və Qərbin, Şimalın və Cənubun qovuşağındadır. Əsrlər boyu ayrı-ayrı istiqamətlərdən xalqımıza təsirlər olmuşdur. Mədəniyyətimizin və elmimizin inkişafına da bu təsirlər olmuşdur. Ancaq xalqımızın dahi simaları Azərbaycan dilini daim yaşadıb. Azərbaycanın milliliyini yaşadıb, milli şüuru yaşadıb, milli məfkurəni yaşadıblar. Lakin elə zamanlar, elə dövrlər də olub ki, bəzən başqa ölkələrdə təhsil almış adamlar o ölkələrin dilini, adət-ənənələrini qəbul edərək öz dilini, öz adət-ənənəsini, milliliyini itirməyə uğramışlar. Bu gün də bu var. Bu hallarla biz yaxın keçmişdə də çox qarşılaşmışıq və demək olar ki, son 20-25 ildə Azərbaycan dilinin Azərbaycanda hakim olması, sadəcə formal surətdə dövlət dili elan olunması yox, hər yerdə tətbiq edilməsi, inkişaf etməsi böyük səylərin nəticəsidir və bu, çox vaxt güclü müqavimətlərlə rastlaşmışdır” [Vc.s.79-80].

Ölkəmizdə digər dillərin öyrənilməsinə ümumbəşəri prizmadan yanaşan böyük natiq dil millətçiliyi azarına tutulmamaqla yanaşı, öz dilimizə olan sayğını da unutmamağı hər bir gəncə tövsiyə edir: “Şübhəsiz ki, hər bir azərbaycanlı, hər bir Azərbaycan vətəndaşı öz ana dilindən savayı, bir çox dilləri bilməlidir. İndi bu, xüsusən lazımdır... İndi isə müstəqilik. Ona görə də bütün dillərin tədris olunması çox gərəklidir” [IIc.s.174-175].

Heydər Əliyev bütün çıxış və nitqlərində olduğu kimi Azərbaycan dilinə münasibətdə də tarix fəlsəfəsinə söykənərək “həqiqətləri unutmamağı, qaralamamağı” önə çəkir. Ritorik suallarla – “Dilimizin qrammatikası, qanunları haqqında o dövrdə nə qədər əsərlər yazıldı. Azərbaycan dili haqqında harada belə əsərlər yazılıb?” – deyə auditoriyaya müraciət edən

böyük natiq "bəli" təsdiq ədatı ilə suala cavab verərək, sonda "tarixi qaralamaq olmaz" tarix fəlsəfəsinə xidmət edən cümlə ilə fikrini yekunlaşdırır: "Bilirsiniz, Anadoluda, Özbəkistanda yaşayanların hərəsinin özünəməxsus xüsusiyyətləri var. Məsələn, mən fəxr edirəm ki, Azərbaycan dili Sovet hakimiyyəti dövründə çox inkişaf etdi, daha da zənginləşdi. Adətən Sovet hakimiyyəti dövrünü çox tənqid edirlər. Amma olan həqiqətləri unutmaq, qaralamaq olmaz. Bizim dilimiz məhz o illərdə inkişaf etdi. Dilimizin qrammatikası, qanunları haqqında o dövrdə nə qədər əsərlər yazıldı. Azərbaycan dili haqqında harada belə əsərlər yazılıb? Bəli, belə əsərlər Sovet hakimiyyəti dövründə yazıldı. Yenə də deyirəm, tarixi qaralamaq olmaz" [VIIc.s.23].

Azərbaycan dilinin səlis, dəqiq öyrənilməsinin yolu Azərbaycan ədəbiyyatını bilməkdən keçir. Heydər Əliyev əmindir ki, ədəbiyyatını bilməyən adam yüksək mədəni səviyyəyə əsla çata bilməyəcəkdir: "Ədəbiyyatımızı bilmək lazımdır. Ədəbiyyatını bilməyən adam yüksək mədəni səviyyəyə çata bilməyəcəkdir. Bu dərslərə fikir vermək lazımdır. Xüsusən o məktəblərdə ki, Azərbaycanda dərslər rus bölməsində keçir, buna fikir vermək lazımdır" [XXIc.s.255].

Heydər Əliyev uşaqların ailədə öyrəndiyi "ana dili" ilə kifayətlənmir. O, gənclərimizin Azərbaycan dilini yüksək səviyyədə bilməyini tələb edir. "Sovetlər Birliyində yol verilən səhvləri təkrar etməyə haqqımız yoxdur!" prinsipindən çıxış edir! O, dilin incəliklərini bilməyi, yüksək səviyyədə söz deməyi bilməyi, fikrini ifadə edə bilməyi, nitq edə bilməyi tələb edir. "Bu hələ bizdə çox çatışmayan bir sahədir" deyən ulu öndər Azərbaycan dili ilə bağlı aktual məsələlərin hələ də ziyalılarımızı gözlədiyini göstərir: "Ana dili" deyəndə, şübhəsiz ki, hər bir uşaq doğulandan sonra ailəsində atasından, anasından öz dilini öyrənir. Bir var ki, sadəcə öz dilini ailədə bil-

mək, bir də var ki, dilini yüksək səviyyədə bilmək. Keçmişdə biz buna fikir verməmişik. Bu həqiqətdir. Yəni o qədər fikir verməmişik. Eyni zamanda onu da unutmaq lazım deyil ki, keçmiş zamanlarda Sovet İttifaqının tərkibində olarkən Azərbaycanda orta təhsil və ali təhsil sistemində Azərabyacan sektoru həmişə çoxluğu təşkil etdiyinə görə biz dilimizi yaşatmışıq və inkişaf etdirmişik. İndi isə, şübhəsiz, bizdə təhsilin tam əksəriyyəti Azərbaycan dilində gedir. Ancaq bir var ki, Azərbaycan dilində oxuyursan bir də var ki, dilin incəliklərini bilirsən, Azərbaycan dilində yüksək səviyyədə söz deyə bilirsən, fikrini ifadə edə bilirsən, nitq edə bilirsən. Bu, hələ bizdə çox çatışmayan bir sahədir [XXIc.s.254].

Təhsil sisteminə incəliklərinə qədər bələd olan ulu öndər yeni təhsil islahatında hansı fənnin "saatını artırmaq və ya azaltmağı" mühüm hesab etmir. "Ancaq orta məktəblər üçün şərtlərimiz var" deyərək auditoriyanı hərəkətə gətirir. Müəllim auditoriyası bu şərtlərin nədən ibarət olmağını eşitmək istəyir. Və bu şərti tələb kimi böyük natiqin dilindən eşidir:

"Təbiidir ki, fənlər çoxdur. İndi siz burada da müəyyən islahatlarla əlaqədar dəyişikliklər aparırsınız – hansının saatını artırırsınız, hansını azaldırsınız. Bu, sizin öz işlərinizdir. Ancaq mən bu gün bir daha demək istəyirəm ki, bizim uşaqlarımız, gənclərimiz hər bir fənni bilməlidirlər və xüsusən, o fənləri ki, ixtisaslaşmaq istəyir, – onu daha da yaxşı bilməlidirlər. Biri istəyir riyaziyyatçı olsun, biri istəyir fizik olsun, biri istəyir geoloq olsun, biri istəyir hüquqşünas olsun. Qoy olsun. Ancaq orta məktəblər üçün bizim bir neçə şərtlərimiz vardır, onları həyata keçirməlidirlər. Ana dilini bilməlidirlər, ədəbiyyatımızı bilməlidirlər, bizim tariximizi bilməlidirlər, bizim mədəniyyətimizi bilməlidirlər" [XXIc.s.254].

Yeni dərs ili münasibətilə Bakı şəhərinin təhsil işçiləri ilə 31 avqust 1994-cü il tarixli görüşündə Azərbaycan dilinin bugünkü səviyyəyə gəlib çatmasında rolları olan elm, mədəniyyət xadimlərinin qiymətini qədirbilənliklə verir, dilimizin zənginliyinin, böyük imkanlara malik olmasının orta məktəbdə gənclərin mənimsəyə bilməsinə şərait yaradılmasını ciddi tələb kimi ortaya qoyur: "Bunlarla yanaşı, məktəblərdə Azərbaycan dilinin tədrisinə mühüm diqqət yetirilməlidir. Bildiyiniz kimi 10-20 il bundan qabaq biz çalışırdıq ki, Azərbaycan dili bütün məktəblərimizdə tədris olunsun və gənc nəsil məktəblərdə ilk təhsil addımlarını atarkən öz dilini, ədəbi dilini yaxşı bilsin. Bu barədə çox işlər görülüb. Mən bu gün fürsətdən istifadə edib demək istəyirəm ki, Azərbaycanın dilçiləri, dilçilik sahəsində fəaliyyət göstərən alimləri çox böyük işlər görüblər. Azərbaycan dilinin bu gün bu qədər zəngin, səlis, cazibədar olması bizim mədəniyyət, elm xadimlərimizin, ədəbiyyatşünaslarımızın, şairlərimizin, yazıçılarımızın və xüsusən dilçiliklə məşğul olan alimlərimizin, mütəxəssislərimizin xidmətinin nəticəsidir. Fəxr edə bilərik ki, bizim zəngin, böyük söz ehtiyatına malik olan Azərbaycan dilimiz var. Ancaq lazımdır ki, Azərbaycan dilinin bu zənginliyi, bu böyük imkanları orta məktəbdə ilk təhsilə başlayan hər bir gənc tərəfindən mənimsənilə bilsin" [IIc.s.174]. Zəngin, səlis, cazibədar, böyük söz ehtiyatına malik dildən danışan böyük natiq dil sahəsindəki qüsur, nöqsan və çatışmazlıqlara təəssüf edir: "Mən nə üçün bu məsələnin üzərində dururam. Çünkü əldə etdiyimiz nailiyyətlərlə yanaşı, təəssüf ki, bu sahədə qüsurlarımız, nöqsanlarımız da çoxdur. Hələ çox adamlar var ki, öz ana dilində mədəni, ədəbi dilin ifadələrindən istifadə edərək yaxşı danışmaq imkanına malik deyillər" [IIc.s.174].

Dilimizə ögey münasibət göstərənlərə təəssüf edən dövlət başçısı Heydər Əliyev "bu, yolverilməz haldır", "öz ana dilini

bilmək hər bir azərbaycanlı üçün lazımdır", "orta məktəblərimizdə bu məsələlərə çox ciddi fikir verilməlidir" kimi qətiyyətli ifadələrlə auditoriyanı dilimizin müdafiəsi yolunda səfərbər edir: "Əgər keçmişdə bu, müəyyən qədər bağışlanırdısa – çünkü onda nədənsə bəzi adamlar ancaq bir dili bilməyi özləri üçün böyük nailiyyət hesab edirdilər – ancaq indi bu, yolverilməz haldır. Lazımdır ki, gənclərimiz orta məktəbi bitirərkən 2-3 xarici dil bilsinlər. Ancaq bununla yanaşı, öz ana dilini bilmək hər bir azərbaycanlı üçün lazımdır. Bir də deyirəm, biz öz dilimizlə fəxr edə bilərik. Çünkü dilimiz zəngin dildir, ədəbiyyatımız zəngindir, mədəniyyətimiz zəngindir və bunların hamısı da ana dilimizlə, Azərbaycan dili ilə bağlıdır. Lazımdır ki, orta məktəblərimizdə bu məsələlərə çox ciddi fikir verilsin".

Heydər Əliyev Azərbaycan dilinin təbliğində özü şəxsi nümunə göstərməkdə birincidir. "Ədəbiyyat və incəsənət" qəzetini tamamilə oxuyan böyük natiq bu gün bizləri bu böyük dili öyrənməyə sövq edir. "Xatirimdədir" modal sözün köməyi ilə fikrini auditoriyaya ünvanlayan Heydər Əliyev tarixi bir ekskursiya edərək dili sevməyin necə olduğunu bizlərə öyrədir: "Xatirimdədir, Moskvada yaşadığım vaxt Azərbaycan qəzetlərinə abunə yazılmışdım, göndərirdilər. Hamısına baxmağa vaxtım yox idi. Amma "Ədəbiyyat və incəsənət" qəzetini mütləq oxuyurdum. İndi bu "Ədəbiyyat" qəzeti çıxmır" [IIIc.s.367].

Heydər Əliyev Azərbaycan dilini bir dil tarixçisi kimi tədqiq edir, bu dilin türk dilləri qrupunda yerini göstərir: "Bilirsiniz, mən bunu dəfələrlə demişəm və bu gün fürsətdən istifadə edib yenə də deyirəm: biz türkdilli xalqların ailəsinə mənsub olan bir xalqıq. Ancaq bunun çox şaxələri var. Bunun bir şaxəsi də Azərbaycan dilidir. Biz bunu təsdiq etmişik və bu, artıq bütün ictimaiyyət tərəfindən qəbul olunubdur. Azər-

baycan dilini daha da zənginləşdirmək, daha da inkişaf etdirmək sizin ən müqəddəs borcunuzdur" [XIIIc.s.135]. "Bilirsiniz" modal sözü ilə böyük natiq məsələnin hamıya məlum olduğunu, lakin hələ də bir qisim şəxslərin öz fikrində qaldığına işarə edir.

Heydər Əliyevin Azərbaycan dilinin qorunmasına yönələn ideyaları bu gün də ölkə rəhbərliyi tərəfindən qətiyyətlə həyata keçirilir. Elə Azərbaycan Respublikası Prezidenti cənab İlham Əliyevin "Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsinə və ölkədə dilçiliyin inkişafına dair Dövlət Proqramı haqqında" 23 may 2012-ci il tarixli sərəncamı və bu sərəncamın icrası istiqamətində ölkədə aparılan işlər buna parlaq sübutdur.

# II FƏSİL

# HEYDƏR ƏLİYEV NİTQİ İLƏ İZAH EDİR

Heydər Əliyevin çıxış etdiyi auditoriyalar öz zənginliyi ilə seçilən auditoriyalardır. Bu auditoriyaları öz parlaq çıxışları ilə fəth etmək yalnız güclü məntiqə malik təfəkkürdən süzülüb gələn nitqlə mümkün olur. Bütün bunlara nail olmaq geniş ensiklopedik biliklərə söykənməyin nəticəsidir. Müxtəlif peşə sahiblərinin toplaşdığı geniş zallar öz peşələrinə aid olan dəyərli sözləri eşidir, həmin peşələrə xas olan daxili məzmunun incələnməsinin şahidi olur, heyranlıqlarını gizlətmirlər.

Böyük natiqin çıxışlar etdiyi auditoriyaları təsnif etmək çətindir. Bunlar YUNİSEF xətti ilə keçirilən uşaqlarla bağlı bayram tədbirləri auditoriyasından tutmuş müharibə və əmək veteranlarına, təhsil və səhiyyə işçilərinin auditoriyasından sərhədçi və milli təhlükəsizlik əməkdaşlarına, gerb və bayraqdan tutmuş, vətəndaş sözünün izahı verilən çoxsaylı auditoriyalardır.

Haqqında söhbət açacağımız anlayışlara Heydər Əliyev izahı həmin anlayışlara böyük natiqədək verilməyən izahlardır. Dünya ensklopedik kitablarında haqqında söhbət açacağımız anlayışlara rast gəlir və bu anlayışlar həmin ensiklopediya əməkdaşları tərəfdən bu və ya digər formada izah olunur. Amma, auditoriyalarda bu anlayışlara verilən Heydər Əliyev izahlarına heç bir ensiklopediyada təsadüf edilmir. Məhz buna görə də biz bu anlayışların Heydər Əliyev tərəfindən verilən izahını oxucularımızla bölüşmək, dilçilik, üslubiyyat baxımından bu anlayışları tədqiq etmək qərarına gəldik. Bu anlayışların çoxu “eyni peşə sahiblərinin toplaşdığı müxtəlif auditoriyalarda” həmin peşələrə verilən izah, həmin peşə sahiblərinin cəmiyyətdəki rolu, yeri, eləcədə onların spesifik xidməti işləri

Heydər Əliyev tərəfindən qiymətləndirilir. İzahı verilən bir qisim anlayışlar isə ictimai-siyasi, mənəvi sahələrə aiddir ki, bunlar daha geniş auditoriyaları əhatə edir.

Bütün bu auditoriyalarda Heydər Əliyevin heç yerdə yazılmayan, heç kəs tərəfindən təkrarı olmayan nitqinin şahidi oluruq. Məhz belə nitqlər daimi və yaddaqalan olur. Heydər Əliyevin müstəqillik atributlarımızla bağlı fikir və mülahizələri xüsusilə yaddaqalandır. Onun Bakıdakı 18 nömrəli məktəbdə, 1 sentyabr 1997-ci il taarixdə keçirilmiş mitinqdəki nitqi bu qəbildəndir. Heydər Əliyev qətiyyətlə dövlət atributlarımızın təbliğini tələb edir. O, Azərbaycan bayrağının müqəddəsliyindən danışır, bu bayrağın "böyük iftixar hissi doğurmağından" söhbət açır, xarici ölkələrin hava limanında gördüyü Azərbaycan bayrağına "həddindən artıq sevinir", Azərbaycan bayrağını "hər bir ailənin həyatının əziz bir hissəsinə" çevrilməsini arzu edir: "Bu sırada mən hesab edirəm ki, məktəblərdə Azərbaycanın müstəqilliyinin atributları yaxşı təbliğ olunmalıdır. Azərbaycanın dövlət müstəqilliyini təmsil edən, Azərbaycanın bayrağına münasibət, onun müqəddəsliyi hər bir cocuqda, yeniyetmədə daxildən olmalıdır. Azərbaycanın bayrağı sadəcə bayraq deyil. O, bizim dövlətçiliyimizn, müstəqilliyimizin rəmzidir. Keçmişdən qalan ənənələrə görə bu bayrağa o qədər də əhəmiyyət verilmirdi, bu bayraq müəyyən qədər formal xarakter daşıyırdı" [XIIc.s.139].

İzahedicilik Heydər Əliyev nitqinə daxilən xas olan bir məziyyətdir. Auditoriya ölkəmizin müstəqillik atributları hesab edilən bayraq, gerb, himn anlayışlarına aid böyük natiqin fikirləri ilə tanış olur. Heydər Əliyev atributlarımızın məktəblərdə gənc nəslə yaxşı təbliğ olunmasını tələb kimi qoyur: "Bu sırada mən hesab edirəm ki, məktəblərdə Azərbaycanın müstəqilliyinin atributları yaxşı təbliğ olunmalıdır. Azərbaycanın dövlət müstəqilliyini təmsil edən Azərbaycanın bayrağına münasibət,

onun müqəddəsliyi hər bir cocuqda, yeniyetmədə daxildən olmalıdır. Azərbaycanın bayrağı sadəcə bayraq deyil. O, bizim dövlətçiliyimizin, müstəqilliyimizin rəmzidir" [XIIc.s.139].

Heydər Əliyev Azərbaycan bayrağı haqqında danışarkən bayrağın məzmuna – Azərbaycanın müstəqilliyinə uyğun gəlməsini nəzərdə tutur:

"Keçmişdən qalan ənənələrə görə bu bayrağa o qədər də əhəmiyyət verilmirdi, bu bayraq müəyyən qədər formal xarakter daşıyırdı. Ancaq indi biz yeni bir həyatdayıq. Biz öz müstəqil dövlətimizdəyik, ölkəmizdəyik. Hansı ölkəyə gediriksə – gedək, Azərbaycan bayrağının o ölkədə asılması həm Azərbaycanın orada təmsil olunmasını göstərir, həm də bizim ölkəmizi tanıdır, eyni zamanda bizdə böyük iftixar hissi doğurur" [XIIc.s.139].

Azərbaycan bayrağını sevən, onu poetik çalarlarla auditoriyalara sevdirən böyük natiq bayraqla Vətəni, xalqı, dövləti eyniləşdirir, bərabərləşdirir. Hər bir evdə Azərbaycan bayrağının olmasını tələb kimi qarşıya qoyur: "Mən çox ölkələrə gedirəm. Hava limanında Azərbaycan bayrağını görəndə həddindən artıq sevinirəm. Yaşadığım iqamətgahın, əyləşdiyim avtomobilin üstündə Azərbaycan bayrağını, hansı bir yerə danışığa gedəndə Azərbaycan bayrağını görürəm. Bu bizim müstəqil dövlətimizin rəmzidir. Ona görə də gərək hər bir Azərbaycan vətəndaşı, xüsusən gənc nəsil bunu dərk etsin, qiymətləndirsin. Onda bayrağa olan məhəbbət eyni zamanda Vətənə, xalqa, dövlətə olan məhəbbətə bərabər olsun. Gərək hər bir evdə Azərbaycan dövlətinin bayrağı olsun, hər bir ailə Azərbaycan bayrağına itaət etsin. Bu bayraq tək rəsmi yerlərdə yox, idarələrdə, küçələrdə, saraylarda, məktəblərdə yox, gərək hər bir ailənin həyatının əziz bir hissəsi olsun" [XIIc.s.140].

Bayraqla yanaşı, gerb və himn də Heydər Əliyev tərəfindən təbliğ olunur. Atributların təbliğində biz böyük natiqi

tariximizi auditoriyalarda öyrədən tarixçi alim kimi görürük: “Azərbaycanın gözəl himni var. Bu gün Azərbaycanın milli dövlət himni burada səsləndi. Sevindiricidir ki, bu himn hələ 1918-ci ildə yazılıbdır. Bunun müəllifi bizim böyük bəstəkarımız Üzeyir Hacıbəyovdur. Himnimizin sözlərini böyük şairimiz Əhməd Cavad yazıbdır. Onun musiqisi də çox gözəldir, sözləri də çox mənalıdır, gözəldir” [XIIc.s.140].

Himnimizlə fəxarət duyan ulu öndər poetik deyimlə onu gənclərə sevdirir: “Mən xarici ölkələrə səfər edərkən hər yerdə iki himn çalınır – Azərbaycanın himni, bir də getdiyimiz ölkənin himni. Hər ölkənin himni özünə görə əzizdir. Öz xalqının müsiqisini, mənəvi xüsusiyyətlərini əks etdirir. Bu təbiidir. Ancaq mən hər yerdə müqayisə edib görürəm ki, bizim himnin müəllifləri bu himni nə qədər böyük məharətlə yaradıblar. Hər dəfə xarici ölkələrdə bu himni dinləyərkən mən yenidən iftixar hissi duyuram” [XIIc.s.140].

Həyatımızdakı çatışmazlıqlara, neqativ hallara qarşı modal söz “təəssüf ki”ni çox işlədən Heydər Əliyev himnimizlə bağlı “təəssüf edir”. O, himni oxumaqla himni bilməyin fərqini auditoriyaya açıqlayır. Vətənpərvərlik hissinin güclənməsi baxımından himnin oxunmasını müsbət hal hesab edir: “Ancaq himni dinləmək yox, onu oxumaq lazımdır. Bizdə təəssüf ki, bu ənənə yaranmayıbdır. Himni dinləyirik, amma onun sözləri var. Mən hesab edirəm ki, bu bizim həyatımızda çatışmazlıqdır. Himn çalınan vaxt insanlar bu himnin sözlərini oxumalıdırlar. Bunun əhəmiyyəti var. Bir var ki, onu dinləyəsən, bir də var ki, o mahnının, musiqinin sədaları altında o sözləri tələffüz edəsən, oxuyasan”[XIIc.s.140].

“Gənclərimiz milli ruhda tərbiyə olunmalıdır, bizim milli-mənəvi dəyərlərimizin əsasında tərbiyələnməlidir. Gənclərimiz bizim tariximizi yaxşı bilməlidir, keçmişimizi yaxşı bilməlidir, dilimizi yaxşı bilməlidir, milli dəyərlərimizi yaxşı bil-

məlidir! Milli dəyərlərimizi, milli ənənələrimizi yaxşı bilməyən, tariximizi yaxşı bilməyən gənc vətənpərvər ola bilməz. Hər bir gənc vətənpərvər olmalıdır. Vətənpərərlik böyük bir məfhumdur. Bu sadəcə orduda xidmət etmək deyil, vətənə sadiq olmaq, vətəni sevmək, torpağa bağlı olmaq – budur vətənpərvərlik" [Vc.s.318].

Məişət çalarlı nitqlərində belə o, mənəviyyatımız haqqında danışır. Fikir və mülahizələrini kütlələrə sadə, inandırıcı, qətiyyətli ifadələrlə çatdırır: "Bəli, bunlar mənim yadımdadır. O vaxt Yaponiyanın "Seyko" markalı saatı çıxmışdı. Həmin saat çox bahalı, yəni bizim maaşımızdan beş dəfə baha idi. Görürdüm ki, rayon katiblərindən birinin, o birinin, başqalarının qolunda "Seyko" markalı saat var. İclasların birində dedim ki, əllərinizi qaldırın saatlarınıza baxacağam. Soruşdum ki, bu "Seyko" saatını haradan almısınız? Sənin məvacibin bu qədərdir, bu saatı hardan alırsan? Bundan sonra heç bir şey deyə bilmədilər. İndi bunu mənə irad tuturlar ki, Heydər Əliyev vaxtilə belə edib. Bəli, edirdim, bu gün də edirəm, sabah da edəcəyəm. Çünki mənəviyyat bizim üçün hər şeydən üstündür" [XXIXc.s.].

Filosoflar çıxış və nitqlərində ana xətti təşkil edən mənəviyyata müxtəlif vaxtlarda özünəməxsus təriflər vermişlər. Mənəviyyat, Heydər Əliyevə görə, "mənəvi tərbiyə məsələsidir". Başqa bir məqamda mənəviyyat böyük natiqə görə "milli-mənəvi dəyərlərimizdir". Heydər Əliyevə görə, mənəviyyat da inkişaf yoluna malikdir.

Respublika Sarayında, müstəqil Azərbaycan Respublikası gənclərinin 2 fevral 1996-cı il tarixli birinci forumundakı nitq mənəviyyat anlayışının izahı baxımından diqqəti cəlb edir. Bu çıxışı ilə böyük natiq gənclərimizi mənəvi kamillik zirvəsinə gedən yola hazırlayır: "Gənclərimizin qarşısında duran əsas vəzifələrdən biri mənəvi tərbiyə məsələsidir. Bilirsiniz, indi

maddi çətinlik, maddi ehtiyaclar, şübhəsiz ki, cəmiyyətdə cürbəcür mənfi halların meydana gəlməsinə gətirib çıxarır. Ancaq gənclərimiz də bilməlidir, vətəndaşlarımız da bilməlidir ki, bu dövrün müvəqqəti çətinliklərinə dözmək lazımdır, mənəvi tərbiyəni daim aparmaq lazımdır və gənclərimizi yüksək mənəviyyat ruhunda tərbiyələndirmək lazımdır. Ümumbəşəri dəyərlər, Azərbaycan xalqının milli-mənəvi dəyərləri hər bir gənc tərəfindən mənimsənilməlidir. Mənəviyyat olmayan yerdə heç bir şey ola bilməz. Nə qədər var-dövlət olsa da, nə qədər pul olsa da, nə qədər zənginlik olsa da, mənəviyyat olmayan yerdə heç bir şey ola bilməz. Xalqımızın tarixinin əsasını təşkil eləyən bütün mərhələlərdə, keçmiş əsrlərdə yüksək mənəviyyat olmuşdur. Keçmiş tariximizdən bizə qalan simaları bu gün dünyada məşhurlaşdıran və bizim üçün nümunə edən onların yüksək mənəviyyatıdır, yüksək amallarıdır. Ona görə də bu gün mənəvi tərbiyə bəlkə də keçmiş illərdən daha çox lazımdır" [Vc.s.318].

Sonrakı nitq mərhələsində mənəviyyat nədir, yüksək mənəviyyatla mənəviyyatsızlığın dialektik ziddiyyəti auditoriyaya açıqlanır: "Çünki mənəviyyat insana xas olan xüsusiyyətlərin hamısından yüksəkdir. Nə qədər böyük alim olursansa-ol, nə qədər böyük mütəxəssis olursansa – ol, nə qədər böyük dövlət xadimi olursansa – ol, əgər mənəviyyatca şikəstsənsə, sənin heç bir qiymətin yoxdur. Mənəviyyat ən yüksək insani keyfiyyətdir. İnsanlar mənəviyyatı əsrlər boyu qoruyub saxlayıblar. Bu heç də o demək deyil ki, keçmiş zamanlarda hamı yüksək mənəviyyata malik olub, amma mənəviyyatsızlar olmayıbdır. Yox. İnsan cəmiyyəti belədir ki, mənəviyyatlı ilə mənəviyyatsız arasında daim mübarizə gedir. Çünki mənəviyyatsızlıq cəmiyyətə zərbələr vurur, insanları pozur. Amma mənəviyyat insanları yüksəldir. Mənəviyyatlı çalışır ki, mənəviyyatsızlıq olmasın" [XXVIIIc.s.207].

Mənəviyyatı yüksək islam əxlaqında görən ulu öndər bu dünyada yüksək mənəviyyata malik olmağı, bu mənəviyyatı qorumağı tələb edir. "O dünyada hamı bərabərdir" fəlsəfəsindən çıxış edərək mənəviyyatsızlığa yol verməməyi tövsiyə edir: "Eyni zamanda, hər bir şəxs düşünməli, dərk etməlidir ki, onun üçün bu dünya daimi deyil. Bu dünya heç kim üçün daimi deyildir. Hamı bu dünyaya gəlir, hamı bu dünyadan gedir. Biri çox yeyir, biri az yeyir. Birinin var-dövləti çox olur, o birininki az olur. Amma hamının yeri oradadır və orada da hamı bərabərdir. O dünyada hamı bərabərdir" [XXVIIIc.s.208].

Ümummilli lider çıxışlarında siyasi terminlərə aydınlıq gətirir. Milli ideologiyanın iki tərəfini ayırır. Birinci tərəfi dövlətçilik adlandıran böyük natiq, ikinci tərəfi milli-mənəvi dəyərlərimiz hesab edir. İzahına ritorik sualla başlayır, dövlətçiliyin nə olduğunu filosofyanə izah edir:

"Bu milli ideologiya nədən ibarətdir? Birinci, dövlətçilik. Dövlətçilik bu gün və gələcəkdə bizim hər bir vətəndaşımızın, cəmiyyətin, dövlətin əsas vəzifəsidir. Dövlətçilik Azərbaycanın müstəqilliyini, ərazi bütövlüyünü qoruyub saxlamaqdır. Azərbaycanın müstəqilliyini möhkəmləndirməkdir. Dövlətçilik hər bir vətəndaşın qəlbində olmalıdır. Ona görə hər bir vətəndaş vətənpərvərlik hissləri ilə yaşamalıdır və bizim partiyamız, bütün dövlət orqanları, bütün təbliğatımız Azərvaycanda dövlətçiliyi inkişaf etdirmək üçün hər bir vətəndaşda milli vətənpərvərlik hisslərini yaratmalıdır. Milli vətənpərvərlik hissləri hər bir vətəndaşda o qədər güclü olmalıdır ki, hər bir vətəndaş milli mənafeyi öz şəxsi mənafeyindən, öz şəxsi yaşayışından, öz şəxsi həyatından – hər şeydən üstün tutsun" [XVIIIc.s.244].

Heydər Əliyevə məxsus izahlı nitq auditoriyaları fəth etməyə imkan yaradır. Azərbaycan Milli Televiziyasının 40 illiyi münasibətilə təntənəli yubiley gecəsində, 17 fevral 1996-cı

ildə Heydər Əliyev çıxışında televiziya anlayışına tərif verir: "Televiziya bütün informasiya orqanlarından ən kütləvisidir". Sonra poetik bir çalarla televiziyanın vacibliyini vurğulayır: "İndi heç kəs öz həyatını televiziyasız təsəvvür edə bilməz.

Yəqin ki, televiziyasız yaşamaq da mümkün olmaz" [Vc.s.343]. Televiziya əməkdaşları necə vacib bir sahədə çalışdıqlarının fərqinə varır, böyük bir rəğbətlə natiqi dinləyirlər.

Böyük natiq televiziyanı "böyük bir aləm" adlandırır. İnsanların estetik tərbiyəsində teatr və kinonun xidmətlərini xüsusi qeyd edərək televiziyanın bu iki "çox mühüm sahəni" birləşdirməsini auditoriya üçün açıqlayır: "Teatrı biz vaxtilə çox yüksək qiymətləndirirdik və bu gün də yüksək qiymətləndiririk. Çünki insanların estetik tərbiyəsində, onların mədəni səviyyəsinin artmasında, insanların mənəvi cəhətdən formalaşmasında teatr həmişə çox böyük rol oynamışdır. Sonra teatrla bərabər kino bu rolu oynamağa başladı. Dünyada televiziya meydana gələndən sonra televiziya bu iki çox mühüm sahənin fəaliyyətini, ola bilər, bir qədər məhdudlaşdırsa da, eyni zamanda onların əldə etdiyi nailiyyətləri geniş kütlələrə çatdırmaq üçün ən gözəl, ən gərəkli bir vasitə oldu" [Vc.s.344].

Böyük natiq televiziyanın cəmiyyətdəki rolunu auditoriyaya bir-bir açıqlayır. Bu mühüm informasiya vasitəsinin Azərbaycan dilinin inkişafında, daha da təkmilləşməsindəki rolunu milyonlara çatdırır: "Azərbaycan dilinin təbliği sahəsində televiziya çox iş görə bilər. Tamaşaçılar qarşısında çıxış edən televiziya işçiləri Azərbaycan dilində nə qədər səlis, gözəl, şirin, mədəni danışsalar, o qədər də hər bir Azərbaycan vətəndaşı öz dilini sevəcək, həmin televiziya verilişlərindən özləri üçün nümunələr götürəcək və öz dilini inkişaf etdirəcəkdir. Bu, televiziya işçiləri qarşısında duran çox böyük vəzifədir və mən bunu xüsusi qeyd edirəm" [Vc.s.350].

Televiziyanın gücünü "məhz" dəqiqləşdirici ədatla çatdıran ulu öndər bir müraciətlə milyonların Prezident Sarayı qarşısındakı meydana topladığını dilə gətirir, "bu nə qədər güclü bir silah imiş!" deməklə heyrətini auditoriyaya açıqlamaqla dinləyiciləri də heyrətə gətirə bilir: "Lakin mən həmin o oktyabr gecəsi dövlət çevrilişi cəhdi başlanan zaman məhz bizim milli televiziyadan istifadə etdim. Bu, nə qədər güclü bir silah imiş! Bu, bütün silahlardan da güclü bir silah imiş! Gecə vaxtı mən televiziya vasitəsilə xalqa müraciət etdim, xalqı Azərbaycan dövlətçiliyinin qorunmasına dəvət etdim. Məhz televiziya vasitəsilə biz buna nail ola bildik" [Vc.s.348].

"Hər bir vətəndaşın" gözü qabağında olan televiziyaya fərqli baxışların olacağını təbii qəbul edən Heydər Əliyev televiziya işçilərini öz üzərlərində ciddi çalışmağa dəvət edir. Televiziya tamaşaçılarının fikir müxtəlifliyinə hörmətlə yanaşan böyük natiq "televiziyanın verilişlərinə heç vaxt birmənalı qiymət vermək mümkün deyil" fəlsəfəsini ortaya qoyur: "Lakin bunu da qeyd etmək lazımdır ki, televiziya hər bir vətəndaşın gözünün qabağındadır. Ona görə də televiziyanın fəaliyyətindəki nöqsanlar dərhal gözə çarpır, bəzən də televiziyanın verilişlərinə hərə öz fikri, öz ağlı, öz dünyagörüşü ilə qiymət verir. Buna görə də hesab edirəm ki, televiziyanın verilişlərinə heç vaxt birmənalı qiymət vermək mümkün deyil. Çünki hərə bu verilişləri bəlkə də öz istədiyi kimi görmək istəyir. Odur ki, televiziyanın verilişlərinə aid cürbəcür iradlar, cürbəcür tənqidlər ola bilər və bunlar da təbiidir. Televiziya işçiləri gərək öz işlərini elə qursunlar ki, belə tənqidlər az olsun və onların işində nailiyyətlər daha çox olsun" [Vc.s.349]

Heydər Əliyev televiziya ilə "Azərbaycan həyatının" qurulmasında iştirak edən insanlar arasındakı dialektik vəhdəti auditoriya üçün açıqlayır. "İnsanların mənəvi tərbiyəsində, mənəvi inkişafında televiziyanın rolu çox böyükdür" deyən

böyük natiq həm də aşağıdakı fikirlərin müəllifidir:“Eyni zamanda, əgər Azərbaycanın həyatının bütün sahələrində çalışan tanınmış adamlar, mütəxəssislər televiziya verilişlərinin hazırlanmasına cəlb olunmasaydı, televiziya istənilən səviyyədə fəaliyyət göstərə bilməzdi” [Vc.s.345].

Heydər Əliyev xarici siyasətimizlə bağlı bir sıra anlayışlara aydınlıq gətirir. Diplomatiya anlayışına verilən tərif də bu sıradan olan izahdır: “Məsələn, nə bilim, hansısa diplomatik bir universitet yaranıbdır, filan olubdur. Diplomatiya, ümumiyyətlə, dövlətin inhisarındadır. Nədir diplomatiya? Diplomatiya hər bir dövlətin xarici siyasətini həyata keçirən təşkilatdır və onun kadrlarıdır. Buna diplomatiya deyirlər və o kadra da diplomat deyirlər. Bunu özəl bir yerdə hazırlayırlar. Axı, bu dövlətin işidir. Özəl bir qurum, yaxud da dövlətlə bağlı olmayan bir qurum həqiqətən müstəqil Azərbaycan dövləti üçün diplomatlar hazırlaya bilərmi? İnanıram ki, lazımi səviyyədə yox. – Onlar oxuyacaqlar, təhsil alacaqlar, diplom da alacaqlar. Amma ola bilər, qeyri bir özəl sektorda işləsinlər. Buna heç kəs mane ola bilməz. Amma dövlət sisteminin diplomatiyasında yer tutmaq üçün, əlbəttə ki, onlar dövlət diplomatiyası ilə tanış olmalıdırlar, dövlət diplomatiyası təhsili almalıdırlar. Hansısa bir kəsin özəl diplomatik təhsilini almamalıdırlar” [XVc.s.24].

“Diplomatiya” anlayışından sonra böyük natiq “diplomat” anlayışını auditoriya üçün aşıqlayır, “diplomat” peşəsinə özünəməxsus Heydər Əliyev tərifini verir: “Bu mövzuya toxunduğuma görə öz fikrimi demək istəyirəm. Dövri-qədimdən bütün dövlətlərin tarixində diplomat peşəsi ən hörmətli, ən şərəfli peşədir. Keçmiş tarixə baxsaq, hansı ölkənin tarixini götürsək, diplomatik işlərə hər bir ölkədə ən yuxarı təbəqədən, ən hazırlıqlı, bilikli, savadlı, ən zəkalı adamları təyin edirdilər. “Diplomat” deyəndə adamın gözünün qabağına nə gəlir? Ən

yüksək savadlı, ən yüksək mədəniyyətli, ən gözəl görünüşlü, yaxşı geyimli, yaxşı tərbiyəsi ilə, cəmiyyətdə özünü aparmağı ilə fərqlənən insanlar... Hesab edirəm ki, bizim gənc, müstəqil Azərbaycanımızda da gərək çox dəyərli, yüksək hörmətə malik olan diplomatlar korpusu yaransın. Şübhəsiz ki, burada xüsusi, daxili meyli olan adamlar olmalıdır. Təkcə daxili meyli yox, – ola bilər, meyli, istəyi olsun, amma bunun üçün isdedadı olmasın, başqa xüsusiyyətləri çatmasın. Elə adamlar olmalıdır ki, hər bir diplomatımızla fəxr edək ki, bizim diplomatımız dünyada, nə təhər deyərlər, üzə çıxarıla bilən, – xalq arasında belə bir söz var – qabağa çıxa bilən bir diplomat olsun. Belə olmalıdır” [XVc.s.24].

Müstəqilliyin ilk illərində Azərbaycan diasporunun formalaşması yolunda Heydər Əliyevin xidmətləri əvəzsizdir. Bu gün bütün dünyada təşəkkül tapan Azərbaycan diasporunun yaranması məhz Heydər Əliyev siyasətinə borcludur. Xaricdə yaşayan soydaşlarımızla bağlı “lobbi”, “diaspor” anlayışlarını da siyasi lüğətimizə ilk dəfə ulu öndər gətirir: “Bəzən azərbaycanlılar öz aralarında danışarkən fikirləşirlər ki, bizim də ermənilərinki kimi lobbimiz olsaydı, başqa ölkələrdə bizim də diasporumuz olsaydı, şübhəsiz, onlar da bizdən ötrü çox iş görərdi. Bu həqiqətdir” [VIc.s.176].

“Xaricdə Azərbaycan lobbisinin yaranmasına nə kimi kömək göstərilə bilər?” sualına cavab verilir. Lobbiçiliyin süni surətdə yaranmadığını vurğulayır. Lobbiçilik üçün nələrin tələb olunduğunu sadə, anlaşıqlı şəkildə auditoriyaya çatdırır: “Güman edirəm ki, burada gərək xaricdə yaşayan azərbaycanlıların özləri fəal, təşəbbüskar olsunlar. Çünki lobbi süni surətdə yaranmır. Xarici ölkələrdəki lobbilər insanların öz vətəni, milləti ilə bağlılığından asılıdır. Amerikanın erməni millətindən olan ən zəngin adamlarından biri, – adını çəkmək istəmirəm – bəlkə də heç vaxt Ermənistanı görməyib, orada

yaşamayıb amma daim Ermənistana maddi yardım edir. Eyni zamanda Amerikada, Avropada Ermənistan haqqında hansı fikir istəyir onu da yaradır” [VIc.s.178].

Heydər Əliyev poetik bir deyimlə dünyada yaşayan Azərbaycanlıların qəlbinin doğma, müstəqil Azərbaycanla bir vurmasını tələb kimi qarşıya qoyur: “Dünyada 40 milyondan artıq azərbaycanlı yaşayır. Burada, belə bir şimal ölkəsində 1500 azərbaycanlının yaşaması özü böyük qüvvədir. Ancaq elə ölkələr var ki, orada milyonlarla azərbaycanlı yaşayır. Azərbaycanlıların vətəni var – müstəqil Azərbaycan dövləti, azərbaycanlı hər yerdə yaşaya bilər, ancaq azərbaycanlı öz dilini, dinini, milli ənənələrini unutmamalııdr. Onun qəlbi daim doğma Azərbaycanla, müstəqil Azərbaycanla bir vurmalıdır. Harada yaşayır – yaşasın – Norveçdə, İsveçrədə, Amerikada, Fransada, İngiltərədə, başqa ölkələrdə – fərqi yoxdur” [VIc.s.181-182].

Heydər Əliyev xaricdə yaşayan soydaşlarımızı həmişə təşkilatlanmağa təşviq edir və bu yolda əminliyini dilə gətirir. Bir-birinə zidd olacaq təşkilatların yaranmasını qəbul etmir. Onları “Qurani-Şərifin” tələblərinə – “öz aramızda səmimi, dost, mehriban olmalıyıq, bir-birimizə kömək etməliyik, bir-birimizin qayğısına qalmalıyıq” – tələblərinə qulaq asmağa çağırır: “Ancaq bir şey məni narahat edir ki, ayrı-ayrı ölkələrdə yaşayan azərbaycanlılar bəzən parçalanırlar. Burada dediniz ki, iki təşkilat yaratmısınız, biri assosiasiyadır, o birisi kültür dərnəyidir. Bu, ola bilər, şübhəsiz mən demirəm ki, hamı bir təşkilat olsun. Ancaq bu təşkilatlar eyni istiqamətdə işləyirlərsə, bir-biri ilə dostdurlarsa, qoy olsun. Yaxud kiçik bir yerdə bir təşkilat digəri ilə rəqabət aparırsa, ya da bəzən bir-birinə zidd gedirsə bu, lazım deyildir. Kənardan bizə olan mənfi hərəkətlər kifayətdir, lazım deyildir. Öz aramızda səmimi, dost, mehriban olmalıyıq, bir-birimizə kömək etməliyik,

bir-birimizin qayğısına qalmalıyıq. Bu, "Qurani-Şərifin" bizə verdiyi nəsihətlərdir, xalqımızın, millətimizin əsrlər boyu, tarixdən gələn ənənələridir, azərbaycanlıların ən yüksək keyfiyyətləri, xüsusiyyətləridir" [VIc.s.182].

"Mənim dostum cənab Şevardnadze bu gün çıxış edərkən dedi ki, Gürcüstanda yaşayan azərbaycanlılara o diaspor demək istəmir. Tamamilə düzgün deyir, heç diaspor demək olmaz. Çünki bu kənardan gəlmiş azərbaycanlılar deyil ki, onlara diaspor deyək. Onlar burada əsrlər boyu yaşamış, yaratmış azərbaycanlılardır" [Vc.s.441].

Xaricdə işgüzar səfərlərdə olan Heydər Əliyev vaxtının məhdudluğuna baxmayaraq həmişə xarici ölkələrdəki soydaşlarımızla görüş keçirməyə imkan tapır. 27 avqust 1997-ci il tarixdə, Varşava şəhərində Polşadakı azərbaycanlılarla görüşdə dediyi kimi: "Mənə məlumat verdilər ki, siz mənimlə görüşmək istəyirsiniz. Mənim proqramım çox gərgindir, ancaq bir halda ki, burada azərbaycanlılar var, qərara aldım ki, sizinlə görüşüm" [XIIc.s.82].

Yer kürəsini hamının Vətəni kimi qəbul edən Heydər Əliyev soydaşlarımızın müxtəlif ölkələrdə məskunlaşmasını təbii qəbul edərək bunu taleyin işi hesab edir. O, bunu ölkəmizin dünyada tanınması yolunda müsbət bir hal kimi qiymətləndirir: "Mən heç də bilmirdim ki, Ukraynada 500 min azərbaycanlı yaşayır. Bu, böyük rəqəmdir. Şübhəsiz ki, azərbaycanlıların Ukraynada yaşaması nə sizdən, nə də məndən asılı deyildir. Bu, hər kəsin öz taleyidir – gəlib, buraya düşüb, yaşayır. Mən buna mənfi bir hal kimi baxmıram, əksinə, müsbət bir hal kimi baxıram. Çünki hər bir millət yalnız öz torpağında cəmləşib yaşamamalııdr. Bilirsiniz ki, hansı millətin nümayəndələri bir çox başqa ölkələrdə yaşayırsa, onlar öz xalqları, ölkələri üçün orada yaxşı təmsilçi olurlar. Ona görə də bunun xeyri var, zərəri yoxdur" [IXc.s.72].

Xaricdəki soydaşlarımızla səmimi söhbətlərində onlara Azərbaycanla daim əlaqə saxlamağı tövsiyə edir. Hər bir soydaşımızı "azərbaycanlı olduğunu unutmamağa", "hamımızın ümumi vətəni olan Azərbaycana" kömək göstərməyə çağırır. 11 oktyabr 1997-ci il tarixdə Strasburqda soydaşımız professor İren Məlikova ilə görüşdə bu fikirlər öz əksini tapır: "İren xanım, səmimi söhbətinizə və Azərbaycanla yaxından əlaqə saxladığınıza görə təşəkkür edirəm. Arzu edirəm ki, nəinki Strasburqda, həm də bütün Fransada yaşayan soydaşlarımız Azərbaycanla əlaqəni daim gücləndirsinlər. Bunu mütləq bilməli və dərindən dərk etməliyik ki, haradan gəlməsindən asılı olamayaraq, xaricdə yaşayan hər bir soydaşımız azərbaycanlı olduğunu unutmamalı, hamımızın Azərbaycan Respublikasına köməyini göstərməlidir" [XIIc.s.325].

Ulu öndər soydaşlarımızın vəziyyətini həmişə bilmək istəyir: "İstəyirəm biləm ki, Ukraynada nə qədər azərbaycanlı var, burada necə yaşayırsınız, nə iş görürsünüz, vətənlə əlaqəniz necədir, hansı problemləriniz var? Doğrudur, mənə dedilər ki, vaxt çox azdır. Ancaq bu az müddətdə də bir şey öyrənmək, demək olar" [IXc.s.72].

Ulu öndər soydaşlarımızın taleyinə həssas yanaşaraq soydaşlarımızla bağlı məsələləri onların məskunlaşdığı ölkələrin dövlət başçıları səviyyəsində həll edir: "Dedilər ki, burada yaşayan azərbaycanlıları bəzən incidirlər. Onları kim, necə incidir? Bu gün mən Ukrayna prezidenti ilə görüşəcəyəm, ona nə deməliyəm? Deməliyəm ki, kimi necə incidirlər?" [IXc.s.72].

Diaspor nümayəndələri Heydər Əliyevlə baş tutan görüşlərdə onun problemlərə incəliklərinə qədər bələd olmasını görürlər. Həmişə çıxış və nitqlərində səmimiyyətə söykənən Heydər Əliyev burada da soydaşlarımızı yaşadıqları dövlətin qayda-qanunlarına hörmət etməyə çağırır: "Gəlin açıq danışaq, ola bilər ki, bəzi azərbaycanlılar cinayət edirlər, qanunu

pozurlar, nalayiq iş görürlər. Bunların da nəticəsində azərbaycanlıların hamısına belə bir münasibət bəslənilir. Hesab edirəm ki, bunlar aradan götürülə biləsi hallardır" [IXc.s.74].

Ukraynada yaşayan azərbaycanlılarla görüşdə biz Heydər Əliyevin şəxsində övladalarına üz tutub xahiş edən bir ağsaqqal görürük. Öncə poetik bir dillə "gərək nəbzin vətənin nəbzi ilə vursun" ifadəsi, onun arxasınca qətiyyətli dövlət başçısına xas olan "bu vətənpərvərlik hissi bizim hər birimizdə olmalıdır" qətiyyətli ifadəsi işə düşür. Xaricdə yaşayan azərbaycanlılar auditoriyası səfərbər olunur: "Ancaq sizdən bir xahişim vardır: Harada yaşamasından asılı olamayaraq heç bir azərbaycanlı öz vətənini, ulu babalarını, dilini unutmamalıdır. Harada yaşayırsansa-yaşa, yaxşı da, pis də, gərək ürəyin öz vətəninlə, torpağınla döyünsün. Gərək nəbzin vətənin nəbzi ilə vursun. Bu vətənpərvərlik hissi bizim hər birimizdə olmalıdır. O cümlədən, respublikamızdan kənarda, Ukraynada yaşayan azərbaycanlılarda da olmalıdır" [IXc.s.78].

Bakı şəhərində, xaricdə yaşayan soydaşlarımızın bir qrupu ilə 9 yanvar 1994-cü il tarixdəki görüşündə soydaşlarımız qarşısında qoyulan mənəvi məsuliyyət sadalanır, Azərbaycan, Vətən anlayışları böyük natiqin dilində yeni çalarlarla auditoriyalara çatdırılır. "Hər bir millətin, hər bir insanın ana torpağı onun Vətənidir" ifadəsini hər bir Azərbaycan vətəndaşı üçün məhək daşına döndərir: "Ölkənin ağır vaxtında prezident seçiləndə, prezident kürsüsünə qalxanda da, andiçmədə də mən təkcə Azərbaycanın ərazisində olan azərbaycanlılara yox, bütün dünyada yaşayan azərbaycanlılara müraciət etdim. Bildirdim ki, respublikanın bu ağır dövründə hər bir azərbaycanlı, damarlarından azərbaycanlı qanı axan hər bir insan gərək Vətənin bu gününə yansın, münasibətini bildirsin, kömək etsin. Çünki azərbaycanlının Azərbaycandan başqa Vətəni yoxdur. Almaniyada yaşaya bilərsiniz, həm də çox firavan yaşaya

bilərsiniz, Fransada, Amerikada da yaşaya bilərsiniz, varınız da, dövlətiniz də olar. Amma o ölkələr sizin vətəniniz ola bilməz. Bunu təkcə azərbaycanlıya aid etmək olmaz. Hər bir millətin, hər bir insanın ana torpağı onun vətənidir. Azərbaycanlıların da vətəni Azərbaycandır” [Ic.s.321].

Heydər Əliyev soydaşlarımızla baş tutan görüşlərdə onları “pərakəndə”, “dağınıq” olduqları üçün qınağa çəkir, onları birləşdirməyə sövq edən sərt ifadələr işlədir: “Az adam toplaşmışdı. Bu o, demək deyil ki, Fransada azərbaycanlılar az yaşayır. Xeyr, çox yaşayır. Amma, sizin dediyiniz kimi pərakəndə, dağınıqdırlar, bir-biri ilə əlaqələri azdır. Siz dediniz ki, Almaniyada ticarətin çoxu azərbaycanlıların əlindədir. Elə Fransada da ticarətin bir hissəsi azərbaycanlıların əlindədir. Amma onlar birləşməyiblər, bəziləri hələ də öz vətənlərini tanımır, öz vətənləri olduğunu dərk etmirlər” [Ic.s.323].

“Həqiqətə çatmaq üçün ən kiçik imkandan belə istifadə olunmalıdır!” fəlsəfi fikrinə söykənən Heydər Əliyev soydaşlarımızı təşəbbüs göstərməyə, səyləri birləşdirməyə səsləyir. Yenə də ermənilərlə müqayisə, paralel aparmaqla soydaşlar auditoriyasını öz cazibədar nitqi ilə sabahkı günlərə hazırlayır: “Erməni lobbisinə Ermənistanda heç kim rəhbərlik etmir. Onlar öz vətənlərinə, millətlərinə, torpaqlarına o qədər bağlıdırlar ki, orada da (Amerikada) öz imkanlarından istifadə edirlər. Şübhəsiz ki, xarici ölkələrdə yaşayan azərbaycanlıların belə imkanları yoxdur, mən bunu bilirəm. Ancaq, hətta ən kiçik imkandan da istifadə etmək lazımdır. Demək, təşəbbüs birinci növbədə gərək sizin özünüzdən olsun. Axı siz niyə gərək üç ildən bir görüşəsiniz? Tez-tez görüşün. Ermənilər hara gedirlər, özlərinə bir məktəb, kilsə və s. açırlar. Kimin harada işləməsindən asılı olamyaraq mütləq bu kilsəyə gəlməlidir. Məktəbdə erməni dilində oxumalıdırlar, erməni dilin-

də qəzet buraxmalıdırlar. Təəssüf ki, bu xüsusiyyət bizim millətimizdə yoxdur" [IIIc.s.381].

Ulu öndər diaspor təşkilatları ilə bağlı narahatçılığını dilə gətirir, təşkilatdaxili demokratiyanı qəbul edir, bir-birinə "zidd" hərəkətləri isə lazımsız hesab edir. Qurani-Şərifin bizə verdiyi nəsihətlər əsasında icmaları öz aralarında səmimiyyətə, dostluğa, mehriban olmağa, bir-birinə kömək etməyə çağırır: "Güman edirəm ki, mənim bu sözlərimdən hərə özü üçün nə lazımdırsa götürəcəkdir. Ancaq bir şey məni narahat edir ki, ayrı-ayrı ölkələrdə yaşayan azərbaycanlılar bəzən parçalanırlar. Burada dediniz ki, iki təşkilat yaratmısınız, biri assosiasiyadır, o birisi kültür dərnəyidir. Bu, ola bilər, şübhəsiz mən demirəm ki, hamı bir təşkilat olsun. Ancaq bu təşkilatlar eyni istiqamətdə işləyirlərsə, bir-biri ilə dostdurlarsa, qoy olsun. Yaxud kiçik bir yerdə bir təşkilat digəri ilə rəqabət aparırsa, ya da bəzən bir-birinə zidd gedirsə bu, lazım deyildir. Kənardan bizə olan mənfi hərəkətlər kifayətdir, lazım deyildir. Öz aramızda səmimi, dost, mehriban olmalıyıq, bir-birimizə kömək etməliyik, bir-birimizin qayğısına qalmalıyıq. Bu, "Qurani-Şərif"in bizə verdiyi nəsihətlərdir, xalqımızın, millətimizin əsrlər boyu, tarixdən gələn əməlləridir, azərbaycanlıların ən yüksək keyfiyyətləri, xüsusiyyətləridir. Bunları itirmək lazım deyildir, əksinə özündə toplamalı və başqalarına da çatdırmalıdır ki, hamımız bir olaq" [VIc.s.182].

Hər yerdə olduğu kimi Heydər Əliyevin səmimiyyəti diaspor təşkilatları qarşısındakı çıxışlarda da özünü büruzə verir. Qazaxıstanda yaşayan Azərbaycan diasporunun nümayəndələri ilə 11 iyun 1997-ci il tarixli görüşündəki çıxışda səmimi bir məzəmmətlə üzünü dünyada yaşayan soydaşlarımıza tutur: "Bizim Azərbaycan millətinin bir balaca zəifliyi vardır. Bu zəiflik də odur ki, assimilyasiyaya tez düşür. Bizim millət assimilyasiyaya, necə deyərlər, yatımlı bir millətdir. Bunu de-

məyə mənim əsasım vardır. Çox sağ olun ki, siz belə deyilsiniz, amma belələri var. Bu məni narahat edir” [Xc.s.129].

Türkiyədə yaşayan Azərbaycan diasporunun nümayəndələri ilə görüşdəki çıxışlarda səmimiyyət daha dərin, daha ülvidir. “Bizim xalqımız, millətimiz birdir. Sadəcə, ərazilərimiz bir-birindən ayrıdır” ifadəsi bir daha Azərbaycan-Türkiyə dostluğunun sarsılmaz tellərlə bağlılığını sübut edir: “Əziz dostlar, qardaşlar, mən sizə təşəkkür edirəm. Siz azərbaycanlı olaraq, Azərbaycan mənşəyinə mənsub olaraq eyni zamanda türksünüz, Türkiyə vətəndaşısınız. Siz Türkiyədə doğulmusunuz, böyümüsünüz, Türkiyənin ab-havası ilə yaşamısınız. Türkiyədə özünüzə məkan, vətən tapmısınız. Bizim xalqımız, millətimiz birdir. Sadəcə, ərazilərimiz bir-birindən ayrıdır. Bizim iki dövlətimiz, bir xalqımız var. Buna görə də Türkiyədə yaşayan azərbaycanlı da türkdür, azərbaycanlıdır, Azərbaycanda yaşayan türk də türkdür və azərbaycanlıdır” [IXc.s.302].

Xaricdə Azərbaycan lobbisinin fəaliyyətini gücləndirmək baxımından dövlət başçısının “səfirliyimiz lazımi iş görsün”, “kömək etsin”, “bu əlaqəni qursun”, “mən ondan tələb edirəm ki”, “ciddi məşğul olsun”, “məşğul olmalıdırlar”, “iş görmək lazımdır” – qətiyyətli ifadələrin üstünlük təşkil etdiyi nitqin şahidi oluruq. Bu kiçik nitq parçası digər ölkələrdəki səfirliklər üçün də ciddi tapşırıqdır: “Digər tərəfdən, xarici ölkələrdəki Azərbaycan lobbisinin fəaliyyətini gücləndirmək üçün gərək bizim nümayəndələrimiz, səfirliyimiz lazımi iş görsün. Burada respublikamızın səfiri neçə ildir işləyir, özü də təcrübəli adamdır. Gərək o gecə-gündüz bu işlərlə məşğul olsun. Baxsın, harada azərbaycanlı var ona kömək etmək lazımdırsa kömək etsin, onu başqa azərbaycanlı ilə bağlamaq mümkündürsə bu əlaqəni qursun. Burada, əlbəttə, səfirlikdən çox şey tələb olunur. Səfir buradadır mən ondan tələb edirəm ki, bu işlərlə Almaniyada ciddi məşğul olsun. İndi buraya, Belçikaya

səfir təyin etdik. O da məşğul olsun. Başqaları da məşğul olmalıdırlar. Əl-ələ vermək, iş görmək lazımdır" [IIIc.s.381].

Soydaşlar auditoriyasında, diaspor azərbaycanlılar auditoriyasında Heydər Əliyev nikbindir. Dünya azərbaycanlılarının həmrəyliyinin sözdə yox, əməli işdə həyata keçəcəyinə əminliyini dilə gətirir: "Mən arzu edirəm ki, vətənpərvərlik hissiyyatları sizdə daha çox olsun. Əminəm ki, indi burada Azərbaycanın Ukraynadakı səfirliyi ətrafında daha çox toplaşacaqsınız, bir-birinizlə daha yaxşı ünsiyyət, əlaqə yaradacaqsınız, birləşəcəksiniz, həmrəy olacaqsınız, bir-birinizə kömək edəcəksiniz, dayaq olacaqsınız. Eyni zamanda Azərbaycanın qayğıları ilə yaşayacaqsınız" [IXc.s.78].

Azərbaycançılıq ideyası ətrafında birləşməyi nitq və çıxışlarında ulu öndər qətiyyətlə tələb edir. Bu zaman "unutmamalıdır", "bir vurmalıdır" kimi qətiyyətli ifadələr diaspor nümayəndələrini səfərbər edir: "Azərbaycanlıların Vətəni var-müstəqil Azərbaycan dövləti, azərbaycanlı hər yerdə yaşaya bilər, ancaq azərbaycanlılığını, öz dilini, dinini, milli ənənələrini unutmamalıdır. Onun qəlbi daim doğma Azərbaycanla, müstəqil Azərbaycanla bir vurmalıdır. Harada yaşayır-yaşasın – Norveçdə, İsveçrədə, Amerikada, Fransada, İngiltərə, başqa ölkələrdə – fərqi yoxdur" [VIc.s.181].

Bütün çıxış və nitqlərinə bir məntiqi ardıcıllıq xas olan Heydər Əliyevin diaspor nümayəndələri ilə görüşlərində də bu ardıcıllıq gözlənilir. Çıxışların başlanğıcında "doğma yurddan, doğma diyardan" salamlar gətirilməsi durursa, sonrakı mərhələdə diaspor qarşısında ölkəmizin vəziyyəti barəsində, görülən işlər barəsində məlumat verilir: "Sizin hamınızı – Norveçdə, İsveçrədə yaşayan azərbaycanlıları səmimi qəlbdən salamlayır, doğma yurdunuzdan, diyarınızdan – Müstəqil Azərbaycan Respublikasından ən qızğın salamlar çatdırıram" [VIc.s.180].

Diasporla tarixən məskunlaşmış əhalinin fərqini yüksək siyasi fəhmlə xalqa çatdırır. Gürcüstan ərazisindəki "azərbaycanlıları diaspor adlandırmaq olmaz" deyimi ilə Heydər Əliyev Borçalı diyarı və digər diyarlarımızda məskunlaşan azərbaycanlıları öz tarixi ərazilərimizdə möhkəm durmağa, öz tarixi haqlarının bərpası yolunda monolit birliyə səsləyir. Və öz fikirlərində tək olmadığını, bu işdə Gürcüstan prezidenti Eduard Şevardnadzenin də ona dəstək olmasını qeyd edir: "Borçalı diyarı Gürcüstan üçün doğma olduğu kimi Azərbaycan üçün də əziz olmuşdur, bu gün də əzizdir. Ona görə də Gürcüstanda yaşayan azərbaycanlılar öz vətənlərində yaşayırlar. Mənim dostum cənab Şevardnadze bu gün çıxış edərkən dedi ki, Gürcüstanda yaşayan azərbaycanlılara o, diaspor demək istəmir. Tamamilə düzgün deyir, heç diaspor demək olmaz. Çünki bu kənardan gəlmiş azərbaycanlılar deyil ki, onlara diaspor deyək. Onlar burada əsrlər boyu yaşamış, yaratmış azərbaycanlılardır. Ona görə də, əziz bacılar, qardaşlar bu sizin doğma vətəninizdir. Bu, sizin doğma torpağınızdır. Siz öz vətəninizdə, doğma torpağınızda yaşayırsınız" [Vc.s.441].

İcma nümayəndələri ilə söhbətlərdə Heydər Əliyev "biz kimik" sualını verir və auditoriya "bir millətik", "bir xalqıq" cavabını eşidir. 20 oktyabr 1995-ci ildə, ABŞ-da yaşayan türk evindəki görüşdə olduğu kimi: "Azərbaycan müstəqil dövlətdir və müstəqil dövlət kimi dünyanın hər bir ölkəsi ilə sərbəst əlaqələr qurur. Biz Azərbaycanda müstəqil dövlət kimi yaşayaraq, eyni zamanda dünyada yaşayan bütün azərbaycanlılar, bütün türklər haqqında düşünürük. Hamımız bir millətik. Hamımız bir kökə məxsus xalqıq. Azərbaycanda yaşayanların, Azərbaycandan gəlib burada, Amerikada, İranda, Türkiyədə, İngiltərədə də digər ölkələrdə də yaşayanların hamısı birdir" [IVc.s.384].

Heydər Əliyev ölkəmizin qüdrətinin getdikcə güclənəcəyini də, diaspor təşkilatların daha da mütəşəkkil olacağını da qabaqcadan proqnozlaşdırır: "Ölkəmiz, dövlətimiz möhkəmləndikcə, güclədikcə, inkişaf etdikcə, imkanlarımız artdıqca biz Azərbaycandan kənarda yaşayan soydaşlarımızla əlaqələri daha da genişləndirəcəyik və bu qayğını da, yardımı da artıracağıq. Ancaq respublikamızda yaşayan azərbaycanlıların vəziyyəti indi hələ ki, çox ağırdır" [Xc.s.130].

Ulu öndər dünyadakı bütün azərbaycanlıların qayğısına qalır, bir prezident kimi soydaşlarımızın taleyi üçün özünü məsul, cavabdeh hesab edir. Onların dünya ölkələrinə "səpələnməsini" təbii qəbul edir, bunun köklərini diaspor nümayəndələri qarşısında açıqlayır: "Bilirsiniz, Azərbaycan müstəqil dövlət olandan sonra biz dünyada olan bütün azərbaycanlıların qayğısını çəkirik. Ona görə də biz 31 dekabrı dünya azərbaycanlılarının həmrəylik günü elan etmişik. Keçmişdə belə olub ki, azərbaycanlılar dünyanın çox ölkələrinə səpələniblər. Təbii olaraq bəziləri özləri gediblər, bir çoxlarını həyat məcbur edib, bəzilərini isə Sovet hakimiyyəti dövründə sürgün ediblər. İndi hərə bir yerdə özünə məskən tapıb, yaşayır. Çoxları özünə yaxşı həyat qurub, təhsil alıb, ailə qurublar. Bu, bizi çox sevindirir. Azərbaycan prezidenti kimi, mən dünyanın hər bir yerində yaşayan azərbaycanlıları soydaşlarımız və onlara görə özümü cavabdeh hesab edirəm. Doğrudur, mən bütün azərbaycanlıların hamısını əhatə edə bilmərəm. Amma azərbaycanlıların bir müstəqil ölkəsi, dövləti var, o da Azərbaycan Respublikasıdır" [Xc.s.129].

Bu gün diaspor təşkilatları ilə iş aparmaq, bu təşkilatların güclənməsinə qayğı və kömək göstərmək böyük Vətənimizin – Azərbaycanın hər bir vətəndaşının şərəfli borcudur. Bu borcu yerinə yetirmək yolunda hər birimizin Azərbaycan döv-

lətçiliyi ətrafında, ölkə prezidenti möhtərəm İlham Əliyev cənabları ətrafında monolit birliyi tarixi zərurətdir.

Heydər Əliyev ziyalı sözünün mənasını auditoriyalara anladır. "Ziyalı kimdir" sualına cavab axtaranlara kömək edir. "Ziyalının cəmiyyətdə hörməti qalxmalıdır!" qətiyyətini ortaya qoyur. Xalq şairi Məmməd Arazın "Azərbaycan – dünyam mənim" yaradıcılıq gecəsindən sonra ziyalılarla görüşdəki kimi: "Cəmiyyət böyükdür, xalq böyükdür. İndi bizdə yeddi milyon əhali var. Bunlar hamısı bizim cəmiyyətdir. Amma xalqın içərisindən çıxan bu ziyalılar tək-təkdir. Bunlar kütləvi deyil axı! Ziyalı kütləvi ola bilməz. Alimdir, şairdir, bəstəkardır, rəssamdır, yazıçıdır, artistdir – bunlar fitri istedada malik olan nadir adamlardır və öz mədəniyyəti, yaradıcılığı, fəaliyyəti ilə bizim cəmiyyətin mədəni səviyyəsini qaldırırlar. Bu adamları təhqir etmək, onlara hörmət etməmək son illərdə cəmiyyətimizdə olan əcaiblikdir. Biz bunlara son qoymalıyıq. Ziyalının hörməti qalxmalıdır, müəllimin hörməti qalxmalıdır, şairin, yazıçının, alimin hörməti qalxmalıdır. Onlar hörmətli olmalıdırlar həmişə" [IIIc.s.366].

Ziyalı sözünün mənasını "məhz" dəqiqləşdirici ədatının köməyi ilə Heydər Əliyev 24 noyabr 1995-ci il tarixli Azərbaycan Respublikası Milli Məclisinin ilk iclasında dəqiqləşdirir: "Hər bir xalqın onu təmsil edən qüvvələri var, onlar da bir gündə meydana çıxan qüvvələr deyil. Xalq öz içindən illər boyu, əsrlər boyu istedadlı, bacarıqlı insanları, yüksək təhsilə malik olan, yüksək intellektə malik olan, yüksək tərbiyəyə malik olan, yüksək əxlaqa malik olan insanları hazırlayır, yetişdirir və onlar xalqın tanınmış adamları, hörmətli adamları, ziyalı adamları hesab olunur. "Ziyalı" məhz bu mənanı daşıyır və bu baxımdan hesab edirəm ki, yeni seçilmiş parlament Azərbaycanın, xalqımızın intellektual səviyyəsini, xalqımızın

mənəvi varlığını təmsil edən, təcəssüm edən bir parlamentdir" [Vc.s.12-13].

Ziyalılara qarşı olan münasibətlərini, ziyalı sözünün böyük mənasını Heydər Əliyev 21 sentyabr 1993-cü il tarixli Azərbaycan Milli Elmlər Akademiyasında ziyalılarla görüşündə açıqlayır. Ziyalılarla görüşdən duyduğu məmnunluq hissini auditoriya qarşısında dilə gətirir, ziyalılarla hər bir görüşü bayram kimi təsəvvür edir: "Uzun fasilədən sonra Azərbaycan ziyalıları ilə görüşmək mənə nəsib olduğu üçün məmnun olduğumu bildirmək istəyirəm. Ziyalılarla görüşmək həmişə böyük bir bayram təsəvvürü yaradır" [Ic.s.148].

"Müəllim kimdir, müəllimin cəmiyyətdəki yeri necədir, nə üçün Azərbaycanda müəllim sözü şərəflidir" kimi suallara böyük natiqin dilində ən dəqiq, ən sərrast, ən düzgün cavabları tapmaq olar: "Məktəb, müəllimlər həmişə xalq, insanlar arasında, ictimaiyyətdə hörmət, ehtiram qazanmışlar və buna layiq olmuşlar. Müəllim adı yüksək addır. Azərbaycanda müəllimə daim böyük hörmət olmuşdur. Müəllim cəmiyyətdə tanınan, seçilən, hörmət edilən şəxs olmuşdur. Heç də təsadüfi deyildir ki, dilimizdə insanların bir-birinə müraciət formasında "müəllim" sözü şəxslərin müəllim olub-olmamasından asılı olmayaraq istifadə edilib. Bizdə bu ənənə çoxdan yaranıb və hamı bir-birinə müraciət edərkən qarşısındakı şəxsə hörmət və ehtiram əlaməti olaraq ona "müəllim" deyir. Çoxları heç müəllim deyil, amma biz bir-birimizə müraciət edərkən "ağa", "cənab", "bəy" deyil, "müəllim" deyirik. Bu, təsadüfi deyil. Bəlkə də başqa xalqlarda belə müraciət forması yoxdur. Bu ondan irəli gəlir ki, xalqımız savadsızlıqdan, gerilikdən, ətalətdən bugünkü günə qısa tarixi bir müddətdə gəlib çatmaqda müəllimlərin rolunu qiymətləndirir və qarşısındakı adama hörmət əlaməti olaraq "müəllim" deyir. Ona görə də müəllimin

cəmiyyətdə xüsusi yeri olduğu artıq heç kəsdə şübhə oyatmır”[IIc.s.170-171].

Keçən əsrin 90-cı illərində müəllimlərin iqtisadi çətinliyini səmimiyyətlə dilə gətirən Heydər Əliyev müəllimləri çətin günlərə hazırlaya, onları dözümə çağıra bilir. “Həyat həmişə belə ağır olmayacaq” deyərək onları gələcək günlərə ruhlandırır, “müəllim” sözünün mənasını poetik bir deyimlə auditoriya üçün açıqlayır: “Müəllimlərin maddi vəziyyəti bizi daim narahat edir. Bilirsiniz ki, biz bu məsələlərə bir neçə dəfə baxmış, imkan daxilində müəllimlərin əmək haqqını artırmağa çalışmışıq. Ümumən əhalinin maddi vəziyyətini müəyyən qədər yaxşılaşdırmaq barədə fikirləşir və tədbirlər hazırlayırıq. "Müəllim" sözü o qədər güclü, müəllim adı o qədər yüksək, sözün əsl mənasında o dərəcədə müqəddəsdir ki, müəllimlər gərək bu çətinliklərə dözsünlər, gənc nəslin təlim-tərbiyəsi ilə məşğul olsunlar. Respublikamızın bu ağır dövrünü hamımız birlikdə keçməliyik. Dövlət tərəfindən imkan daxilində bütün tədbirlər görüləcək, ancaq müəllimlər, təhsil sahəsində çalışan başqa işçilər də bilməlidirlər ki, həyat həmişə belə ağır olmayacaq, dözmək lazımdır. Məktəblərin, tədrisin səviyyəsi aşağı düşməməli, müəllim adı öz nüfuzunu itirməməlidir. Müəllim çalışmalıdır ki, özünün müqəddəs vəzifəsini ömrünün axırınadək layiqincə yerinə yetirsin” [IIc.s.177].

1 sentyabr 2000-ci il tarixdə ulu öndər müəllimlər auditoriyasında çıxışı ilə bir daha müəllim anlayışına yeni çalarlar qazandırır. Müəllimə hörmət və ehtiramın necə olduğunu milyonlara çatdırır: “Bizim hamımız həyatımızda əldə etdiyimiz nailiyyətlərə, bütün varlığımıza görə müəllimə borcluyuq. Mən də müəllimə borcluyam, sən də müəllimə borclusan, bu nazirlər də müəllimə borcludur. Ona görə də, mən dəfələrlə demişəm, – bir insan, adi vətəndaş kimi məktəbə qədəm qoyduğum ilk vaxtdan indiyədək mənim müəllimə böyük hör-

mətim, sevgim, məhəbbətim olubdur. Mən həyatımda çox yollardan keçmişəm. Həyatımın bəzi hissələrini bəlkə də indi xatırlaya bilmirəm, amma müəllimləri heç vaxt unutmamışam, hər bir müəllimim bu dəqiqə də gözümün qarşısındadır" [XXIXc.s.413].

"Müəllim" anlayışını izah edən böyük natiq Azərbaycan müəlliminin cəmiyyətdəki rolunu, onların yüksək mənəviyyata malik olmasını qiymətləndirir: "Respublikamızın çox güclü müəllim ordusu var. Azərbaycanın müəllimləri ən yüksək mənəviyyata, vətəndaşlıq hisslərinə malik olan insanlardır. Müəllimlik sənəti şərəfli bir sənətdir. Mən bunu öz həyatımda da, işlədiyim dövrlərdə müəllimlərlə görüşlərdə, danışıqlarda da hiss etmişəm ki, Azərbaycanın müəllimləri bu şərəfli adı ləyaqətlə daşıyıblar və bu gün də daşıyırlar. Baxmayaraq ki, son illər onların həyatında, o cümlədən maddi vəziyyətlərində çətinliklər baş veribdir, ancaq əminəm ki, onlar bu çətinliklərə dözürlər və dözəcəklər" [XIIc.s.129].

2 sentyabr 1996-cı ildə Bakının Nərimanov rayonunda yeni orta ümumtəhsil məktəbinin açılışı mərasimindəki nitqində Heydər Əliyevin müəllimə münasibətinin bir çox tərəfləri açıqlanır. "Mən bu gün müəllim qarşısında baş əyirəm" ifadəsi ilə hamımızı müəllim adına hörmətə çağırır, müəllimləri isə bu şərəfli adı qorumağa səsləyir: "Şəxsən mənim müəllimə həmişə hörmətim olubdur. İndiyə qədər həyatımda keçdiyim yol, mənin biliyim, elmim – hamısı məhz orta məktəbdə aldığım təhsillə bağlıdır. Müəllimlərin mənə verdiyi biliklərlə bağlıdır, müəllimlərin mənə o illərdə oxuyan mənim kimi gənclərə göstərdikləri qayğıkeşliklə bağlıdr, eyni zamanda mənim kimi bizim də, xüsusən mənim də müəllimə böyük hörmətimlə, ehtiramımla bağlıdır. Mən indi də – on illər keçib üstündən – müəllimlərimi heç vaxt unutmamışam və ömrümün son dəqiqəsinə qədər unutmayacağam. Mənim üçün

müəllim adı həmişə ən ülvi, ən şərəfli bir məfhum olubdur. Mən bu gün müəllim qarşısında baş əyirəm, müəllimə hörmət və ehtiramımı bildirir, Azərbaycan müəllimlərinə bundan sonra da öz işlərində uğurlar arzulayır, can sağlığı, səadət diləyirəm” [VIIc.s.262].

Heydər Əliyev müəllimlərə olan sevgisini təkcə içdən gələn, qəlbdən süzülən lətif kəlmələrlə söyləməklə kifayətlənmir, həm də müəllimlər ordusuna əməli kömək göstərilməsini “əmin ola bilərsiniz” ifadəsi ilə gələcəkdə həyata keçirilməsini günün tələbi kimi qarşıya qoyur: “Bizim, təhsil işi ilə məşğul olan nazirliklərin, idarələrin, icra hakimiyyəti orqanlarının, dövlətin, hamımızın borcu ondan ibarətdir ki, bütün çətinliklərə baxmayaraq, məktəblərin müvəffəqiyyətlə fəaliyyət göstərməsini təmin edək, tələbələrin, şagirdlərin təhsil almasına kömək edək.

Mən sizi əmin edirəm ki, öz tərəfimdən və dövlət orqanları tərəfindən bütün imkanlardan istifadə olunmasını təmin etməyə çalışacağam və məktəbə, təhsilə qayğımızı, köməyimizi bundan sonra da artıracağıq. Buna əmin ola biərsiniz” [VIIc.s.263].

“Mənim xatirimdədir” modal sözün köməyi ilə müəllim auditoriyasını Böyük Vətən müharibəsi dövrünə aparır, o ağır, o məşəqqətli, o fəlakətli dövrlərdə müəllim şərəfini qoruyan insanları gənc nəslə tanıdır. Müəllim mənəviyyatının yüksəkliyini xalq qarşısında bəyan etməklə müəllimlər auditoriyasının rəğbətini qazana bilir: “Mənim xatirimdədir, 1941-1945-ci illərdə, İkinci Dünya müharibəsi, Böyük Vətən müharibəsi zamanı məktəblərin, müəllimlərin vəziyyəti indi də gözümün qabağındadır. Xalqımız da, respublikamız da, o cümlədən məktəblər də, müəllimlərimiz də bundan qat-qat ağır vəziyyətdə yaşayırdı. O illərdə insanlar adi çörək tapa bilmirdilər. Talonla gündə insanlara, hər bir müəllimə, hər bir insana 400 qram

qara çörəkdən savayı başqa şey verilmirdi. Ancaq xatirimdədir o illər, o çətin illər xalqımız yaşadı, xalqımızın cəsarətli oğulları faşizmə qarşı döyüşlərdə qəhrəmanlıq göstərdilər, respublikamızın müəllimləri fəaliyyətlərini heç vaxt dayandırmadılar... Mən bunu ona görə xatırlayıram ki, müəllim peşəsinin nə qədər şərəfli olduğunu və həqiqi müəllimin nə qədər mənəviyyatlı olduğunu bir daha nümayiş etdirim" [VIIc.s.262].

Böyük natiq müəllim-insan fəlsəfəsini ortaya qoyur. Hörmətli insan anlayışı ilə müəllim anlayışını müqayisə edir: "Özünü müəllimliyə həsr etmiş insan ən şərəfli insandır. Ali məktəb müəllimi, professor cəmiyyətdə ən hörmətli insan olmalıdır və insandır. Ona görə də mən çox arzu edərdim ki, sizin hamınız bu şərəfli adı həmişə, ömrünüzün axırına qədər daşıyasınız" [XXIc.s.259].

Heydər Əliyevin nitq və çıxışlarında mühüm bir ünvan var ki, o da müəllim ünvanıdır. Təhsil işçiləri ilə olan görüşlərdə, məktəblərin açılışında, ali məktəblərə daxil olan tələbələrlə söhbətlərdə və elmimizlə bağlı digər tədbirlərdə müəllimə olan hörmət, sayğı böyük natiqin dilindən düşmür: "Ona görə də mən bu gün bütün Azərbaycan müəllimlərinə hörmət və ehtiramımı bildirirəm. Azərbaycanın müəllimlər ordusuna gələcək fəaliyyətində uğurlar arzulayıram. Azərbaycan müəlliminə cəmiyyətimizin ən şərəfli adını – müəllim adını bundan sonra da şərəflə daşımağı arzu edirəm" [VIIc.s.260].

Qısa zaman kəsiyində fərqli auditoriyalarda, deyərdik ki, bəzən bir-birinə əks görünən, lakin Heydər Əliyev nitqində bir-biriylə əlaqəli olan auditoriyalardakı nitqlər heyrət doğurmaya bilmir. Əgər 2 sentyabr 1996-cı il tarixdə təhsilimizin problemlərindən və şərəfli müəllim peşəsindən danışırsa, 14 sentyabr 1996-cı il tarixdə Bakıda "İmproşop" ticarət mərkəzinin açılışında sahibkarlıqdan, sahibkarlardan söhbət açır. Dünya iqtisadiyyatına inteqrasiya prosesində sahibkarlığın

inkişaf etdirilməsindən danışır. "Sahibkarlar auditoriyası böyük natiqin gözündə necə görünür" sualına cavabları tapmaq olur: "Eyni zamanda hər bir sahibkar, ticarətlə məşğul olan şəxs, şirkət bilməlidir ki, bunların hamısı ölkəmizin iqtisadiyyatına, yəni iqtisadi inkişafına kömək etməlidir, ona zərər gətirməməlidir. Şübhəsiz ki, hər bir sahibkar iş görərək qazanc əldə etmək və bunu işə yönəldib fəaliyyətini daha da genişləndirmək istəyir" [VIIc.s.304].

Sahibkarlar auditoriyası onların problemlərini, eləcə də onların spesifik iş şəraitlərinin incəliklərinə bələd olan böyük natiqin nüfuzedici nitqini diqqətlə dinləyir: "Ancaq eyni zamanda hər bir sahibkar, iş adamı unutmamalıdır ki, o, həm öz mənafeyi, həm də ölkəmizin mənafeyi, ümumxalq mənafeyi üçün çalışmalıdır. Həm də bütün bu işlər respublikamızın qanunları çərçivəsində olmalıdır, qanunlara riayət edilməlidir. Qaçaqmalçılıq yolu ilə mal gətirmək, xəlvəti iş görmək, yaxud da cürbəcür yollarla vergidən yayınmaq – bax, bu cür hallar hələ ki, bizdə mövcuddur və təəssüf ki, geniş yayılıbdır. Bunun qarşısı alınmalıdır" [VIIc.s.304].

Heydər Əliyev müəllimlər üçün iş şəraitinin yaradılmasını, müəllimlərin əmək haqlarının artırılmasını diqqət mərkəzində saxlayırsa, sahibkarlara da dəstək verir: "Ona görə də mən sahibkarlığa, sərbəst ticarətə, alış-verişə, bizim iş adamlarının bütün ölkələrlə ticarət əlaqələrinə dəstək verərək, eyni zamanda xəbərdarlıq edirəm ki, onların hamısı Azərbaycanın qanunları çərçivəsində işləməli, respublikamızın qanunlarına əməl etməli, ən əsası isə şübhəsiz ki, öz mənafeyini təmin etməklə yanaşı, dövlətin, ölkənin, xalqın mənafeyini də unutmamalıdırlar" [VIIc.s.305].

Heydər Əliyev natiqliyi qarşısında keçilməz auditoriya yoxdur. Biz böyük natiqi səhiyyə və tibblə bağlı mötəbər məclislərdə, toplantılarda, konqreslərdə görürük. 21 sentyabr 1997-

ci il tarixli Pediatriya cəmiyyətlərinin Bakıda keçirilən IV beynəlxalq konqresinin açılışında həkimlik peşəsinin xarakterik xüsusiyyətləri auditoriya üçün açılır: "Həkimlər, səhiyyə işçiləri, o cümlədən uşaq həkimləri çox şərəfli peşənin sahibləridir. Cəmiyyətdə həkim peşəsi ən mötəbər, ən hörmətli peşədir. Özünü həkimlik, təbiblik peşəsinə həsr edən insanlar xoşbəxt insanlardır. Çünki cəmiyyətin onlara həmişə böyük ehtiyacı var. Eyni zamanda həkimlər hər yerdə mehribanlıq, sülh, əmin-amanlıq yaradan insanlardır. Onlar insanların sağlamlığı yolunda çalışırlar. Həkimlər öz peşələrinə görə müharibənin əleyhinədirlər. Onlar öz peşələrinə görə qan tökülməsini, hərbi münaqişə olmasını istəmirlər. Ona görə də həkimlərin, səhiyyə işçilərinin fəaliyyəti həm cəmiyyətimizin sağlamlığı, səhhəti naminə, həm də insanlar arasında sülh, əmin-amanlıq yaradılması üçün çox əhəmiyyətli və dəyərlidir" [XIIc.s.171].

Heydər Əliyevə görə "özünü həkim sənətinə, insanların sağlamlığına, səhhətinə həsr edənlər ən qiymətli insanlardır". Bu ən qiymətli insanlaradək böyük natiq insan fəlsəfəsini auditoriyaya açıqlayır, insanın rolu, insanın gücü məsələlərini filosofyanəliklə izah edir, sonra isə həkimlik sənətinin üstünlüklərini vurğulayır: "Çünki Yer kürəsinin zənginliyi birincisi, onun təbiəti, faunası və florasıdır, ikincisi isə, başqa planetlərdən fərqli olaraq Yer kürəsində yaşayan insanlardır. İnsanlar yaşayır, həyat sürür, yaşamaq, yaxud başqa məqsədlərə nail olmaq üçün zəhmət çəkir. Məhz bu insanlar əsrlər, minilliklər boyu cəmiyyəti inkişaf etdiriblər. İnsanların fədakarlığı nəticəsində cəmiyyət böyük elmi tərəqqiyə nail olubdur. İndi, bizim əsrdə elmi-texniki tərəqqi o qədər yüksək səviyyəyə çatıbdır ki, təsəvvur etmək mümkün deyildir ki, bundan sonra nə olacaqdır. Amma olacaqdır. İnsanın zehni, beyni, bacarığı bizim təsəvvur etdiyimizdən də qat-qat çox güclüdür. Ona görə biz də, gələcək nəsillər də daha yeni, böyük hadisələrin

şahidi olacağıq. Yer kürəsindəki insanların hərəsi öz fəaliyyətini bir sahədə göstərir. Hər bir sahə lazımdır. Amma özünü həkim sənətinə, insanların sağlamlığına, səhhətinə həsr edənlər ən qiymətli insanlardır” [XXVIIIc.s.199].

Heydər Əliyev tibb auditoriyasındakı bu çıxışında millətin inkişafı ilə hər bir fərdin sağlamlığı arasındakı dialektik vəhdəti verə bilir. Bir səhiyyə bilicisi kimi gələcəkdə tibbin profilaktikaya söykənməsi ideyasını irəli sürür: “Təkcə bu cümlələr kifayət edər ki, həkimlik sənətini seçən gənclər öz gələcək peşələrinə sevgi ilə yanaşsınlar. Çünki hər bir sahədə işləyən insan canlı bir orqanizmdir. Bu canlı orqanizm nə qədər sağlam olsa, öz sahəsində o qədər də yeni ixtiralar edəcək, nailiyyətlər qazanacaq və cəmiyyəti irəli aparacaqdır. Deməк, insan sağlamlığı ən əsas amillərdən biridir. Ona görə də mən belə hesab edirəm ki, həkimlik sənəti, yəni insanın sağlamlığının qorunması və müxtəlif xəstəliklərdən xilas edilməsi, onun daha da çox yaşaması üçün çalışan sahə tibb, səhiyyə sahəsidir. Dünyada ən sağlam adam da həkimə möhtacdır. Ona görə ki, onu həm xəstəlikdən müalicə etsin, həm də sağlamlığının səviyyəsini müəyyənləşdirsin. Təsadüfi deyildir ki, səhiyyə sahəsində ən əsas istiqamətlərdən biri insanların vaxtaşırı profilaktikadan kecirilməsidir” [XXVIIIc.s.200].

Həkim-xəstə münasibətlərini öyrənən deontologiya elmi tibbin mühüm bir sahəsidir ki, burada da auditoriya Heydər Əliyev fikirlərinin sehrinə düşür: “Bilirsiniz, həkimlik elə bir sənətdir ki, bəzən həkim biliyindən, dərmanından, müəyyən aparatlarından daha çox, öz münasibəti, mehribanlığı, istiqanlılığı, diqqəti ilə xəstəni daha tez müalicə edir” [XVIIIc.s.205].

Tibbi deontologiyanın əsasını təşkil edən əxlaqi dəyərlərin birləşdiyi mənəviyyatı həkimlər üçün mühüm hesab edən Heydər Əliyev həkim andı kimi tanınan “Hippokrat andı”ndan söhbət açır, gələcək həkimləri andına düz olmağa çağırır:

"Həkim yüksək mənəviyyata malik olmalıdır. Təsadüfi deyil ki, heç bir sahədə "Hippokrat andı" kimi and yoxdur. Hansı bir mütəxəssis, mühəndis ali təhsilini qurtarandan sonra and içir ki, "Mən yaxşı mühəndis olacağam". Hansı bir aqronom and içir ki, "Mən yaxşı aqronom olacağam". Ancaq həkim and içir. And içir ki, "Mən bu şərəfli peşəmə sədaqətlə xidmət edəcəyəm" [XXVIIIc.s.208].

Əxlaq fəlsəfəsinin lüğətində mühüm yer alan mənəviyyat anlayışına Heydər Əliyevin öz baxışı, öz izahı var ki, bu da özünü müxtəlif çeşidli auditoriyalarda göstərir. Tibb Universitetinin professor-müəllim və tələbə heyəti ilə görüşdə mənəviyyat anlayışı bir neçə aspektən qiymətləndirilir. Mənəvi dəyərlərimizin qorunub saxlanmasında Heydər Əliyev xidmətinin şahidi oluruq: "Umumiyyətlə, bizim ali məktəblərdə, institutlarda həm çox gözəl işlər, həm əyintilər, rüşvətxorluq, həm də mənəvi çatışmazlıqlar olubdur. Bilirsiniz ki, biz bunlarla mübarizə aparırdıq. Xüsusən, 1970-ci illərdə, mən Azərbaycana rəhbərlik etdiyim zaman həyatımın böyük bir hissəsini Azərbaycanda mənəvi dəyərlərin qorunub saxlanmasına, insan mənəviyyatının paklığına, təmizliyinə həsr etmişdim" [XXVIIIc.s.207].

"Şəhidlik nədir, şəhidlik nəyə xidmət edir" kimi suallara hər kəs 20 Yanvar 1995-ci il tarixli Şəhidlər Xiyabanındakı Heydər Əliyevin çıxışında cavab tapa bilər. Bu cavablar qəlbləri riqqətə gətirən, səmimiyyətlə yoğrulan, qətiyyətlə səslənən cavablardır: "Hər bir şəhidin tökülən qanı Azərbaycanın müstəqilliyini təmin edibdir. İndi Azərbaycan müstəqil dövlətdir. Siz bu müstəqil dövlətin azad vətəndaşlarısınız. Bu azadlıq bizim üçün hər şeydən üstündür, bizim böyük nailiyyətimizdir, böyük qələbəmizdir və bu azadlıq naminə, bu müstəqillik naminə biz qurbanlar vermişik. Bundan sonra da verəcəyik. Hər bir adam şəhid olmağa hazır olmalıdır ki, xalqımız daim azad olsun, daim müstəqil olsun" [IIIc.s.137].

Heydər Əliyev şəhidlərin həlak olmasının nə qədər "ağır itki" olduğunu deyirsə, şəhidliyi bir o qədər də "milli sərvətimiz" sayır. Şəhidliklə fəxr etməyi, öyünməyi, iftixar duymağı hər bir kəsə öyrədir: "Ona görə də bu şəhidlərin həlak olması bizim üçün nə qədər qəm-qüssə doğurursa, nə qədər ağır itkidirsə, o qədər də xalqımız üçün, qəhrəmanlıq nümunəsi kimi, örnək kimi bizim milli sərvətimizdir, milli iftixarımızdır. Biz bu gün buraya həm qəm hissi ilə, həm də böyük iftixar hissi ilə gəlmişik. Biz fəxr edirik ki, Azərbaycan xalqı qəhrəman xalqdır. Biz fəxr edirik ki, Azərbaycan xalqı öz milli mənliyini, öz milli azadlığını qorumaq üçün həlak olmağa, şəhid olmağa hazırdır. Biz fəxr edirik ki, bizim qəhrəmanlarımız var, biz fəxr edirik ki, bu azadlıq yolunda özünü qurban etmiş şəhidlərimiz var, onların qəhrəmanlığı, onların ruhu bizim qəlbimizdə daim yaşayacaq. Onlar əbədiyyətə qovuşublar. Onların xatirəsi bizim üçün əbədidir" [IIIc.s.139].

Heydər Əliyev bütün tədbirlərdə, dini mərasimlərdə şəhidləri xatırlayır, yada salır: "Bayram günündə hər şeydən əvvəl, torpaqlarımızın, ərazi bütövlüyümüzün, müstəqilliyimizin müdafiəsi yolunda canını qurban vermiş övladlarımızı, bacı və qardaşlarımızı minnətdarlıqla yad edirəm. Bir daha bəyan edirəm ki, onların qəhrəmanlığı heç vaxt unudulmayacaqdır. Onların əziz xatirəsi bizim qəlbimizdə əbədi yaşayacaqdır. Onlar öz qəhrəmanlığı, şəhidliyi ilə özlərinə əbədi abidə qoyublar" [Ic.s.578].

Heydər Əliyevin dini üslubda şəhidlərə müraciəti çıxışlarının sonluğuna təsadüf edir. Təkrar-təkrar şəhid ailələrinə Allahdan səbir, şəhidlərə isə Allahdan rəhmət diləyir. Şəhidlərlə bağlı nitqlərini nikbinliklə, əminliklə başa çatdırır: "Mən şəhidlərin ailələrinə Allahdan səbir diləyirəm. Allah bütün şəhidlərə rəhmət etsin. Yanvar faciəsi şəhidlərinə, Azərbaycanın torpaqlarının müdafiəsində, respublikamızın ərazi bütövlüyü-

nün keşiyində şəhid olanların hamısına Allah rəhmət etsin. Bütün şəhidlərin ailələrinə, qohum-əqrəbalarına Allahdan səbir diləyirəm. Xalqımıza Allahdan səbir diləyirəm. Ona görə səbir diləyirəm ki, xalqımızın bütün bu çətin mərhələlərdən keçib gedəcəyinə inanıram. Xalqımız öz müstəqilliyini qoruyub saxlayacaqdır. Buna əmin ola bilərsiniz. Müstəqil Azərbaycan günü-gündən inkişaf edəcək, ancaq bu günlər heç vaxt unudulmayacaqdır. Heç vaxt unudulmayacaqdır. Gələcək nəsillər bu günləri daim yad edəcəklər. Mən buna əminəm" [Vc.s.295].

O, şəhidlər qarşısında borcumuzu bircə-bircə bizlərə xatırladır: "Bizim borcumuz şəhidlərin ruhuna sadiq olmaqdır. Bizim borcumuz əcdadlarımızın vəsiyyətinə sadiq olmaqdır – milli azadlığımızı qorumaq, dövlət müstəqilliyimizi qoruyub saxlamaqdır. Borcumuz bütün şəhidlərin ailələrinə qayğı göstərməkdir, yaralılara qayğıları artırmaqdır. Şübhəsiz ki, görülən işlər görüləcək işlərin bir hissəsidir. Mən bu gün bir daha bütün dövlət orqanlarına, təşkilatlara, xeyirxah insanlara müraciət edirəm. Şəhidlərin ailələrinə qayğı, diqqət, 20 Yanvar hadisələrində xəsarət alanlara, müharibə əlillərinə qayğı, diqqət bizim borcumuzdur və borcumuzu yerinə yetirməliyik. Hər bir kəs bu borcunu yerinə yetirməyə çalışmalıdır və heç vaxt bunu unutmamalıdır" [Vc.s.296].

Şəhidliyə, şəhidlərə Heydər Əliyev qiyməti həmişə öyrənilməyə layiqdir. Bu gün də hamımızı şəhidlərin xatirəsi önündə baş əyməyə çağırır: "Ən böyük nailiyyət ondan ibarətdir ki, Azərbaycan xalqı öz torpağını qorumağa qadirdir. Azərbaycan vətəndaşları bu yolda şəhid olur, xalqa çəkilən dağı dərk edirlər. Mən bütün şəhidlərin, torpaq, Vətən yolunda həlak olanların xatirəsi qarşısında baş əyirəm, onların valideynlərinə, bacı və qardaşlarına, qohum-əqrəbalarına Allahdan səbir diləyirəm" [Ic.s.301].

20 iyun 1994-cü il tarixində Təzəpir məscidində, Aşura günü mərasimindəki çıxışında şəhidliyə ən böyük qiymətin – Heydər Əliyev qiymətinin şahidi oluruq: "İndi Vətənimiz faciəli bir dövr keçirir. Yağı düşmən torpaqlarımıza hücum edir. Azərbaycanın cəsarətli oğulları Vətənimizi müdafiə edir və bu yolda Həzrəti İmam Hüseyn kimi şəhid olurlar. Biz Vətən, torpaq, din yolunda canından keçmiş bütün şəhidlərin şücaəti qarşısında Kərbəla müsibətilə əlaqədar keçirilən bu mərasimdə bir daha baş əyir, onların xatirəsini qəlbimizdə daim yaşatmağa söz veririk" [IIc.s.27].

18 yanvar 1995-ci il tarixində, "Qanlı Yanvar" adlı rəssamlıq sərgisinin açılışındakı çıxışında, şəhidliyin uca zirvəsinə aparıb çıxaran yolları göstərir. Hər bir şəhidin bizdən ötrü itki olduğunu söyləyən böyük natiq sonda şəhidlərin "əbədi behiştə qovuşduğunu" dilə gətirməklə xalqın qəlbində şam yandırır: "20 Yanvar faciəsində insanlar qırıldı. Aydındır, bu, sovet ordusunun, Kommunist Partiyası rəhbərliyinin Azərbaycan xalqına qarşı etdiyi hərbi, siyasi təcavüzdür. Bu təcavüzün nəticəsində xalqımız qurbanlar vermişdir. Amma xalq həmişə azadlıq uğrunda mübarizə apararkən qurbanlar verməlidir. Keçmişdə də belə olmuşdur, bu gün də belədir, gələcəkdə də belə olacaqdır. Hər bir şəhid bizdən ötrü böyük itkidir. Onların xatirəsi bizim üçün əzizdir, qəlbimizdə daim yaşayacaqdır. Şəhidlərimiz əbədiyyətə qovuşmuşlar. Çünki onlar Azərbaycan xalqının milli azadlığı yolunda şəhid olmuşlar. Xalqımızın bu mübarizəsinə qarşı kommunist rejiminin, Sovet İttifaqının rəhbərliyinin, sovet ordusunun hərbi təcavüzü nəticəsində qurban getmiş, şəhid olmuşlar. Bizim adətimizcə desək, onlar əbədi behiştə qovuşmuşlar" [IIIc.s.125].

Ulu öndəri tez-tez gördüyümüz, qəlbləri riqqətə gətirən nitqlərin şahidi olduğumuz bir auditoriya var ki, bu da uşaqlar auditoriyasıdır. Ölkənin, müstəqil respublikanın gələcəyi olan

uşaqlar böyük natiqin dilindən düşmür, onlara dövlət qayğısı önə çəkilir: "Uşaqlar cəmiyyətin ən gözəl hissəsidir. Hər bir insan, hər bir ana, hər bir ata öz xoşbəxtliyini birinci növbədə öz uşağında, öz övladında görür. Ailədə yeni uşağın dünyaya gəlməsi ailə üçün bütün sevinclərdən də üstündür. Bu təbiidir, çünki insan yaşayır, yaradır və cəmiyyətin gələcəyini yaradır. Bu Allahtəalanın buyurduğu bir prosesdir. Azərbaycan prezidenti kimi, mənim üçün hər bir ailədə uşağın dünyaya gəlməsi, bu ailənin sevinci elə mənim də sevincimdir. Mənim üçün hər bir uşağın həyatı bizim ümumi cəmiyyətimizin həyatıdır" [XXIIIc.s.394].

Heydər Əliyev uşaqlar auditoriyasında həm dövlətin, həm də uşaqlar və yeniyetmələrin vəzifə borclarını açıqlayır:

"Bizim borcumuz gənclərə daha çox qayğı göstərməkdən, onların təhsil və tərbiyəsi işini, yaşayış şəraitini daha da yaxşılaşdırmaqdan və gələcək nəsil üçün daha yaxşı həyat qurmaqdan ibarətdir. Əziz balalar, sizə bildirmək istəyirəm ki, bu, bizim və şəxsən mənim ali məqsədimdir. Bu məqsəd yolunda mən bundan sonra da durmadan çalışacağam. Sizin borcunuz yaxşı təhsil, tərbiyə almaqdan, öz istedadınızdan səmərəli istifadə etməkdən, həyat fəaliyyətinə, gələcəyinizə yaxşı hazırlaşmaqdan, öz əxlaqınızla, təhsilinizlə, tərbiyənizlə valideynlərinizi, cəmiyyətimizi və bizi sevindirməkdən ibarətdir. Əziz balalarım, mən sizə bu arzularla müraciət edirəm" [IXc.s.36-37].

Heydər Əliyevin ən çox baş çəkdiyi, görüşünə getdiyi auditoriyalar içərisində şəhid, köçkün ailələri və kimsəsiz uşaqlar auditoriyası mühüm yer tutur.

20 mart 1996-cı il tarixdə "Gülüstan" sarayında şəhid və kimsəsiz uşaqlar üçün təşkil olunmuş Novruz şənliyindəki çıxışında uşaqlara onların valideyinləri haqqında məlumat verilir, onlara valideynlərinin Azərbaycan dövləti olması inamı aşılanır: "Sizin çoxunuz atanızı, ananızı itirmisiniz, çoxlarını-

zın atası Vətənimizi, torpağımızı, müstəqil Azərbaycanı müdafiə edərkən şəhid olub, canını qurban verib, qəhrəmanlıq nümunələri göstərib, həyatı qəhrəman kimi tərk edibdir. Ancaq onlar sizin də, bizim də, bütün Azərbaycan xalqının qəlbində qəhrəman kimi yaşayırlar. Onlar həyatdan getməyiblər, bizimlədirlər, qəlbimizdədirlər. Onlar bu gün bu salondadırlar, sizin şən, xoşbəxt gününüzü görüb daha da sevinirlər. Ona görə də siz özünüzü heç də valideynsiz hesab etməyin. Sizin valideynləriniz var. Müstəqil Azərbaycan dövləti sizin valideyninizdir. Sizin valideyniniz Azərbaycan torpağıdır, Vətənimizdir, müstəqil Azərbaycan dövləti və onun prezidentidir. Siz buna arxayın ola bilərsiniz" [VIc.s.6].

"Uşaqlar kimdir, uşaqlar üçün nə etmək lazımdır" kimi suallara cavab tapmaq üçün 1 iyun 1996-cı il taarixində, Heydər Əliyevin Azərbaycan Dövlət Opera və Balet Teatrında Uşaqların Beynəlxalq Müdafiə Günü münasibətilə uşaq musiqi festivalı qaliblərinin yekun konsertindəki çıxışına diqqət yetirmək lazımdır: "Uşaqlar bizim sevincimiz, xoşbəxtliyimiz, cəmiyyətin gələcəyidir. Uşaqlar hər bir insanın mənəviyyatıdır. Ona görə də dünyada, hər bir insanpərvər cəmiyyətdə uşaqlara daim xüsusi qayğı, xüsusi diqqət göstərilibdir. Uşaqlar daim qayğı altında olmalıdır, onları qorumaq, müdafiə etmək, böyütmək, insan cəmiyyətinin fəal iştirakçısı, fəal üzvü etmək lazımdır. Ona görə də dünyada Uşaqları Beynəlxalq Müdafiə günü təsis olunubdur. Bu bayram dünyanın hər yerində, hər bir ölkədə qeyd edilir" [VIc.s.365].

Azərbaycan ailələrində uşağın yeri, onlara münasibət böyük natiqin nitqində öz əksini təfərrüatları ilə tapır: "Uşaqlar hər bir insana ən böyük xoşbəxtlik gətirir. Hər bir insan istəyir ki, onun uşağı olsun. Hər bir insan uşağını sevir, ona tərbiyə verir, uşağını böyüdür, oxudur, gələcəyə hazırlayır. Belə insanlar, ailələr xoşbəxt insanlardır, ailələrdir. Azərbaycanda ailələr

həmişə çoxuşaqlı olublar, bu bizim xalqımızın milli xüsusiyyətidir. Atalar, analar – valideynlər uşaqlarına həmişə qayğı göstəriblər və bundan sonra da belə olmalıdır. Bundan sonra ailələrimiz nəinki çoxuşaqlı olmalıdır, eyni zamanda valideynlər gərək uşaqlarına daha çox qayğı, diqqət göstərsinlər, onların tərbiyəsinə, təhsilinə xüsusi fikir versinlər, bunları özlərinin əsas vəzifəsi hesab etsinlər. Biz isə-hökumət, cəmiyyət, yaşlı nəsil uşaqlara daim qayğı göstəririk və göstərəcəyik. Bu bizim ən müqəddəs, ən şərəfli vəzifəmizdir" [Xc.s.36-37].

11 dekabr 1994-cü il tarixdə "Uşaqlar dünyanın sevincidir" xeyriyyə telemarafonunda uşaqlar haqqında Heydər Əliyevin söylədiyi fikirlər Azərbaycan dövlətinin uşaqlara qayğısını əks etdirir: "Siz – Azərbaycanın övladları, bizim əziz balalarımız, Azərbaycanın gələcəyisiniz. Sizin bugünkü həyatınız, yaşayışınız, təhsiliniz, böyüməyiniz Azərbaycan dövlətinin daim qayğısı altındadır. Mən bu gün bildirmək istəyirəm ki, Azərbaycan Respublikasında uşaqlar respublikamızın son illərdə düşdüyü ağır, bəlalı, əzab-əziyyətli günlər içində yaşayaraq, eyni zamanda öz valideynlərinin, onlara qayğı göstərən insanların, təşkilatların, xeyriyyə cəmiyyətlərinin köməyi ilə dərs keçirlər, tərbiyə alırlar, böyüyürlər və inkişaf edirlər. Mən əminəm ki, bu ağır, çətin dövrdə dünyaya gəlib böyüyən uşaqlar cəsarətli, mətin, vətənpərvər olacaqlar. Azərbaycanın xoşbəxt gələcəyi naminə həm təhsil alıb böyüyəcəklər, həm də gələcəkdə cəmiyyətdə öz yerlərini tutacaqlar" [IIIc.s.5-6].

Elə həmin görüşdə uşaqların gələcəyinə tuşlanan qətiyyətli ifadələr öz yerini alır: "Dövlətin qayğısı ilə hər bir vətəndaşın, hər bir təşkilatın qayğısı, hər bir cəmiyyətin qayğısı, xeyriyyəçilik edən hər bir adamın qayğısı birləşməlidir, qovuşmalıdır. Biz uşaqlarımızı yaxşı tərbiyə etməliyik, yaxşı şəraitdə yaşatmalıyıq. Uşaqlarımıza təhsil verməliyik. Onları gələcək üçün hazırlamalıyıq" [IIIc.s.5].

Uşaq auditoriyası ilə yanaşı qadın auditoriyasında da səmimi, səmimi olduğu qədər də təvazökar Heydər Əliyev nitqi işə düşür. Azərbaycan qadını cəmiyyətdəki yerini, mövqeyini böyük natiqin dilindən eşidir və ecazkar nitqin cazibəsinə düşür: "Burada Azərbaycan qadını haqqında xoş sözlər dedilər. Ola bilər ki, mən deyilənlərə bir şey əlavə edə bilməyim. Ümumiyyətlə, qadın cəmiyyətin ən hörmətli üzvüdür. Hamı qadının qarşısında baş əyməlidir, hamı qadına hörmət etməlidir. Mən bütün həyatım boyu qadına hörmət etmişəm və cəmiyyətimizi, millətimizi, xalqımızı qadına hörmət etməyə dəvət etmişəm. Bu gün bir daha görürəm ki, Azərbaycan qadınları xalqımızın adət-ənənələrini, mədəniyyətini, elmini, intellektual potensialını yüksək səviyyədə təmsil etmişlər və bu, indi də belədir. Qadınlara hörmət, qadınlara təşəkkür, qadınlara cansağlığı!" [IIIc.s.246].

Heydər Əliyev dilində qadının ailədə rolu sadə, poetikcəsinə cümlələrlə auditoriyalara açıqlanır. Eləcə də müstəqilliklə qadın azadlığı arasındakı münasibətlər sistemi araşdırılır: "Demək olar ki, ailəni ikisi birlikdə saxlayırlar, uşaqlarını böyüdürlər. Amma onların arasında böyük fərq var. Qadın uşaq doğur, körpə böyüdür. Qadının bu zəhməti əvəzsizdir və heç bir kişi belə zəhməti çəkə bilməz. Biz qadınları ilbəil daha da çox qiymətləndiririk. Bu da müəyyən qədər təbiidir. Çünki keçmişdə qadınlara olan münasibət dərin köklər salmışdı və bu dəyişiklikləri təmin etmək üçün zaman lazım idi" [XXVc.s.321].

Qadın haqqında, qadının cəmiyyətdəki yeri, rolu haqqında Heydər Əliyev fikirləri əsasən 8 Mart Beynəlxalq Qadınlar günü münasibətilə söylədiyi nitqlərdə öz əksini tapır: "İnsan cəmiyyətində qadınların rolu, əhəmiyyəti məlumdur. Qısaca onu demək olar ki, qadınsız insan yoxdur. Qadınsız həyat yoxdur. Bu, həmişə belə olub, bu gün də belədir, gələcəkdə də belə olacaqdır" [XXVc.s.319].

Azərbaycan qadınının cəmiyyətdə yeri, xüsusiyyətləri böyük natiq tərəfindən sadalanır: "Qadınlar cəmiyyətin bəzəyidir, gözəlliyidir. Qadınsız cəmiyyət ola bilməz, qadınsız həyat ola bilməz. Azərbaycan qadınları da öz ağıllarına, zəkalarına görə, biliklərinə, istedadlarına görə, eyni zamanda gözəlliklərinə görə dünya qadınları içərisində özünəməxsus və çox yüksək yer tuturlar. Ona görə də biz qadınlarımızla fəxr edirik. Azərbaycanda bütün sahələrdə gördükləri işlərə, səmərəli fəaliyyətlərinə görə bu bayram günündə mən bütün qadınlarımıza təşəkkür edirəm" [IXc.s.24].

Ulu öndər görkəmli bəstəkar, Azərbaycanın xalq artisti Tofiq Quliyevin 80 illiyinə həsr edilmiş yubiley gecəsindəki çıxışında mahnıya, musiqiyə tərif verir, onların fərqini izah edir. Estetik fəlsəfənin bəzi cəhətlərini bir musiqiçi-filosof alim kimi dinləyicilər üçün açıqlayır: "Musiqi ümumiyyətlə, insan üçün çox əziz olan bir sənət nümunəsidir. Musiqinin hər bir sahəsi həmişə insanlar tərəfindən sevilibdir. Ancaq mahnı, şərqi insanlara daha yaxın olubdur. Yəni əgər opera musiqisini, simfonik musiqini bir çox adamlar qəbul edir, ancaq o hamıya çatmırsa, amma mahnı və xüsusən sənin kimi bəstəkarın mahnıları demək olar ki, insanları – kiçikdən böyüyə qədər, cocuqdan yaşlıya qədər, qadını da, kişini də, hamını sevindirir və hamıya təsir edir. Ona görə də mahnı daim yaşayır"[XIIIc.s.215].

Bu gün ölkəmizdə elə bir peşə sahibi tapmaq çətin olar ki, həmin peşə sahibləri öz peşələri barəsində Heydər Əliyev fikirləri ilə tanış olmasınlar. O cümlədən jurnalistlər də öz peşələrinin özlərinə belə məlum olmayan sirlərini böyük natiqin dilindən eşidirlər. Jurnalist əməyinə yüksək qiymət verən, bu peşəyə yiyələnməyin hansı yollardan keçdiyini göstərən Heydər Əliyev nitqi auditoriyanı burada da fəth edir:

"Mən bu fürsətdən istifadə edərək, jurnalist əməyinə böyük hörmət etdiyimi bildirmək istəyirəm. Jurnalistlərin əməyi qeyri-adi əməkdir, olduqca böyük, zəhmətli əməkdir, çox səylər göstərilməsini, hətta cəsurluq, hünər, fədakarlıq tələb edən əməkdir, öz peşəsinə vurğunluq tələb edən əməkdir. İnsanın daxilində bu peşəyə xüsusi bir meyl, ehtiras olmasa, o, jurnalist peşəsinin öhdəsindən gələ bilməz" [VIc.s.373].

"Jurnalist peşəsi hünər tələb edir" – deyən ulu öndər bu hünərin nədən ibarət olduğunu auditoriyaya çatdırır: "Siz dünya təcrübəsindən bilirsiniz ki, Yer kürəsinin qaynar nöqtələrində olan jurnalistlər bəzən necə həlak olurlar. Jurnalistlər bizdə, Azərbaycanda da həlak olmuşlar. Cəbhə zolağında, Ermənistan tərəfindən Azərbaycana qarşı təcavüz ilə bağlı döyüş əməliyyatları gedən zaman bizim neçə-neçə istedadlı jurnalistlərimiz həlak olmuşdur. İndi jurnalistlər Çeçenistanda da, Rusiyanın digər qaynar nöqtələrində də həlak olurlar. Onlar dünyanın başqa ölkələrində də həlak olurlar. Bəli, həlak olurlar, amma bununla belə, əsl jurnalistlər öz jurnalist peşəsindən imtina etmirlər. Buna görə də jurnalist peşəsi hünər tələb edən peşədir" [VIc.s.374].

Peşəkar jurnalist auditoriyasında Heydər Əliyev Azərbaycan dilinin imkanlarından geniş istifadə edir. Nitqində sinonim cərgələrdən istifadə etməklə jurnalist auditoriyasını fəth edə bilir. Jurnalistlərin qarşısında ciddi tələblər qoyur, onların göstərdikləri xidməti bəyan edir: "Əlbəttə, bizim hər birimiz jurnalistdən obyektivlik, düzlük, səmimilik gözləyirik. Lakin jurnalistlər bu və ya digər qüsurları aşkara çıxararaq, qanuna, konstitusiyaya zidd faktları aşkara çıxararaq, bəlkə də başqalarına nisbətən sözü üzə daha şax və açıq deyir, bəzən də xoşagəlməz olurlar. Bununla bərabər, onlar cəmiyyətin demokratikləşdirilməsi işinə, siyasi plüralizm prinsipinin bərqə-

rar edilməsinə və dərinləşməsinə olduqca böyük kömək göstərirlər" [VIc.s.375].

Azərbaycan polisinin 80 illk yubileyinə və polis gününə həsr olunmuş təntənəli yığıncaqda söylədiyi nitqində (2 iyul 1998-ci il) ulu öndər polis peşəsinə münasibətini bildirir: "Polis peşəsi ağır, çətin peşədir. Polis peşəsinə öz həyatını sərf edən insan bir çox xüsusi keyfiyyətlərə malik olmalıdır. Polis əməkdaşı birinci növbədə ölkəsinin dövlətinə, Konstitusiyasına, qanunlarına tam sadiq olmalııdr. Polis əməkdaşı bilikli, öz sahəsində yüksək təhsilə, yaxşı təcrübəyə malik iradəli, cəsarətli, qorxmaz olmalıdır. Polis əməkdaşı saf mənəviyyata malik olmalıdır. Polis əməkdaşı yalnız və yalnız qanun çərçivəsində fəaliyyət göstərməlidir, qanunun aliliyini daim rəhbər tutmalıdır, qanuna həmişə hörmət etməlidir. Polis əməkdaşı vətəninə, torpağına hədsiz sədaqəti və istənilən vaxt öz vəzifəsini yerinə yetirərək həyatını belə qurban verməyə hazır olmalıdır" [XVIc.s.173].

Heydər Əliyev nitqinin bir gücü də çıxış etdiyi auditoriyanın peşə tərkibinə baxışıdır. 28 oktyabr 1998-ci il tarixdə Azərbaycan Respublikası Prokurorluq orqanlarının 80 illiyinə həsr olunmuş təntənəli yığıncaqda Heydər Əliyev prokurorluq orqanlarının hüquq mühafizə sistemindəki yerini müəyyənləşdirir: "Prokurorluq orqanı hüquq-mühafizə orqanlarının içərisində xüsusi yer tutur. Prokurorluq istintaqın əsas hissəsini aparır. İstintaq isə cinayəti açmaq üçün və qanun əsasında cinayətkarın cinayətkar olduğunu sübut etmək üçün yaxud da ki, edilmiş cinayətin məzmununu aşkar etmək üçün əsas vasitədir" [XVIIIc.s.285].

Heydər Əliyev nitqi gömrük işçiləri qarşısında da digər peşə sahibləri auditoriyasındakı kimi rəğbətlə qarşılanır. O, əvvəlcə gömrük xidmətinin tarixindən danışır: "Gömrük xidməti ölkəmiz dövlət müstəqilliyini əldə etdikdən sonra Azərbaycan-

da yaranmış yeni dövlət strukturlarından biridir. Doğrudur, Azərbaycanın gömrük işi sahəsində müəyyən tarixi var, o barədə burada deyildi. Ancaq Azərbaycan müstəqil dövlət olmadığı dövrdə – XIX əsrdə də, XX əsrdə də bir sərhəd məntəqəsi kimi müəyyən gömrük idarələri bu ərazidə yerləşibsə də, Azərbaycanın özünün gömrük xidməti olmayıbdır” [VIIIc.s.350].

Sonrakı nitq mərhələsində müstəqilliyimizə gedən yolda iqtisadiyyatımızın dirçəlməsində və inkişafında gömrük xidmətinin rolu real faktlar əsasında gömrük işçiləri üçün aydınlaşdırılır. Gömrük işçiləri onların problemlərinə dərindən bələd olan prezidentin – böyük natiqin nitqini diqqətlə izləyir, problemlərin incəliklə çözülməsinin şahidi olurlar: “Gömrük işçilərinin əksəriyyəti, şübhəsiz cürbəcür ixtisaslar alıbdır. Amma sırf gömrük ixtisası üzrə təhsil alan adamlar, ola bilər ki, çox azdır. Ona görə də siz bu təhsili də işləyə-işləyə almalısınız” [VIIIc.s.356].

Gömrük işçiləri auditoriyası qətiyyətli dövlət başçısının iti nəzərlərindən heç bir neqativ halın qaçmayacağı qənaətinə gəlir: “Özünü bu peşəyə həsr edənlər” nə etməli olduqlarını böyük natiqin dilindən eşidir və özləri üçün müsbət mənada nəticə çıxarırlar: “Ancaq bunların hamısı ilə birlikdə gömrük işçiləri bilməlidirlər ki, onlar müstəqil Azərbaycan dövlətinin çox mühüm, vacib bir sahəsində işləyirlər. Özünü bu peşəyə həsr edən insanlar maddi maraq, yaxud da ki, qeyri-qanuni yolla gəlir əldə etmək məqsədi daşımamalıdırlar” [VIIIc.s.357].

“Gömrük işçisinin əxlaq kodeksi necə olmalıdır” sualının cavabı elə auditoriyadaca açıqlanır, dövlət orqanlarında çalışan işçilərin mənəviyyatı burada da izah olunur. Dövlət, dövlətçilik, dövlət xidməti kimi anlayışlar gömrük işçilərinə müraciətdə vəhdət halında verilir: “Hər peşəyə gələn insan gərək birinci, peşəni sevsin, özünü peşəyə həsr etsin və o peşənin öz daxili mənəviyyatına uyğun olduğunu dərk edərək işləsin. Hər

peşəyə, o cümlədən gömrük xidməti peşəsinə başqa məqsədlərlə gələn adamlar bu orqanın daimi işçisi ola bilməzlər və onlar, şübhəsiz ki, bu orqana və dövlətə mənfəət gətirə bilməzlər. Ona görə bütün dövlət orqanlarından tələb olunan prinsiplər – mənəvi təmizlik, mənəvi saflıq, dövlətin qanunlarına riayət etmək, öz işinə sədaqət – bunlar hamısı gömrük xidmətində çalışan işçilər üçün də olan tələblərdir, onların müvəffəqiyyətlə işləməsi üçün əsas prinsiplərdir və siz bu prinsiplərin gömrük təşkilatının, Gömrük Komitəsinin hər bir özəyində bərqərar olunmasını təmin etməlisiniz” [VIIIc.s.358].

16 dekabr 1996-cı il tarixində, Şəhriyar adına mədəniyyət mərkəzində Azərbaycan Respublikası sərhəd qoşunlarının yaradılmasının beş illiyinə həsr olunmuş təntənəli yığıncaqdakı nitqində Heydər Əliyev sərhəd, sərhədçi anlayışlarına özünəməxsus izahlar verir, sərhədçi auditoriyası öz peşəsinin sirlərini böyük natiqin dilindən eşidir. “Sərhəd nədir” sualına cavabı dəyərləndirir: “Sərhəd hər bir ölkənin müstəqilliyini, suverenliyini təsdiq edən amillərdən biridir. Beynəlxalq hüquq normaları, millətlərarası, dövlətlərarası əlaqələr, hər bir ölkənin suverenliyi, toxunulmazlığı, ərazi bütövlüyü prinsipi – bunların hamısı ölkələrin sərhədləri ilə əlaqədardır” [VIIIc.s.187].

Heydər Əliyev sərhədçi peşəsinin romantikliyini, böyüklüyünü gənc sərhədçilərə öyrədir, bu peşəni onlara sevdirir: “Sərhədçi böyük, romantik peşədir. Mən sərhədçilərin tarixini yaxşı bilirəm. Çünki özüm də keçmişdə sərhəddə çox olmuşam. Azərbaycanın sərhədlərində bəlkə də elə bir nöqtə yoxdur ki, mən orada olmayım. Vaxtilə, gənc yaşlarımda xidmət etmişəm, çox yerlərə piyada getmişəm, çox yerlərə at üstündə getmişəm, bizim gözəl təbiəti sərhədlərimizdə görmüşəm. Eyni zamanda sərhədçilirəmizlə həmişə fəxr etmişəm. Mən sərhədi yaxşı bilirəm, sərhədin nə qədər romantik yer olduğunu bilirəm, sərhədçilərin romantik insanlar olduğunu bili-

rəm, bu peşənin də çox romantik, cazibədar peşə olduğunu bilirəm” [VIIIc.s.195-196]

Heydər Əliyev nitqiylə sərhədçi – ləyaqətli insan, sərhədçi – yüksək mənəviyyatlı insan obrazı yaradır. “Vətən sərhəddən başlayır” – fikri bir daha sərhədçilərin nəzərinə çatdırılır: “Bax bunlara görə də sərhədçi peşəsi yüksək qiymətə layiq olan bir peşədir. Hər bir gənc, hər bir insan özünü sərhədçi peşəsinə həsr edirsə, axıra qədər həsr etməlidir. Belə olan halda o, cəmiyyətdə özünə layiq yer tutur, belə olan halda hər bir sərhədçi cəmiyyətdə çox hörmətli bir insan olur. Mən arzu edirəm ki, bizim sərhədçilərimiz belə hörmətə malik olsunlar, belə hörmətə layiq olsunlar, hər bir sərhədçi yüksək mənəviyyatlı bir insan olsun” [VIIIc.s.196-197].

Milli Təhlükəsizlik Nazirliyinin əməkdaşlarına müraciətdə bu nazirlikdə işləyənlərin necə çətin bir peşə sahibi olduğunu anladır. Bu nazirliyə cəlb olunan əməkdaşların hansı xüsusiyyətlərə malik olmasını sadə, auditoriya üçün anlaşıqlı bir dildə izah edir: “Sizin peşəniz elə peşədir ki, burada hər adam özünə yer tapa bilməz. Ola bilər, bu işdə işləməyə kiminsə həvəsi olsun, amma onun xüsusiyyətləri buna çatmasın. Ona görə də kadrların seçilməsində, yeni gənclərin işə qəbul olunmasında və kadrların irəli çəkilməsində çox həssas, diqqətli olmaq lazımdır” [XXVIIc.s.187-188].

“Milli Təhlükəsizlik Nazirliyində çalışan kadrlar necə olmalıdır” sualına Heydər Əliyev cavabı aşağıdakı kimi səciyyələndirilir: “Burada kadrları tanışlıqla, dostluqla təyin etmək gərək olmasın. Təəssüf ki, bu qüsur bizdə, Azərbaycanda hələ var. Amma burada olmamalıdır. Çünki, yenə də deyirəm, bir Təsərrüfat Nazirliyində, yaxud da başqa bir nazirlikdə müəyyən bir vəzifəni tutan adam, ola bilər, öz peşəsini bəlkə o qədər də bilməsin. Amma burada, Milli Təhlükəsizlik Nazirliyində – mən bunu öz təcrübəmə, keçdiyim yola görə deyirəm – gərək

bu peşəni daxilən sevən adam olsun, öz şəxsi xüsusiyyətlərinə görə bu peşəyə gərək yararlı adam olsun, eyni zamanda yüksək bilikli, işə sədaqətli adam olsun. Bu peşəni sevərək, heç bir şeylə hesablaşmayaraq gecə-gündüz çalışmağa qadir adam olsun. Burada belə kadrlar olmalıdır" [XXVIIc.s.189].

Heydər Əliyev MTN-nin işçilərinə "siz kimsiniz" sualını verir və sualı öz polad məntiqi əsasında cavablandırır. Əməkdaşlar kim olduqlarını, Vətən qarşısında hansı məsuliyyəti daşıdıqlarının fərqinə varırlar: "Ona görə də bu gün sizin işiniz o dövrdəki işdən tamamilə fərqlidir. Bu gün siz Azərbaycanın müstəqilliyini qoruyanlarsınız. Azərbaycan xalqının azadlığını qoruyanlarsınız. Bizim dövlətimizə xarici ölkələrdən və daxili düşmən qüvvələri tərəfindən yönəldilmiş təxribatların qarşısını alanlarsınız. Belə halları aşkara çıxarıb, onları ifşa edənlərsiniz. Ona görə də sizin işiniz çoxdur. Bir də deyirəm, sizin işiniz keçən dövrlərdən fərqlidir" [XXVIIc.s.189].

Göründüyü kimi fərqli auditoriyalarda Heydər Əliyevin özünəməxsus nitq ustalığının öyrənilməsinə, müxtəlif peşə sahələrinə aid Heydər Əliyevin çıxışlarını tədqiq etməyə ehtiyac vardır.

# III FƏSİL

# HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ GİRİŞLƏR VƏ SONLUQLAR

Nitqin auditoriyaya təsir göstərən mühüm elementlərindən biri – onun giriş və sonluğudur ki, bu elementlər Heydər Əliyev nitq və çıxışlarında öyrənilməyə layiqdir. Bənzərsiz giriş və sonluqlar böyük natiqin nitqində əsas struktur vahidlərindəndir.

Beynəlxalq Təşkilatlardakı nitqlərinin sonluqları çox vaxt tələblər şəklində qoyulur, "üz tutmaq" frazeologizmi ilə xahişlər olunur, "təşəkkür etmək"lə fikir bitir.

ATƏT-in Lissabon Zirvə görüşündəki nitqin sonluğu bu qəbilədəndir: "Mən ATƏT-in Lissabon Zirvə görüşünün iştirakçısı olan dövlət və hökumət başçılarına üz tutub onlardan xahiş edirəm ki, Avropada sürəkli və viranedici regional münaqişələrdən biri olan Ermənistan-Azərbaycan münaqışəsinin tezliklə aradan qaldırılması üçün səylərini əsirgəməsinlər. Qitəmizdə sülh, sabitlik və xalqların firavanlığı naminə bütün tədbirləri görmək bizim müqəddəs borcumuzdur.

Diqqətinizə görə təşəkkür edirəm" [VIIIc.s.93].

Heydər Əliyev rəsmi görüşlərdə çıxışına daha çox "Xanımlar və cənablar" ifadəsi ilə başlayırsa, Azərbaycan ədəbiyyatına, mədəniyyətinə, musiqisinə həsr olunmuş tədbirlərdəki nitqində bu ifadələr dəyişir. Respublika sarayında məşhur müğənni və bəstəkar Müslüm Maqomayevin yubiley gecəsindəki giriş sözü araşdırılmağa layiqdir. Bu poetik çalarla dolu nitq mədəniyyət xəzinəmizə düşə biləcək incilərdəndir: "Hörmətli dostlar, xanımlar və cənablar! Biz bu gün Azərbaycanın zəngin mədəniyyətinin ən gözəl nümunələrindən, ən gözəl şaxələrindən biri olan Müslüm Maqomayevin yaradıcılığı ilə, onun

mahnıları, əsərləri ilə yenidən görüşdük. Bu xalqımızın, ölkəmizin həyatında əlamətdar hadisədir.

Ona görə də bu gün hamımız böyük sevgi və məhəbbətlə bu möhtəşəm salona toplaşmışq. Bu salonda olanların hamısı böyük məhəbbət və ehtirasla Müslüm Maqomayevin mahnılarını dinləyir, onun səsini dinləyirlər” [XIIc.s.354].

Böyük natiq bu girişdə “Hörmətli dostlar”ı xanımlar və cənablardan önə keçirməklə auditoriyada dostların çoxluğuna işarə edir ki, bu, bir daha dövlət başçısı kimi Heydər Əliyevin mədəniyyətimizə olan sevgisinin təzahürüdür. Dost sözünə qiymət qoyan dinləyicilər ilk cümlədən böyük natiqin nitqinin cazibəsinə düşürlər. Sonra ən təsirli, səmimi ifadələrlə Müslüm Maqomayevin Azərbaycan musiqi sənətində tutduğu yer auditoriyaya çatdırılır. Son iki cümlə isə təfəkkür nitq əlaqəsi, bu əlaqələrdəki fəlsəfilik baxımından xüsusi maraq doğurur. Belə ki, bu möhtəşəm salona toplaşmaq “böyük sevgi və məhəbbətlə” müşayiət olunursa, Maqomayevin mahnılarını dinləmək isə “böyük məhəbbət və ehtirasla” əvəzlənir. Eləcə də mahnını dinləməklə səsi dinləməyin fərqli olduğunu, mahnı və səsin dialektik vəhdətini ortaya qoyaraq auditoriyanı canlandırır.

Hər belə yubileydə, hər belə məqamda ümumazərbaycan problemlərini qabartmaqla sonluqlarda auditoriyanı ümummilli məsələlərdə səfərbər edir, bir öndər olaraq məsuliyyətini dilə gətirməklə bizləri də məsuliyyətə səsləyir: “Hesab edirəm ki, bizim simfonik orkestr və simfonik orkestrin musiqiçiləri ən fədakar insanlardır. Bütün çətinliklərə baxmayaraq, onlar öz peşələrindən, öz sənətlərindən ayrılmırlar. Bizim simfonik orkestr yaşayır və yaşayacaqdır. Mən demişəm və bu gün də təntənəli surətdə vəd edirəm – bizim simfonik orkestrə ən əlverişli şərait yaratmaq üçün tədbirlər görəcəyik ki, o, fəaliyyət göstərsin. Bir daha təbrik edirəm” [XIIc.s.361].

Bir qisim çıxış və nitqlərin giriş və sonluqlarında emosionallığa yer ayrılmasa da məna tutumuna, qoyulan məsələlərin ciddiliyinə görə nitq yenə də cazibədarlığını itirmir. Belə ciddi girişlər və sonluqlar milləti, xalqı səfərbər etmək baxımından daha da güclü sayılır: “Biz Bakı beynəlxalq hava limanı kompleksinin tikintisinə 1981-ci ildə başlamışıq. O vaxt lazımi layihələr hazırlanmışdı. Mən 1982-ci ildə bu layihələrə bir neçə dəfə baxmışam. Ancaq indi 1997-ci ildir. O vaxtdan 15 il keçir və Bakı beynəlxalq hava limanı beləcə tikilməmiş qalıbdır. Görünür, 15 il bundan əvvəl başladığım işi başa çatdırmalıyam. Ona görə də mən bu işə çox ciddi və diqqətlə yanaşıram. Çünki bu tikinti dövlətə məxsusdur. Ötən 15 ildə bu işə laqeyd yanaşıblar, yaxud ona ciddi fikir verməyiblər. Amma bundan sonra belə hala yol vermək olmaz” [XIIc.s.363].

“Görünür” modal sözü, “amma” bağlayıcısı qətiyyətliliyi gücləndirərək “başladığım işi axıra çatdırmalıyam”, “belə hala yol vermək olmaz” kimi ifadələri ilə natiq bu məsələyə ciddi fikir verdiyini auditoriyada aidiyyatı olan şəxslərə anladır.

Elə Bakı Beynəlxalq Hava Limanının layihəsinin 19 oktyabr 1997-ci il tarixdə, təqdimetmə mərasimindəki çıxışın sonluğu da ciddiliklə qurtarır: Burada da “milli dizayna uyğun aparmalısınız”, “yabançı bir iş görmək olmaz”, “xüsusi fikir verməlisiniz” kimi qətiyyətlilik ifadələri, eləcə də “qoy” əmr ədatı milli dəyərlərə sadiqliyin bariz nümunəsini, milli dəyərlərə sonsuz sevgini üzə çıxarır: “Cənab Erenin, siz Bakı beynəlxalq hava limanının tikintisində görüləcək işləri Azərbaycan memarlıq sənətinə, milli dizayna uyğun aparmalısınız. Yəni burada Azərbaycan üçün yabançı bir iş görmək olmaz.

Siz bu kompleksin tikintisində keyfiyyətə, bir də Azərbaycanın milli memarlıq ənənələrinin orada öz əksini tapmasına xüsusi fikir verməlisiniz. Qoy bu, Azərbaycandakı tarixi binalara uyğun olsun. Yəni azərbaycanlı olsun, nə amerikalı, ingil-

tərəli, fransalı, aşqabadlı, daşkəndli nə də istanbullu olsun. Bu, azərbaycanlı olsun” [XIIc.s.364].

Diplomatik xarakterli çıxışlarında da Heydər Əliyev nitqinin giriş və sonluqları tədqiq olunmağa layiqdir. Ukraynanın milli müstəqillik günü münasibəti ilə Ukraynanın Azərbaycandakı səfirliyinin təşkil etdiyi rəsmi qəbuldakı nitqində (22 avqust 1997-ci il, “Gülüstan” sarayı) böyük natiq qəbul olunmuş ümümişlək diplomatik ifadələri işlətməklə yanaşı iki yerdə “ən” qüvvətləndirici ədatı və “ukrayna xalqı” kimi anafora təkrarlarından istifadə edərək nitqin girişini yaddaqalan edir, auditoriyanın növbəti nitq mərhələlərinə marağını yüksəldir: “Hörmətli cənab səfir! Möhtərəm xanımlar və cənablar! Sizi Ukraynanın milli bayramı – müstəqillik günü münasibətilə ürəkdən təbrik edirəm və müstəqil dövlət quruculuğu yolunda Ukrayna xalqına ən xoş arzularımı yetirirəm. Ukrayna Avropanın ən iri ölkəsidir. Ukrayna xalqı zəngin tarixə, gözəl ənənələrə malikdir. Ukrayna xalqı ümumdünya sivilizasiyasına böyük töhfə vermişdir” [XIIc.s.21]. Sonluqda isə anaforalarla yanaşı özünəməxsus Heydər Əliyev sinonim cərgələri işə düşür: “Ukrayna xalqına firavanlıq, xoşbəxtlik və uğurlar arzulayıram. Ukrayna xalqına Azərbaycan xalqının səmimi salamlarını və xoş arzularını yetirirəm. Dostum prezident Leonid Kuçmaya ən xoş arzularımı yetirərək, ona səadət, Ukraynaya tərəqqi, əmin-amanlıq və müstəqillik, milli azadlıq yolunda yeni-yeni uğurlar diləyirəm. Sağ olun” [XIIc.s.25].

Başqa bir diplomatik ruhlu nitq emosional girişlə başlayır və emosionallıqla da qurtarır. Varşava şəhərində, Polşa prezidenti Aleksandır Kvasnevskinin Azərbaycan prezidentinin şərəfinə təşkil etdiyi rəsmi qəbuldakı nitqin girişinə nəzər yetirək: “Hörmətli cənab prezident Kvasnevski! Möhtərəm xanımlar və cənablar! Sizə və sizin simanızda bütün Polşa xalqına Azərbaycan xalqının, Azərbaycan Respublikasının atəşin

salamını və ən xoş arzularını yetirirəm”. Burada “atəşin salam”la nitqin emosionallığının gücləndiyinin şahidi oluruq.

Həmin nitq onun məna gücünü artıran “səadət, firavanlıq və sülh”, “azadlıq və müstəqillik” kimi sinonim cərgələr, “sağlığına” və “şərəfinə” kimi epiforalarla məna gücünü artıraraq sona yetir: “Polşa xalqına əbədi olaraq səadət, firavanlıq və sülh, azadlıq və müstəqillik arzulayıram! Polşa prezidenti, mənim dostum, gözəl insan Aleksandr Kvasnevskinin sağlığına, Polşa Respublikasının şərəfinə, Polşa xalqının şərəfinə badə qaldırıram. Əziz dostlar, Polşa-Azərbaycan dostluğunun şərəfinə, xalqlarımızın şərəfinə badə qaldırıram” [XIIc.s.47].

Heydər Əliyevin ciddi elmi, rəsmi çıxışları xüsusi bir xitabla başlamır. Belə çıxışlar çox vaxt “minnətdarlığımı bildirmək istəyirəm” frazeoloji ifadə ilə auditoriyaya yol açır. 28 dekabr 1994-cü il tarixdə ABŞ-ın Kolumbiya Universitetinin Harriman institutundakı çıxışın giriş hissəsində tərəflərin qarşılıqlı maraq dairəsi olduğunu dilə gətirərək dinləyicilərdə – sovetoloqlarda maraq doğura, nitqi dinləməyə sövq edə bilir. Bu zaman “axı” qüvvətləndirici ədatının və “əlbəttə” modal sözünün köməyilə auditoriyaya çatdırılacaq fikirlər qüvvətlənir: “İlk öncə məni dəvət etdiyinizə görə sizinlə görüşərək bəzi fikir və mülahizələrimi bölüşdürmək imkanına görə məşhur Harriman İnstitutunun rəhbərliyinə minnətdarlığımı bildirmək istəyirəm. Axı sizin institut və əlbəttə, buraya toplaşanlar keçmiş Sovet İttifaqının öyrənilməsi, yəni sovetologiya sahəsində mütəxəssislərdir. Ona görə də vaxtilə Sovet İttifaqının tərkibində olmuş Azərbaycan Respublikası, yəqin, sizin üçün maraq doğurur. Məni isə sizin Azərbaycan, onun bügünkü həyatı, müstəqil Azərbaycan Respublikasının hansı yolla getməsi barədə nə bildiyiniz maraqlandırır” [IIc.s.186].

Belə rəsmi-elmi görüşlər “təşəkkür edirəm” ifadəsi ilə yekunlaşır: “Çıxışımın sonunda görüşün iştirakçılarına təşək-

kür edirəm. Azərbaycan ilə Amerika Birləşmiş Ştatları arasında bütün istiqamətlərdə və bütün sahələrdə münasibətlərin möhkəmlənəcəyinə əmin olduğumu bildirirəm və görüşün iştirakçılarına onların böyük və nəcib fəaliyyətində uğurlar arzulayıram" [IIc.s.192].

Heydər Əliyevin nitqlərinin giriş və sonluqları diplomatiya sahəsində fəaliyyət göstərən gənclərimiz üçün xüsusi əhəmiyyətə malikdir. ABŞ-ın Bakıdakı səfirliyi binasının açılışında söylənilən, 4 may 1995-ci il tarixli çıxış bu baxımdan diqqətəlayiqdir:

"Hörmətli cənab səfir Kozlariç və xanım Kozlariç! Hörmətli səfirlər, diplomatik işçilər və rəsmi qonaqlar!

ABŞ-ın Bakıdakı səfirliyi binasının təmir olunub abadlaşdıqdan və avadanlıqla təmin edildikdən sonra açılması münasibətilə cənab Kozalariçi və səfirliyin bütün işçilərini təbrik edirəm. Mən bunu böyük hadisə hesab edirəm" [IIIc.s.242].

Səfirlik açılmasını o böyük hadisə hesab edir. Azərbaycan üçün onun müstəqilliyini tanıyan super dövlət ABŞ-ın səfirliyinin açılması, eləcə də keçmiş Sovet məkanında ictimai-siyasi və iqtisadi maraqlarının təmin olunması baxımından ABŞ üçün böyük hadisədir. Bax, elə bu çıxışın sonluğu da məntiqi, lakonik, diplomatik ünsürlərlə zəngindir: "Bu fürsətdən istifadə edib Azərbaycan dövləti adından, Azərbaycan xalqı və vətəndaşları adından Amerika xalqına, onun dövlətinə və cənab prezident Bill Klintona bir daha hörmət və ehtiramımızı bildirmək istəyirəm. Sizi bir daha təbrik edirəm və bütün işlərinizdə uğurlar arzulayıram."

Rəsmi dövlət tədbirlərində Heydər Əliyev xarici dövlət başçılarının adlarını giriş hissələrdə çəkərkən müəyyən ardıcıllığı gözləyir.

29 oktyabr 1998-ci il tarixdə Bakı-Tbilisi-Ceyhan marşrutunun müəyyənləşdirilməsini nəzərdə tutan Ankara bəyan-

naməsinin imzalanması mərasimindəki çıxışda öncə Türkiyə Cumhuriyyətinin dövlət xadimlərini sıralayır. Növbəti nitq mərhələsində qonşu Qazaxıstan və Özbəkistan prezidentlərinin adını çəkir. ABŞ isə bu imzalamaya energetika nazirini göndərmişdir. Bu cür girişlər diplomatiya sahəsində öyrənilməyə layiq nitq nümunələrindəndir: “Türkiyə Cumhuriyyətinin prezidenti cənab Süleyman Dəmirəl!

Türkiyə Böyük Millət Məclisinin sədri hörmətli cənab Hikmət Çətin!

Türkiyə Cumhuriyyətinin Baş naziri hörmətli cənab Məsud Yılmaz!

Gürcüstan prezidenti cənab Eduard Şevardnadze!

Qazaxıstan prezidenti cənab Nursultan Nazarbayev!

Özbəkistan prezidenti cənab İslam Kərimov!

Amerika Birləşmiş Ştatlarının energetika naziri cənab Bill Riçardson!” [XIIIc.s.121].

Belə rəsmi girişlər sıralanmalarla da qurtarır. Cümlədaxili məntiqi ardıcıllıq burada da işə düşür: sərvətlərin sahibi olmaq → sərbəst istifadə etmək → hasil edilmiş nefti dünya bazarına çıxarmaq: “Biz yalnız dövlət müstəqilliyi əldə edəndən sonra öz təbii sərvətlərimizin sahibi olmuşuq, bunlardan sərbəst surətdə istifadə edirik və hasil edilmiş nefti istədiyimiz vaxt dünya bazarlarına çıxarırıq.

Mən bu gün bəyannamənin imzalanması münasibətilə dost ölkələrin dövlət başçılarını – Türkiyəni, Qazaxıstanı, Gürcüstanı, Özbəkistanı, Amerika Birləşmiş Ştatlarını və Xəzəryanı ölkələrin hamısını təbrik edirəm. Ümidvaram ki, bizim bu gün gördüyümüz iş XXI əsr, gələcək əsrlər üçün böyük töhfələr verəcəkdir. Xeyirli, uğurlu olsun!” [XVIIIc.s.127]

Təntənəli yubiley mərasimlərinin girişləri böyük natiqin dilində xitablarla başlayır, rəsmi üslubun tələb etdiyi standartlar və nitqin ekspressivliyini artıran dil vasitələrindən isti-

fadə olunur. Şeyx Şamilin 200 illik yubileyi münasibəti ilə söylədiyi nitqdə (4 noyabr 1997-ci il) Şeyx Şamili Qafqazın qəhrəman oğlu, əfsanəvi şəxsiyyət adlandıraraq "sülh, əmin-amanlıq", "səadət, xoşbəxtlik" kimi sinonimlər giriş hissəyə dərin məzmun verir: "Hörmətli xanımlar, cənablar! Hörmətli qonaqlar! Sizi və bütün Azərbaycan xalqını, Dağıstan xalqını, bütün Qafqaz xalqlarını Qafqazın qəhrəman oğlu, əfsanəvi şəxsiyyət Şeyx Şamilin 200 illik yubileyi münasibətilə ürəkdən təbrik edirəm. Bütün Qafqaza sülh, əmin-amanlıq arzulayıram. Qafqaz xalqlarının hamısına səadət, xoşbəxtlik diləyirəm". Belə təntənəli yubiley gecələri emosional sonluqla, stilistik fiqurlarla – anaforalarla, xalqlar arasındakı dostluğu möhkəmləndirməyə çağıran anaforalarla yekunlaşır: "Eşq olsun Qafqaz xalqlarına! Eşq olsun Dağıstana! Eşq olsun Azərbaycana! Eşq olsun sarsılmaz Dağıstan-Azərbaycan birliyinə! Sağ olun" [XIIc.s.157].

Heydər Əliyevin yubiley nitqlərindəki girişlərdə müraciətlərlə yanaşı yubiley iştirakçılarını tərkibinə görə təsnif edir, nitqin məzmununu artıran, mənasını qüvvətləndirən vasitələrdən də yerindəcə yararlanır:

"Hörmətli xanımlar və cənablar!

Əziz qonaqlar, dostlar!

Sizi dahi Azərbaycan şairi Məhəmməd Füzulinin 500 illik yubileyi, xalqımızın el bayramı münasibətilə ürəkdən təbrik edirəm! Məhəmmıd Füzulinin 500 illik yubileyinə, yubiley mərasimlərində iştirak etmək üçün respublikamıza gəlmiş bir çox ölkələrdən olan nümayəndə heyətlərinə, dövlət xadimlərinə, bütün qonaqlarımıza Füzuli yaradıcılığına, Azərbaycan Respublikasına göstərdikləri hörmət və diqqətə görə təşəkkürümü, minnətdarlığımı bildirirəm" [VIIIc.s.19].

Heydər Əliyev nitqlərinin sonluğu çox vaxt "eşq olsun" xitabı ilə yekunlaşır. Füzulinin 500 illik yubileyindəki nitqin

sonluğu da bu sıradandır: "Eşq olsun şeirə, eşq olsun Füzuliyə, eşq olsun Füzuli yaradıcılığına! Yaşasın elm, mədəniyyət, yaşasın şeir! Yaşasın müstəqil Azərbaycan Respublikası! [VIIIc.s.23]

Müstəqil Azərbaycan iqtisadiyyatının dirçəlməsində mühüm rol oynayan ölkələrarası sazişlərdə söylənilən nitqlərin giriş və sonluqları əsasən publisistik üslubda təqdim edilir. "Azərqızıl" Dövlət şirkəti ilə Amerikanın "R.V.İnvestment qrup servisis" şirkəti arasında sazişin imzalanma mərasimindəki nitqin giriş və sonluğu da bu qəbildəndir. Bu girişdə də Heydər Əliyevin nitq "qəlibi" özünü göstərir. Standart cümlələrlə yanaşı müstəqilliyimizi önə çəkən frazeoloji birləşmələrdən – "öz taleyimizin sahibi olmaq", ədatlardan – "daha da" sözlərindən istifadə edir:

"Hörmətli xanımlar və cənablar! Hörmətli qonaqlar!

Azərbaycan zəngin təbii sərvətlərə malikdir. Bu təbii sərvətlərdən keçmiş zamanlar da Azərbaycan xalqının rifahı naminə istifadə olunubdur. İndi isə biz öz taleyimizin sahibi olaraq, müstəqil dövlət olaraq təbii sərvətlərimizdən sərbəst və daha da səmərəli istifadə etmək imkanı əldə etmişik" [XIIc.s.11].

"Xarici investisiyaların Azərbaycana gəlməsini zəruri, çox əhəmiyyətli" hesab edən ulu öndər xarici şirkətlərə "qapılarımız hamı üçün açıqdır" deyərək nitqini yekunlaşdırır: "Bu gün bir daha bəyan edirəm ki, Azərbaycan öz dövlət müstəqilliyini qoruyub saxlayaraq ərazisində olan bütün imkanlardan bundan sonra da səmərəli istifadə etməyə çalışacaq və bu münasibətlə xarici investisiyaların Azərbaycana gəlməsini zəruri, çox əhəmiyyətli hesab edir. Qapılarımız hamı üçün açıqdır və Azərbaycana maraq göstərən hər bir şirkəti, ölkəni qəbul etməyə hazırıq" [XIIc.s.19].

Heydər Əliyevin xarici ölkələrdə apardığı işgüzar xarakterli görüşlər bu gün ölkəmizdə diplomatiya sahəsində çalı-

şanlar üçün örnəkdir. Bu görüşlərdəki nitqlərin giriş hissələri müraciətlə yanaşı imzalanan sənədlər, sazişlər haqqında mülahizələrlə zəngin olur. Roma şəhərində 25 sentyabr 1997-ci il tarixdə, İtaliya Xarici Ticarət Əlaqələri Nazirliyinin Azərbaycan Prezidentinin şərəfinə təşkil etdiyi rəsmi qəbuldakı nitqin girişi diqqətəlayiqdir: "Hörmətli nazir, xanımlar və cənablar! İtaliyaya rəsmi səfərimin birinci günü başa çatır və mən bugünkü gündən, burada görülmüş işdən son dərəcə razıyam. Bugünkü günün mühüm yekunu həm də ondan ibarətdir ki, İtaliya prezidenti cənab Skalfaro, baş nazir cənab Prodi ilə çox səmərəli danışıqlarımız, söhbətlərimiz oldu və mən onların nəticələrindən razıyam. Bugünkü günün mühüm yekunu həm də ondan ibarətdir ki, İtaliya ilə Azərbaycan arasında ilk dəfə olaraq hökümətlərarası, dövlətlərarası sənədlər imzalandı. Baş nazir cənab Prodi ilə mənim imzaladığım iki bəyannamə, habelə hökümətlərimiz arasında imzalanmış bir neçə saziş əməkdaşlığımızı daha da genişləndirmək və dərinləşdirmək üçün yaxşı müqavilə – hüquqi əsas yaratdı" [XIIc.s.206]. Burada "hökumətlərarası" və "hökumətlərimiz arasında" ifadələrinin məna fərqləri üzə çıxır. Digər bir cümlədə isə Heydər Əliyevə xas olan izah: "müqavilə – hüquqi əsas deməkdir" özünə yer tapır. Elə həmin çıxışın yekunu da "sağlığına, şərəfinə" epiforları ilə, təkrarlarla, emosionallıqla bitir: "İtaliyanın şərəfinə, İtaliya xalqının sağlığına badə qaldırıram! İtaliya prezidentinin sağlığına, İtaliya baş nazırının sağlığına, hörmətli dostlar, sizin sağlığınıza badə qaldırıram. İtaliya ilə Azərbaycan arsında dostluq münasibətlərinin daha da möhkəmlənməsi və inkişaf etməsi şərəfinə, sizin gələcək uğurlarınız şərəfinə, sizin sağlığınıza badə qaldırıram!"

Ölkənin problemləri ilə bağlı dövlət strukturları rəhbərlərinin iştirak etdiyi müşavirələrdə Heydər Əliyev birbaşa mətləbə keçir, həllini gözləyən problemləri sadalayır. Bu za-

man məmurlar auditoriyası hansı çatışmazlıqlar və nöqsanların sadalanacağını, xalq kütlələri isə prezidentin xalqın problemlərini çözəcəyini, konkret qərarlar verəcəyini sevinclə gözləyir. Natiq böyük uzaqgörənliklə bu gözləntiləri duyur və auditoriyanı intizarda qoymur: "Mən respublikanın sosial-iqtisadi problemləri ilə əlaqədar bəzi məsələləri müzakirə etmək üçün sizi bu gün bu müşavirəyə dəvət etmişəm. Bugünkü müşavirə respublikada xüsusən elektrik, su, qaz təchizatının, nəqliyyatın və kommunal təsərrüfatı sahələrinin işi ilə əlaqədar hazırkı vəziyyəti təhlil etmək və qarşıda duran vəzifələr haqqında danışmaq məqsədi daşıyır".

Bu cür müşavirələr "icra hakimiyyəti orqanlarının vəzifəsidir", "siz bunu etməlisiniz", "xüsusi diqqət yetirilməlidir" kimi qətiyyətlilik ifadə edən sözlərlə yekunlaşır. Müşavirə auditoriyası səfərbər edilir: "Müşavirənin gedişində deyildiyi kimi bu baxımdan qaçqınların, məcburi köçkünlərin vəziyyətinə xüsusi diqqət yetirilməlidir. Bu təkcə həmin sahə ilə məşğul olan Qaçqınlar Komitəsinin, yaxud Nazirlər Kabinetində olan strukturun vəzifəsi deyil, bütün hakimiyyət orqanlarının, yerli icra hakimiyyəti orqanlarının vəzifəsidir. Siz bunu etməlisiniz! Sağ olun".

Azərbaycan yazıçılarının X qurultayı ərəfəsində yaşlı nəsildən olan yazıçıların bir qrupu ilə görüşdəki giriş sözünə fikir versək (Prezident sarayı, 28 okyabr 1997-ci il) yazıçı və şairlərə dövlət səviyyəsində yüksək hörmətin, yazıçılarla görüşün özü üçün çox əlamətdar hadisə olduğu anlaşılır: "Adətən biz bu salonda dövlət adamları ilə əlaqədar olan məsələləri müzakirə etməyə toplaşırıq. Ancaq mənim burada olduğum zamanda ilk dəfədir ki, yazıçıların böyük bir nümayəndə heyəti ilə görüşürəm. Bunu özüm üçün çox əlamətdar hadisə hesab edirəm." [XIIIc.s.5].

Həmin görüşün sonluğu da yaddaqalandır: “Siz özünüz bilərsiniz, qurultayı necə keçirəcəksiniz, rəhbərliyə kimi seçəcəksiniz. Amma hesab edirəm ki, bu altı il müddətində Yazıçılar Birliyini saxlayan və onu yaşadan rəhbərlər bu gün təşəkkürə layiqdirlər” [XIIIc.s.60]. “Siz özünüz bilərsiniz” deməklə qurultayın demokratik ruhda keçirilməsini tələb edən ulu öndər öz şəxsi fikirlərini də səmimiyyətlə iştirakçılara çatdırır.

Prezident sarayında keçirilən müşavirələrdəki nitqlərdə qətiyyətlilik nitq ünsürü daha çox istifadə olunur. 29 aprel 1994-cü il tarixdə Daxili İşlər Nazirliyi rəhbər işçilərinin geniş müşavirəsində DİN əməkdaşlarının vəzifələri onların yadına salınır, onların ölkə qarşısında, müharibə şəraitində məsuliyyətləri xatırlanır: “Daxili İşlər Nazirliyi dövlət strukturunda çox mühüm yer tutur və onun qarşısında böyük vəzifələr durur. İndi, Azərbaycan Respublikası öz dövlət müstəqilliyini möhkəmləndirdiyi, ölkəmiz müharibə şəraitində olduğu bir dövrdə bu nazirliyin qarşısında duran vəzifələrin nə qədər məsuliyyətli olduğunu sübut etməyə ehtiyac yoxdur” [Ic.s.322].

Belə girişlərə malik nitqlərin sonluğu da qətiyyətə söykənir. Daxili İşlər Nazirliyinin əməkdaşlarını dövlətçilik ənənələrinə sadiqliyə çağırır, eləcə də “öz tərəfimdən lazımi tədbirlər görəcəyəm” deməklə auditoriya səfərbər olunur. Sonda “vəzifələrin yerinə yetirilməsində” onlara uğurlar dilənir: “Mən Daxili İşlər Nazirliyinin bütün əməkdaşlarına müraciət edərək onları qrupbazlıqdan, siyasi oyunlardan əl çəkməyə, öz işlərini ancaq və ancaq dövlətin mövqeyinə, onun prinsiplərinə əsasən qurmağa çağırıram. DİN orqanlarının da vəzifələrinin həyata keçirilməsi üçün öz tərəfimdən lazımi tədbirlər görəcəyəm. Burada irəli sürülən vəzifələrin yerinə yetirilməsində hamınıza uğurlar arzulayıram. Sağ olun!” [Ic.s.333].

Prezident sarayında keçirilən müşavirələrdə girişlər ən çox “bildiyiniz kimi” ifadələri ilə başlayaraq müşavirənin nə

məqsədlə keçirildiyi haqqında məlumat verilir. 29 avqust 1994-cü il tarixdə keçirilən müşavirədə məqsəd 15 iyun 1994-cü il tarixli "əhalinin sosial müdafiəsinin gücləndirilməsi və iqtisadiyyatın maliyyə vəziyyətinin sabitləşdirilməsi tədbirləri haqqında" fərmanın necə yerinə yetirilməsinə həsr olunmuşdur. Belə müşavirələrdəki girişlər məmurlar ordusunu Prezident fərmanlarını yerinə yetirməyə səfərbər edir, analitik təfəkkürə əsaslanaraq fərmanın yerinə yetirilməməsi səbəblərinin araşdırılması qarşıya qoyulur: "Bildiyiniz kimi son vaxtlar biz respublika iqtisadiyyatının müxtəlif məsələləri - maliyyə, istehsal məsələləri ilə mütəmadi məşğul oluruq. Bu günkü müşavirə də həmin fərmanın həyata keçirilməsi ilə əlaqədardır. Fərmanın qəbul olunmasından artıq iki ay yarım vaxt keçib. Ona görə də mən bu gün sizi buraya dəvət etmişəm. İstəyirəm bilək ki, fərman necə həyata keçirilir, hansı nəticələr əldə etmişik, nəyə nail ola bilmişik və nə yerinə yetirilməyib, nə üçün yerinə yetirilməyib, səbəbləri nədir və nə etmək lazımdır" [IIc.s.160].

Bu tip müşavirələri Heydər Əliyev "bir daha tələb edirəm ki", "tədbirlər görsün", "göstərilməlidir" qətiyyətlilik ifadələri ilə yekunlaşdıraraq, "güman edirəm ki" modal sözünün köməyi ilə müşavirənin vacibliyini nəzərə çatdıraraq fikrini "sağ olun"la yekunlaşdırır: "Müzakirəni yekunlaşdıraraq bir daha tələb edirəm ki, hər kəs burada deyilənlərdən lazimi, ciddi nəticə çıxarsın və fərmanda göstərilən vəzifələrin yerinə yetirilməsi üçün tədbirlər görsün. Vahid Axundova da tapşırıram ki, fərmanın yerinə yetirilməsinin gedişi barədə hər on gündən bir mənə yazılı məlumat versin. Həmin məlumatlarda görülən işlərlə yanaşı, yerinə yetirilməyən məsələlər, bunların səbəbi və kim tərəfindən yerinə yetirilmədiyi göstərilməlidir.

Güman edirəm ki, bügünkü müzakirə lazım idi və hər kəs bundan irəli gələn vəzifələri yerinə yetirmək üçün vacib olan işləri görməlidir. Sağ olun" [IIc.s.168]

Ölkə həyatının ağır məqamlarında çağırılan müşavirələrdə birbaşa mətləbə keçilir, ölkənin vəziyyəti Heydər Əliyev təfəkkürü əsasında auditoriyaya izah olunur. 21 iyun 1994-cü il tarixdə, Prezident sarayında Respublika iqtisadiyyatının və həyatın digər sahələrinin cari məsələlərinə həsr olunmuş müşavirədəki kimi: "Respublikamız, Azərbaycan vətəndaşları ölkəmizin tarixinin çətin dövrünü yaşayırlar... Dediyim kimi biz tariximizin ağır dövrünü yaşayırıq. Bu, bir neçə amillə bağlıdır. Əvvəla, müstəqillik yoluna çıxmaq, tam müstəqilliyi təmin etmək, dövləti formalaşdırmaq çətin vəzifələrdir və məşəqqətli bir yoldur. Biz bu yolla gedirik" [IIc.s.28].

Prezident sarayında keçirilən müşavirələrdə ulu öndər nitqini ənənəvi olaraq tələb və tapşırıq xarakterli qətiyyətli ifadələrlə yekunlaşdırır. Sonluqlar bütöv bir müşavirənin ruhuna uyğun seçilir. Sanki girişdə qarşıya qoyulan məsələlər sonluqlarla həllini tapır. Hər kəs nə etməli olduğunu qətiyyətli dövlət başçısının dilindən eşidir: "Mən icra hakimiyyəti başçılarından, hərbi komissarlardan, polis rəislərindən, prokurorlardan, bu işlərlə məşğul olan nazirlərdən tələb edirəm ki, ordu sıralarını komplektləşdirmək üçün verilən tapşırıqları verilən müddət ərzində yerinə yetirsinlər. Bilin, bu, taxıldan da, pambıqdan da, neftdən də daha mühüm vəzifədir. Cəbhə bölgəsində olan rayonların icra hakimiyyəti başçılarının məsuliyyəti daha böyükdür. Onlar bəzən ordunun işinə qarışırlar. Mən istərdim ki, belə olmasın. Amma bəzən də onlar ordunun, döyüşçülərin vəziyyətinə biganə qalır, lazımi kömək göstərmirlər. Şübhəsiz ki, belə də yaramaz. Mənə belə gəlir ki, vəzifələr aydındır. Artıq danışmağa ehtiyac yoxdur. Hamınıza müvəffəqiyyətlər arzulayıram" [IIc.s.38]

Prezident sarayındakı müşavirələrdə böyük natiq müraciət və xitablarsız birbaşa mətləbə keçir, birbaşa həllini gözləyən məsələlərdən danışır. 19 noyabr 1993-cü il tarixdə, Prezident sarayında bank-maliyyə, tədiyə sistemlərinin və idxal-ixrac əməliyyatlarının vəziyyətinə və onu yaxşılaşdırmaq sahəsində vəzifələrə həsr olunmuş müşavirədə respublikanın ağır iqtisadi vəziyyəti xalqdan gizlədilməyərək səmimi bir şəkildə auditoriyaya çatdırılır: "Respublikamız ağır iqtisadi böhran vəziyyətindədir. 1993-cü il sona çatır. Ölkədə gedən müharibə iqtisadiyyatın vəziyyətinə də ciddi təsir göstərir. Bütün bunlar isə bir sıra ciddi, əsaslı tədbirlər görülməsini tələb edir! Çalışmalıyıq ki, bu tədbirlər iqtisadiyyatda böhran prosesinin qarşısını alsın, iqtisadi potensialdan səmərəli istifadə olunmasına lazımi şərait yaratsın. Müşavirənin də keçirilməsi məhz bu zərurətlə bağlıdır" [Ic.s.257].

Müşavirələrdəki nitqlərin sonluğu vəzifəli şəxslərə ünvanlanır, onlara ciddi tapşırıqlar verilir və onlardan öz "məsuliyyətlərini hiss etmələri" tələb olunur: "Müzakirə olunan məsələlər barədə öz fikirlərimi bildirdim, tapşırıqlarımı verdim. Toxunulmayan məsələlər qalmadı. Güman edirəm ki, bu görüşümüzdən sonra hər bir vəzifəli şəxs iqtisadiyyatımızın bundan sonrakı vəziyyəti haqqında öz məsuliyyətini hiss etməlidir. Azərbaycanın iqtisadi potensialı böyükdür. Biz gərək bu potensialdan səmərəli istifadə edək. Diqqətinizə görə sağ olun" [Ic.s.265].

Prezident sarayında nöqsanlar, çatışmazlıqlarla bağlı keçirilən müşavirələrdə, sonluqlarda "təşəkkür edirəm", "diqqətinizə görə minnətdaram", "sağ olun" ifadələrinin yerini "hər kəs öz məsuliyyətini hiss etməlidir", "bu işlərlə ciddi məşğul olmaq lazımdır" kimi qətiyyətli ifadələr tutur. Prezident sarayında, maliyyə sistemində və əhalinin taxıl məhsulları ilə təchizatında olan ciddi nöqsanların aradan qaldırılmasına həsr

olunmuş 8 dekabr 1993-cü il tarixli müşavirəsindəki nitqin sonluğu buna əyani misaldır: "Bu gün fürsətdən istifadə edərək demək istəyirəm ki, çörəyin və taxıl məhsullarının keyfiyyəti ilə əlaqədar əhalidən yenə də çoxlu şikayət gəlir, narazılıqlar eşidilir. Əhalinin çörəklə təchizatının normal səviyyədə olmaması haqqında Bakı şəhərində və ölkənin başqa bölgələrində narazılıqlar var və bu barədə məlumatlar gəlir. Ona görə də icra hakimiyyəti orqanlarına, müvafiq nazirliklərə tapşırılır ki, bu işlərlə ciddi məşğul olsunlar. Bir daha təkrar edirəm ki, tapşırıqlar Nazirlər Kabinetinə, Baş nazirə, onun müavinlərinə, hüquq-mühafizə orqanlarına, müvafiq nazirliklərə və onların rəhbərlərinə verilir. Bu işlərlə ciddi məşğul olmaq lazımdır" [Ic.s.276].

Prezident sarayında keçirilən müşavirələrdə girişlər ən çox "bildiyiniz kimi" ifadəsi ilə başlayır və bunun nə məqsədlə keçirildiyi haqqında məlumat verilir. 29 avqust 1994-cü il tarixdə keçirilən müşavirədə məqsəd 15 iyun 1994-cü il tarixli "Əhalinin sosial müdafiəsinin gücləndirilməsi və iqtisadiyyatın maliyyə vəziyyətinin sabitləşdirilməsi tədbirləri haqqında" fərmanın necə yerinə yetirilməsinə həsr olunmuşdur. Belə müşavirələrdəki girişlər məmurlar ordusunu Prezident fərmanlarını necə yerinə yetirməyə səfərbər edir, analitik təfəkkürə əsaslanaraq fərmanın yerinə yetirilməməsi səbəblərinin araşdırılması qarşıya bir məqsəd kimi qoyulur: "Bildiyiniz kimi son vaxtlar biz respublika iqtisadiyyatının müxtəlif məsələləri – maliyyə, istehsal məsələləri ilə mütəmadi məşğul oluruq. Bu günkü müşavirə də həmin fərmanın həyata keçirilməsi ilə əlaqədardır. Fərmanın qəbul olunmasından artıq iki ay yarım vaxt keçib. Ona görə də mən bu gün sizi buraya dəvət etmişəm. İstəyirəm bilək ki, fərman necə həyata keçirilir, hansı nəticələr əldə etmişik, nəyə nail ola bilmişik və nə yeri-

nə yetirilməyib, nə üçün yerinə yetirilməyib, səbəbləri nədir və nə etmək lazımdır” [IIc.s.160].

Bu tip müşavirələri Heydər Əliyev “bir daha tələb edirəm ki”, “tədbirlər görsün”, “göstərilməlidir” qətiyyətlilik ifadələri ilə yekunlaşdıraraq, “güman edirəm ki,” modal sözünün köməyi ilə müşavirənin vacibliyini nəzərə çatdıraraq fikrini “sağ olun” sözü ilə yekunlaşdırır: “Müzakirəni yekunlaşdıraraq bir daha tələb edirəm ki, hər kəs burada deyilənlərdən lazimi, ciddi nəticə çıxarsın və fərmanda göstərilən vəzifələrin yerinə yetirilməsi üçün tədbirlər görsün. Vahid Axundova da tapşırıram ki, fərmanın yerinə yetirilməsinin gedişi barədə hər on gündən bir mənə yazılı məlumat versin. Həmin məlumatlarda görülən işlərlə yanaşı, yerinə yetirilməyən məsələlər, bunların səbəbi və kim tərəfindən yerinə yetirilmədiyi göstərilməlidir.

Güman edirəm ki, bügünkü müzakirə lazımi idi və hər kəs bundan irəli gələn vəzifələri yerinə yetirmək üçün vacib olan işləri görməlidir. Sağ olun” [IIc.s.168]

Milli bayramlarda xalqın təbriki bədii frazeoloji ifadələrlə sonuclanır. Elə həmin təbriklərdə sonluq “əhval-ruhiyyəsi diləmək”, “bağrına basmaq”, “uğurlar arzulamaq” kimi frazeoloji birləşmələrlə bəzənmiş olur: “Bu şad bayram günlərində hər birinizi bağrıma basıram, sizə gözəl Novruz əhval-ruhiyyəsi diləyir, həyatınızda və işlərinizdə uğurlar arzulayıram! Bayramınız mübarək olsun!”

Dövlət bayramlarımıza həsr olunmuş təntənəli yığıncaqlarda Heydər Əliyev öz nitqini yığcam, lakonik cümlələrlə başlayır, girişlər çox vaxt sinonim cərgələrlə milyonların qəlbinə yol açır. “Əziz həmvətənlər” ifadəsi ölkə vətəndaşlarının dilindən, dinindən, siyasi mənsubiyyətindən asılı olmayaraq hamısını əhatə edir. Bu ifadənin arxasınca “bacılar və qardaşlar” deməklə auditoriyanın ona doğmalığını dilinə gətirir. “Xanımlar və cənablar” diplomatik bir ifadə olaraq dövlət

başçısının müraciətini təşkil edir. 27 may 1994-cü il tarixdə, Respublika sarayında Azərbaycanın istiqlal bayramına – Respublika gününə həsr olunmuş təntənəli yığıncaqdakı nitqdə olduğu kimi:

“Əziz həmvətənlər, bacılar və qardaşalar!

Hörmətli xanımlar, cənablar! Sizi Azərbaycanın Respublika günü, istiqlal bayramı münasibətilə təbrik edirəm, sizə dözümlülük, nikbinlik, dövlətçiliyimizin möhkəmlənməsi yollarında dönməzlik və inam, Azərbaycanın işıqlı gələcəyi naminə xoşbəxtlik və səadət arzulayıram” [IIc.s.5]

Elə bu çıxışını da “əziz həmvətənlər” ifadəsi ilə, eləcə də “ümidvar olduğumu bildirmək istəyirəm ki” modal sözü ilə, nitqin emosionallığını gücləndirən frazeoloji birləşmələrlə yığcam şəkildə qurtarır: “Əziz həmvətənlər bu böyük bayram münasibətilə sizi bir daha təbrik edir, hər birinizə can sağlığı, xoşbəxtlik arzulayıram. Ümidvar olduğumu bildirmək istəyirəm ki, işıqlı gün uzaqda deyil, Azərbaycan bu qaranlıqdan, bu bəladan çıxacaq, xalqımız daha da ucalacaq və müstəqil Azərbaycan Respublikası dünya birliyində öz layiqli yerini tutacaqdır. Sağ olun” [IIc.s.13].

Heydər Əliyevin xalq şairlərinə, yazıçılara, görkəmli sənət adamlarına ünvanlanan təbriklərində onların yubiley ili, tutduğu mövqe bir-iki cümlə ilə qeyd edilir, sonluqlar da “cansağlığı, xoşbəxtlik, yeni-yeni yardıcılıq uğuralrı arzulayıram” kimi ifadələrlə bitir: “Hörmətli Balaş Azəroğlu! Sizi – müasir Azərbaycan poeziyasının görkəmli nümayəndəsini anadan olmağınızın 75 illiyi münasibətilə səmimi qəlbdən təbrik edirəm. Sonda isə “Sizə cansağlığı, xoşbəxtlik və yeni yaradıcılıq uğurları arzulayıram”.

Rəsmi təbriklərdə izahedici cümlələrdən istifadəyə geniş yer verilir. Təbrik olunan şəxs ictimaiyyətə təqdim olunur: “Hörmətli Balaş Azəroğlu! Sizi – müasir Azərbaycan poezi-

yasının görkəmli nümayəndəsini anadan olmağınızın 75 illiyi münasibətilə səmimi qəlbdən təbrik edirəm” [IXc.s.31]. Elə buradaca sonluqlar məişət üslubunda səmimiyyət və sevgi ilə bitir: “Sizə can sağlığı, xoşbəxtlik və yeni yaradıcılıq uğurları arzulayıram” [IXc.s.31]. Bu cür izahedici girişlər təkcə şəxsiyyətlərə yox, hadisə və mərasimlərə də yönəlir.

Heydər Əliyevin Azərbaycan xalqının görkəmli şair və yazıçılarının, sənət adamlarının yubiley və vidalaşma mərasimlərindəki nitqlərinin girişləri qəlbləri riqqətə gətirən özünəməxsus frazeoloji birləşmələrlə zəngindir. 24 iyun 1994-cü il il tarixdə xalq şairi Xəlil Rza Ulutürklə vidalaşma mərasimindəki çıxışda “fədakar mübariz”, “böyük vətəndaş” ifadələri yerli-yerində işlənərək Xəlil Rza şəxsiyyətini xalqa bir daha tanıdır: “Ağır dövrdə yaşayan Azərbaycan bu gün böyük bir matəmə bürünmüşdür. XX əsrdə Azərbaycanın görkəmli simalarından biri şair, yazıçı, filosof, alim, xalq azadlığı uğrunda fədakar mübariz, böyük vətəndaş Xəlil Rzanı itirmişik. Bu böyük itkidir. Son illər xalqımız faciələr içində yaşayır. Lakin Xəlil Rza kimi şəxsiyyətlər, böyük insanlar xalqımızı daim ruhlandırmış, mübarizəyə dəvət etmiş, milli azadlıq uğrunda öz mübarizəsi ilə nümunə göstərmişdir.” [IIc.s.36].

Belə vidalaşma mərasimlərinin sonluqları dini üslubun tələb etdiyi sadə, məna yükü böyük cümlələrlə yekunlaşır: “Allah rəhmət eləsin”, “başsağlığı verirəm”, “Allah səbir versin” və s. frazeoloji ifadələr belə sonluqları bəzəyir: “Mən bu gün Xəlil Rzanın cənazəsi qarşısında baş əyirəm. Allah ona rəhmət eləsin. Mən onun ailəsinə başsağlığı verirəm. Bu böyük itki münasibətilə bütün Azərbaycan xalqına başsağlığı verirəm. Başınız sağ olsun. Allah xalqımıza səbir versin. Allah Xəlil Rzaya rəhmət eləsin” [IIc.s.37].

İşğal olunmuş rayonların əhalisi ilə görüşündə sonluqlar nikbinliyə çağırışla şəhidlərə Allahdan rəhmət diləməklə bitir:

"Vətən yolunda şəhid olanlara, Kəlbəcərin müdafiəsi yolunda şəhid olanlara Allahdan bir daha rəhmət diləyirəm. Sizə dözümlülük, dəyanət diləyirəm. Əmin olun ki, biz sizinlə birlikdə qarşımızda duran məqsədlərə nail olacağıq. Çox sağ olun" [IXc.s.124].

15 iyun 1993-cü ildən ömrünün sonunadək qismətinə daim qaçqınlar və məcburi köçkünlər qarşısında çıxış etmək düşən siyasi xadim Heydər Əliyevin bu səpkidə çoxsaylı nitqləri araşdırılmaq baxımından diqqətəlayiqdir. Elindən-obasından, dədə-baba torpaqlarından, əsrlərlə formalaşmış həyat tərzlərindən məhrum olmuş insanlarla – Azərbaycan vətəndaşları və soydaşları ilə görüşlər xüsusi bir auditoriya təşkil edir. Bu auditoriyadakı nitqlərdə Heydər Əliyevin nitq "qəlibindən" süzülən səmimi, nikbin, lazım gəldikdə sərt və qətiyyətli ifadələr özünə yer tapır. Bu görüşlərin məkanı əsasən qaçqın və məcburi köçkünlərin məskunlaşdığı ərazilər, eləcə də müşavirələrin keçirildiyi Prezident sarayıdır. Xalqın milli və dini bayramlarında söylənilən nitqlərin girişi torpaqlarımızın işğaldan azad edilməsinə, qaçqın və məcburi köçkünlərin dədə-baba torpaqlarına qaytarılmasına həsr olunur. 19 mart 1999-cu ildə Novruz bayramındakı çıxış bu sıradandır:

"Əziz bacılar və qardaşlar!

Sizi, çadır şəhərciyində yaşayan bütün soydaşlarımızı xalqımızın əziz bayramı – Novruz bayramı münasibətilə ürəkdən təbrik edirəm. Sizə xoş ovqat, şən həyat, səadət, bütün arzularınıza çatmağınızı diləyirəm.

Novruz bayramı insanlara həmişə xoşbəxtlik gətirir, insanları xeyirxah, nikbin edir. Bu Novruz bayramı da Azərbaycan üçün, bütün xalqımız üçün yeni müjdələr gətirir. Sizin hamınıza cansağlığı arzulayıram. Bildirirəm ki, hamımızın yeganə arzusu – Azərbaycanın işğal edilmiş torpaqlarının azad olunması, ölkəmizin ərazi bütövlüyünün bərpa edilməsi və

işğal olunmuş bütün torpaqlarımızdan zorla çıxarılmış, didərgin düşmüş soydaşlarımızın öz doğma torpağına, elinə-obasına qayıtması bizim və Azərbaycan prezidenti kimi şəxsən mənim müqəddəs vəzifəmdir. Mən bu vəzifəni yerinə yetirmək üçün bundan sonra da əzmlə çalışacağam" [XIXc.s.311].

Səmimiyyətlə yoğrulan, nikbinliklə dolu, gələcəyə tuşlanan nitq sonluğu bu çıxışda da özünü göstərir. Yaxın qohumlarının, hətta övladlarının toyunda qol qaldırıb rəqs etməyən böyük natiq "yeni ailə quran gənclərlə və onların ailə üzvləri ilə rəqs edərək" çıxışını əbədi olaraq yaddaşlara həkk edir: "Mən həmişə sizinləyəm. Bu gün də sizinləyəm, sabah da, gələcəkdə də sizinlə olacağam. İnanıram ki, işğal edilmiş torpaqlar azad olan zaman biz sizinlə Cəbrayılda da, Füzulidə də, Zəngilanda da, Qubadlıda da, Ağdamda da, Kəlbəcərdə də, Laçında da, Şuşada da, bütün rayonlarda, Azərbaycan torpağı olan Dağlıq Qarabağda da görüşəcəyik. Mən sizə bir daha cansağlığı arzulayıram. Novruz bayramı münasibətilə sizi bir daha təbrik edir, hər birinizə səadət, işlərinizdə uğur arzulayıram. İndi isə musiqiçilər yaxşı, ürəyəyatan bir hava çalsınlar, mən yeni ailə quran gənclərlə və onların ailə üzvləri ilə rəqs edib sizi tərk edəcəyəm" [XIXc.s.320].

Ulu öndəri Respublikamızın gələcəyi olan uşaqların auditoriyasında da tez-tez görürük. Bu auditoriyalardakı giriş nitqlərində bir qayğıkeş ata, bir ağsaqqal baba müraciəti görür, sonluqlarda isə balalarına öyüd verən, onları gələcəyə hazırlayan, onlara nikbinlik aşılayan nitqin şahidi oluruq. 14 dekabr 1997-ci il tarixdə, Uşaqların Beynəlxalq Televiziya və Radio günü münasibətilə "uşaqlar dünyanın sevincidir" devizi altında keçirilən şənlikdəki çıxışın girişi belə başlayır: "Əziz uşaqlar, əziz balalar! Mən sizi – Müstəqil Azərbaycan Respublikasının bütün uşaqlarını bayram münasibətilə – Uşaqların Beynəlxalq Televiziya və Radio günü münasibətilə ürək-

dən təbrik edirəm" [XIIIc.s.390]. Uşaqlarla olan bu görüş müstəqil Azərbaycanın gələcəyinə yönələn, nikbinliklə, inamla dolu bir nitqdir. Səmimi bir sonluqla qurtaran bu nitq uşaqların, valideynlərin yaddaşlarına həkk olunur. Stilistik fiqurlarla – anaforalarla ekspressivliyi yüksələn bu nitq şifahi nitqin ən gözəl nümunələrindəndir: "Azərbaycanın gözəl gələcəyi var, mən bunu görürəm və bunun uğrunda mən həyatımı sərf etmişəm, bundan sonra da sərf edəcəyəm. Sizə görə, Azərbaycanın gələcəyinə görə. Amma bilin ki, siz müstəqil Azərbaycanda yaşayırsınız, siz azad Azərbaycanda yaşayırsınız. Siz müstəqil, azad Azərbaycan Respublikasının övladlarısınız. Siz bizim demokratik cəmiyyətimizin, demokratik dövlətimizin gələcək qurucularısınız. Siz bizim işimizin davamçılarısınız. Biz gələcəyi sizə tapşırırıq. Sizi ürəkdən bir daha təbrik edirəm. Sizi bağrıma basıram, sizi öpürəm, sizə xoşbəxtlik arzulayıram. Sağ olun" [XIIIc.s.395].

"Əziz uşaqlar, əziz balalar, əziz övladlarımız!" müraciəti ilə başlayan nitqlərə böyük natiqin dilində tez-tez təsadüf edirik. Uşaqlar və gənclərin toplaşdığı tədbirlərdə Heydər Əliyevin çıxışları ölkənin gələcəyinə, o gələcəyi quracaq insanlara – uşaq və gənclərə ünvanlanır. Müstəqil ölkəmizin gələcək qurucularının yaddaşlarına Heydər Əliyev öyüdü, nəsihəti hopur: "Azərbaycanın gəncləri Azərbaycanın gələcəyidir. Doğma Vətən-Azərbaycan, doğma ölkə, müstəqil Azərbaycan dövləti sizin gələcəyiniz üçün çox işlər görür. Siz Azərbaycanın müstəqilliyinin ilk illərində oxumağa başlamısınız, təhsil alırsınız, Azərbaycanın gözəl gələcəyini görmək imkanınız var. Ona görə də siz bizim, Azərbaycanın xoşbəxt balalarısınız" [VIIIc.s.185].

Uşaqlar və gənclərə həsr olunan nitqlərinin sonluqları isə "Əziz balalar, mən sizi sevirəm, hər birinizi bağrıma basır, qucaqlayıram, hər birinizi öpürəm" cümləsi ilə bitir. Uşaqların

timsalında Azərbaycanın xoşbəxt gələcəyinə olan inam, nikbinlik əsas yeri tutur: "Sizə xoşbəxtlik arzulayıram. Valideynlərinizə xoşbəxt həyat, əmin amanlıq arzu edirəm. Əminəm ki, Azərbaycan xalqının həyatı bundan sonra gündən-günə xoşbəxt, gözəl olacaqdır. Ölkəmiz gündən-günə yüksələcək, müstəqil dövlətimiz yaşayacaq və Azərbaycan xalqı Dünya Birliyində daim özünə layiq yerini tutacaqdır" [VIIIc.s.186].

Uşaq və gənclər auditoriyasında söylənilən nitqlər də özünəməxsus girişlər və sonluqlara malikdir. Girişlər çox vaxt müraciətlə başlayır, sonra iştirakçılar təbrik olunur, arzular ünvanlanır: "Əziz uşaqlar, sevimli balalar! Mən sizə müraciət edirəm və Azərbaycan radiosu və televiziyası vasitəsilə Azərbaycanın bütün uşaqlarına, gənclərinə müraciət edirəm. Sizin hamınızı – Azərbaycanın uşaqlarını, gənclərini, qızlarını, oğlanlarını bu bayram münasibətilə, YUNİSEF Beynəlxalq Təşkilatının yaratdığı Beynəlxalq gün – uşaqların televiziya və radio günü münasibətilə ürəkdən təbrik edirəm. Sizə xoş həyat, sevinc, səadət və gözəl gələcək arzulayıram" [XXIIIc.s.394].

Heydər Əliyev nitqinə xas olan izahedicilik, nitqin ekspressivliyini gücləndirməyə yönələn sinonim cərgələrdən istifadə burada da öz əksini tapmışdır.

Uşaq auditoriyasında söylənilən nitqlərin sonluqları adətən nikbin notlar üzərində qurulur, hər şey Azərbaycanın gələcəyinə tuşlanır. "Budur mənim həyatımın bugünkü mənası və gördüyüm işlərin məzmunu!" Bu məna, bu məzmun aşağıdakı sonluqda açılır: "Mənim bütün həyatım xalqıma xidmətə həsr olunub. Amma bu gün həyatımın mənası, məqsədi müstəqil Azərbaycanın gələcəyini təmin etməkdir. Yəni Azərbaycan bir müstəqil dövlət kimi yaşasın və müstəqilliyi əbədi olsun. Azərbaycan inkişaf etsin və inkişaf etmiş dövlətlər səviyyəsinə çatsın. Azərbaycan yüksək iqtisadiyyata malik olsun və Azərbaycan xalqı, Azərbaycan vətəndaşları, Azər-

baycanda hər bir insan xoşbəxt yaşasın, firavan yaşasın, rahatlıq şəraitində yaşasın, qorxu altında olmasın, təhlükə altında olmasın, gələcəyə baxsın və gələcək haqqında düşünsün. Budur mənim həyatımın bugünkü mənası və gördüyüm işlərin məzmunu!” [XXIIIc.s.400].

9 may 1997-ci ildə İkinci Dünya Müharibəsində alman faşizmi üzərində qələbənin 52-ci ildönümü münasibətilə Həzi Aslanovun məzarı önündə keçirilən mərasimdəki nitqdən bir hissə: “Əziz və hörmətli veteranlar!

Əziz həmvətənlər, əziz bacılar, qardaşlar!

Mən sizin hamınızı, bütün Azərbaycan xalqını, Azərbaycan Respublikasının vətəndaşlarını qələbə günü münasibətilə, İkinci Dünya Müharibəsində, Böyük Vətən müharibəsində alman faşizmi üzərində qələbənin ildönümü münasibətilə təbrik edirəm. Sizə cansağlığı, səadət, uzun ömür arzulayıram” [IXc.s.423-424].

Çıxışın məzmununa uyğun olaraq qısa, lakonik girişlər izahedici xarakterdədir. Elə bu çıxışın sonu qüvvətləndirici “ən”, “da”, “də” ədatlarının köməyi ilə veteranların qayğısına yönələn, onlara qayğının hamımızın borcu kimi dəyərləndirən böyük natiq, ağsaqqal və ağbirçək veteranların “özünə də, övladlarına da, nəvə və nəticələrinə də” xoşbəxt həyat arzulamaqla fikrini yekunlaşdırır. Poetik duyğularla qurtaran nitq veteranların qəlbini oxşayır, onlar dövlət başçısının ehtiramından riqqətə gəlir, belə nitq yaddaşlara hopur: “Onlar da bilir və Azərbaycanın bütün ictimaiyyəti, bütün Azərbaycan xalqı da bilməlidir ki, İkinci Dünya Müharibəsinin, Böyük Vətən Müharibəsinin veteranları bizim ən əziz, ən mötəbər insanlarımızdır. Onlara qayğı göstərmək, hörmət etmək, onların bütün problemlərini həll etmək bizim dövlətin və hər bir dövlət orqanının, hər bir namuslu Azərbaycan vətəndaşının borcudur. Ona görə də mən veteranları xüsusi təbrik edirəm.

Bir daha sizin hamınıza cansağlığı, uzun ömür arzulayır, bundan sonra özünüzə də, övladlarınıza da, nəvələrinizə, nəticələrinizə də xoşbəxt həyat arzu edirəm. Hamınızı bir daha təbrik edirəm. Qələbə günü münasibətilə mənim təbriklərimi qəbul edin. Sağ olun" [IXc.s.427-428].

Müstəqilliyimizin qorunması və möhkəmləndirilməsi yolunda Heydər Əliyevi tez-tez hərbçilər auditoriyasında görürük. 15 oktyabr 1997-ci ildə Azərbaycan Respublikası hərbi təyyarəçilər məktəbinin ilk buraxılışına həsr olunmuş təntənəli mərasimdə söylədiyi nitqin girişi əsgərlərə müraciətlə başlayır: "Əziz əsgərlər və zabitlər, Azərbaycan Milli Ordusunun hava qüvvələri kadrlarının hazırlanmasında ilk addımlarını atan Azərbaycan döyüşçüləri!" Azərbaycan Respublikasının Silahlı Qüvvələrinin şəxsi heyətinə bayram təbrikində isə müraciət generallarla başlayır: "Hörmətli generallar, admirallar, zabitlər, gizirlər, miçmanlar, əsgərlər, matroslar! Sizi Azərbaycan Respublikası Silahlı Qüvvələr günü münasibətilə ürəkdən təbrik edir, hər birinizə səmimi arzularımı bildirirəm". Belə auditoriyalarda sonluqlar da müxtəlif olur. Təyyarəçilirəmizi milli şahinlər adlandıraraq onları ruhlandırır, onlara vətən səmasını qorumaqda qol-qanad verir: "Mən sizi ürəkdən təbrik edirəm. Bir daha deyirəm: Çox sevinirəm ki, indi milli şahinlərimiz var. Sevinirəm ki, bizim şahinlərimiz Azərbaycan səmasını daim qorumağa, Azərbaycanın ərazisini daim qorumağa, Azərbaycanın müstəqilliyini qorumağa qadirdirlər". Gənc hərbçilərlə görüş emosionallıqla başlayıb, emosianallıqla da sona çatırsa şəxsi heyətə olan təbrik isə ciddi çalarlar, rəsmi tonla başlayıb qurtarır: "Bilin ki, sizin hər birinizin arxasında Azərbaycan dövləti və xalqı durmuşdur. Hərbi xidmətdə qazandığınız uğurlar Azərbaycan Respublikasının müstəqiliyyinin və ərazi bütövlüyünün qorunmasında mühüm rol oynayır".

Heydər Əliyevi tez-tez peşə bayramlarını qeyd edən nazirlik əməkdaşlarının təntənəli yığıncaqlarında görür, onun belə tədbirlərdə giriş nitqləri rəsmi xarakter daşıyır, "təbrik edirəm", "uğurlar arzulayıram" frazeologizmləri ilə müşayiət olunur. 28 mart 1998-ci ildə Azərbaycan Milli Təhlükəsizlik Nazirliyi əməkdaşlarının bir qrupu ilə Respublika sarayındakı görüş bu qəbildəndir:

"Hörmətli dostlar!

Mən sizi – Milli Təhlükəsizlik Nazirliyinin əməkdaşlarını müstəqil Azərbaycan Respublikasının milli təhlükəsizlik orqanları əməkdaşlarının peşə bayramı günü münasibətilə bir daha təbrik edirəm. Azərbaycanın Milli Təhlükəsizlik Nazirliyi sahəsində çalışan bütün vətəndaşlarımıza işlərində uğurlar arzulayıram" [XVc.s.109].

Təhlükəsizlik Nazirliyi əməkdaşlarının peşə bayramındakı nitqin sonluğu hüquq-mühafizə orqanlarında işləyən, çalışan vətəndaşlarımıza örnəkdir. Məşhur bir kəlamla - "soyuq baş, hərarətli ürək, təmiz əllər" – nitqini yekunlaşdıran böyük natiq "mənəvi saflıq", "mənəvi paklıq" sinonimləri ilə nitqin ekspressivliyini gücləndirərək nitqin analitik təfəkkürə malik auditoriya üçün yadda qalmasını təmin edir, "hərə özü üçün lazımi nəticələr çıxaracaqdır" deməklə onları səfərbər edir: "Vaxtilə belə bir məşhur kəlam var idi ki, soyuq baş, hərarətli ürək, təmiz əllər olmalıdır. Bu kəlamın müəllifinin kim olub-olmamağından asılı olmayaraq, müdrik sözlərdir. Mən arzu edirəm ki, bizim hüquq-mühafizə orqanlarında işləyən adamların həqiqətən yanan hərarətli ürəyi olsun, düşünən başı olsun və təmiz əlləri olsun. Biz ümumiyyətlə, vətəndaşlarımızı və xüsusən hüquq-mühafizə orqanlarında çalışan əməkdaşları bu tələblər əsasında tərbiyə etməliyik. Bir daha deyirəm, mənəvi saflıq, mənəvi paklıq ən əsas tələblərdən biridir. Vətənə, xalqa sədaqət və mənəvi saflıq – bunlar bizim müvəffəqiyyətimizin əsasıdır.

Güman edirım ki, biz hüquq-mühafizə orqanlarında belə bir mühitin, əhval-ruhiyyənin yaranmasına nail ola biləcəyik.

Mən sizə işlərinizdə uğurlar arzulayıram və ümidvar olduğumu bildirmək istəyirəm ki, bizim bugünkü görüşlərimizdən, bu danışıqlardan hərə özü üçün lazımi nəticə çıxaracaqdır. Sağ olun. Təşəkkür edirəm" [XVc.s.126].

Məşhur Fransız yazıçısı Viktor Hüqo "Səfillər" əsərində Vaterloo çölündə Fransa imperatoru Napaleon Bonapartın məğlub edildiyi döyüş səhnəsini verir, Vaterloo çölündə ingilis generalına qoyulan heykələ münasibətini açıqlayarkən heykəlin döyüşü udan ingilis əsgərinə qoyulmalı olduğunu diqqətə çatdırır.

Ordu ilə bağlı çıxışlarda Heydər Əliyev əsgərə olan hörməti, qayğını önə çəkməklə bütün dövlət strukturlarının diqqətini Azərbaycan əsgərinə yönəldir.

Çıxışlarının əksərində "Əziz əsgərlər, zabitlər, döyüşçülər!" xitabı səslənir. 26 iyun 1998-ci il Azərbaycan Milli Ordusunun yaradılmasının 80 illiyinə həsr olunmuş təntənəli yubiley mərasimindəki nitqdə Azərbaycan əsgərinə tərif verir, təbrik edir:

"Əziz əsgərlər, zabitlər, döyüşçülər!

Hörmətli xanımlar və cənablar! Sizi Azərbaycan Respublikasının Silahlı Qüvvələri Günü, Azərbaycan Milli Ordusunun yaranmasının 80 illik yubileyi, bayram münasibətilə səmimi qəlbdən təbrik edirəm. Azərbaycan Silahlı Qüvvələrində öz şərəfli xidmətlərini yerinə yetirən, səngərlərdə duran, hərbi hissələrdə fəaliyyət göstərən, cəbhə bölgəsində Ermənistan silahlı qüvvələri ilə üz-üzə duraraq Azərbaycan torpaqlarını, vətənimizi qoruyan əsgərləri, döyüşçüləri ürəkdən təbrik edirəm" [XVIc.s.81].

Milli Ordu yaranmasının 80 illik yubileyi də Azərbaycan əsgərinə ünvanlanaraq sonuclanır. O bu sonluqla 26 iyunu hər

il təntənə ilə qeyd etmək ənənəsi yaradır. Onun nitqində bütün "yeni-yeni uğurlar" əsgərindir, "əmin-amanlığımızın və sülhün keşiyində duran" yenə də əsgərlərimizdir, "Eşq olsun" nidasının sahibi də Azərbaycan əsgəridir: "Mən Silahlı Qüvvələrimizə, Azərbaycan əsgərinə qarşılarında duran bütün vəzifələrin yerinə yetirilməsində yeni-yeni uğurlar arzulayıram.

Bu gün biz ilk dəfədir ki, Azərbaycanın Silahlı Qüvvələri gününü yüksək səviyyədə bayram edirik. Bununla da yeni bir ənənə yaranır. Hesab edirəm ki, Azərbaycanın Silahlı Qüvvələri günü bir bayram kimi xalqımızın həyatına daxil olacaq, xalqla ordunun birliyini, dövlətimizin və xalqımızın orduya olan qayğısını nümayiş etdirəcəkdir. Mən bütün Azərbaycan xalqına sülh, əmin-amanlıq arzulayıram. Əmin-amanlığımızın və sülhün keşiyində bizim qəhrəman əsgərlərimiz durubdur.

Azərbaycan əsgərinə eşq olsun!" [XVIc.s.97].

Xarici ölkələrə olan səfərlərində ulu öndər vaxt tapan kimi, imkan yarananda azərbaycanlılarla görüşməyə üstünlük verir. Bu zaman girişlərdə doğma olan münasibət zəminində xüsusi salama ehtiyac duymur.

Diaspor təşkilatların yaranması yolunda əvəzsiz xidmətləri olan böyük natiq onları səfirlik ətrafında birliyə çağırır. "Əminəm ki" modal sözü "yaxşı ünsiyyət, əlaqə yaratmaq, birləşmək, həmrəy olmaq kimi" eləcə də "bir-birinə kömək etmək, dayaq olmaq" sinonimlərindən istifadə etməklə onlara diaspor təşkilatları yaratmaq yolunda tapşırıq verir: "Mən arzu edirəm ki, bu hissiyyatlar sizdə daha çox olsun. Əminəm ki, indi burada Azərbaycanın Ukraynadakı səfirliyi ətrafında daha çox toplaşacaqsınız, bir-birinizlə daha yaxşı ünsiyyət, əlaqə yaradacaqsınız, birləşəcəksiniz, həmrəy olacaqsınız, bir-birinizə kömək edəcəksiniz, dayaq olacaqsınız. Eyni zamanda Azərbaycanın qayğıları ilə yaşayacaqsınız.

Sağ olun. Sizə cansağlığı, xoşbəxtlik arzu edirəm" [IXc.s.78-79].

Azərbaycandan kənarda yaşayan soydaşlarımız ulu öndərin həmişə diqqət mərkəzində olmuşdur. Və bu gün də möhtərəm prezidentimiz İlham Əliyev tərəfindən bu xoş məramlı missiya layiqincə yerinə yetirilir.

25 dekabr 1997-ci ildə "Dünya azərbaycanlılarına" müraciəti müxtəlif aspektlərdən auditoriya üçün yaddaqalan tarixi bir girişdir. Bu giriş Heydər Əliyevin çıxışlarında bəlkə də ən çox işlədilən antroponimik sıralarla yaddaqalandır. Bu girişdə Azərbaycan xalqına məxsus olan abidələr də sıralanır. Gah ədəbiyyatımızın "korifeyləri" gah da "mədəniyyət xəzinəmizə incilər verən" sənət dahiləri dinləyicilərə çatdırılır. Eləcə də, dünya elm aləminə yaxşı tanış olan alimlərimiz, "vətənin bütövlüyü", "xalqın birliyi" yolunda vuruşan sərkərdələrimiz, dövlətçiliyimizi inkişaf etdirən dövlət xadimləri sıralanır. Auditoriya qeyri-adi bir yaddaşa, polad məntiqə, analitik təfəkkürə söykənən böyük natiqin nitq sehrinə düşür, bu nitqi nəfəsini içinə çəkmədən dinləyir:

"Hörmətli həmvətənlər!

Əziz soydaşlarımız!

31 Dekabr Dünya Azərbaycanlılarının Həmrəylik Günüdür. Bu ümummilli bayram münasibətilə hamınızı ürəkdən təbrik edir, hər birinizə səmimi arzularımı yetirirəm.

Azərbaycan xalqı dünya mədəniyyətində öz dəst-xətti ilə seçilən xalqlardandır" [XIVc.s.5]. Dünya azərbaycanlılarına ünvanlanan müraciət möhkəm bir inamla sonluğa yetir.

Sonluq bütün soydaşlarımızı "azad Azərbaycan ideallarının həyata keçirilməsi" yolunda əzmlə çalışmağa sövq edir: "İnanıram ki, əsrlərdən bəri arzusunda olduğumuz və uğrunda mübarizə apardığımız müstəqil və azad Azərbaycan ideallarının həyata keçdiyi bu tarixi sınaq anlarında dünyanın hər bir

guşəsində yaşayan həmvətənlərimiz bizim ümummilli məqsədlərimizin tam gerçəkləşməsi üçün daha böyük əzmlə çalışacaqdır. Qətiyyətlə bəyan edirəm ki, Azərbaycanın dövlət müstəqilliyi əbədidir və heç bir qüvvə bizi bu yoldan döndərə bilməyəcəkdir.

Hamınızı azad, müstəqil, demokratik Azərbaycan dövlətinin daha da möhkəmlənməsi naminə həmrəyliyə və milli birliyə çağırıram.

Ulu Tanrıdan bütün dünya azərbaycanlılarına səadət və əmin-amanlıq diləyirəm" [XIVc.s.11].

Prezidentlik fəaliyyəti dövründə, eləcə də əski Sovetlər dövründə Heydər Əliyevin çıxış etdiyi auditoriyalardan biri də tələbə auditoriyasıdır. Biz ulu öndəri gah övladları təhsil almaq şansına malik bir valideyn kimi, gah da Vətənimizə, respublikamıza layiq milli kadr hazırlığını həyati məsələ kimi ortaya qoyan bir müəllim kimi görürük. Tələbələrlə görüşlərdəki nitqlərin girişində tələbə adına layiq olmağın böyük şərəf olduğundan danışılır, tələbələrin biliyi, zəkası təqdir olunur, təhsil yollarında onlara uğurlar dilənir:

"Əziz tələbələr!

Öncə sizin hamınızı həyatınızda yeni böyük hadisə – Türkiyə Universitetlərinə qəbul olmanız münasibətilə təbrik edirəm, sizə gələcək həyatınızda ali təhsil almaqda uğurlar arzulayıram. Hər bir gənc üçün ali məktəbdə təhsil almaq böyük xoşbəxtlikdir. Şübhəsiz ki, bu hər kəsə müyəssər olmur. Ancaq siz öz biliyinizlə, öz zəkanızla buna nail olmusunuz. Türkiyə universitetlərinə qəbul edilmisiniz və orada təhsil almağa yola düşürsünüz. Mən sizə uğurlu yol arzulayıram" [Ic.s.224].

Böyük natiqin tələbələrlə görüşünün sonluğu isə ümidlərlə, nikbinliklərlə dolu, cümlədaxili məntiqi ardıcıllıqla müşayiət olunur: "Ümidvar olduğumu bildirmək istəyirəm ki, Siz

Azərbaycanı Türkiyədə layiqincə təmsil edəcək, ali təhsil alacaq və qayıtdıqdan sonra vətənimizə, xalqımıza sədaqətlə, yorulmadan xidmət edəcəksiniz. Sağ olun, yaxşı yol!"

Auditoriyada xarici qonaqların əksəriyyət təşkil etdiyi nitqlərində ilk öncə "Hörmətli qonaqlar" ifadəsini işlədir. Heydər Əliyev çıxışın söylənildiyi günü auditoriyanın yadına salır, həmin günün tarixinin çıxış günü ilə siyasi, fəlsəfi əlaqəsini aşkara çıxarır. 12 noyabr 1997-ci il tarixdə, "Gülüstan" sarayında Azərbaycan prezidenti adından Xəzər dənizinin Azərbaycan sektorunda xarici şirkətlərlə birgə işlənilən neft yataqlarında ilkin neftin çıxarılması münasibəti ilə keçirilən təntənəli mərasimdə iştirak etmək üçün Azərbaycana gəlmiş qonaqların şərəfinə təşkil olunmuş rəsmi qəbuldakı çıxışda ilk demokratik konstitusiyanın ikinci ildönümü ilə ilkin neftin alınması gününün üst-üstə düşdüyünü xüsusi qeyd edir:

"Hörmətli qonaqlar!

Hörmətli xanımlar, cənablar və dostlar! Bu gün bizim üçün çox sevincli bir gündür. Bu gün çox böyük bayram günüdür və xalqımız, millətimiz, Azərbaycanın bütün vətəndaşları bayram edirlər. Çünki bu, müstəqil Azərbaycan Respublikasının ilk demokratik konstitusiyasının qəbul olunmasının ikinci ildönümü münasibətilə və eyni zamanda bizim çoxdan gözlədiyimiz, üç il gərgin işimizin nəticəsi kimi, ilkin neftin alınması münasibətilə keçirdiyimiz bayramdır" [XIIIc.s.199].

Girişdə "bu gün" ifadəsini iki yerdə təkrar işlədərək anafora stilistik fiqurunu işə salır. Həmin çıxışın sonluğu isə təşəkkürlərlə, ...şərəfinə epiforaların emosionallıqla səslənməsi ilə qurtarır. Heydər Əliyev burada fəaliyyət göstərən şirkətlərin şərəfinə, Azərbaycan neftçilərinin, dostların şərəfinə badə qaldırmaqla yanaşı, maraqlı sonluq kimi "Çıraq" neft yatağı və orada qurulmuş platformanın, ilkin neftin, ilk demokratik konstitusiyanın da şərəfinə badə qaldıra, sonluğu yad-

daqalan edə bilir: "Mən bütün qonaqlara təşəkkür edirəm və badələri Azərbaycan sektorunda yerləşən "Azəri", "Çıraq" və "Günəşli" neft yataqlarında və bütün başqa neft yataqlarında birgə işləmək üçün Azərbaycanla müştərək iş qurmuş və fəaliyyət göstərən şirkətlərin şərəfinə, Azərbaycan Beynəlxalq Əməliyyat Şirkətinin şərəfinə, "Çıraq" neft yatağı və orada qurulmuş platformanın şərəfinə, Xəzər dənizində "Çıraq" neft yatağından alınmış ilkin neftin şərəfinə, Azərbaycan respublikasının ilk demokratik Konstitusiyasının şərəfinə, bütün ölkələrin sülhsevər insanlarının şərəfinə, dünyada sülhün, əmin-amanlığın şərəfinə, dostluğun, əməkdaşlığın, mehribanlığın şərəfinə, əziz dostlar sizin şərəfinizə qaldırmaq istəyirəm. Sağ olun" [XIIIc.s.200].

Heydər Əliyev nitqlərinin girişi ilə tanış olan auditoriya çıxışın məzmununu anlaya bilir. Çıxışın məna və məqsədi aydın olur. Bakı-Supsa neft kəmərinin açılışına həsr olunmuş təntənəli mərasimdə (17 aprel 1999-cu il) Gürcüstan və Ukrayna prezidentlərinə "zati-aliləri" ifadəsi ilə müraciət edir, mərasim iştirakçılarını "ürəkdən salamlayıram", "sevinc hissi keçirirəm" frazeoloji söz birləşmələri ilə təbrik edərək Bakı-Supsa neft kəmərinin rolunu mərasim iştirakçılarının diqqətinə çatdırır: "Zati-aliləri, hörmətli Gürcüstan prezidenti Eduard Şevardnadze! Zati-aliləri, hörmətli Ukrayna prezidenti Leonid Kuçma! Xanımlar və cənablar, qonaqlar, dostlar! Mən sizi ürəkdən salamlayıram və bu xoş görüşlə əlaqədar çox böyük sevinc hissi keçirdiyimi bildirirəm. Gürcü xalqına, bütün Gürcüstan vətəndaşlarına səmimi salamımı yetirir, sülh, firavanlıq və tərəqqi arzulayıram. Bu gün biz tarixi bir hadisənin şahidiyik. Bakı-Supsa neft kəmərinin inşasına dair böyük səmərəli iş başa çatdırılmışdır və biz Azərbaycanın Xəzər nefti yüklənmiş ilk tankerinin dünya bazarına yola salınmasını təntənəli şəraitdə qeyd edirik: Əsrimizin əvvəllə-

rində Bakı-Batumi neft kəməri – Avropada ilk neft kəməri çəkilmişdir. İndi, XX-XXI əsrlərin ayrıcında biz Bakı-Supsa neft kəməri çəkmişik və o, Azərbaycan neftinin dünya bazarına ixracını həyata keçirəcəkdir” [XXc.s.15].

Dini mərasim və bayramlarda dini üslubun tələb etdiyi girişlər işə düşür. Bu zaman Heydər Əliyev nitqi Rəhmli, Mərhəmətli Allahın adıyla başlayır. Bu mərasim və ya bayramların mənası lakonik şəkildə auditoriyaya çatdırılır. Qurban bayramı münasibəti ilə xalqa olan təbrikin girişi buna misaldır: “Rəhmli, Mərhəmətli Allahın adıyla! Allah-təalanın dinimizi tamamlayıb mükəmməl etdiyi, İslamı bir din kimi bizim üçün bəyənib seçdiyi bu əziz gündə bütün müsəlman bacı və qardaşlarımızı ürəkdən təbrik edir, onlara can sağlığı və xoşbəxt həyat arzulayıram” [Ic.s.352].

Belə çıxışların sonluqları da sadə xalq dilindəki frazeoloji birləşmələrlə, ədatlarla bəzənərək dindarların qəlbinə yol tapır, islami dəyərlərimizi xalqa çatdırır: “Mübarək Qurban bayramı adətən insanlar arasında umu-küsülərin, kin-küdurətin aradan qaldırılması, yaxınların yad olunması, cəmiyyətdə mehribanlıq və qardaşlıq tellərinin möhkəmləndirilməsi üçün ən gözəl münasibət olmuşdur. Qoy bu ilki mübarək Qurban bayramı da müstəqil Azərbaycanımızın tərəqqisi naminə milli həmrəyliyin daha da möhkəmləndirilməsinə xidmət etsin. Burada işlədilən “umu-küsü”, “kin-küdurət” izafət tərkibli mürəkkəb isimlər – xalq ruhundan qidalanaraq “qoy” əmr ədatı ilə həmrəyliyimizin möhkəmlənməsinə xidmət edir.

Dini bayramlardakı görüşlər “Rəhmli, Mərhəmətli Allahın adı ilə” başlayır. Rəsmi işgüzar xarakterli “Cənablar və xanımlar” ifadəsinin yerini “müsəlman qardaş və bacılar” ifadəsi tutur: “Rəhmli, Mərhəmətli Allahın adı ilə!

Müqəddəs kitabımız Qurani-Kərimin nazil edildiyi mübarək Ramazan ayını ləyaqətlə başa vurmuş bütün müsəlman

qardaş və bacılarımızı Orucluq bayramı münasibətilə ürəkdən təbrik edirəm”. Belə dini bayramlarda sonluqlar auditoriyanın tərkibindən, görüşün keçirildiyi zamandan və məkandan, insanların ovqatından asılı olaraq müxtəlif ola bilir: “Bu əziz bayram günündə müqəddəs şəhid ruhlarının narahat-narahat dolaşdığı Azərbaycanın hər bir övladına, dözümlü və mətanətli xalqıma cansağlığı, Orucluq bayramında doğan xoş əhval-ruhiyyə, əmin-amanlıq və xoşbəxtlik arzulayıram”. Təkcə bu sonluğu ifadə edən cümlə özündə yüksək bədiilik, fəlsəfilik, eləcədə leksik zənginlik daşıyır. Təbrikin 1994-cü il 14 mart tarixinə düşdüyünü nəzərə alsaq, cəbhədə erməni işğalçıları ilə qanlı döyüşlər getdiyinin fərqinə varsaq “müqəddəs şəhid ruhlarının narahat-narahat dolaşdığı Azərbaycan” ifadəsi aydınlaşar. “Hər bir övlad” və “dözümlü və mətanətli xalq” dedikdə hissə və tamın vəhdəti fəlsəfəsi ortaya çıxır, elə buradaca “xoş əhval-ruhiyyə”, “xoşbəxtlik”, “əmin-amanlıq” kimi Heydər Əliyevə məxsus sinonim cərgə sonluğu möhtəşəm edir [Ic.s.297].

Dini mərasimlərdəki nitqlərdə Heydər Əliyev dindarlar auditoriyasına dərin psixoloji təsir edə bilir. Auditoriya onun nitqində islamın proqressiv din kimi rolunu anlayır, öz dini dəyərlərinə sayğıya qayıdır, müstəqilliyə gedən yolda islam dininin mühümlüyünü qəbul edir.

Heydər Əliyev girişlərdə dini mərasimlərin yaranma tarixini, əhəmiyyətini, bu günlə əlaqəsini milyonlara çatdıra, izah edə bilir. Bu zaman təkrarlardan, sinonimlərdən istifadə edərək, sadə, anlaşıqlı bir dillə dindarların qəlbinə yol tapır, xalqımızın dini inanclarına aydınlıq gətirir: “Bu gün Məhəmməd Əleyhissəlamın Peyğəmbərliyə yetişdiyi gündü, mehrab günüdür. Bu gün bütün müsəlmanların böyük bayramıdır.

Biz müsəlmanlar Allah-təalanın buyruğu Peyğəmbər Məhəmməd Əleyhissəlamın bizə göstərdiyi yolla, müqəddəs

kitabımız Qurani-Şərifin verdiyi tövsiyələr yolu ilə əsrlər boyu getmişik, bu gün də bu yolla gedirik. Bu yol sülh yoludur, bu yol mehribanlıq, dostluq, əmin-amanlıq yoludur. Bu yol insanlara səadət gətirən yoldur. Mən fəxr edirəm ki, Azərbaycan müsəlmanları öz müqəddəs dininə itaət etmək, dini ayinlərə, qanun-qaydalara riayət etmək üçün indi geniş imkanlar əldə ediblər" [VIIIc.s156].

Dini liderlərlə görüşlərdə nitqlərin girişləri artıq başqa bir məzmunda olur. Müraciətlər də dəyişir, digər girişlərdəki izahlar da. Bu izahlarda ölkəmizdəki dini tolerantlıqdan, insan hüquqlarının qorunmasından, demokratik cəmiyyət quruculuğundan danışılır. Heydər Əliyevin Vatikanda Roma papası II İoann Pavel ilə görüşdəki nitqinin girişi özünəməxsusluq kəsb edir: "Möhtərəm zati-müqəddəsləri Papa II İoann Pavel, Vatikana dəvətə, qonaqpərvərliyə və xoş sözlərə görə sizə minnətdarlığımı bildirirəm və vurğulayıram ki, ölkəmizdə müxtəlif dini konfessiyalar sərbəst fəaliyyət göstərir, Azərbaycanda insan hüquqları möhkəm qorunur, demokratik cəmiyyət quruculuğu prosesi böyük uğurla həyata keçirilir, siyasi plüralizmə, mətbuat azadlığına geniş yer verilir" [XIIc.s.239]. Elə girişdə ulu öndər II İoan Pavelə Ermənistanda bir müsəlman yaşamadığı halda bizdə "müxtəlif dini konfessiyaların sərbəst fəaliyyət göstərdiyini" vurğulayır.

Roma papası ilə görüşün sonluğu rəsmi üslubun tələb etdiyi cümlələrlə yekunlaşır: "Cənab zatı-müqəddəsləri, səmimi və mehriban görüş üçün sizə təşəkkürümü bildirir və sizi Azərbaycana rəsmi səfərə dəvət edirəm. Əminəm ki, zati müqəddəslərinin ölkəmizə səfəri Azərbaycan xalqı üçün əlamətdar bir hadisəyə çevrilə, dövlətlərimizin əməkdaşlığının daha da möhkəmləndirilməsində mühüm rol oynaya bilər" [XIIc.s.240].

Ulu öndər prezidentliyi dövründə hər il dini mərasimlərdə xalqın arasında olur, dindarlar qarşısında dini üslubun tələb

etdiyindən də yüksək səviyyədə nitqlər söyləyir. İslam dininin əxlaqi-fəlsəfi cəhətlərini özündə ehtiva edən nitqləri ilə dini auditoriyalara düşündürücü, ayıldıcı, səfərbəredici xarakterdə təsir edə bilir. Hər bir mərasimin qısa tarixi şərhini verir. Bu sadə cümlələrdə dərin mətləbləri açıqlayır. Heydər Əliyev Təzəpir məscidində (20 iyun 1994-cü il) aşura günü mərasimindəki çıxışı ilə bu günün "müsəlman aləmində faciəli, müqəddəs" olduğunu qeyd edir. Sinonim cərgələrlə – "vətən, torpaq", "haqq, ədalət" – Həzrəti İmam Hüseynin şəhidliyinin günümüzün reallığına uyğunluğunu anladır: "Əziz bacılar və qardaşlar, əziz müsəlmanlar!

Müsəlman aləmində faciəli, müqəddəs bir günün əziz xatirəsi qeyd olunur! Bu gün Həzrəti Məhəmməd peyğəmbərin nəvəsi İmam Hüseynin qətlə yetirildiyi gündür. Biz ulu babalarımızın vətən, torpaq, haqq, ədalət yolunda şəhid olduğu günü yad edirik. Bu münasibətlə mən bütün Azərbaycan müsəlmanlarına dərin hüznlə başsağlığı verirəm".

Böyük natiqin dini mərasimlərdəki nitqlərinin sonluğu "rəhmət eləsin", "xalqımıza səbir versin" kimi frazeoloji birləşmələrlə, nikbin notlarla gələcəyə ümid dolu baxışlarla zəngindir: "Biz qətlə yetirilmiş İmam Hüseyn və onun silahdaşlarının xatirəsi önündə baş əyirik. Əmin olduğumu bildirirəm ki, xalqımız öz milli ənənələrinə, adətlərinə, dininə, məsləkinə həmişə sadiq olacaqdır. Allah bu ağır günlərdə xalqımıza səbir versin. Allah doğma Azərbaycanımızı xoşbəxt etsin" [IIc.s.27].

Dindarlar auditoriyası ilə görüşlərdəki girişlərdə "cənablar və xanımlar" deyimi ilə yox, sadə xalq dilində "qardaşlar və bacılar, hörmətli həmvətənlər" ifadələrinə xüsusi yer verilir. Sinonimlər, frazeoloji birləşmələr, poetik duyğulu sözlərlə başlayan girişlər dindarlar auditoriyasını bəzəyir: "Hörmətli bacılar, qardaşlar, hörmətli həmvətənlər. Sizin hamınızı və sizin simanızda islam dininə etiqad edənləri, bütün azərbay-

canlıları, müsəlmanları səmimi qəlbdən salamlayır, hər birinizə, müstəqil Azərbaycanımıza bu ağır dövrdə dözüm, dəyanət arzulayıram. Sizin hamınıza həyatda səadət və xoşbəxtlik diləyirəm" [IIc.s.81].

Sadə, ülvi, səmimi sözlərlə başlayan girişlər elə səmimi ifadələrlə də nitqin sonunda özünü göstərir: "Mən bir daha sizin hamınızı salamlayıram, hamınıza səadət, xoşbəxtlik arzulayıram. Bu gün buraya gəldiyimə görə, sizinlə görüşdüyümə görə özümü çox məmnun hiss edirəm" [IIc.s.86].

Yazıçı və şairlərin, bir sözlə, ədəbiyyat, elm, mədəniyyət insanlarının toplaşdığı auditoriyalarda Heydər Əliyev nitqində poetik duyğular aşıb-daşır. Dinləyici sanki ədəbiyyatşünas alim nitqinin cazibəsinə düşür: "Mən bu gün belə bir ifadə işlətmək qərarına gəlmişəm: Bu günlər Azərbaycanda ədəbiyyat günləridir".

29 oktyabr 1997-ci il tarixdə, Prezident sarayında, Azərbaycan yazıçılarının X qurultayı ərəfəsində gənc nəsildən olan yazıçı və şairlərin bir qrupu ilə görüşdəki bu giriş cümləsi zaman etibarilə yerinə düşür. 28 oktyabrda yaşlı nəsildən olan şair və yazıçılarla görüş olmuş, 30 oktyabrda isə artıq X qurultay işinə davam edəcəkdir. Elə həmin görüşün sonluğu gənc yazıçıların gələcək vəzifələrinin məntiqi ardıcıllıqla sadalanması ilə və onların xalq, millət yolunda hansı məsuliyyət daşıdıqlarını yada salmaqla bitir: "Xalqımızı hansı yolla aparmaq, cəmiyyətimizdə olan nöqsanları aradan götürmək, cəmiyyətimizi təmizləmək, daha da saf etmək, ayrı-ayrı çirkin hallardan xilas etmək-bütün bunlarda ədəbiyyatın, bədii sözün imkanları da, gücü də, təsiri də çoxdur. Ona görə də siz yazıçı kimi, şair kimi tək öz istedadınızı ifadə etmirsiniz. Siz eyni zamanda millətə, xalqa, cəmiyyətə xidmət edirsiniz" [XIIIc.s.96].

Heydər Əliyev nitqlərinin giriş və sonluqları çox vaxt poetik bir dillə ifadə olunur ki, bu da xalqın yaddaşına həkk

olunma yolunda çox mühümdür. 20 Yanvar faciəsinin dördüncü ildönümü münasibətilə xalqa etdiyi müraciətin girişindəki bir cümlə məna tutumuna, problemi əhatə etməsinə, gələcəkdə xalqın nə etməli olduğu baxımından əvəzsiz nitq nümunəsidir: "Mənim əzizlərim! Bu gün, tariximizə qızıl qanla yazılmış 20 Yanvar faciəsinin 4-cü ildönümündə Qanlı Yanvarın günahsız qurbanlarının əziz xatirəsini ehtiramla yad edib, hələ qanı alınmamış şəhidlərimizin ruhu qarşısında baş əyirəm". Təkcə, "qanı alınmamış şəhid ruhları" frazeoloji birləşməsi torpaqlarımızın işğaldan azad edilməsi yolunda qarşıda bizi gözləyən mübarizələrdən xəbər verir, xalqı səfərbər edir. "Ruhu qarşısında baş əyirəm" ifadəsi isə bu gün hamımızı şəhid ruhlarına hörmətə çağırır. Həmin müraciətin sonluğu da özünəməxsus Heydər Əliyev nitqindən güc alır, "qara buludların cövlan etdiyi ana torpağın" xilası inamını xalqa aşılayır: "Vətən torpağına bəxş etdiyi müqəddəsliyə, gözləri buludlanmış ağsaçlı ana və bacılarımızın əyilməz vüqarına and içərək deyirəm: İnanın, bu gün üzərində qara buludların cövlan etdiyi ana torpağımızın düçar olduğu müsibət və fəlakətə son qoyulacaqdır".

10 may 1997-ci il tarixdə, Bakı şəhərində parkın açılışında giriş nitqi parkın mövcud olduğu Nizami rayonunun sakinlərinə müraciətlə başlayır, bir qədər məişət üslubu çalarları qazanır "ürəkdən salamlamaq", "ehtiram, sevgi və məhəbbət bildirmək" frazeoloji birləşmələri ilə özünü göstərir. "Əziz həmvətənlər, əziz bacılar, qardaşlar, əziz övladlar!

Bakı şəhərinin, Nizami rayonunun sakinləri!

Mən sizin hamınızı ürəkdən salamlayır, sizə, bütün Azərbaycan xalqına, Azərbaycan vətəndaşlarına hədsiz hörmət və ehtiramımı, sevgi və məhəbbətimi bildirirəm" [IXc.s.428].

Elə həmin çıxışın sonluğu xalqına qədirbilənliklə, sevgi ilə yönəlmiş bir sonluqdur. Bu sonluqda sinonim cərgələrlə

böyük natiqin gücünün mənbəyinin bir daha xalq olduğu ortaya qoyulur. "İlham və güc" mənbəyinin xalq olduğu, "gərgin, qaynar, qızğın" fəaliyyətə sövq etdirən də xalqdır" fikri düşüncələrə çatdırılır: "Mən yaşayıram və görürsünüz ki, gecə-gündüz çalışıram. Məni yaşadan da, bu qədər əzmlə çalışmağıma imkan verən də həmişə xalqın etimadı olubdur. Xalqın etimadı, dayağı, xalqın mənimlə bir olması həmişə mənə ilham, güc veribdir, məni daim belə gərgin, qaynar, qızğın fəaliyyətdə olmağa sövq edibdir. Mən təbriklərinizə görə sizə təşəkkür edirəm. Sizi əmin edirəm ki, bundan sonra da mən xalqa, millətə, müstəqil Azərbaycan Respublikasına xidmət etməyi, sizə, əziz bacılar və qardaşlar xidmət etməyi özümün ən şərəfli vəzifəm, ən ali məqsədim hesab edirəm. Əmin olun ki, mən bu şərəfli vəzifəni yerinə yetirməyə daim çalışacağam. Sağ olun" [IXc.s.437-438].

Azərbaycan xalqının görkəmli oğul və qızları ilə vidalaşma mərasimlərindəki nitqlərin girişləri özünəməxsus frazeoloji ifadələrlə müşaiyət olunur. 23 fevral 1997-ci il tarixdə, Şəhriyar adına Mədəniyyət Mərkəzində, görkəmli alim və ictimai xadim, akademik Ziya Bünyadovla vidalaşma mərasimindəki nitqin girişində "itki üz vermək", "qəzəbin coşdurulması", "matəmə qərq olmaq" kimi məişət frazeologizmlərindən istifadə olunur: "Hörmətli bacılar, qardaşlar, əziz həmvətənlər! İkinci gündür ki, Azərbaycan Respublikası, Azərbaycan xalqı matəm içindədir. Xalqımıza böyük itki üz veribdir. Xalqımızın böyük oğlu Ziya Bünyadovun vəhşicəsinə qətlə yetirilməsi hamımızı kədərləndirib, qəzəbimizi coşdurub, hiddətləndiribdir. Biz hamımız matəmə qərq olmuşuq" [VIIIc.s.448].

Bu nitqin sonluğu vidalaşma mərasimləri üçün örnək ola biləcək sonluqdur. Təskinlikverici, xalqı sınmağa qoymayan, "vətənpərvərlik duyğularını" inkişaf etdirən bir sonluqdur:

"Ziya Bünyadovun ailəsinə başsağlığı verirəm və bəyan edirəm ki, onun ailəsi Azərbaycan dövlətinin daim qayğısı altında olacaqdır. Ziya Bünyadovun qoyduğu irs, onun əsərləri yaşayacaq, bizim gənclərimiz Ziya Bünyadovun simasını, yaradıcılığını örnək edərək təhsil alacaq, tərbiyələnəcək, vətənpərvərlik duyğularını özlərində inkişaf etdirəcəklər.

Allah rəhmət eləsin, Allah sizə və Ziya Bünyadovun ailəsinə, bütün xalqımıza səbr versin" [VIIIc.s.460].

Heydər Əliyev nitqlərinin girişlərində nitqin söyləndiyi zaman və nitqin söyləndiyi məkanla həmin mərasimlər, yığıncaqlar hamısı vəhdət halında verilir.15 dekabr 1996-cı ildə Bakıda yeni sellülyar rabitə sisteminin təntənəli açılışı mərasimindəki nitqdə biz bunu görə bilirik: "Hörmətli xanımlar və cənablar, hörmətli dostlar, bacılar və qardaşlar!

Bu gün, 1996-cı ilin sona çatdığı bir vaxtda, dekabr ayında paytaxtımızda, Bakı şəhərində günəş, gözəl hava hamımızı sevindirir. Bu gözəl gündə siz hamınız istirahət etməlisiniz, öz işlərinizlə məşğul olmalısınız. Ancaq görürəm ki, Azərbaycanın ümumi işlərinə, ümumi məsələlərinə olan münasibətiniz sizi buraya toplayıbdır" [VIIIc.s.181].

Heydər Əliyev nitqlərindəki girişlərin özünəməxsus xarakterik bir xüsusiyyəti də ondan ibarətdir ki, görüşlərin keçirildiyi məkanlar vurğulanır, gələcək nəsillərə bu görüşlərin məhz harada keçirildiyi, Heydər Əliyevin məhz hansı məkanda nitq söylədiyi məlum olur. Bu da çox güman ki, böyük natiqin məkan və zaman dialektikasına dərindən bələdliyi, tarixin gələcəkdə saxtalaşdırıla bilməməsini istəməsindən irəli gəlir. 21 may 1994-cü il tarixdə, Bibiheybət ziyarətgahında toplaşanlar qarşısındakı nitqin girşi bu fikirə misaldır: "Əziz qardaşlar, bacılar, hörmətli həmvətənlər! Bu gün burada Azərbaycan xalqının, müsəlman aləminin müqəddəs yerində, Bibiheybət pirində sizi bütün müsəlmanların əziz bayramı olan

Qurban Bayramı münasibətilə təbrik edir, hamınıza cansağlığı, xoşbəxtlik arzu edirəm” [Ic.s.354].

Yaxud başqa bir çıxışda: “Hörmətli rektor! Əziz rektor yardımçıları! Dəyərli professor və müəllimlər, tələbələr! Əziz dostlar və qardaşlar! Bu gün Türkiyənin çox hörmətli, böyük universitetində – Höcəttəpə Universitetində olduğuma görə özümü xoşbəxt hesab edirəm”.

Heydər Əliyev nitqlərinin girişləri nitqin söyləndiyi məkana, o məkanda yaşayan insanlara ünvanlanır. 24 sentyabr 1998-ci il tarixdə, Suraxanıda, Əmircan qəsəbəsində Tofiq Bayramın büstünün açılışında “Suraxanı sakinləri”ni, “Suraxanı camaatı”nı ürəkdən salamlayır. Suraxanılılar timsalında Azərbaycan ziyalılarını, Azərbaycan xalqını təbrik edir:

“Əziz bacılar, qardaşlar!

Əziz həmvətənlər, dostlar! Mən sizin hamınızı və sizin simanızda Suraxanı sakinlərini, Suraxanı camaatını ürəkdən salamlayıram, sizə ən xoş arzularımı çatdırıram. Siz Suraxanılıları, Azərbaycan ziyalılarını, bütün xalqımızı böyük şair Tofiq Bayramın xatirəsinin əbədiləşdirilməsinə həsr olunmuş abidənin açılışı münasibətilə ürəkdən təbrik edirəm” [XVIIc.s.339].

Heydər Əliyev nitqlərinin girişləri insanlara ünvanlanmaqla yanaşı, həm də zavodlara, fabriklərə, bir sözlə, müstəqilliyimizə xidmət edən hər bir şeyə ünvanlanır. Səttarxan adına zavodun işə salınmasının 100 illiyi münasibətilə zavod kollektivi ilə görüşdə (24 iyun 1994-cü il) “Əziz Səttarxançılar” deyimi ilə zavodun əməkçi insanlarına yön alır, sonra bu zavodun fəaliyyətini poetik bir tərzdə auditoriyaya izah edir. Əmək müəssisəsi və əməkçi insanlar arasındakı əlaqələr onun nitqində canlılıq səviyyəsinə yüksəlir, zavodun işçiləri belə bir nitqi heyranlıqla dinləyir: “Əziz qardaşlar, bacılar, əziz Səttarxançılar!

Bu gün sizinlə görüşməyimdən çox məmnunam və hamınızı səmimi qəlbdən salamlayıram. Bu müəssisədə Azərbaycanın bir çox nəsilləri çalışmış, ömür sürmüş, xalqımıza xidmət etmiş, zavodun inkişaf etməsinə öz töhfələrini vermişlər. Əgər bir əsr bundan əvvəl müəssisənin yaranmasını əks etdirən rəsmlər, fotoşəkillər qalmışsa, o dövrlə zavodun indiki dövrünü müqayisə etsəniz çox əyani surətdə görəcəksiniz ki, yüz il müddətində Bakıda, bu fəhlə şəhərində, neft şəhərində, Azərbaycan xalqının gözü olan Bakıda, ölkəmizin paytaxtı olan Bakıda, ölkəmizin paytaxtı oaln şəhərdə bu sənaye müəssisəsi necə böyük yol keçib” [IIc.s.39].

Sonluğu isə “zavodumuzun 100 illiyi” deməklə özünü kollektivin bir üzvü hesab edir, kollektivin qəlbini riqqətə gətirir, iki yerdə “dövlət adından” kollektivə minnətdarlıq bildirir, təşəkkür edir: “Zavodumuzun 100 illiyi münasibətilə sizi təbrik edir, bu dövrdə müəssisədə çalışmış bütün nəsillərin nümayəndələrinə dövlət adından minnətdarlığımı bildirirəm. Bu gün zavodda çalışan bütün kollektivə dövlət adından təşəkkür edir, hamınıza cansağlığı, xoşbəxtlik arzulayıram. Sağ olun” [IIc.s.43].

Heydər Əliyev nitqlərinin giriş hissələrində həmin ərəfəyə düşən tarixi hadisələrin bir-biriylə əlaqələndirilməsinin şahidi oluruq. 10 oktyabr 1999-cu il tarixdə, Naxçıvanda, “Həzrəti Zəhra (s)” məscidinin təntənəli açılış mərasimində girişdəki müraciətlər naxçıvanlılara, müsəlmanlara və qonaqlaradır. Giriş hissədə izahedici nitq həmişəki kimi auditoriyanı valeh edir. “Xüsusən” modal sözünün köməyi ilə Naxçıvan Muxtar Respublikasının yaranmasının 75 illiyini diqqətə çatdırır. “Məhz” dəqiqləşdirici ədat ilə fikrini auditoriya üçün dəqiqləşdirir. Naxçıvanlıların islam dininə sadiqliyini dilə gətirir:

“Əziz naxçıvanlılar! Əziz müsəlmanlar! Əziz qonaqlar!

Bu gün Naxçıvan Muxtar Respublikasının, Azərbaycan Respublikasının həyatında çox böyük hadisə baş verir. Biz Naxçıvanda yeni bir məscidin, Allah evinin açılışına toplaşmışıq. Bu, bizim üçün böyük bayramdır. Xüsusən onu qeyd etmək istəyirəm ki, bu günlər Naxçıvan Muxtar Respublikasının yaranmasının 75 illiyi keçirilir. Məscidin məhz bu günlərdə açılması 75 il ərzində Naxçıvan Muxtar Respublikası vətəndaşlarının, insanlarının, müsəlmanlarının – naxçıvanlıların öz islam dininə nə qədər bağlı olduğunu və islam dininin ənənələrini yaşatdığını göstərir" [XXIIc.s.160].

Heydər Əliyev çıxışlarının girişi müraciətlərdən dərhal sonra çıxışın bütöv məzmununu əhatə edə biləcək lakonik bir-iki cümlə ilə davam etdirilir. Bu cümlələr elmi şura zalında müdafiə edən alimin qarşıya qoyduğu əsas vəzifələri xatırladır. Xalq şairi Səməd Vurğunun 90 illik yubileyinə həsr edilmiş gecədə natiqin:

"Hörmətli xanımlar və cənablar! Əziz dostlar!" müraciətindən sonra – "Böyük şair Səməd Vurğunun 90 illik yubileyi şeir, mədəniyyət bayramıdır, Azərbaycan xalqının bayramıdır. Bu bayram münasibətilə mən sizi, bütün Azərbaycan vətəndaşlarını ürəkdən təbrik edirəm" ifadələri gəlir.

Həmin nitqdə Səməd Vurğunun "Azərbaycan" şeirindən hər kəsin bildiyi bir bəndin dövlət başçısı tərəfindən söylənilməsi auditoriyada xüsusi canlanma yaradır:

*"El bilir ki, sən mənimsən,*
*Yurdum, yuvam, məskənimsən!*
*Anam, doğma Vətənimsən!*
*Ayrılarmı könül candan?*
*Azərbaycan, Azərbaycan!*

– yüksək əhval-ruhiyyənin fonunda: Yaşasın müstəqil Azərbaycan! Yaşasın Səməd Vurğun yaradıcılığı! Səməd Vurğuna eşq olsun!” sonluğu da canlı alınır.

Ukraynada olarkən söylədiyi nitq (4 mart 1997-ci il) sonda Ukrayna dilində “Xay jive samostiynaya Ukraina” – “Yaşasın müstəqil Ukrayna” deməklə auditoriyanı heyran qoyur.

Heydər Əliyev nitqində girişlər çox vaxt “əlamətdar hadisədir” ifadəsi ilə başlayır: “Hörmətli xanımlar və cənablar! Bu gün Azərbaycanda yaşayan qaçqınların və məcburi köçkünlərin həyatını əks etdirən fotoşəkillərdən ibarət kitabın yaranması və təqdim olunması təqdirəlayiq, əlamətdar hadisədir” [XIIIc.s.150].

M.F.Axundov adına Azərbaycan Dövlət Kitabxanasında “Azərbaycan qaçqınları” fotoalbomunun təqdimatı mərasimindəki bu nitq “ümidvaram ki”, “ümumiyyətlə” modal sözlərinin iştirak etdiyi sonluqlardan biri ilə qurtarır: “Ümidvaram ki, bu mərasimdə iştirak edən xarici ölkələrin səfirlikləri, beynəlxalq təşkilatların nümayəndələri, bu kitabın yayılmasında, təbliğ olunmasında öz xidmətlərini göstərəcəklər, ümumiyyətlə bu gün burada meydana çıxmış məsələlərin həll olunmasında Azərbaycan Respublikasına, xalqına və yerindən-yurdundan didərgin düşmüş Azərbaycan vətəndaşlarına yardımçı olacaqdır. Sağ olun”.

Heydər Əliyev nitqlərinin girişləri bəzən də sadə, lakonik, rəsmi müraciətlərlə başlayır, hadisə barədə yığcam bir cümlə ilə auditoriyaya məlumat verilərək münasibət bildirilir: “Hörmətli xanımlar və cənablar! Hörmətli qonaqlar! Sizi böyük Bülbülün 100 illik yubileyi münasibəti ilə ürəkdən təbrik edirəm, Azərbaycan mədəniyyətinin, incəsənətinin çiçəklənməsi naminə uğurlar arzulayıram” [XIIIc.s.300].

Belə nitq poetik çalarlarla zəngin, nikbinliklə dolu, epiforaların üstünlük təşkil etdiyi sonluqla qurtarır. Auditoriya

sərbəst vəzndə deyilən bir şeiri xatırladan nitqin cazibəsinə düşür: "Güman edirəm ki, bu gün Bülbülün ruhu şad olubdur. Amma eyni zamanda düşünürəm ki, Bülbülün narahatçılığı da var. Narahatçılığı ondan ibarətdir ki, onun doğma Şuşası, Qarabağı Ermənistan silahlı qüvvələrinin işğalı altındadır. Buna görə Bülbül narahatdır. Biz də narahatıq. Ancaq Bülbül də bilməlidir, xalqımız da bilməlidir bizim üçün əziz olan Qarabağ torpağı, Şuşa qalası işğaldan azad olacaq, Bülbül diyarı müstəqil Azərbaycanın çiçəklənən bir guşəsi olacaq və gələcək nəsillər məhz Qarabağda, Şuşada Bülbülün heykəlin qoyacaq, Üzeyir Hacıbəyovun yenidən heykəlin qoyacaq və Şuşa, Qarabağ Azərbaycanın gözəl guşəsi kimi müstəqil Azərbaycanda yaşayacaqdır" [XIIIc.s.305].

Heydər Əliyev öz nitqlərinin girişlərində auditoriyanı təəccübləndirir, düşündürür və heyran qoyur. Azərbaycan yazıçılarının X qurultayında (30 oktyabr 1997-ci il) böyük natiq çıxışına belə başlayır: "Hörmətli qurultay! Əziz yazıçılar! Hörmətli xanımlar və cənablar! Mən sizi səmimi qəlbdən salamlayıram və yazıçılar qurultayının işinin müvəffəqiyyətlə getməsi münasibətilə sizi ürəkdən təbrik edirəm". Burada "Hörmətli qurultay!" ifadəsi ilk baxışda auditoriyada təəccüb yaratsa da yazıçıların ali orqanı olan qurultaya müraciət qurultayın əhəmiyyətini bir daha yada salır və auditoriyanı heyran qoyur. Həmin qurultaydakı sonluq da yaddaqalandır. Keçid dövrünün ağır şəraitində yazıçıların vəziyyətini yaxşı bilən dövlət başçısı "qayğımı göstərəcəyəm", "yardımımı əsirgəməyəcəyəm" frazeoloji birləşmələrlə onları daha da yaxşı işləməyə ruhlandırır. Onların XXI əsrdə dünya, bəşər ədəbiyyatına gözəl nümunələr verəcəyinə şübhə etmir: "Mən bir dövlət başçısı kimi ədəbiyyata, mədəniyyətə indiyə qədər olduğu kimi, bundan sonra da qayğımı göstərəcəyəm və sizin hər birinizin yaradıcılığınızın uğurlu olması üçün yardımımı əsirgəməyəcəyəm. Sizə can-

sağlığı arzu edirəm. Ədəbiyyatımıza yeni uğurlar arzu edirəm. Heç şübhə etmirəm ki, Azərbaycan ədəbiyyatı XX əsri uğurla sona çatdıracaq və XXI əsrdə dünya, bəşər ədəbiyyatına gözəl nümunələr verəcəkdir. Sağ olun".

Çıxış etdiyi rəsmi auditoriyada Heydər Əliyevin insanlara müraciət etdiyi girişlərdə onlara tutduğu vəzifələrə görə müraciət edir. "Hörmətli nazir, hörmətli rektor, hörmətli xanımlar və cənablar! Mən Moskva Dövlət Hüquq Akademiyasının rektoru hörmətli akademik Oleq Yemelyanoviç Kutafinə, akademiyanın elmi şurasına, sizin hamınıza təşəkkür edirəm. Sonluq isə: "Hesab edirəm ki, Azərbaycan ilə Moskva Dövlət Hüquq Akademiyası arasında əməkdaşlıq uğurlu ola bilər. Biz Azərbaycanda yüksək ixtisaslı kadrlar hazırlamaq üçün gələcəkdə də sizin akademiyanın imkanlarından və şübhəsiz ki, böyük təcrübənizi, elmi potensialınızı nəzərə alaraq köməyinizdən istifadə edəcəyik. Sizə təşəkkür edir, cansağlığı, xoş həyat, uğurlar arzulayıram".

Böyük natiq auditoriyanı gözəl anlayır. O auditoriyanı seçə bilir. İlahi bir fəhmlə seçə bilir. Beynəxalq qadınlar günü münasibətilə "Sevil" Azərbaycan qadınları məclisinin təşkil etdiyi görüşdəki bu çıxışda girişi oxuyarkən arzu və minnətdarlığın məhz Azərbaycan qadınına yönəldiyi məlum olur: "Əziz xanımlar! Mən sizi Beynəxalq Qadınlar Günü münasibətilə ürəkdən təbrik edir, sizə cansağlığı, daim gözəllik, səadət və bütün işlərinizdə müvəffəqiyyətlər arzulayıram. Bu bayram münasibətilə şəhid analarını, ölkəmizin torpaqlarını qoruyan igidlərin analarını, ordumuza əsgər böyüdən anaları xüsusi təbrik edir və onlara öz təşəkkürümü, minnətdarlığımı bildirirəm" [IXc.s.24].

Sonluq güvənc yeri olan qadınların bir daha emosionallıqla təbriki ilə başa çatır: "Ona görə də mən qadınlara indiyə qədər güvəndiyim kimi, bu gün də güvənirəm, sabah da güvənə-

cəyəm. Mən sizin hamınızı sevirəm, bağrıma basıram, əgər icazə versəniz, öpürəm, sizə cansağlığı, xoşbəxtlik arzu edirəm" [IXc.s.26].

Heydər Əliyevin nitqində girişlər çox vaxt xitablar şəklində ünvanlanır. Azərbaycan Respublikası Daxili İşlər Nazirliyində keçirilmiş müşavirədəki çıxışda olduğu kimi: "Hörmətli zabitlər, Daxili İşlər Nazirliyinin əməkdaşları, polis işçiləri!" Müşavirənin sonluğunda isə "Polis işçilərinin ağır və şərəfli işinə" işarə edilir: "Hamınıza sizin şəxsinizdə Azərbaycan Respublikası Daxili İşlər Nazirliyinin bütün əməkdaşlarına, polis işçilərinə ağır, şərəfli və müstəqil Azərbaycan üçün çox mühüm olan işinizdə uğurlar arzulayıram" [Ic.s.97].

Heydər Əliyevin nitqlərinin girişlərinin ədatlarla zənginliyi emosionallığı artırır. 26 sentyabr 1997-ci il tarixdə, Roma şəhərində şəhərin meri Françesko Rutelli ilə görüşdəki nitqin girişi Roma sakinlərinə salamlar və Roma şəhəri haqqında şəxsi təəssüratlarını bölməkdir. "Ən" qüvvətləndirici ədatının köməyilə nitqi gücləndirərək növbəti cümlədə Roma şəhərinin lakonik bir cümlədə təsvirini verə bilməklə auditoriyanı səfərbər etmək Heydər Əliyev nitqinə xasdır: "Hörmətli cənab mer! Möhtərəm xanımlar və cənablar! Sizi ürəkdən salamlayır və gözəl Roma şəhərinin bütün sakinlərinə ən səmimi ehtiram hisslərimi, ən xoş arzularımı yetirir, onlara xoşbəxtlik və firavanlıq diləyirəm.

Biz hamımız xoşbəxtik ki, Romadayıq – saysız-hesabsız miqdarda tarixi arxitektura və sənət abidələrini özündə saxlayan və bununla eyni zamanda müasir mədəniyyət, demokratiya və tərəqqi mərkəzi olan şəhərdəyik" [XIIc.s.234].

Çıxışın sonluğunda isə fikirlər Roma merinə tuşlanır. "Çoxillik dövlət fəaliyyətinə malik olması" fikrini merin diqqətinə çatdırmaqla, merin işinin çətinliyini Roma ictimaiyyətinə çatdırmaqla merin siyasi lider qarşısında rəğbətini və

heyranlığını qazanır: "Cənab mer, sizə çətin fəaliyyətinizdə uğurlar arzulayıram. Mən çoxillik dövlət fəaliyyəti təcrübəsinə malikəm və bilirəm ki, Roma kimi şəhəri idarə etmək çox çətindir. Roma nəinki böyük və izdihamlı həm də açıq şəhərdir. Açıq şəhəri idarə etmək isə çox çətindir. Buna görə də sizə daha böyük qüvvə və sağlamlıq, işlərinizdə yeni-yeni uğurlar arzulayıram" [XIIc.s.237].

Heydər Əliyevin natiqliyinin bir məziyyəti də, bir xüsusiyyəti də, bir özünəməxsusluğu da iti müşahidəçilik qabiliyyətinə malik olmağındadır. Görüşlər, qəbullar zamanı müşahidə etdiyi hansısa bir maraqlı faktı, görüntünü yerindəcə, nitq prosesinə qoşa, dinləyiciləri valeh edə bilir. Onun bu cür nitq üsulları, nitq priyomları auditoriya üçün gözlənilməz olduğundan nitq yaddaqalan olur. Belə nitq sonluqları xalqın yaddaşına hoparaq gələcək nəsillər üçün nağıllaşır. Bakı Elektrik Maşınqayırma zavodonun 50 illik yubileyində zavoddakı stenddə gördüyü bir cümləni çıxışın sonluğuna daxil edir: "Mən sizin hamınıza cansağlığı, səadət arzu edirəm. Bütün işlərinizdə sizə uğurlar arzulayıram. Mən burada stend gördüm. O bizim keçmiş əlaqələrimizə həsr olumuş bir stenddir. Siz orada yazmısınız ki, "Heydər Əliyev, biz sizinləyik". Mən onu oxudum. Mən sizə deyirəm ki, əziz bacılar, qardaşlar, dostlar, mən daim sizinləyəm! Sağ olun".

Heydər Əliyevin nitqlərinin bir xüsusiyyəti də iştirak edib nitq söylədiyi konfranslarda mövzunun adını bütöv şəkildə həm girişdə, həm çıxış boyu, həm də sonluqda çəkməklə həmin konfransın mövzusunu yaddaşlara həkk etməklə onun əhəmiyyətini vurğulamaqdır. Müstəqillik yoluna qədəm qoyan respublika üçün mühüm əhəmiyyət kəsb edən "Sahibkarlığın strategiyası və iqtisadiyyatın yenidən qurulması" mövzusu girişdə auditoriyaya bir daha açıqlanır: "Hörmətli xanımlar və cənablar. "Sahibkarlığın strategiyası və iqtisadiyyatın yenidən

qurulması" mövzusunda Beynəlxalq Bakı konfransının iştirakçıları! Sizi bu mühüm hadisə – Beynəlxalq Bakı konfransının açılışı münasibətilə ürəkdən təbrik edir və sizə Azərbaycan Respublikası üçün çox mühüm olan işinizdə uğurlar arzulayıram".

Həmin konfransda sonluqda mövzunun adı böyük natiq tərəfindən bir daha açıqlanır, konfransın Azərbaycan iqtisadiyyatının inkişafında rolundan danışılır. Azərbaycan sahibkarlarına "uğurlar və tərəqqi" dilənir: "Mən xalqın rifahı naminə fəaliyyət göstərən hər bir Azərbaycan sahibkarına uğurlar və tərəqqi arzulayıram. Həmçinin əmin olduğumu bildirmək istəyirəm ki, "Sahibkarlığın strategiyası və iqtisadiyyatın yenidən qurulması" mövzusunda Beynəlxalq Bakı konfransı Azərbaycan iqtisadiyyatının daha da inkişaf etməsində öz rolunu oynayacaqdır. Sizə işinizdə müvəffəqiyyətlər arzulayıram. Diqqətinizə görə sağ olun" [IIc.s.142].

Heydər Əliyev nitqlərinin giriş hissələri xalq ruhundan qidalanan frazeoloji ifadələrlə zəngindir. Məhz bu frazeoloji birləşmələr nitqin gələcəkdə yüksək səviyyədə dinlənilməsini təmin edir. 11 oktyabr 1999-cu il tarixdə, Yusif Məmmədəliyev adına Naxçıvan Dövlət Universitetinin yeni tədris korpusunun təntənəli açılışı mərasimindəki nitq bu sıradandır:

"Əziz dostlar! Əziz bacılar, qardaşlar! Əziz naxçıvanlılar! Əziz ziyalılar!

Mən bu gün Naxçıvan Dövlət Universitetinin müəllim, professor və tələbə kollektivi ilə burada bu görüşümdən həddən ziyadə şadam. Sizin hamınızı səmimi qəlbdən salamlayıram və sizə – Naxçıvan Muxtar Respublikasının ziyalılarına, gənclərinə, tələbələrinə, müəllimlərinə öz hörmət, ehtiramımı bildirirəm" [XXIIc.s.180].

Bu giriş hissədə "həddən ziyadə şadam", "səmimi qəlbdən salamlayıram" frazeoloji ifadələri nitqin sadəliyini, xəlqiliyini

gücləndirir. Elə həmin çıxışın sonluğu auditoriyanı fəth etmək baxımından maraq doğurur. Girişdə həddən ziyadə şad olan böyük natiq sonda "daha da çox fəxr edir ki" Yusif Məmmədəliyev adına Universitetin doktorudur. Təkcə "mən çalışacağam ki, sizin bu etimadınızı doğruldum" səmimi ifadəsi Heydər Əliyev nitqinin ecazkarlığına işarədir: "Mən fəxr edirəm ki, bir çox böyük dövlətlərin zəngin tarixə malik olan universitetlərinin fəxri doktoruyam. Ancaq daha da çox fəxr edirəm ki, mən Naxçıvan Muxtar Respublikasının Yusif Məmmədəliyev adına Universitetinin doktoruyam. Sağ olun".

Heydər Əliyev nitqlərinin girişləri bəzən ritorik sualla auditoriyalara yönəlir. 8 Mart Beynəlxalq Qadınlar Günü münasibətilə söylədiyi nitqdə bunun şahidi oluruq. Qadınları "qəlbimizin dayağı" adlandıraraq qadınlara hörmət və məhəbbəti öndə saxlayır: "Burada xarici ölkələrin səfirləri öz xanımları ilə birlikdə iştirak edirlər. Bilmirəm, bu bayram Amerikada, Türkiyədə, İngiltərədə, başqa ölkələrdə qeyd olunur, yoxsa yox? Fərqi yoxdur, onların bu gün burada iştirak etməsi və bu bayramı bizim qadınlarla birlikdə qeyd etmələri çox gözəl haldır. Mən sizin adınızdan və öz adımdan xarici ölkələrin səfirlərinin xanımlarını bizimlə birlikdə olduqlarına görə təbrik edirəm, səfirlərə, diplomatik nümayəndəliklərin başçılarına təşəkkürümü və minnətdarlığımı bildirmək istəyirəm.

Bu gün mənim həyəcanlanmağımın səbəbi odur ki, xalqımız çətin, ağır vəziyyətdə, müharibə şəraitində yaşayır – bunların hamısını mən bilirəm, bu çətinliklərə görə qəlbən əzab-əziyyət çəkirəm, çünki bunların hamısına cavabdehəm. Ancaq eyni zamanda sizi şən, xoşbəxt görəndə, bu çətinliklərə baxmayaraq, sizi xoş əhval-ruhiyyədə, nikbin görəndə mən bir daha inanıram ki, xalqımız bu çətinliklərin hamısından çıxacaqdır. Bizim qəlbimizin dayağı qadınlardır, qadınlardır, qadınlardır!

Qadınlara hörmət, qadınlara məhəbbət! Qadınlar bizim qəlbimizdədir. Sağ olun, təbrik edirəm!” [IIIc.s.128].

Heydər Əliyev nitqinin əsas struktur elementləri kimi giriş və sonluqların öyrənilməsi Azərbaycan nitq mədəniyyətinin inkişafına mühüm töhfədir. Heydər Əliyev nitqlərinin giriş-lərində auditoriya nektar, bal toplamaq həvəsi ilə pətəyi tərk edən arılara bənzəyirsə, sonluqlarda isə çinədanı nektarla, bal-la dolu pətəyinə, yuvasına dönən arıları xatırladır...

# IV FƏSİL

# HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ MƏNTİQİ ARDICILLIQ

Heydər Əliyev nitqinə daxilən xas olan məntiqi ardıcıllıq müxtəlif üslublarda və müxtəlif çeşidli auditoriyalarda özünü göstərir.

Şifahi nitq prosesində ardıcıllığı təmin etmək hər natiqə müyəssər olmur. Bunun üçün təfəkkürdə ardıcıl nitq formalaşdırmaq natiqlik məharətinin mühüm şərtidir.[1] Azərbaycan elminin gələcək inkişafına Heydər Əliyev baxışlarının müəyyən bir qisminin öz əksini tapdığı 14 sentyabr 1994-cü ildəki "Respublikanın ali məktəblərinə daxil olmuş birinci kurs tələbələri ilə görüş"dəki nitqində məntiqi ardıcıllığa diqqət yetirilmişdir.

Bütün çıxışlarında olduğu kimi bu nitqdə də girişlər auditoriyanı səfərbər edir. Azərbaycan elminin zirvələrinə gedən yollarda yaddaşlara hopan səmimi sözlərlə gəncləri ruhlandırır: "Əziz gənclər, tələbələr, qızlar və oğlanlar, müstəqil Azərbaycan Respublikasının əziz övladları! Bu gün sizin üçün tarixi bir gündür... Orta məktəbi qurtarıb ali məktəbə daxil olmaq hər bir gənc üçün böyük hadisədir və tam qətiyyətlə deyə bilərik ki, bu, xoşbəxtlikdir. Siz bu xoşbəxtliyə nail olmusunuz... Mən sizi və sizin simanızda ali məktəblərə daxil olan Azərbaycan gənclərinin hamısını ürəkdən təbrik edirəm və sizə cansağlığı, ali təhsil almaq yollarında uğurlar arzulayıram!" [Ic.s.215].

---

[1] "Heydər Əliyev dil haqqında və Heydər Əliyevin dili". Bakı, "Elm", 1998. səh.83

Gənclərin qəlbini bahar işığı təkin sözlərlə işıqlandıran böyük natiq onları ali məktəblərə hazırlayan müəllimləri təbrik edir: “Ona görə də bu gün mən gənclərimizi orta məktəblərdə hazırlamış, ali təhsil almaq üçün onlara lazımi bilik, tərbiyə vermiş müəllimlərə, məktəblərə minnətdarlığımı bildirirəm və bütün orta məktəb müəllimlərimizi bu hadisə münasibətilə təbrik edirəm”.

Gəncləri və onların orta məktəb müəllimlərini təbrikdən sonra gənclərin qarşısında duran böyük yolu cümlədaxili məntiqi ardıcıllıqla sadalayır: “Qarşınızda böyük yol durur: ali təhsil almaq, müstəqil Azərbaycan Respublikasının həyatında özünü sınaqdan çıxarmaq, cəmiyyətdə istədiyiniz və layiq olduğunuz yeri tutmaq”.

Gənclərin özlərinin qeyd etdiyi kimi test üsulunun köməyi ilə ali məktəblərə daxil olublar. Test üsulunun mütərəqqiliyini qeyd edərək, bu üsulun davam etdirilməsini qətiyyətlə auditoriyaya çatdırır: “Bu fikirlər bir daha təsdiq edir ki, son vaxtlar Azərbaycanda ali məktəblərə qəbulda test üsulunun tətbiq olunması müsbət nəticələr verir, cəmiyyətimiz üçün xeyirlidir. Odur ki biz bunu davam etdirməliyik.

Lakin son illərdə əldə edilən nəticələr göstərir ki, bu mütərəqqi üsuldur, gənclər sırasından ən biliklilərinin ədalətlə seçilib ali məktəblərə qəbul olunmasını təmin edən ən münasib üsuldur” [Ic.s.216].

Qüvvətləndirici “ən” ədatının işləndiyi bu cümlədə test üsulunun gələcəkdə inkişafına stimul verir.

Nitqin sonrakı mərhələsində böyük natiq XX əsrin 80-90-cı illərindəki tələbə qəbuluna nəzər yetirir, auditoriyadakı yaşlı nəsli o dövrə qaytarır, səmimi bir şəkildə arzu və istəklərini xalqı ilə bölüşür: “Ali məktəblərə qəbulda nöqsanların aradan qaldırılması uğrunda ciddi mübarizə aparmışam, daim də arzu və istəyim bundan ibarət olmuşdur ki, ali məktəb-

lərimiz həqiqətən yüksək təhsil ocaqlarına çevrilsin, ali məktəblərdə oxuyan gənclərimiz həm yüksək səviyyədə təhsil ala bilsin, həm də yaxşı tərbiyə edilsinlər".

Heydər Əliyev nitqinə xas olan qətiyyətlilik sonrakı ardıcıllıqda özünü göstərir: "Minlərlə gənclərimiz sırasından ali məktəblərimizə yalnız və yalnız biliyinə, zəkasına görə, hazırlığına görə ən layiqlilər seçilib götürülməlidirlər" [Ic.s.217].

Tarix fəlsəfəsinə hörmətlə yanaşan, "tarixi heç vaxt qaralamaq olmaz" fikrini auditoriyalara tez-tez xatırladan böyük natiq bu çıxışında da hər şeyi olduğu kimi auditoriyaya çatdırır, müstəqilliyin test üsulu kimi şirin meyvələrinin gənc nəslin daddığını qeyd edir: "Keçmiş vaxtlarda bu sahədə nailiyyətlər də olub, nöqsanlar, qüsurlar da. Ancaq eyni zamanda bəzi qruplar, adamlar bizim bu işimizin ədalətlə getməsinə əngəl törədirdilər... Lakin o vaxtlar Sovet İttifaqının heç bir yerində test üsulu tətbiq edilmirdi. İndi üçüncü ildir ki, test üsulu Azərbaycanda tətbiq olunur. Test üsulu ilə keçirilən builki imtahanlar ötən illərdəkindən daha uğurlu olmuşdir" [Ic.s.217].

Bütün nitqlərinə nikbinlik hakim olan böyük natiq test üsuluna olan inamını, nikbinliyini dilə gətirir. Bu gün həyatımızın müxtəlif sahələrində geniş yer tutan test üsulu Heydər Əliyev uzaqgörənliyinin bariz nümunəsidir: "Beləliklə də, biz test üsulunun bəhrəsini görəcəyik, ali məktəblərimizə tələbələrin yeni bir dəstəsi qəbul ediləcəkdir".

Növbəti mərhələdə o ali məktəblərdəki vəziyyəti şərh edir, müharibə şəraitində təhsilin səviyyəsinin bəzi hallarda aşağı düşməsini səmimiyyətlə etiraf edir: "Hətta bəzi hallarda tədrisin, təhsilin səviyyəsi də aşağı düşmüşdür. Bunlar reallıq, həqiqətdir. Biz onları etiraf etməliyik. Nöqsanları özümüz deməliyik. Əvvəla, biz daim gərək həqiqəti açıq söyləyək. İkincisi də, hamımız birləşib bu nöqsanları aradan qaldırmalıyıq" [Ic.s.218].

Övladları arasında ayrı-seçkilik salmayan müdrik bir ata, "bu vətən hamımızındır" prinsipini daim irəli sürən ulu öndər ali məktəblərə daxil olmayan gəncləri də yada salır, şəhid olan gənclərimizin ruhları naminə çalışmağı tövsiyə edir: "Torpaqlarımızı qoruyan, sərhədlərimizin keşiyini çəkən, cəbhədə olan sizin kimi gənclər haqqında daim düşünməlisiniz, onlara mənəvi dayaq olmalı, onları ruhlandırmalısınız. Bu da sizli-bizli hamımızın müqəddəs vəzifəsidir" [Ic.s.219].

Bu fikirlərin arxasınca Ermənistanın bizi təhrik etdiyi müharibəyə münasibətini bildirir. Cəlb olunduğumuz münaqişə ilə bağlı gənclərin ordu sıralarında xidmətə hazır olmalarını yada salır: "Buna görə də biz ordu quruculuğuna daim diqqət yetiririk... Siz gənclər də ali təhsil almaqla yanaşı bilməlisiniz ki, hər biriniz Azərbaycan Ordusu sıralarında xidmət etməyə hazır olmalısınız, özünüzü buna hazırlamalısınız".

Bütün çıxışlarının ana xəttini müstəqillik ideyası təşkil edən ümummilli lider Heydər Əliyev burada da milli azadlığımızdan danışır: "İndi biz öz taleyimizin sahibiyik. Xalqımız öz milli azadlığına nail olmuşdur. Müstəqil dövlətimiz qurulur və biz müstəqilliyimizi qoruyub saxlamalıyıq. Ona görə də gənclərimizin bu prinsiplər əsasında tərbiyə edilməsi həm müəllimlərimizin, həm ictimaiyyətin, həm də informasiya orqanlarımızın başlıca vəzifəsidir" [Ic.s.221].

Çıxışın sonuna yaxın ali məktəblərin qarşısında duran vəzifələri sadalayır, sosial-iqtisadi çətinlikləri xatırladır, "biz belə vəziyyətdən çıxmağa nail olacağıq" kimi nikbin notlarla fikrini yekunlaşdırır.

"Ümidvaram ki", modal sözün köməyi ilə çıxış sona yaxınlaşır. Auditoriya böyük natiqin ümidlə gələcəyə baxdığının şahidi olur: "Ümidvaram ki, ali məktəblərə daxil olan gənclərin hamısı öz gələcək həyatlarını xalqımızın əsrlərdən-əsrlərə

ötürülən milli-mənəvi dəyərləri əsasında quracaq və özlərini Azərbaycanın gələcəyi naminə layiqincə hazırlayacaqlar".

Eləcə də Dövlət Tələbə Qəbulu Komissiyasının gələcəkdə təhsilimizə göstərə biləcəyi xidməti qiymətləndirir: "Ümidvaram ki, Dövlət Tələbə Qəbulu Komissiyası tərəfindən aparılan işlər yüksək səviyyədə həyata keçiriləcək, bütün qəbul məsələləri lazımınca həll ediləcək və ali məktəblərə gənclərin yeni bir dəstəsi də qəbul olunacaqdır" [Ic.s.222].

Müstəqilliyə qədəm qoyduğumuz ilk illərdə kənd təsərrüfatı sahəsində aparılan islahatlarla bağlı 5 noyabr 1994-cü il tarixdə, Prezident sarayında keçirilmiş müşavirədəki Heydər Əliyev nitqi məntiqi ardıcıllıq baxımından, eləcə də ölkə əhalisinin hər birinin maraq dairəsinə aid olan bir nitq kimi araşdırılmağa layiqdir. Burada Heydər Əliyevin simasında böyük islahatçını, kənd təsərrüfatı sahəsinin alim mütəxəssisini, qanunların həyata keçirilməsi yolunda qətiyyətli dövlət başçısını, insan və torpaq münasibətlərini dərindən-dərinə bilən filosofu görürük. Bu nitqdə kənd təsərrüfatı problemlərinə yönəlmiş elmi üslubun digər üslublarla harmoniya yaratmasının şahidi oluruq. Müşavirədəki nitqin məntiqi ardıcıllığını sxematik olaraq aşağıdakı kimi verə bilərik:

Kənd təsərrüfatı sahəsində aparılan islahatlar → müstəqil dövlətçiliyimizin əbədiliyi → ölkənin kənd təsərrüfatı potensialı → taxılla bağlı ölkədə gərginlik yaşanması → kənaraçıxma: Füzulinin 500 illik yubileyi → digər ölkələrdə kənd təsərrüfatının vəziyyəti və onların təcrübəsindən bəhrələnmək → regional xüsusiyyətlərin nəzərə alınması → tapşırıqar verilməsi → sonluq.

Nitqin girişində elmi üslub işə düşür, problemin həlli yolları auditoriyaya açıqlanır: "Ölkəmizin iqtisadi potensialının böyük bir qismi, təbii sərvətlərimizlə bağlı olan hissəsi kənd təsərrüfatında aqrar-sənaye bölməsindədir. Ona görə də müs-

təqil Azərbaycanımızın gələcəyi bu sahənin səmərəli işlədilməsindən asılıdır”.

Qəbul olunmuş qanunlarda cümlədaxili məntiqi ardıcıllığın ciddi gözlənildiyi bir cümlə ilə münasibətini bildirən böyük natiq: “Ola bilər indiyədək qəbul edilmiş qanunların hamısına mütləq yenidən baxılsın, onlar bir daha təhlil edilsin, işləməməsinin səbəbləri araşdırılsın, hansı maddələrin bu günün tələblərinə cavab verdiyi müəyyənləşdirilsin və onlardan istifadə edilsin” – sonrakı mərhələdə kənd təsərrüfatı ilə zaman (mövsüm) asılılığını “əvvələn” və “ikincisi” modal sözlərin köməyi ilə auditoriyaya çatdırır: “Bayaq dedim bir də təkrar edirəm – kənd təsərrüfatında islahatların keçirilməsinin mövsümdən asılılığı var. Payız-qış dövrü bu islahatların keçirilməsi üçün ən əlverişli vaxtdır. Biz bu vaxtı ötürə bilmərik. Əvvələn ona görə ki, biz onsuz da gecikmişik daha gecikə bilmərik. İkincisi, əgər biz bu vaxtı ötürsək, yaz-yay aylarında islahatların keçirilməsi daha da çətin olacaqdır”.

Sonrakı mərhələdə müstəqillikdən söhbət açan böyük natiq müstəqilliyi təbliğ edir, xalqda müstəqilliyə olan inamı daha da gücləndirir: “Sovetlər İttifaqının dağılması prosesi gedərkən bir çox iqtisadçılar bunu təhlil etmiş və hələ o zaman belə nəticəyə gəlmişdilər ki, 15 Sovet respublikasından ikisi-üçü müstəqillik dövründə özünü tam yaşada bilərsə, bunlardan biri də Azərbaycandır. Bunu hələ o zaman həm sovet alimləri, həm də Qərb sovetoloqları demişdir”.

Sonra natiq ölkənin kənd təsərrüfatı potensialını rəqəmlərin dili ilə auditoriyanın nəzərinə çatdırır. İlk baxışda quru, cansıxıcı görünən rəqəmlər Heydər Əliyevin şifahi nitqində canlılıq xüsusiyyəti kəsb edir. Sonda “bu rəqəmləri toplayın, görün neçə milyon ton edir” müraciəti nitqin emosionallığını gücləndirir, natiqin rəqəmləri bədahətən söyləməsi isə ona olan rəğbəti birə yüz, birə min artırır: “70-ci illəri 80-cı illərin

əvvəlini götürürəm: təsəvvür edin Azərbaycanda ildə orta hesabla 1,3-1,4 milyon ton, bəzən 1,5 milyon ton – orta hesabla 1,3 milyon ton götürürəm – taxıl istehsal olunurdu; ildə 800 min ton pambıq, 1,5 milyin ton üzüm, 700 min ton tərəvəz məhsulları, 300 min ton meyvə, 50-55 min ton tütün, 25-26 min ton yaşıl çay yarpağı, 150-160 min ton ət, 700 min tonadək, fərdi təsərrüfatlar da nəzərə alınarsa, 1 milyon tonadək süd istehsal olunurdu. Bu rəqəmləri toplayın görün neçə milyon ton edir".

İqtisadi potensialın yüksəkliyi ilə taxıl qıtlığı arasındakı bu cür uyğunsuzluğu islahatların gecikməsi ilə əlaqələndirir. Taxılın qıtlığı ilə bağlı ölkədə yaranan ağır vəziyyətdən çıxış yolu arayan natiq hesabat verir: "Mən oktyabrın 18-19-da İstanbulda – türk cumhuriyyətləri dövlət başçılarının görüşündə olarkən Türkiyəyə müraciət etdim. Oktyabrın 21-də Moskvada MDB dövlət başçılarının iclasında oldum və orada Rusiyanın rəhbərlərinə müraciət etdim. Ayın 27-də Bakıdan mənə müraciət etdilər ki, vəziyyət çox gərgindir. Mən İran prezidenti Haşimi-Rəfsəncanidən təklikdə xahiş etdim ki, təcili olaraq bizə un göndərsinlər və onlar Astaradan gündə 150-200 ton un verməyə başladılar. 25 min ton un verməyə razılaşmışdılar. İndi onu gəmilərlə gətirməliyik. Türkiyə də 100 min ton taxıl verəcək".

Bu hesabatı dinləyən xalq güclü, qayğıkeş dövlət rəhbərini görür və arxasınca gedir.

Növbəti mərhələdə məişət üslubunda sadə dildə fikirlər söylənir: "Ona görə də münbit torpağı, təbii imkanları olan bir ölkədə bunlardan istifadə etməyərək, ordan-burdan taxıl axtarmağa haqq qazandırmaq olmaz. Kənardan taxıl, un almaq üçün vəsait də lazımdır. Vəsait göydən də düşmür, yerdən də çıxmır, onu da bilməlisiniz ki, heç kəs bizə müftə heç nə vermir".

"Nəhayət" modal sözü ilə çıxışını yekunlaşdıran ölkə prezidenti insanları çaşqınlığa düşməməyə səsləyir, onları islahatları həyata keçirməyə təşviq edir.

"Nəhayət bir fikri də bildirmək istəyirəm. Bilirsiniz insanlarda inam yaranması üçün, prezident kimi qəti deyirəm ki, iqtisadi islahatlara doğru getməyimiz barədə heç kəsdə şübhə olmasın" [IIc.s.489].

7 mart 1998-ci ildə qadınlar bayramı münasibətilə böyük natiq qadınları yaşına görə sıralayır, ağbirçək sözü ilə nitqinə xəlqilik gəirir, südəmər uşaqların gənc qadın, gənc ana qucağında olması həqiqətini auditoriyaya bəyan edir: "Mənə ən çox təsir edən, ürəyimdə müsbət mənada iz buraxan, məni həyəcanlandıran o oldu ki, toplaşanların içərisində çoxlu qadın var idi – yaşlı qadınlar, ağbirçək qadınlar, analar, gənc qadınlar var idi. Mən gənc qadınların qucağında südəmər uşaqları gördüm" [XVc.s.43].

İqtisadiyyatla bağlı başqa bir məqamda böyük natiq bircə cümlə ilə neft sahəsindəki vəziyyəti və dövlətin vətəndaşları qarşısındakı borcunu, bu borcu necə yerinə yetirməyi ardıcıl şəkildə məntiqə uyğun sıralayır: "Azərbaycanın neft yataqlarında neft və neft məhsulları hələ çoxdur. Onları çıxarmaq, istifadə etmək, iqtisadiyyatı, xalqımızın sosial vəziyyətini qaldırmaq, adamlarımızın rifahını yüksəltmək bizim vəzifəmizdir" [IIc.s.243]. Bu cümlədə məntiqi ardıcıllıq özünü biruzə verir: neft çıxarmaq → neft məhsullarından istifadə etmək → iqtisadiyyatı qaldırmaq → adamların rifahını yüksəltmək.

Qaldırmaq, yüksəltmək kimi sinonim ifadələr cümlənin mənasını gücləndirməklə nitqin ekspressivliyini artırır.

Heydər Əliyevin nitqindəki məntiqi ardıcıllıq müxtəlif auditoriyalarda özünü göstərir. Dilimizlə bağlı aşağıdakı parçada dili bilməməyin hansı faciələrə, ağırlaşmalara gətirib

çıxarmağı izah olunur. Dil-tarix-mədəniyyət-milli-mədəni ənənələr-vətənpərvərlik-milli vətənpərvərlik duyğuları, hissiyyatı. Demək dili bilməmək sonda milli vətənpərvərlik və hissiyyatının itməsi kimi dəhşətli faciəyə səbəb olduğunu anladır: "Azərbaycan ədəbiyyatını, ana dilini bilməyən gənc Nizamini oxuya bilməz, Füzulini oxuya bilməz, Sabiri oxuya bilməz, Cəlil Məmmədquluzadəni oxuya bilməz və digərlərini oxuya bilməz. Əgər onları oxuya bilməsə, bizim mədəniyyətimizi bilməyəcək, mədəni köklərimizi bilməyəcək, milli-mədəni ənənələrimizi bilməyəcək. Onları bilməsə o, vətənpərvər olmayacaq, onda milli vətənpərvərlik duyğuları, hissiyyatı olmayacaqdır".

Cümlə daxilində məntiqi ardıcıllıq müxtəlif çeşidli auditoriyalarda səslənir. İqtisadiyyatımızla bağlı məsələlərdə də bu ardıcıllıq özünü daha qabarıq göstərir. Azərbaycanın, o cümlədən Sovet İttifaqının təsərrüfat sistemini illərlə idarə edən Heydər Əliyev nitqində iqtisadiyyatın öz təbii axarı ilə inkişafının şərtləri ciddi ardıcıllığa söykənir: "Qeyd olundu ki, son vaxtlar iqtisadiyyata dair iki fərman verilmişdir. Bu fərmanlar bazar iqtisadiyyatına həqiqətən keçmək üçün, iqtisadiyyatı demokratikləşdirmək üçün, adamlara sərbəstlik vermək üçün, sahibkarlıq və təşəbbüskarlıq prinsiplərini inkişaf etdirmək üçün çox əhəmiyyətli dövlət sənədləridir".

Məntiqi ardıcıllıq cümlə daxilində sırf sosial-fəlsəfi məsələlərdə də özünü göstərir, səbəb-nəticə ardıcıllığı önə çıxır: "Ancaq təəssüf hissi ilə qeyd etmək istəyirəm ki, Ermənistanın Azərbaycana qarşı hərbi təcavüzü bu kitabda geniş şəkildə öz əksini tapmayıb, bu hərbi təcavüz ilə əlaqədar respublikamızda sosial-iqtisadi vəziyyətin ağırlaşması, adamların yaşayışının kəskinləşməsi, insan inkişafına dair problemlərin həllinin çətinləşməsi məsələsi bu kitabda lazımi qədər göstərilməyibdir". Belə ki, bu cümlədə Ermənistanın təcavüzü res-

publikamızda sosial-iqtisadi vəziyyətin ağırlaşmasına səbəb olur, bu ağırlaşma adamların yaşayışını kəskinləşdirir və bütün hallarda hamısı insan inkişafına dair problemlərin çözülməsini çətinləşdirir – ardıcıllığı işə düşür.

Heydər Əliyevin nitqində zamanın məntiqi ardıcıllığı gözlənilir: "Bu təbiidir, çünkü Səməd Vurğun xalqımız, millətimiz üçün o qədər dəyərli bir şəxsiyyət olub, o qədər zəngin bir irs qoyub ki, onun 90 illik yubileyi bir gün, bir ay yox, məhz bir il müddətində keçirilməli idi" [IXc.s.16].

Heydər Əliyevin nitqində tarixi hadisələrin xronoloji ardıcıllığı həmişə gözlənilir. Bu ardıcıl tarixi hadisələrə olan məntiqi münasibət necə deyərlər bir daha məntiqi ardıcıllıq məfhumunu gündəmə gətirir: "XX əsr bəşər tarixində çox ziddiyyətli, mürəkkəb proseslər dövrüdür. Səməd Vurğunun yaşadığı illər həddindən artıq mürəkkəb, qarışıq, çətin olub. Birinci dünya müharibəsi dünyaya nə qədər ziyanlar vurubdur. Ondan sonra yer kürəsinin altıda bir hissəsində yeni bir quruluş, yeni ideologiya hökm sürməyə başlayıbdır. Sonra bəşəriyyət üçün ən təhlükəli olan faşizim meydana çıxıb. İkinci Dünya Müharibəsi başlanıb, nə qədər insanlar qurban gedib. İkinci Dünya Müharibəsindən sonra "soyuq müharibə" başlayıb, yer üzərində yenə də gərginlik yaranıb, eyni zamanda sülhü müdafiə etmək üçün qüvvələr yaranıbdır. Bunlar o dövrün ən böyük tarixi hadisələridir. Belə bir dövrdə yaşamaq, yaratmaq və yüksək yaradıcılıq səviyyəsinə çatmaq hər bir insana nəsib ola bilməzdi" [IXc.s.16-17]. Lakonik şəkildə hər bir tarixi hadisəyə məntiqi izah verilir və növbəti hadisə şərh olunur. SSRİ-nin yaranması – Yer kürəsinin altıda bir hissəsində yeni bir quruluş, yeni ideologiyanın hökm sürməsi fikri ilə, "Soyuq müharibə" – yer üzündə gərginlik eyni zamanda sülhü müdafiə qüvvələrinin yaranması məntiqi ilə auditoriyaya açıqlanır".

Demokratik prinsiplərə əsaslanan Heydər Əliyev nitqində zaman ardıcıllığından ciddi şəkildə istifadə edir: "Mən buna əminəm və bir prezident kimi Konstitusiya ilə mənim üzərimə qoyulan vəzifələri həyata keçirərkən hər saniyə, hər dəqiqə, hər gün yalnız və yalnız demokratik prinsiplərə əsaslanacağam, qəbul olunmuş konstitusiyanın bütün maddələrinə, bütün müddəalarına, bütün fikirlərinə əsaslanacağam".

Hüseyn Cavidin məqrəbəsinin qurulması ilə bağlı çıxışda məntiqi ardıcıllığa söykənən bir cümlə bütöv bir çıxışa ekvivalent ola bilir: "Mən belə qərara gəlmişəm ki, hökumətin, dövlətin ehtiyat fondundan vəsait ayrılsın, lazım olan materiallar qısa müddətdə tapılsın, inşaat işləri aparılsın və məqbərə qurulsun. Mən bu gün buraya heykəltəraşları, memarları, rəssamları da dəvət etmışəm ki, bu layihələrə hamımız birlikdə baxaq. Ancaq məqbərənin bu ilin oktyabr ayınadək yaranması təmin olunmalıdır. Fikrim qətidir, mən bu barədə sərəncam verəcəyəm və bunun üçün lazım olan vəsaiti dövlətdən ayıracağam". Öncə qərar qəbul olunur, sonda məqbərə qurulur, lakin məqbərə qurulanadək vəsait ayrılır, materiallar tapılır, inşaat işləri aparılır ardıcıllığı nitqə xüsusi çalarlar qazandırır.

26 oktyabr 1994-cü il tarixdə, Bakı Dövlət Universitetinin 75 illik yubileyinə həsr olunmuş təntənəli mərasimdəki nitqə diqqət yetirsək orada səslənən bir cümlədə məntiqi ardıcıllığa söykənən fikirlərin sonda izahedici cümlə ilə yekunlaşmasının şahidi olarıq: "Azərbaycanda milli azadlıq hərəkatının yaranması, əsrlərdən-əsrlərə xalqımızın böyük tarixə, böyük mədəniyyətə malik olması, böyük mənəviyyat sahibi olması – bunlar hamısı XX əsrdə alimlərimizin, müəllimlərimizin, ali təhsil ocaqlarında çalışanların fəaliyyəti nəticəsində olmuşdur".

Heydər Əliyevin nitqinə xas olan məntiqi ardıcıllıq Azərbaycanın görkəmli şəxsiyyətlərinin auditoriyalara tanıdılma-

sında da özünə yer tapır: "O rus dilində mükəmməl bilib, Avropa mədəniyyətini çox dərindən öyrənib, ümumbəşəri dəyərləri dərk edib, onları öz milliliyi ilə, öz ana dili ilə, öz milli kökləri ilə birləşdirərək Mirzə Cəlil olubddur, Cəlil Məmmədquluzadə olubdur... Cəlil Məmmədquluzadənin böyüklüyü həm şəxsi həyatında, həm fəaliyyətində, həm də yaradıcılığında ondan ibarətdir ki, o, ilk təhsilini Naxçıvanda molla məktəbində aldıqdan sonra rus dilində Qori seminariyasını bitirib, sonra Sankt-Peterburqda təhsil almışdır". Yuxarıdakı cümlələrdə zaman, məkan, təhsil pillələri məntiqi ardıcıllıqla sıralanır: ilk təhsil, Naxçıvan, molla məktəbi → Qori, seminariya təhsili → sonra, Sankt-Peterburq, ali təhsil.

Heydər Əliyevin nitqində cümlədaxili məntiqi ardıcıllıq çox vaxt tabesiz mürəkkəb cümlə ilə həyata keçirilir: "Bilirsiniz ki bir çox tədbirlər görmüşük, iqtisadi islahatlar sahəsində addımlar atmışıq, qanunlar, o cümlədən özəlləşdirmə haqqında qanun, proqlamlar qəbul etmişik, aqrar sektorda islahatlar həyata keçirmişik, maliyyə sistemimizi dünya sisteminə, bank sisteminə uyğunlaşdırmaq üçün işlər görmüşük" [Vc.s.19].

Məntiqi ardıcıllıq böyük natiqin dini üslublu çıxış və nitqlərini də tərk etmir: "Kəbəni görmək, müqəddəs Qara daşı öpmək, ona toxunmaq, onu ziyarət etmək, Kəbənin içərisinə daxil olmaq, orada namaz qılmaq, dua etmək mənə nəsib oldu".

Məntiqi ardıcıllığa söykənən başqa bir dini üslublu nitqində dinimizi bizlərə öyrədir, dinimizin gözəlliklərini bizə açıqlayır: "Mən Mədinədə Həzrəti Məhəmməd Peyğəmbərin qəbrini ziyarət etdim. Peyğəmbərin namaz qıldığı məbədin qarşısında namaz qıldım, onun qəbrinin üzərində o dövrdə tikilmiş məsciddə oldum, orada ibadət etdim, Peyğəmbərin namaz qıldığı minbərin pilləsində oturub, Quranı öpüb gözümə, alnıma basdım". Peyğəmbər minbərinin pilləsində oturub, Quranı öpüb, gözünə basan bir Məhəmməd ümməti, səmi-

miyyətə söykənən, əməli saleh bir natiq auditoriya tərəfindən sevgi ilə qarşılanır.

Heydər Əliyevin həcm etibari ilə böyük sayılan nitqlərindən birində – 30 oktyabr 1997-ci ildə Prezident sarayında Azərbaycan yazıçılarının X qurultayında söylədiyi nitq də məntiqi ardıcıllıq, sistemlilik baxımından diqqətəlayiqdir.

XX əsr Azərbaycan ədəbiyyatının araşdırılmasına yönələn mükəmməl elmi-tədqiqat işini xatırladan bu nitq başlanğıcını duru dağ çeşməsindən götürüb böyük dənizə – nitq mədəniyyətinə qovuşan əzəmətli bir çaya bənzəyir. İki saatdan çox davam edən bu möhtəşəm nitqə, bu şifahi söylənilən nitqə hər an məntiqi ardıcıllıq və Heydər Əliyev təfəkkürünə söykənən təhlillər, ümumiləşdirmələr xasdır. Bu nitqdə Heydər Əliyevin nitq qəlibi işə düşür. Əsasını bədii üslub təşkil edən və digər üslubların harmonik şəkildə çulğalaşdığı bu nitq Azərbaycan nitq mədəniyyətinə ən böyük töhfələrdəndir. Bütün çıxış və nitqlərinə xas olan özünəməxsus Heydər Əliyev girişi burada da özünü göstərir: "Hörmətli qurultay! Əziz yazıçılar! Hörmətli xanımlar və cənablar". Azərbaycan xalqının müstəqilliyi yolunda mühüm rola malik yazıçı və şairlərin toplaşdığı qurultay ulu öndərin dilində canlı bir varlığa çevrilərək "Hörmətli qurultay" kimi səslənir. Elə ilk cümlə bədii üslubda səslənərək auditoriyanı səfərbər edir: "Azərbaycanda yazıçı daim böyük hörmətə layiq olmuşdur. Bu bizim tarixi ənənəmizdir, əcdadlarımızdan gəlib bizə çatmış gözəl bir xüsusiyyətdir. Bu da təsadüfi deyil. Çünki bizim xalqımız birincisi, öz istedadına görə şair, yazıçı, söz ustası olubdur. İkincisi, bizim xalqımız çoxəsrlik tarixində böyük şairlər, yazıçılar, mütəfəkkirlər yetişdiribdir" – deməklə qurultayda qonaq sifətilə iştirak edən nümayəndələrə bəşər tarixini zənginləşdirən əsərlərin yaradılmasında Azərbaycan söz ustalarının rollarını açıqlayır. Sonra öz sözləri ilə desək: "Yazıçılar Birliyi

ilə bu əlaqələrimi şəxsən mən özüm üç mərhələyə bölürəm” – deməklə keçən yüzilliyin 70-ci və 80-ci illərdəki dövrdə ədəbiyyatımızın inkişafından danışır: “Biz o quruluşda, o həyatda, o dövlətdə, o şəraitdə yaşamışıq, təhsil almışıq, böyümüşük və respublikamızı, xalqımızı yaşatmışıq... Mən hesab edirəm ki, çox işlər görülübdür. Əgər o dövr olmasaydı, bu gün burada, bu salonda Yazıçılar Birliyinin 500-dən artıq üzvü, yaxud da nümayəndəsi iştirak etməzdi”. Ulu öndər ikinci dövrü 1990-ci illər hesab edir. O dövrü belə xatırlayır: “Nəhayət, Ali sovetdə o sessiyada, o salonda – hansı ki, həmin binanı vaxtı ilə mən tikib yaratmışdım, o salonda ki, orada məni həmişə böyük hörmət, ehtiramla qarşılayırdılar, – ancaq orada mənə qarşı o qədər hörmətsizlik və ədalətsizlik olduğu halda, Filarmoniyanın salonunda, yazıçıların qurultayında mənə çox mehribanlıq, çox istiqanlılıq, çox yüksək hörmət göstərildi. O vaxt mənim imkanım olmadı ki, belə geniş təşəkkür edim. Altı il keçenden sonra məhz o hadisəyə görə mən sizin hamınıza təşəkkür edirəm. Çox sağ olun” [XIIIc.s.104].

“Bizim ədəbiyyatımız, mədəniyyətimiz xalqımızın milli sərvətidir və intellektual mülkiyyətidir.” – deyən böyük natiq mədəniyyətimizin, ədəbiyyatımızın özünəməxsusluğuna izah verir. Üzeyir Hacıbəyov tərəfindən ilk milli operanın yaranmasını, Mirzə Fətəli Axundovun Azərbaycanda latın əlifbasını tətbiq etməsinə çalışmasını qurultay iştirakçılarının nəzərinə çatdıraraq “milli ədəbiyyatımızı, mədəniyyətimizi Qərb mədəniyyəti, ədəbiyyatı ilə birləşdirən, onun sintezini yaradan insanlar çox uzaq görən, müdrik insanlar” kimi qiymətləndirilir.

Qurultayda toplaşan yaradıcı insanlar qiymətləndirilir, onlar gələcək günlərimizə ruhlandırılır: “Bizim mənəvi potensialımız ədəbiyyatımız, mədəniyyətimiz və intellektual potensialımızın əsasını təşkil edir. Bunu yaradanlar var. Bunu yaradanlar bizim xalqımızın dahi insanlarıdır” [XIIIc.s.106].

Heydər Əliyev Azərbaycan ədəbiyyatının özünəməxsuslu-ğunu, XIX-XX əsrdə onun inkişafını, Mirzə Fətəli Axundo-vun latın qrafikasını tətbiq etmək istəyini, bu istəyin bu gün yerinə yetirilməsini canlı faktlar əsasında açıqlayır. Ədəbiy-yatımızı inkişaf etdirənləri minnətdarlıqla yad edərək onların yubileylərinin keçirilməsini qanunauyğun bir hadisə hesab edir: "Bu gün biz burada qurultay keçirərək müasir ədəbiy-yatımız haqqında danışarkən bu ədəbiyyatı yaradanları, – bu ədəbiyyatı inkişaf etdirənləri – daim hörmət, ehtiram, min-nətdarlıq hissi ilə yad etməliyik. Ona görə də təsadüfi deyil ki, biz Azərbaycanda yazıçıların yubileylərinin keçirilməsini bö-yük əhəmiyyətli bir hadisə hesab edirik".

Heydər Əliyev nitqində məntiqi ardıcıllıq körpülərlə – möhtəşəm körpülərlə həyata keçirilir. Natiq üçün çətin mə-qamlardan biri də fikirlər arasına salınan rahat körpülərdir. O körpülər ki, yeni fikrə keçərkən auditoriya onu hiss etmir və əksinə yeni fikri yeni bir hisslə, həvəslə dinləməyə başlayır. Polad məntiqə söykənən Heydər Əliyev nitqindəki ardıcıllıq hər natiqə müyəssər olmur.

Qurultayda sərbəst bazar iqtisadiyyatı şəraitində yazıçı və şairlərə güzəştin olmayacağından danışan natiq yazıçılar audi-toriyasına necə deyərlər ağır olsa da və bu bədbin ovqatı da səmimi bir dildə izah edir: "Mən çox açıq danışan adamam. Həmişə söz xoş gəlməsə də, mən onu açıq deməliyəm. İndi bizim maliyyə sistemimiz elədir ki, biz bütün güzəştləri ləğv etdik və edirik. Çünkü güzəşt ancaq sosialist iqtisadi sisteminə aiddir. Bazar iqtisadiyyatı, sərbəst iqtisadiyyat sistemində gü-zəşt ola bilməz. İnsanlara başqa vasitələrlə kömək etmək olar" [XIIIc.s.112].

Sonra demokratik, hüquqi, dünyəvi dövlət quruculuğu yo-lunda çətinliklərə sinə gərməyi, bu yolda Türkiyə Cümhu-riyyətinin 74 ildə keçdiyi ağır problemləri, çətin mərhələləri

xatırladır. Türkiyənin keçdiyi yolu nümunə kimi açıqlayır: "Əlbəttə, Türkiyə kimi bir dövlətin, cümhuriyyətin qurulması, inkişafı bizim üçün böyük örnəkdir" [XIIIc.s.114]. İqtisadi çətinliyi təhlil edən böyük natiq qurultay iştirakçılarını sonda nikbinliyə səsləyə bilir. Bu nikbn notlar sırf elmi araşdırmalara, iqtisadi reallıqlara söykənir: "Təsəvvür edin, əgər 30 milyard sərmayə qoyulacaqsa, ondan neçə qat artıq gəlir götürüləcəkdir" [XIIIc.s.117].

Yazıçıların maddi imkanlarının məhdudlaşdığı bir dövrdə, dağılmış iqtisadiyyatın bərpası və dirçəldilməsi dövründə sabahkı günlərə inam yaradılır: "Bizim iqtisadi islahatlarımız və gördüyümüz dünya miqyaslı qlobal işlərimiz bir neçə vaxtdan, qısa müddətdən sonra böyük dəyişikliklər gətirəcəkdir. Onda bizim ədəbiyyata, mədəniyyətə olan qayğımızı da artırmağa imkanımız olacaqdır" [XIIIc.s.119].

İqtisadiyyatımızdan, iqtisadiyyatımıza qoyulan xarici sərmayələrdən və s. danışan böyük natiq "Ən əsas vəzifəni, "ən ümdə borcu" yada salır: "Ancaq bunlarla yanaşı, bizim ən əsas vəzifəmiz, ən ümdə borcumuz Azərbaycanın işğal olunmuş torpaqlarını azad etmək, ərazi bütövlüyünü bərpa etmək və yerindən-yurdundan didərgin düşmüş bir milyona qədər Azərbaycan vətəndaşını öz evinə, yurduna qaytarmaqdır" [XIIIc.s.120].

Burada geniş şəkildə 1988-ci ildən Azərbaycana olan təcavüz, Qorbaçov hakimiyyətinin iç üzünün, o dövrün siyasi xadiminin canlı şahidi olduğu tarixi məqamların yada salınması, SSRİ-nin dağılması səbəbləri, Lissabon zirvə görüşü, xarici ölkələrə olan səfərlər, Qafqazın həmin dövr düşdüyü şərait ətraflı izah olunur. Belə geniş siyasi məsələnin həlli yolunda yazıçı və şairə ehtiyacı dilə gətirməklə, onları dövlətçilik yolunda səfərbər edir: "Bu sahədə də sizin dəstəyinizə,

köməyinizə ehtiyacımız var. Mədəniyyət, ədəbiyyat gərək daim dövlətlə bir yerdə olsun”.

Azərbaycanda şairlərə, yazıçılara qoyulan heykəllərdən danışarkən aşağıdakı “körpü”dən istifadə edir: “Azərbaycanda yazıçıya, şairə hörmət və ehtiramın geniş olması haqqında fikirlərimi tamamlamaq üçün bir-iki məqama da toxunmaq istəyirəm. Azərbaycanda şairlərə, yazıçılara qoyulan heykəllər qədər heç bir insanlara heykəllər qoyulmayıbdır. Bunun özü ədəbiyyata, şairə, şeirə, yazıçıya nə qədər böyük hörmətin olduğunu göstərir”.

Sonrakı mərhələdə ədəbiyyata, mədəniyyətə göstərilən qayğıdan danışılır. Keçid dövrünün çətinlikləri ilə milli azadlıq müqayisə edilir. Təkcə bu fəlsəfi fikirlər beyinlərdə, şüurlarda intibah yaradır, müstəqilliklə bağlı insanları dözümə, səbrə, mətanətə çağırır: “Ancaq tərəziyə qoyanda – hansı ağır gəlir, hansı yüngül gəlir, hamı bir səslə deyəcəkdir ki, bəli müstəqillik naminə biz hər şeyə dözməliyik, müstəqillik naminə hər çətinliyə, hər əzab-əziyyətə dözməliyik”... Elə bu fikirlərin ardınca nikbin notlarla zəngin Heydər Əliyev nitqi işə düşür, auditoriyanın necə deyərlər üzü gülür: “Ancaq bu çətinliklər daimi deyildir. Bunlarında sonu var, bunlar müvəqqətidir. Mən bu gün bunu bir daha deyirəm və hesab edirəm ki, biz bu çətinliklərdən keçib gedəcəyik.”

Bütün məsələlərdə şair və yazıçıların tam sərbəst halda fəaliyyətini dəstəkləyən böyük natiq “Siz tam sərbəstsiniz, azadsınız və sərbəstlik, azadlıq şəraitində nə cür istəyirsinizsə, o cür də yazın” deyir.

Qələm azadlığına imkan yaradan Heydər Əliyev ərazi bütövlüyü, qüdrətli ordu yaradılması, gənclərin vətənpərvərlik ruhunda tərbiyə edilməsi sahəsində yazıçı və şaurlər qarşısında tələb qoyur: “Ancaq hesab edirəm, bir məsələdə siz daha da yaxından iştirak etməlisiniz. Bu məsələ də Azərbay-

can ərazisi bütövlüyünün bərpa olunması, işğal edilmiş torpaqlarımızın azad olunması, Azərbaycanın qüdrətli ordusunun yaradılması, Azərbaycan vətandaşlarının hərbi vətənpərvərlik rolunda tərbiyələndirilməsi, Azərbaycan gənclərinin hərbi vətənpərvərlik yolunda tərbiyəsinin möhkəmləndirməsidir. Bu çox vacibdir, çox lazımdır”.

Bu fikrin, ideyanın şüurlarda möhkəmləndirilməsi məqsədi ilə böyük natiq şair və yazıçıların adlarını çəkir, onların xidmətlərini qurultay iştirakçılarına bir daha xatırladır və nəzərə alsaq ki, auditoriya canlı yayıma diqqət kəsilən Azərbaycan xalqıdır nitqin milyonlara yönəldiyi məlum olur: “Əsrin əvvəllərində 1910-cu, 1921-30-cu illərdə bizim böyük şairlərimizin, yazıçılarımızın əsərləri ancaq millilik, vətənpərvərlik, millətçilik hissləri ilə yazılmışdır”. Fikirləri bir-birinə “körpülərlə” bənd edən dahi nitq ustası auditoriyanı yormur. Bir məqamda əbədiyyətə qovuşan, ədəbiyyat yolunda, millət yolunda əzab-əziyyətə qatlaşan və bu şərəfli yolda yoruldum deməyən cəlilləri, sabirləri yada salırsa digər məqamda auditoriyada əyləşən qurultay iştirakçılarına müraciət edir: “İndi yaşa dolmuş və 60-70-ci illərdə gənc olan yazıçılarımız və şairlərimiz də bu sahədə çox böyük xidmətlər göstərmişdir” [XIIIc.s.127]. Anarın “Şəhərin yay günləri” pyesini, Eldar Quliyevin çəkdiyi “Bir Cənub Şəhərində” filmini və s. xatırlamaqla həmin görkəmli şəxsləri bir daha Azərbaycan xalqına tanıdır.

Heydər Əliyev nitqində tərif yoxdur. Heydər Əliyevin nitqində xalq qarşısında xidmətlərin dilə gətirilməsi və bu xidmətlər müqabilində ürəkdən təşəkkürlər mövcuddur. Növbəti fikirdə “dissident” yazıçı, şairləri gündəmə gətirir, onları xalqa tanıdır: “Amma sizin çoxunuz dissident olmusunuz. Sizin dissident olmağınızı müsbət mənada deyirəm. Yaxşı ki, siz dissident olmusunuz. Əgər dissident olmasaydınız, Azərbay-

can xalqında bu milli ruhu, əhval-ruhiyyəni qaldıra bilməzdiniz. Əgər Bəxtiyar Vahabzadə dissident olmasaydı, Azərbaycan xalqının, gənclərinin şüuruna təsir edə bilməzdi. Əgər Xəlil Rza dissident olmasaydı, onun əsərlərinin təsiri güclü olmazdı" [XIIIc.s.128].

Heydər Əliyevin nitqlərinin bir gücü də auditoriya ilə aktiv qarşılıqlı əlaqəyə girməkdir, auditoriyaya bu şansı verməkdir. Dissidentlikdən danışan məqamda yazıçı Anarın: "Heydər müəllim, bağışlayın sözünüzü kəsirəm. Bir dəfə siz özünüz dediniz ki, o vaxt elə ən böyük dissident mən özüm olmuşam" sözlərinə cavab olaraq keçdiyi dissident yolunu auditoriyaya çatdırır: "Ancaq 1969-cu ildən başlayaraq 1987-ci ildə istefaya getdiyim zamanadək kommunist partiyasında ən böyük dissidentlərdən biri mən olmuşam" [XIIIc.s.128]. Bu fikirlərin arxasınca milyonlara nümunə ola biləcək bir həyat tərzinin səmimi ifadəsinin şahidi oluruq: "Ümumiyyətlə, mən nə etmişəmsə, hamısını şüurlu etmişəm. Bütün keçmişimə, həyatıma görə, bütün gördüyüm işlərə görə də heyfslənmirəm. Hesab edirəm ki, hamısını xalqın naminə, millətin naminə və doğma Azərbaycanım naminə etmişəm" [XIIIc.s.129]. Növbəti mərhələdə yeni fikir müraciət formasında canlanır. "Mənim bun gün sizə müraciətim ondan ibarətdir ki, çox sağ olun ki, indiyədək xalqımızı vətənpərvəər etmisiniz, millətini sevən etmisiniz, millətin qayğısına qalan etmisiniz. Xalqımızı daha da vətənpərvər etmək lazımdır".

Vətənpərvərlikdən danışan böyük natiq növbəti məntiqi ardıcıllıqla qurultay iştirakçılarının, milyonların qəlbini riqqətə gətirərək ritorik suallarla xalqı, milləti səfərbər edir. Düşdüyümüz vəziyyyətin real mənzərəsini verir: "Bilirsiniz, Ermənistan tərəfindən torpaqlarımızın 20% işğal edilməsinə dözə bilmərəm. Dözə bilmərəm ki, Azərbaycan əsgəri erməni əsgərindən gücsüz olubdur, geri çəkilibdir. Bu daim mənə əzab ve-

rir. Nə üçün, nəyə görə? Bizim xalqımız ermənilərdən zəifmi xalqdır? Və yaxud Respublikamız Ermənistan Respublikasından kiçikdirmi? Doğrudur, bunun başqa səbəbləri var.

...Buna baxmayaraq, bizim xalqımız qadirdir ki, bir qarış torpağımızı da Ermənistana verməsin. Biz buna qadirik” [XIIIc.s.129].

Güclü ordu quruculuğundan danışan natiq elə bil yazıçılar qurultayında yox hərbçilər qarşısındadır. Lakin növbəti “körpüdən” sonra məlum olur ki, bu “kənaraçıxma” ana fikri, ana xətti, ana ideyanı möhkəmlətməyi güdürmüş: “Amma şairin daim ordunun içərisində olması, əsgərlərlə görüşüb söhbət aparması, onlara vətənin nə demək olduğunu, torpağın nə demək olduğunu, müstəqilliyin nə demək olduğunu anlatması çox vacibdir”.

Heydər Əliyevin nitqlərinin bir gücü də yaxın zaman kəsiyində baş verən hadisələri, cəmiyyətdə diqqət mərkəzində olan hadisələri xatırlatmaq, həmin hadisələrə öz qiymətini veməkdir. 1997-ci il 30 oktyabr Yazıçılar Qurultayı və Milli Məclisin 17 oktyabr “Amnistiya haqqında” qərarı. O “Amnistiya haqqında” qərardan danışır. Özünəməxsus “nitq kənaraçıxmasına” yol verir. Sonda isə bu kənaraçıxmalarla qurultay iştirakçıları arasında sıxı bir əlaqənin mövcudluğundan danışır. Ordunu tərk edən, fərarilik edən gənclərin amnistiyası və bu fərarilik yolunda cəmiyyətin məsuliyyəti məsələsi vəhdətdə götürülür: “Gənclərimizin düzgün tərbiyə olunması və Azərbaycana, müstəqilliyimizə sədaqət, hesab edirəm ki, sizin yaradıcılığınızın əsas mövzusu olmalıdır.

İkinci Dünya Müharibəsində – Böyük Vətən Müharibəsində Azərbaycandan gedən 300 min adam həlak oldu, geri qayıtmadı. Xatirinizdədir, bunu dəfələrlə deyiblər. Onların bəzilərinin öləndən sonra cibindən Səməd Vurğunun, Rəsul Rzanın şeirləri çıxmışdı. Demək şeir, şair sözü, yazıçı sözü

hər şeydən təsirlidir. Ona görə də istərdim ki, bu sahəni siz daim öz diqqətinizdə saxlayasınız” [XIIIc.s.130].

Nəhayət, böyük natiq yazıçılar qurultayındakı əsrarəngiz nitqini Azərbaycan dili haqqındakı fikirlərlə yekunlaşdırır. Bu məsələdə böyük natiq qurultay iştirakçılarının dilimizin inkişafındakı rolundan bəhs edir: “Bu gün müstəqil bir dövlət kimi ən fəxr etdiyimiz bir də odur ki, bizim gözəl Azərbaycan dilimiz var. Azərbaycan dilinin formalaşmasında, inkişaf etməsində, bugünkü səviyyəyə çatmasında yazıçılarımızın, şairlərimizin, ədəbiyyatşünasların, dilçi alimlərin böyük xidməti var. Bu gün danışdığımız dil 20-ci ildə danışılan dil deyil. Elədir, yoxsa yox?” [XIIIc.s.133].

Yazıçılar qurultayındakı nitqin zirvəsi Heydər Əliyevin dil haqqındakı fikirləridir desək – yanılmarıq. Dil-xalq, dil-millət vəhdətini böyük natiq tez-tez səsləndirir: “Xalqı xalq edən, milləti millət edən onun ana dilidir. Layiqli ana dili olmayan, ana dilindən istifadə edə bilməyən, ana dilindən bəhrələnə bilməyən xalq, millət, xalq millət ola bilməz” [XIIIc.s.133].

Bu çıxışda Heydər Əliyev və Azərbaycan dili vəhdəti təvazökarlıqla, səmimiyyətlə xalqa açıqlanır: “Yadımdadır, ilk dəfə Yazıçılar İttifaqının qurultayında mən Azərbaycan dilində nitq söyləyəndən sonra tənəffüsə çıxdıq. Hamı gəlib məni təbrik edirdi. Ona görə ki, mən orada birinci növbədə Azərbaycan dilində danışdım. Dedim ki, əziz qardaşlar axı burada elə bir şücaət yoxdur. Bu bizim öz dilimizdir. Mən bunu anladım. Çünkü dövlət adamları Azərbaycan dilində danışmamışdılar. Bu dil məişət dili olmuşdu və bir də ədəbiyyatın dili olmuşdu. Amma dövlət dili olmamışdı” [XIIIc.s.134].

“Yadımdadır” sözü ilə başlayan fikirdə Azərbaycan dilinin dövlət dili səviyyəsinə yüksəlməsindən danışırsa, növbəti “bilirsiniz” modal sözlə Azərbaycan dilinin türkdilli xalqların ailəsində tutduğu yeri müəyyənləşdirir: “Bilirsiniz, mən bunu

dəfələrlə demişəm və bu gün fürsətdən istifadə edib yenə də deyirəm: biz türkdilli xalqların ailəsinə mənsub olan bir xalqıq. Ancaq bunun çox şaxələri var. Bunun bir şaxəsi də Azərbaycan dilidir. Biz bunu təsdiq etmişik və bu artıq bütün ictimaiyyət tərəfindən qəbul olunubdur” [XIIIc.s.135]. Sonrakı nitq mərhələsində böyük natiq dilimizə münasibətdə milli mənafeyini öndə saxlayaraq digər dillərə münasibətini auditoriyaya çatdırır: “Biz artıq dünyaya qovuşmuşuqsa, dünya birliyinə daxil olmuşuqsa, gərək insanlarımız bir neçə dil bilsinlər, rus dilini də bilsinlər, fransız dilini də bilsinlər. Amma birinci növbədə öz ana dilini bilməlidirlər” [XIIIc.s.136].

Heydər Əliyevin nitqini dillə bağlı fikirlərlə sona çatdırması təsadüfi deyil. “Beləliklə” modal sözünün köməyi ilə dil məsələlərinə yekun vuraraq, “qoy” əmr ədatı ilə təntənəli şəkildə nitqini gücləndirir: “Beləliklə, görürsünüz, dil məsələsi ilə əlaqədar nə qədər məsələlər meydana çıxır. Ancaq yenə də ən əsas nəticə ondan ibarətdir ki, Azərbaycanın dövlət müstəqilliyi Azərbaycan dilini əbədi edibdir və bu gün Azərbaycan dilimiz yaşayır və yaşayacaqdır. Qoy Azərbaycan dili müstəqil Azərbaycanda, eləcə də dünyada yaşayan bütün Azərbaycanlıların dili olsun!” [XIIIc.s.137].

Nəhayət, Yazıçılar qurultayında Heydər Əliyev nitqini poetik çalarlarla zəngin bədii üslubla yekunlaşdıraraq ədəbiyyatımızın gələcəyinə nikbin baxır: “Mən bu gün sizinlə çox açıq, səmimi söhbət aparıram. Ürəyimdə olan sözləri sizə dedim. Bilmirəm, bəlkə də mən çıxışımı qurtarandan sonra siz yenə danışacaqsınız. Ancaq mən bu gün sizinlə bərabər keçirdiyim saatlardan, gündən çox razıyam və sizə təşəkkür edirəm ki, məni səbrlə, diqqətlə dinlədiniz. Mən də öz ürəyimdə olan sözləri sizə çatdırdım” [XIIIc.s.137].

Beləliklə, Heydər Əliyevin Yazıçılar Birliyinin X qurultayındakı nitqini aşağıdakı ardıcıllıqla düzmək olar: “Hörmətli

qurultay!” xitabı ilə auditoriyaya müraciət; Azərbaycan xalqının şair və yazıçıya hörmət və ehtiram ənənəsi; XX əsrdə Azərbaycan ədəbiyyatının güclü inkişafı; Azərbaycan yazıçılarının qurultaylarına münasibət; Yazıçılar Birliyi ilə əlaqələrinin mərhələləri; XIX əsrin sonu XX əsr özünəməxsus Azərbaycan ədəbiyyatının formalaşması (o dövrdə latın qrafikası və Mirzə Fətəli Axundovun xidməti); Şairlərimizə qoyulan abidə və heykəllər haqqında; Yazarlara olan qayğı; Son illərin maddi çətinlikləri; Bu çətinliklərin müstəqilliklə müqayisəsində bazar iqtisadiyyatı şəraitində güzəştlərin olmaması kimi iqtisadi məsələlərin müzakirəsi; Türkiyə Cümhuriyyəti misalında müstəqillik yolunda dözümə çağırış; İqtisadiyyatımızın son illərdəki vəziyyəti, xarici sərmayələrin cəlbi; Gələcək gəlirlərdən fondlar yaradılması, gələn təkliflər əsasında “Heydər Əliyev fondu”nun yaradılması ideyası; Fonddan ədəbiyyatımıza kömək; Əsas vəzifəmizin, ümdə borcumuzun yenə də Azərbaycanın işğal olunmuş ərazilərinin azad olması; Auditoriyaya bu sahədə aparılan işlər barədə hesabat; Müstəqillik yolunda xidmətləri olan şair və yazıçılarımızın adlarının çəkilməsi; XX əsrin 60-70-ci illərində imperiya əleyhinə yazılmış əsərlər, çəkilmiş kino filimlərin xatırlanması; O dövr şair və yazıçılarımızın vətənpərvərliyinin qiymətləndirilməsi; Diqqətin ordu quruculuğuna yönəldilməsi; Dövlət dili kimi Azərbaycan dili haqqında məlumat verilməsi;

Azərbaycan ədəbiyyatının bu günü və sabahının araşdırılması baxımından rəhbərlik səviyyəli Heydər Əliyev çıxışı rəvan “körpülərlə”, auditoriyanı cəlb edən “kənaraçıxmalarla”, özünəməxsus nikbin notlarla yekunlaşır: “Sizə cansağlığı arzu edirəm. Ədəbiyyatımıza yeni uğurlar arzu edirəm. Heç şübhə etmirəm ki, XX əsri uğurla sona çatdıracaq və XXI əsrdə dünya, bəşər ədəbiyyatına gözəl nümunə verəcəkdir. Sağ olun” [XIIIc.s.138].

Nitqdə məntiqi ardıcıllıq təhsilimiz və ədəbiyyatımızla bağlı iki böyük çıxışda araşdırılmağa məruz qalmışdır. Heydər Əliyev təfəkkürünün iqtisadiyyat sahəsində işıq saçdığı çoxsaylı çıxışlardan birində – Bakıda "Sahibkarlığın strategiyası və iqtisadiyyatın yenidən qurulması" mövzusunda beynəxalq konfransının açılışı (13.09.1994) mərasimindəki nitqdə – məntiqi ardıcıllıq araşdırılmışdır.

Elmi üsluba söykənən bu nitqdə iqtisadi terminologiyadan geniş istifadə olunur. İqtisadiyyat sahəsinin görkəmli mütəxəssisi kimi çıxış edən böyük natiqi auditoriya heyranlıqla dinləyir, bazar iqtisadiyyatının incəliklərini onun dilindən eşidir. "Azad iqtisadiyyat", "bazar iqtisadiyyatı", "Soial iqtisadi böhran", "azad sahibkarlıq", "kiçik müəssisə", "sahibkarlıq fəaliyyəti", "infrastruktur", "iqtisadi potensial", "xarici investisiya", "müştərək sahibkarlıq", "özəlləşdirmə", "məhsuldar qüvvələr" və s. onlarla iqtisadi termin çıxışın iqtisadiyyat sahəsinə həsr olunmasından xəbər verir. Yenə də giriş! Situasiyaya uyğun, zamana uyğun, auditoriyaya uyğun giriş. Konfrans müstəqilliyin ilk illərinə - 13 sentyabr 1994-cü ilə təsadüf edir: "Beynəxalq xarakter daşıyan konfrans, sözsüz, böyük əhəmiyyətə malikdir. Lakin azad inkişaf yoluna qədəm qoyan müstəqil Azərbaycan üçün konfrans xüsusilə böyük əhəmiyyət daşıyır" [IIc.s.210].

Konfransın beynəlxalq xarakter daşıdığını, auditoriyada əcnəbi iqtisadçıların, sahibkarların çoxluğunu nəzərə alan böyük natiq bazar iqtisadiyyatının çətinliklərini incələyərək, diqqəti bu çətinliklərə və gələcəkdə bu çətinliklərdən çıxamağa kömək göstərməyə səsləyir: "Təbiidir ki, 70 il ərzində başqa sosial-iqtisadi sistem şəraitində yaşamış olan respublika üçün bu yol son dərəcədə çətin və mürəkkəbdir... Biz azad iqtisadiyyatın, bazar iqtisadiyyatının bərqərar olunmasının və inkişaf etdirilməsinin müxtəlif yollarını nəzərdən keçirməyə

çalışırıq”. Çətinliklərdən danışan natiq sonrakı nitq ardıcıllığında dövlətin bu sahədə gördüyü işləri sıralayır: “Azad sahibkarlığa dövlət yardım fondu yaradılmış, digər tədbirlər görülmüşdür. Azərbaycan Republikasının Milli Məclisi sahibkarlıq fəaliyyətinin əsas istiqamətlərini müəyyənləşdirmiş, sahibkarlığı, təşəbbüskarlığı fəallaşdırmaq, iqtisadiyyatımızı bazar iqtisadiyyatı yolu ilə inkişaf etdirmək üçün həm hüquqi zəmin, həm də müvafiq şərait yaratmaqdan ötrü bir sıra digər tədbirlər görmüşdür”.

Xarici investorların iştirak etdiyi konfransda onların Azərbaycana olan maraq dairəsini genişləndirmək üçün ölkənin malik olduğu iqtisadi dəyərləri ardicıllıqla düzür: “Azərbaycan böyük iqtisadi potensiala, məhsuldar qüvvələrə, əmək ehtiyatlarına, təbii sərvətlərə malikdir. Ümumən Azərbaycan iqtisadiyyatının bütün sahələrində bazar iqtisadiyyatı prinsiplərini həyata keçirmək üçün aqrar bölmədə böyük ehtiyat mənbələri vardır” [IIc.s.212].

İqtisadiyyatla bağlı nitqdə Heydər Əliyev qəyiyyəti və nikbinliyi məntiqi ardıcıllığı müşayiət edir: “Ümüd edirik ki, Azərbaycanın böyük iqtisadi intellektual potensialı, zəngin təbii ehtiyatları və məhsuldar qüvvələri məhz həmin yolla hərəkətə gətiriləcək və ölkə iqtisadiyyatının səviyyəsi qaldırılacaq. Mən əminəm ki, biz bu yolla gedərək müvəffəqiyyətlərə nail olacağıq. Biz bu sahədə də tutduğumuz yoldan dönməyəcəyik”.

Sonrakı mərhələdə Qərb ölkələrinin bazar iqtisadiyyatı sahəsində görkəmli mövqe tutan mütəxəssislərinə üz tutur, onların təcrübəsinə ehtiyacımızı xatırlatmaqla əcnəbi qonaqları nitqi heyranlıqıla dinləməyə sövq edir: “Onlar bazar iqtisadiyyatı əsasında iqtisadi sistem yaradılması yollarını kifayət qədər yaxşı bilirlər. Ümüdvaram ki, əcnəbi qonaqlarımızın çıxışları və onların sahibkarlarımıza, Azərbaycanın iqtisadiy-

yatla məşğul olan bütün dövlət orqanlarına faydalı məsləhətləri, tövsiyələri bizim üçün böyük kömək və böyük yardım olacaqdır” [IIc.s.213].

Heydər Əliyev Azərbaycan sahibkarlarına böyük ehtiram göstərərək fəlsəfi bir fikri – tamın hissələrdən təşkilini ortaya qoyur: “Yəni Azərbaycanın hər bir sahibkarı özünü respublika iqtisadiyyatının bir hissəsi bilməli və ölkənin iqtisadi tərəqqəsi üçün səylər göstərməlidir” [IIc.s.213].

Uzun illər, özü demişkən, nəhəng bir ölkənin – Sovetlər İttifaqının iqtisadi strukturlarına bilavasitə rəhbərlik etmiş bir şəxsin ölkənin bazar iqtisadiyyatına keçid dövründə çevik iqtisadi islahatlar aparması, yeni bir təbəqə sahibkarların formalaşmasına çalışan və sonda buna nail olan Heydər Əliyevin nitqi mövzunun adına uyğun da yekunlaşır: “Mən sahibkarlıq fəaliyyəti ilə məşğul olan hər bir Azərbaycan vətəndaşına məhz belə yanaşıram, onlara öz ehtiramımı bildirir, onların fəaliyyətinə səmimi münasibət göstərirəm... Mən xalqın rifahı naminə fəaliyyət göstərən hər bir Azərbaycan sahibkarına uğurlar və tərəqqi arzulayıram” [IIc.s.213].

Heydər Əliyev nitqindəki məntiqi ardıcıllıq necə deyərlər çox vaxt gözdən qaçır. Amma, fəhmli oxucu, dinləyici bu ardıcıllığı dərk edəndən sonra valeh olmaya, heyran qalmaya bilmir. Aşağıda veilmiş kiçik bir parça çıxışda üç yerdə məntiqi ardıcıllığın şahidi oluruq: “Qanunu yaratmaq çətin bir şey deyildir. Hər bir qanunu yaratmaq üçün təcrübə, bilik əsasında konstitusiya əsasında bir 2-3 ay vaxt tələb edir ki, onu yazasan, hazırlayasan, müzakirə edəsən, ondan sonra da imzalayasan. Amma onu icra etmək başqa məsələdir. Qanunu yaradanlar bir kiçik dəstə adamlardır: onu yazıb hazırlayanlar, parlamentdə qəbul edənlər və nəhayət, o qanunları imzalayan prezident: Amma bunlar hər bir insan tərəfindən icra olunmalıdır” [XVc.s.142].

Doğrudan da qanunu yaratmaq üçün lazım olan təcrübə bilikdən öndədir. Təcrübə və bilik əsasında yaradılan qanun konstitusiyaya söykənməzsə onun qüvvəsi olmaz (təcrübə – bilik – konstitusiya). Qanunlar yazılır, sonda isə imzalanır. Bəs ortada? Yenə də Heydər Əliyevin nitq ardıcıllığı işə düşür. Hazırlanmayan və müzakirə olunmayan qanun imzalanmağa verilə bilməz (yazmaq – hazırlamaq – müzakirə etmək – imzalamaq). Bəs qanunları yaradan insanlar? (Yazıb hazırlayan mütəxəssislər – qəbul edən deputatlar – imza edən prezident).

"Mənə ən çox təsir edən ürəyimdə müsbət mənada böyük iz buraxan, məni həyəcanlandıran o oldu ki, toplaşanların içərisində çoxlu qadınlar var idi – yaşlı qadınlar, analar, gənc qadınlar var idi. Mən gənc qadınların qucağında südəmər uşaqları gördüm".

Natiq burada qadınları yaşına görə sıralayır. Ağbirçək sözü ilə nitqinə xəlqilik gətirir, südəmər uşaqların gənc qadın, gənc ana qucağında olması həqiqətini xalqa çatdırır (Gənclik meydanı, Qoşaqala qapısı, 21 mart 1998-ci il).

Heydər Əliyevin nitqində keçmişimiz, onun ənənələri gənc nəslə və gələcək nəsillərə çatdırılması məntiqi ardıcıllığa söykənir: "Bu gün biz xoşbəxtik ki, ulu babalarımızdan sevimli əcdadlarımızdan bizə yadigar olan bu mənəvi dəyərlər yenidən canlanır, gənc nəslə çatdırılır və gənc nəslimiz də adət-ənənələrimizi, bu mənəvi dəyərlərimizi bu gün də yaşadır və gələcək nəsillərə də çatdıracaqdır."

Heydər Əliyev nitqində çox vaxt cümlədaxili məntiqi ardıcıllıq həyatdakı inkişaf ardıcıllığını göstərir. Torpağa düşən toxumdan yeni bir ağacın əmələ gəlməsi və bar verməsi ardıcıllığı necədirsə böyük natiqin nitqlərində də bunun şahidi oluruq: "Sizə tövsiyəm, sizdən xahişim ondan ibarətdir ki, burada olduğunuz günləri, ayları, illəri səmərəli keçirəsiniz, yaxşı təhsil alasınız, Türkiyədən ən gözəl ənənələri mənimsə-

yəsiniz, Azərbaycana gətirəsiniz, Türkiyə-Azərbaycan dostluğunu möhkəmləndirəsiniz və özünüzü müstəqil Azərbaycanın gələcəyi üçün hazırlayasınz" [IXc.s.357].

Cümlədaxili məntiqi ardıcıllıq bəzən ritorik sual cümlələrində öz əksini tapır. "Əgər Azərbaycanda siyasi sabitlik, iqtisadi qanunlar, xarici sərmayənin gəlməsi üçün imkanlar olmasaydı, onlar Azərbaycana gələ bilərdilərmi? Onlar bizdən xahiş edirlər, bizə müraciət edirlər" [XIIc.s.95].

Demokratiyanın əsasında iqtisadiyyatın güclü inkişafı, sərbəst bazar iqtisadiyyatına dövlətin dəstəyi durur ki, bu məsələlər Heydər Əliyev nitqində məntiqi ardıcıllıqla auditoriyaya çatdırılır.

"İqtisadiyyatı güclü olan ölkədə demokratik dəyərlərə üstünlük veriləcək" fəlsəfəsini ortaya qoyur: "Çünki biz maliyyə vəziyyətimizi sağlamlaşdırmışıq, sabitləşdirmişik və bu sabitliyi də qoruyuruq. İnsanların əmək haqqı son iki-üç ildə xeyli artıbdır. Aqrar islahatların həyata keçirilməsi nəticəsində Azərbaycanda kənd təsərrüfatı istehsalı çox yüksəlibdir. Aparılan özəlləşdirmə iqtisadiyyatı xeyli canlandırıbdır. Bütün bünlar Azərbaycanda demiokratiyanı, demokratik dəyərləri inkişaf etdirmək üçün yaxşı şərait yaradıbdır" [XVIIc.s.203].

Demokratiyaya gedən yolun ardıcıllığı Heydər Əliyevin təfəkkür süzgəcindən aşağıdakı kimi süzülərək iqtisadi və fəlsəfi fikirlərin harmoniyasını yaradır. Maliyyə vəziyyətinin sabitləşməsi → əmək haqqının artırılması → aqrar islahatların həyata keçirilməsi → iqtisadiyyatın xeyli canlanması → demokratiya.

Məntiqi ardıcıllıq böyük natiqin çıxışlarının sonluğunda da özünü göstərir. 10 oktyabr 1993-cü ildə Azərbaycan Respublikasının Prezidenti seçilərkən andiçmə mərasimindəki nitq buna misaldır: "Əlimi Qurani-Kərimə basaraq and içirəm ki, Azərbaycan xalqının milli və mənəvi ənənələrinə daim sadiq olacaq

və bu ənənələrin müstəqil dövlətimizdə bərqərar olmasını, yaşamasını və inkişaf etməsini təmin edəcəyəm” [Ic.s.133].

Burada ənənələrə sadiq olmaq → bərqərar etmək → yaşatmaq → inkişaf etdirmək ardıcıllığı özünü göstərir.

Müstəqilliyə qədəm qoyan, müstəqillik yolunda irəliləyən respublikamızdakı proseslər böyük natiqin nitqlərində güclü, səlis, məntiqə söykənən ardıcıllıqla auditoriyalara çatdırılır: “Azərbaycan demokratik inkişaf, bazar münasibətləri yolunu seçmiş, Dünya Birliyi ilə sıx əlaqələr qurmuş, öz qapılarını xarici iş adamlarının üzünə açmış, iqtisadiyyatın dünya iqtisadiyyatı ilə sıx bağlanmasına, Avropa strukturlarında bərabər hüquqlu üzv kimi iştirak etməyə böyük əhəmiyyət verir” [XVIc.s.334].

“Çox zəngin təbii ehtiyatlar, dünya iqtisadi sisteminə uğurlu inteqrasiya, yeni Avrasiya nəqliyyat dəhlizləri layihələrinin həyata keçirilməsi, Transxəzər enerji magistrallarının çəkilməsi, Böyük “İpək yolu”nun dirçəldilməsi ölkələrimiz üçün yaxşı perspektiv yaradır.

Yeni kommunikasiya sistemləri dünya bazarlarını təbii sərvətlərimiz üçün açacaq, xalqlarımızın firavanlığının artmasını təmin edəcək, onların təhlükəsizliyi və tərəqqisi üçün möhkəm zəmin yaradacaqdır” [XVIc.s.14].

Cümlədaxili məntiqi ardıcıllıq müxtəlif üslublarda, müxtəlif mərasimlərdə özünə yer tapır, dinləyiciləri düşündürə bilir. Akademik Ziya Bünyadovla vidalaşma mərasimində bu ardıcıllığın şahidi oluruq: “Görünür ki, Azərbaycanın dövlət müstəqilliyini qoruyub saxlamaq, → Azərbaycanı müstəqil bir dövlət kimi yaşatmaq, → Azərbaycanda həqiqi demokratik, hüquqi dövlət qurmaq, → Azərbaycan xalqını bu ağır vəziyyətdən çıxarmaq, → Azərbaycanın ərazi bütövlüyünü bərpa etmək, → işğal olunmuş torpaqları azad etmək, → yerindən-yurdundan didərgin düşmüş vətəndaşlarımızı öz el-obasına

qaytarmaq yolu hələ çətin yoldur, ağır yoldur. Amma biz bu yol ilə gedirik, gedəcəyik, biz mübarizə aparırıq, aparacağıq və heç kəs iradəmizi sındıra bilməyəcəkdir, heç kəs bizi sarsıda bilməyəcəkdir" [VIIIc.s.459].

Xalqını çətin yola, ağır yola hazırlayan siyasi lider "heç kəs iradəmizi sındıra bilməyəcəkdir" deməklə terrorçu təşkilatlara, müstəqilliyimizə qənim kəsilənlərə bizi bu yoldan döndərə bilməyəcəklərini bir daha xəbərdar edir.

Məntiqi ardıcıllıq hətta məişət üslublu nitqlərdə belə ciddiliklə gözlənilir. 26 avqust 1997-ci il tarixdə, Varşavada, Prezident sarayında Polşa prezidenti Aleksandr Kvasnevskinin Azərbaycan Prezidentinin şərəfinə təşkil etdiyi rəsmi qəbuldakı nitq bu sıradandır. Nitq Azərbaycan xalqının, Azərbaycan Respublikasının atəşin salamları və xoş arzuları ilə başlayır, bu görüş tarixi hadisə kimi qiymətləndirilir: "Hörmətli cənab prezident Kvasnevski! Möhtərəm xanımlar və cənablar! Sizə və Sizin simanızda bütün Polşa xalqına Azərbaycan xalqının, Azərbaycan Respublikasının atəşin salamını və ən xoş arzularını yetirirəm.

Cənab prezident, mən sizinlə tamam razıyam ki, bugünkü görüş, müstəqil Azərbaycan Respublikası prezidentinin Polşaya ilk səfəridir və bu gün keçirilmiş tədbirlər həqiqətən tarixi hadisədir" [XIIc.s.41].

Sonra Heydər Əliyev "həqiqətən" modal sözü ilə Polşa və Azərbaycan əlaqələrinin tarixinin hələ orta əsrlərə gedib çıxdığını maraqlı faktlarla auditoriyanın diqqətinə çatdırır. Belə səhih, ciddi tarixi məlumatları alan auditoriya heyran qalmaya bilmir: "Həqiqətən, orta əsrlərdə Polşa ilə Azərbaycan fəal iqtisadi əlaqələr və ticarət əlaqələri saxlamışlar. Azərbaycandan Polşaya gözəl xalçalar, pambıq, ipək və bir çox mühüm məhsul gətirilirdi. Nəinki ticarət, iqtisadi əlaqələr mövcud idi. Həm də insani əlaqələr yaradılmışdı. Məsələn, yaxşı məlumdur

ki, XV əsrdə Azərbaycan hökmdarı Uzun Həsən Polşa kralı Yagello ilə sıx əlaqə saxlamışdır” [XIIc.s.42].

Daha sonra Polşa-Azərbaycan münasibətləri tarixinin incə təfərrüatlarına belə dərindən bələd olan natiq XIX, XX əsrlərə səyahət edir, həm Polşa, həm də Azərbaycan xalqı üçün maraqlı olan məqamları açıqlayır. Polyak auditoriyası Polşa xalqının tarixini gözəl bilən Heydər Əliyevin nitqinin sehrinə düşür. Xarici ölkələrin tarixinə belə bələdlik sabahkı gün ölkələrarası əlaqələrin qurulması baxımından diqqətəlayiqdir.

Hər bir əlverişli məqamda Azərbaycan xalqının dahi oğul və qızlarını xarici auditoriyalara tanıdan Heydər Əliyev burada da bu ənənəni inkişaf etdirir. Azərbaycanın dəyərli övladlarını Polşa xalqına tanıdır. Əlimərdan bəy Topçubaşovun, Üzeyir Hacıbəyovun, Abbasqulu ağa Bakıxanovun, Qutqaşınlının adlarını rəsmi qəbuldakı insanlara xatırladır: “Azərbaycanın siyası xadimlərindən və maarifçilərindən olan Topçubaşov əsrin əvvəlində Adam Mitskeviçin şeirlərini Azərbaycan dilinə tərcümə etmiş, Azərbaycan peşəkar musiqisinin banisi, Azərbaycanın 1918-ci ildə yazılmış və bu gün sizin eşitdiyiniz himnin müəllifi Üzeyir Hacıbəyov həmin şeirləri öz qəzetində dərc etdirmişdir.

XIX əsrin ortalarında Azərbaycan yazıçıları, mütəfəkkirləri, filosofları – Abbasqulu ağa Bakıxanov və Qutqaşınlı Polşada yaşayıb yaratmış və polyak həmkarları ilə əməkdaşlıq etmişlər” [XIIc.s.42].

Bunun ardınca Azərbaycan və Polşa xalqlarının müstəqillik yolunda oxşar talelərini müqayisə edir, 1918-ci ildə polyak Pilsudski ilə ilk Azərbaycan Demokratik Hökumətinin banilərindən biri olan Məmməd Əmin Rəsulzadənin bu zəmində fəal əməkdaşlığını diqqətə çatdırır: “Tanınmış mühacirlərdən biri burada, Polşada yaşayıb yaratmış Məmməd Əmin Rəsulzadə idi. Yeri gəlmişkən qeyd edim ki, onun

Vanda adlı xanımı Pilsudskinin qohumu idi" – "yeri gəlmişkən" modal sözü ilə xalq ruhunu nitqinə hopdurur.

Azərbaycanın polyaklar üçün doğma diyar olduğunu, Azərbaycan xalqının polyaklara olan hörmətini sadə, aydın cümlələrlə söyləyir: "Polyaklar Azərbaycanda 1918-ci ildə yaradılmış ilk demokratik hökumətin fəaliyyətində də iştirak etmişlər. Məsələn, Kuçinski qardaşları Azərbaycan Demokratik Respublikası hökumətində işləyirdilər. 1918-ci ildə Azərbaycan demokratik hökumətinin ilk milli ordusunun qərargah rəisi general Sulkeviç idi. Birinci dünya müharibəsindən sonra polyaklar Polşadan deportasiya olunarkən onlardan on minlərlə insan Azərbaycana gəlmişdi. Onlar Bakıda, Azərbaycanın digər bölgələrində yaşamışlar və yaşamaqdadırlar. Hazırda təkcə Bakıda iki mindən çox polyak yaşayır" [XIIc.s.43].

Polşa-Azərbaycan münasibətlərinin keçmişindən söhbət açan böyük natiq Azərbaycanın XX əsrin 90-cı illərində qazandığı "əbədi, həmişəlik" müstəqilliyə səyahət edir, yenidən Polşa-Azərbaycan münasibətlərinə qayıdır.

Müstəqillik qazandığımız ilk illərdə Polşanın müstəqilliyimizi müdafiə etməsini önə çəkir, Polşanın Avropanın ən iri ölkələrindən biri olduğunu vurğulayır, onun böyük potensiala malik olduğunu dilə gətirir: "Biz Polşaya minnətdarıq ki, o, çağırışımıza dərhal hay verərək, Azərbaycanın dövlət müstəqilliyini biz öz istiqlaliyyətimizi elan etdikdən sonra, demək olar, elə ilk aylarda tanımışdır.

Polşa Avropanın ən iri ölkələrindən biridir, mühüm strateji mövqedə yerləşir və olduqca böyük potensiala malikdir".

Polşanın qəhrəmanlığı, azadlıq və müstəqillik uğrunda mübarizəsi, ikinci dünya müharibəsi illərində Polşa xalqının məruz qaldığı itkilər, verdiyi qurbanlar poetik bir dillə insanlara çatdırılır: "İkinci Dünya Müharibəsində Polşa xalqının necə böyük itkilərə məruz qaldığı, nə qədər qurbanlar verdiyi

yaxşı məlumdur. Gözəl şəhər olan Varşava öz diqqətəlayiq qədim tarixi və memarlıq abidələri ilə birlikdə yerlə yeksan edilmişdi. Polşa xalqınını zəhməti bahasına, məharəti sayəsində bərpa edilmiş gözəl Varşavaya bu gün biz hədsiz sevinc hissi ilə gəzintiyə çıxdıq. Sizin dostlarınız kimi biz şadıq ki, son illərdə Polşa Respublikasının siyasi, sosial-iqtisadi həyatında olduqca böyük dəyişikliklər baş verir" [XIIc.s.45].

Sonrakı nitq mərhələsi "zənnimcə" modal sözü ilə Polşanın Azərbaycanla gələcək əməkdaşlıq perspektivlərinə nəzər yetirilir: "Zənnimcə, Polşa üçün Avrasiya nəqliyyat dəhlizi də olduqca böyük maraq doğurur. Fəal işləyən bu dəhlizdə Mərkəzi Asiyadan Xəzər dənizi, Azərbaycan vasitəsilə Avropaya və oradan geriyə yüklər daşınır. Biz Azərbaycanla Polşanın bu sahədə fəal əməkdaşlığına dair konkret təkliflər verməyə hazırıq".

"Ancaq Qafqazda baş verən mürəkkəb proseslər Azərbaycana da olduqca böyük ziyan vurmuşdur" ifadəsini işlətməklə Qarabağ məsələsini Polşa auditoriyasında səsləndirir, haqq səsimizin Avropaya yayılmasında Polşanın kömək və dəstəyinə bel bağlamaqdan söhbət açır: "Biz isə öz tərəfimizdən atəşkəsin qalması, tam sülhə nail olmaq üçün hər şey edəcəyik və Dünya Birliyinin böyük ölkələrinin, o cümlədən Polşanın kömək və dəstəyinə bel bağlayacağıq".

Nitqini sinonim cərgələrlə yekunlaşdıran böyük natiq Azərbaycanın tutduğu yolu auditoriya üçün açıqlayır. Bu yolun "azad, müstəqil inkişaf, demokratiya yolu" olduğunu bəyan edir: "Hörmətli dostlar, Azərbaycan demokratik, hüquqi, dünyəvi dövlət quruculuğu yolu ilə qətiyyətlə gedir. Azərbaycanda köhnə rejim, köhnə sistem, kommunist ideologiyası yoxdur və olmayacaqdır. Bizim yolumuz azad, müstəqil inkişaf, demokratiya yoludur, dünyanın bütün mütərəqqi ölkələrinin getdikləri yoldur" [XIIc.s.46].

Nitq arzularla – Polşa xalqına, Polşa prezidentinə yönələn arzularla sona çatır: “Polşa xalqına əbədi olaraq səadət, firavanlıq və müstəqillik arzulayıram. Polşa prezidenti, mənim dostum, gözəl insan Aleksandr Kvasnevskinin sağlığına, Polşa Respublikasının şərəfinə, Polşa xalqının şərəfinə badə qaldırıram. Əziz dostlar, Polşa-Azərbaycan dostluğu şərəfinə, xalqlarımızın şərəfinə badə qaldırıram” [XIIc.s.47].

Bu rəsmi qəbuldakı çıxışı aşağıdakı məntiqi ardıcıllıqla düzmək olar:

– Polşa xalqına, Polşa prezidentinə müraciətlə səsləndirilmiş giriş hissə;

– Polşa-Azərbaycan münasibətlərinə tarixi baxış;

– Polşa-Azərbaycan münasibətlərinin formalaşmasında yüksək rolları olan Azərbaycan və Polşa dövlət xadimlərinin auditoriyaya tanıdılması;

– Polşa-Azərbaycan münasibətlərinin bugünkü durumunu auditoriyanın diqqətinə çatdırılması;

– Azadlıq və müstəqillik yolunda Polşanın mübarizəsi;

– Qarabağ məsələsi ilə əlaqədar Polşa ictimaiyyətinə məlumat verilməsi və dəstək istənilməsi;

– Azərbaycanın tutduğu yolun bir daha Polşa auditoriyasına açıqlanması;

– Polşa xalqına, “mənim dostum, gözəl insan” müraciətinə sahib Polşa prezidenti Aleksandr Kvasnevskiyə yönələn sonluq.

Bu çıxışda əsasən tarixi hadisələrin, ictimai-siyasi dövrlərin xronologiyası ardıcıllığına xüsusi diqqət yetirilmişdir.

Bu çıxışda bir daha Heydər Əliyev tərəfindən məntiqi ardıcıllıqla xarici, yaxud ölkəiçi çıxışlarında qarşı tərəflərin mənsub olduqları ölkələrin tarixi hərtərəfli öyrənilir, həmin ölkələrin xalqlarını riqqətə gətirən ifadələr səmimi şəkildə seçilir, gələcək ikitərəfli münasibətlərin əsası qoyulur.

31 avqust 1994-cü il tarixdə, Bakı şəhərinin təhsil işçiləri ilə görüşdə ulu öndərin söylədiyi nitq Azərbaycan təhsilinin inkişafı, gələcəyi baxımından ciddi sayılan nitqlərdən biridir. Bu nitqdə də məntiqi ardıcıllıq özünü ciddi büruzə verir. “Hörmətli müəllimlər, görüş iştirakçıları!” müraciətilə başlayan çıxışda təhsil sahəsinin həyatımızın ən gərəkli, ən mühüm sahəsi olduğu anlaşılır: “Əgər çıxışların hamısını ümumiləşdirsək, bir fikir aydın olur: respublikamızın təhsil sahəsi həyatımızın ən gərəkli, ən mühüm sahəsidir. Bu sahədə cəmiyyətimizin çoxminli müəllimlər ordusu çalışır. Bu sahə respublikamızın bu günü və xüsusən gələcəyi üçün çox böyük işlər görür”.

Auditoriya nitqin başlanğıcında “ən” qüvvətləndirici ədatının köməyi ilə təhsil sahəsinin Heydər Əliyev üçün nə dərəcədə önəmli olduğunu dərk edir. Növbəti nitq mərhələsi artıq dövlət başçısının qətiyyətli fikirləri ilə davam edir. Bu zaman “lazımı tədbirlər görülməlidir”, “tapşırıram ki,”, “təqdim etsinlər” ifadələri ilə nitq qətiyyətliliyə yüklənir: “Burada irəli sürülən təkliflər, mülahizələr hamısı, şübhəsiz ki, ümumiləşdirilməli və onların haqqında lazımı tədbirlər görülməlidir. Ona görə də bugünkü görüşün yekunu kimi, vəzifəli şəxslərə tapşırıram ki, burada irəli sürülmüş təkliflərin hamısını başqa nazirliklərlə, idarələrlə birlikdə öyrənsinlər, ümumiləşdirsinlər və orta məktəblərin, təhsilin vəziyyətini yaxşılaşdırmaq üçün qısa bir müddətdə, bir neçə gün içərisində əməli tədbirlər təqdim etsinlər”.

Sonra XX əsrdə Azərbaycan təhsilinin inkişafı tarixi-fəlsəfi bir dillə, frazeoloji birləşmələrdən istifadə yolu ilə araşdırılır, Azərbaycan təhsil tarixinin yaradılması ideyasını ortaya qoyur, bütün bu nailiyyətlərin mərkəzində “Azərbaycanın bütün nəsillərdən olan müəllimlərin” durduğunu qeyd edir: “Azərbaycanın təhsili, məktəbləri sona çatan XX əsr dövründə

çox böyük nailiyyətlər əldə edib. Əgər Azərbaycan Respublikasının təhsil tarixi yazılsa, şübhəsiz ki, hər mərhələdə görülən işlər orada əksini tapacaq və öz qiymətini alacaqdır. Əsrin əvvəlindən indiyə qədər Azərbaycanın ərazisində, xalqımızın həyatında, təhsil, elm, mədəniyyət, şüurun inkişafı sahəsində çox böyük işlər görülüb, böyük nailiyyətlər əldə olunub. Azərbaycan xalqı savadsızlıqdan ümumi savadlılığa keçib. O qaranlıq keçmişdən sonra indi respublikamızda xalqın bütün təbəqələrini əhatə edən yüksək mədəniyyət, təhsil, elm mövcuddur" [IIc.s.170].

Azərbaycan təhsilinin XX əsrdəki inkişafına diqqət yetirən ulu öndər bu inkişafın mərkəzində dayanan, "həmişə xalq, insanlar arasında, ictimaiyyətdə hörmət, ehtiram qazanan" müəllimlərin rolundan danışır. "Müəllim" anlayışının Azərbaycan xalqı üçün nə dərəcədə dəyərli olmasını müəllim auditoriyasına açıqlayaraq, müəllimlər ordusunun qəlbini riqqətə gətirir: "Müəllim cəmiyyətdə tanınan, seçilən, hörmət edilən şəxs olmuşdur... Çoxları heç müəllim deyil, amma biz bir-birimizə müraciət edərkən "ağa", "cənab", "bəy" deyil, "müəllim" deyirik. Bu, təsadüfi deyil. Bəlkə də başqa xalqlarda belə müraciət forması yoxdur. Bu ondan irəli gəlir ki, xalqımız savadsızlıqdan, gerilikdən, ətalətdən bugünkü günə qısa tarixi bir müddətdə gəlib çatmaqda müəllimlərin rolunu qiymətləndirir və qarşısındakı adama hörmət əlaməti olaraq "müəllim" deyir" [IIc.s.171].

Cəmiyyəti müəllim adına hörmət etməyə səsləyir, "gələcəkdə də olmalıdır" qətiyyətli ifadəsi ilə xalqın bütün təbəqələrini bu məsələdə – müəllimə ehtiram məsələsində səfərbər edir: "Ona görə də müəllimin cəmiyyətdə xüsusi yeri olduğu artıq heç kəsdə şübhə oyatmır. Müəllimə hörmət, ehtiram həmişə olub, bu gün də olmalıdır, gələcəkdə də olmalıdır".

Müəllim adı, müəllimin cəmiyyətdəki yeri, müəllimlərə minnətdarlıq hissindən danışan böyük natiq növbəti nitq mərhələsində Azərbaycanın milli təhsil ideologiyasını yaratmaq barədə fikirlərini söyləyir: "Respublikamız müstəqil dövlət kimi Azərbaycanın öz milli ideologiya konsepsiyasını yaradaraq, inkişaf etdirərək, şübhəsiz ki, təhsil sahəsini də milli məqsədlər, mənafelər əsasında qurmalıdır" [IIc.s.171].

İki yerdə "güman edirəm ki" modal sözünün köməyi ilə bu milli təhsili həyata keçirməyə təhkim olunan insanları, institutları sadalayır, inam və nikbinliklə fikrini yekunlaşdırır: "Ona görə də təhsil sahəsində çalışan alimlər, mütəxəssislər, müəllimlər, həmin sahədə ixtisaslaşmış elmi institutlar, təşkilatlar hamısı birləşib bu vəzifələri həyata keçirməlidirlər. Güman edirəm ki, bunun üçün imkanlarımız və şəraitimiz var. İndi bizim təhsil sistemimiz müstəqil Azərbaycanın gələcək inkişafını təmin etməlidir. Bu yolda keçiriləcək islahatlar gərək müstəqil Azərbaycanın milli mənafelərinin inkişafına yönəldilsin. Güman edirəm ki, bizim alimlər, müəllimlər, təhsil sahəsində ixtisaslaşmış institutlar bu işlərin öhdəsindən gələcəklər və gələ bilərlər" [IIc.s.172].

Çıxış və nitqlərində "bir neçə kəlmə demək istəyirəm" ifadəsi nitqin xəlqiliyindən xəbər verir, qısa, lakin mühüm məsələlərdən danışılacağına işarə vurur.

Elə burada da təhsilimizin bu günü, gələcəyi araşdırılır, istiqamətləri müəyyənləşdirilir. Milli ideologiyamızı yaratmaq yolunda xalqımızın hər cəhətdən azad, müstəqil olduğunu auditoriyaya açıqlayır: "Bütün bunlarla yanaşı, bu gün təhsilin hansı istiqamətlərdə getməsi haqqında bir neçə kəlmə demək istəyirəm. Şübhəsiz ki, bizim gənclər orta məktəbdə yaxşı təhsil, həqiqi mənada yaxşı təhsil almalıdırlar. Dediyim kimi, bizim milli ideologiyamızın konsepsiyası olmalıdır. Biz XX əsrdə cürbəcür mərhələlərdən keçdik, ayrı-ayrı ideologiyaların

təsiri altında qaldıq. İndi xalqımız hər cəhətdən azaddır. Ona görə də lazımdır ki, ümumiyyətlə, düşünən beyinlərimiz, alimlərimiz və o cümlədən təhsil sahəsində çalışan müəllim ordusu milli ideologiyamızın formalaşması üçün öz fəaliyyətini göstərsin” [IIc.s.172-173].

Milli ideologiyamızı hər yerdə tətbiq etmək üçün Azərbaycan xalqının tarixinə və Azərbaycan dilinin tədrisinə ciddi önəm verilməsini önə çəkir. Bu ilk baxışda nitqdə “kənaraçıxma” effekti yaratsa da, sonda məlum olur ki, milli ideologiyanı tarix və dil fənlərini bilmədən nə yaratmaq, nə də inkişaf etdirmək olar: “Bir sözlə, məktəblərdə bütün fənlərin tədrisində müəllimlərimiz fədakarcasına çalışmalıdırlar. Bu fənlərin arasında bir neçə humanitar fənn var və onlara xüsusi fikir verilməlidir. Milli ideologiyamızı hər yerdə tətbiq etmək üçün məktəblərdə Azərbaycan xalqının tarixinin tədrisinə çox az yer verilirdi. Şübhəsiz ki, tarix deyəndə həm dünyanın tarixi, həm başqa ölkələrin tarixi tədris olunmalıdır. Amma Azərbaycan tarixi gərək orta məktəblərimizdə gənclərimizə yaxşı aşılansın. Gənclərimiz öz tarixini, öz tarixi köklərini və öz keçmişini gərək yaxşı bilsinlər” [IIc.s.173].

Təhsil işçiləri ilə söhbəti bir fürsət hesab edən Heydər Əliyev Azərbaycan dilinin tədrisinə ciddi fikir verilməsini ön planda saxlayır, Azərbaycan dilinin “bu gün bu qədər zəngin, səlis və cazibədar olmasını” dilçi alimlərimizin, elm, mədəniyyət xadimlərinin, ədəbiyyatşünaslarımızın, şair və yazıçılarımızın xidməti olduğunu qeyd edir, nə üçün dil məsələsinin üzərində çox durduğunu izah edir: “Bunlarla yanaşı, məktəblərdə Azərbaycan dilinin tədrisinə mühüm diqqət yetirilməlidir... Azərbaycan dili söz ehtiyatına görə, fikri ifadə etmək imkanlarına görə çox zəngindir. Ancaq lazımdır ki, Azərbaycan dilinin bu zənginliyi, bu böyük imkanları orta məktəbdə ilk təhsilə başlayan hər bir gənc tərəfindən mənimsənilə blsin

və gənclərimiz artıq orta məktəbdə öz dilini-ədəbi dilini, mədəni dilini yaxşı mənimsəsin, öz dilində yaxşı danışa bilsin, öz dilində fikrini ifadə edə bilsin. Mən nə üçün bu məsələnin üzərində dururam? Çünki əldə etdiyimiz nailiyyətlərlə yanaşı, təəssüf ki, bu sahədə qüsurlarımız, nöqsanlarımız da çoxdur. Hələ çox adamlar var ki, öz ana dilində mədəni, ədəbi dilin ifadələrindən istifadə edərək yaxşı danışmaq imkanına malik deyillər" [IIc.s.174].

Orta məktəblərimizin üzərinə düşən mühüm vəzifələri sadalayan ulu öndər gənclərin vətənpərvərlik ruhunda tərbiyə olunmasını da nəzərdən qaçırmır, məntiqi ardıcıllığı pozmadan, necə deyərlər auditoriya hiss etmədən belə vətənpərvərlik və təhsil arasındakı əlaqəni, vəhdəti açıqlayır: "Xalqımızı, gəncləri vətənpərvərlik, Vətənə sədaqət ruhunda tərbiyə etmək üçün orta məktəbdə çox iş görülməlidir...

Vətənpərvərlik çox geniş məna daşıyır. Vətənpərvərlik təkcə o deyil ki, gedib Vətəni silahla müdafiə edəsən. İnsan gərək həyatının hər dövründə, fəaliyyətinin bütün sahələrində öz vətəninin, ölkəsinin qayğısı ilə yaşasın, onun həm iqtisadiyyatının, həm də mədəniyyətinin qayğısı ilə yaşasın" [IIc.s.175].

Gənclərin vətənpərvərlik ruhunda tərbiyəsini müəllimlər qarşısında mühüm vəzifə kimi qoyan ulu öndər gənclərin orduya hazırlanmasını qabardır: "Bir daha deyirəm, gənclərin hərbi xidmətə hazırlanması, vətənpərvərlik ruhunda tərbiyə edilməsi məktəblərin, müəllimlərin əsas vəzifələrindən biridir. Xahiş edirəm bunu nəzərə alasınız".

Sonrakı nitq prosesində respublikada baş verən iqtisadi böhran, bu böhranın təhsil sahəsinə də sirayət etməsi kimi "kənaraçıxmaya" yol verilir: "Respublikanın iqtisadi vəziyyəti ağırdır. Keçmiş Sovet İttifaqına daxil olan başqa respublikalar kimi, Azərbaycan da indi keçid dövründədir, sosial-itdisadi böhran içindədir" [IIc.s.177].

Bu kənaraçıxma müşavirədə səslənən "müəllimlərin maddi vəziyyətinin pisləşməsi" fikrinə münasibət kimi səslənir, müəllim nüfuzunun qorunmasına yönəlir: "Müəllimlərin maddi vəziyyəti bizi daim narahat edir. Ancaq müəllimlər, təhsil sahəsində çalışan başqa işçilər də bilməlidirlər ki, həyat həmişə belə ağır olmayacaq, dözmək lazımdır. Məktəblərin, tədrisin səviyyəsi aşağı düşməməli, müəllim adı öz nüfuzunu itirməməlidir".

Respublikamızın Ermənistan tərəfindən müharibəyə cəlbi, erməni münaqişəsi ilə bağlı fikirlərini auditoriya ilə bölüşən natiq yenə də ana fikrə – gənclərin vətənpərvərlik ruhunda tərbiyə olunmasına qayıdır: "Eyni zamanda silahlı qüvvələrimiz möhkəmləndirilməli, ordumuz indi tutduğu mövqeləri müdafiə etməyə qadir olmalıdır. Ona görə də ictimaiyyətdə, əhalidə və xüsusən gənclərdə vətəni müdafiə etmək əhval ruhiyyəsi, döyüş əhval ruhiyyəsi daim təbliğ edilməlidir" [IIc.s.179].

Gənclər arasında cinayətkarlığın azaldılması yolunda təhsil işçilərini səfərbər edir: "Cinayət edənlərin əksəriyyəti gənclərdir. Ona görə də məktəblərdə gəncləri həm də cinayətkarlıqdan uzaq olmaq ruhunda tərbiyə etmək lazımdır. Burada çıxış edənlər dedilər – təəssüf ki, respublikada spirtli içkilərə meyl artmışdır, narkotik maddələrdən istifadə olunur. Əfsus ki, bunlara meyil edənlərin çoxu gənclərdir. Ona görə də müəllimlər, təhsil ocaqları bu sahədə fəaliyyətlərini gücləndirməlidirlər" [IIc.s.180].

Beləliklə, Heydər Əliyevin təhsil işçiləri ilə görüşdəki çıxışını (31 avqust 1994-cü il) aşağıdakı məntiqi ardıcıllıqla düzmək olar:

Müəllimlərin və maarif işçilərinin ehtiramla salamlanması – müşavirədə irəli sürülən məsəslələrlə bağlı vəzifəli şəxslərə yerindəcə tapşırıqlar verilməsi – XX əsrdə Azərbaycan təhsilinin uğurları – təhsilin mərkəzində dayanan müəllimin cə-

miyyətdəki nüfuzu, yeri – müəllimlər qarşısında qoyulan tələblər – orta məktəbdə fənlərin, xüsusilə tarix və Azərbaycan dili fənlərinə xüsusi qayğı göstərilməsi – Azərbaycan dilinin dövlət dili kimi statusu haqqında – gənclərin vətənpərvərlik ruhunda tərbiyəsi-vətənpərvərlik anlayışının şüurlara çatdırılması – məktəblərin maddi-texniki bazalarının iqtisadi böhranla bağlı müvəqqəti zəifləməsi – düşdüyümüz bu vəziyyətin kökündə Ermənistan-Azərbaycan münaqişəsinin dayanması və münaqişə haqqında – gənclərimizin orduya hazırlığı – və nəhayət, milli, dini adət-ənənələrimiz əsasında gənclərin tərbiyəsinə önəm verilməsi – tədris ilinin başlanması ilə əlaqədar təbriklərlə başa çatan sonluq.

Heydər Əliyevin hansı nitqinə, hansı çıxışına əl atdıqsa orada məntiqə söykənən, sistemliliyə, ümumiləşdirmələrə gətirib çıxaran ardıcıllığın şahidi oluruq. Şifahi niqdə belə məntiqi ardıcıllıqları, xüsusilə də saatlarla davam edən çıxışlarda təmin etmək hər natiqə müyəssər olmur. Elə Heydər Əliyev nitqinin fenomenliyi də bundadır.

Gələcəkdə Heydər Əliyevin nitqində məntiqi ardıcıllığın təfərrüatlarının öyrənilməsi, davam etdirilməsinə ehtiyac vardır.

# V FƏSİL

## HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ FƏLSƏFİ FİKİRLƏR

Siyasi natiqliyin banilərindən biri kimi Heydər Əliyevin nitqinin araşdırılması bu gün də aktualdır. Heydər Əliyev nitqinin gücü bir çox nitq elementləri – səmimiyyət, qətiyyət, nikbinlik, poetizm və sair ilə şərtlənir ki, onlardan biri də böyük natiqin nitqindəki fəlsəfi fikirlərdir. Müdrikliyi sevmək kimi qəbul edilən fəlsəfə tarix boyu görkəmli şəxsiyyətlərin sözləri ilə zənginləşib, yüksək səviyyəyə çatıb.[1]

Əgər bizə deyilsə ki, "Müdriklik nədir?" bu suala hərə bir cür cavab verər, yaxud bu izahda çətinlik çəkər.

Heydər Əliyev müdrikliyə elə müdrikcəsinə də tərif verir, müdriklik anlayışına, bu fəlsəfi anlayışa öz təfəkkürü işığında tərif verir: "Bilirsiniz mən keçən dəfə də demişəm, – alimlərimiz, şairlərimiz, yazıçılarımız, mədəniyyət xadimlərimiz hesab edirlər ki, dəyərli sözləri onlar deyə bilərlər. Ancaq xalqımızın çoxəsrlik tarixində dəyərli, müdrik sözləri müdrik insanlar deyiblər. Müdriklik təkcə o insanların elmi, biliyi, təhsili ilə bağlı deyildir. Müdriklik insanın fitri istedadıdır, müdriklik həm də insanın həyatı dərk etməsi, gedən proseslərə düzgün qiymət verə bilməsi və ondan özü üçün lazımi faydalar götürməsidir".

Nitq və çıxışlarında böyük natiq tez-tez "dialektik nöqteyi-nəzərdən yanaşıram", "dialektik nöqteyi-nəzərdən baxıram" deməklə cəmiyyətdə baş verən neqativ hallara bir dövlət başçısı-filosof kimi dözümlülük göstərir. Əgər sovetlər döv-

---

[1] Şükürov A. "Fəlsəfə". Bakı, "Çıraq", 2008.

ründə gündəlik nəşrlərin mövcudluğu həm də mətbuatda olan senzura ilə birgə vəhdət təşkil edirsə, senzuranın götürülməsinin "özünü itirməsinə" gətirib çıxarmasını qeyri-adi hal hesab etmir və nikbinliklə güman edir ki, gələcəkdə, "zaman keçdikcə" vətəndaş mövqeyindən istifadə geniş yayılacaq: "Mən bu məsələyə də müəyyən qədər dialektik nöqteyi-nəzərdən yanaşıram. Yəni hesab edirəm ki, bilirsiniz, bu məhdudiyyətlər var idi, bu məhdudiyyətləri götürəndən sonra ola bilər, bəzi mətbuat orqanları sadəcə, özlərini itiriblər. Hesab ediblər ki, bu azadlıqlardan artıq istifadə edib böhtan da demək, yalan da yazmaq, söyüş də söymək, təhqir də etmək və başqa şeylər də etmək olar.

Məlumdur ki, bu cür məqalələrin, mətbuatda dərc olunan fikirlərin müəllifləri beləliklə, öz mədəni səviyyələrinin hansı dərəcədə olduğunu, yaxud da ki, ümumiyyətlə, mədəni səviyyələrinin olmadığını göstərirlər. Dedim ki, mən buna dialektik nöqteyi-nəzərdən baxıram. Güman edirəm ki, zaman keçdikcə insanlar da anlayacaqlar ki, bu azadlıqlardan qərəzli, böhtançı mövqedən yox, vətəndaş mövqeyindən çıxış edərək istifadə etmək lazımdır" [XVIIIc.s.311].

Bəzən Heydər Əliyevin kiçik bir parça çıxışında müxtəlif üslublar və nitq elementləri elə qaynayıb qarışır ki, onları ayırmaq mümkün olmur. Möhtəşəm bir ansamblı xatırladan bu nitq elementlərini heç ayırmaq da lazım gəlmir. Elə bunu özünəməxsus Heydər Əliyev nitqi adlandırmaq zərurəti ortaya çıxır: "Süleyman Rüstəm xoşbəxt bir insandır. Bu dünyaya gələn hər bir adam bu dünyadan gedəcəkdir. Ancaq xoşbəxt o kəsdir ki, dünyada böyük iz qoyur. Süleyman Rüstəm bizim ölkəmizdə, Azərbaycan xalqının həyatında böyük iz qoyub dünyasını dəyişmiş görkəmli şəxsiyyətlərdən biridir. Ona görə də Süleyman Rüstəmin yubileyini keçirmək sadəcə, bizim tərəfimizdən onun xidmətlərinə, şəxsiyyətinə, onun Azərbay-

can xalqına qoyub getdiyi irsə göstərdiyimiz hörmətdir. Burada qeyri-adi heç bir şey yoxdur" [XVc.s.102].

Təkcə bu parçada dini üslub (dünyanın faniliyi, axirətə bir şey toplamaq), poetiklik (dünyada iz qoymaq xoşbəxtlikdir), məişət üslubu (Süleyman Rüstəm xoşbəxt bir insandır), publisistik üslub və fəlsəfilik (şəxsiyyətin rolu) çulğalaşır.

Heydər Əliyev nitqində fəlsəfi fikirlər məişət üslubunda da özünə yer tapır, auditoriyanı işıqlandırır. "Çünki sizin hər biriniz Azərbaycanın ədəbiyyatının, mədəniyyətinin, elminin tarixini yaradan insanlarsınız. Tarixi də insanlar yaradır. Azərbaycanda bunu yaradan sizlərsiniz. Mən sizə bir daha təşəkkür edirəm" [XVc.s.84].

Heydər Əliyev nitqində fəlsəfi fikirlər müxtəlif çeşidli auditoriyalarda, müxtəlif nitq üslublarında səslənir. "Elegiya" əsərinin təqdimat mərasimindəki çıxışda akademik Zərifə Əliyevanın heykəlinə baxarkən dediyi fikirlər bu sıradandır: "Görürsünüz, bu adi bir əsər deyil. Bu əsərdə məni valeh edən – bu sözü tam həqiqətlə deyirəm – sevindirən və məndə böyük hissiyyatlar doğuran odur ki, bu əsərdə böyük fəlsəfi məna vardır. Ən birincisi odur ki, Zərifə xanımın daxili mənəviyyatını, onun simasını, daxili və zahiri simasını Ömər Eldarov əks etdirə bilibdir. Eyni zamanda o, gözəl bir heykəltəraş kimi heykəltəraşlıq sənətinin məktəbinin, – nəinki Azərbaycan heykəltəraşlıq məktəbinin, dünya heykəltəraşlıq məktəbinin elementlərini, yaxud onların müəyyən cəhətlərini – bu əsərində həyata keçirə, tətbiq edə bilibdir" [IXc.s.156].

Heydər Əliyev fəlsəfəsinin qaynağı fəlsəfənin söykənəcək tapdığı elmlərin araşdırılması, filosofların həyatının öyrənilməsidir: "Məhəmməd Füzulinin yaradıcılığında elmin, fəlsəfənin bir çox sahələri geniş təhlil olunmuş və onun əsərlərində öz əksini tapmışdır. Onun bütün əsərləri şeir, poeziya, ədə-

biyyat nümunələri olmaqla bərabər, eyni zamanda böyük fəlsəfi ideyalar, elmi fikirlər daşıyır" [VIIIc.s.24-26].

Ulu öndərin müxtəlif auditoriyalarda müxtəlif üslublu nitqlərinə fəlsəfilik xasdır. Almaniyanın birləşməsi günü – ildönümü münasibətilə Almaniya Federativ Respublikasının Azərbaycandakı səfirliyinin təşkil etdiyi rəsmi qəbuldakı nitqində elmi-texniki tərəqqinin yüksək inkişaf etdiyi Almaniyanın "böyük dərd çəkməsini" diqqətə yetirir. Elə bu məqamda xalqın hissələrə bölünməsini böyük dərd hesab edir. Sonrakı nitq mərhələsində böyük natiq fəlsəfədəki səbəb-nəticə dialektika qanununun bariz nümunəsini göstərir. "Berlin divarının" dağılması → Almaniyanın birləşməsi → Sovet imperiyasının qısa bir müddətə dağılması: "Almaniya Federativ Respublikasında elmi-texniki tərəqqinin inkişafı və ölkənin Avropada və bütün dünyada sülhsevər siyasət aparması Avropada 80-ci illərin sonlarında, 90-cı illərin əvvəllərində böyük dəyişikliklər baş verməsinə səbəb oldu. Ancaq bu qədər xoşbəxtlik içərisində yaşayan Almaniya Federativ Respublikası eyni zamanda böyük dərd çəkirdi. Çünki xalqı, ölkəsi iki yerə parçalanmışdı. "Berlin divarı"nın dağıdılması, ondan bir il sonra isə Almaniyanın birləşməsi Avropada, bütün dünyada tarixi hadisə oldu. O vaxt bu hadisələrin dünya siyasətinə, Avropaya və o cümlədən Şərqi Avropaya, keçmiş Sovetlər İttifaqına nə qədər böyük təsir göstərəcəyini bəlkə də o qədər dərk edə bilmirdilər. Ancaq bu iki böyük hadisə – "Berlin divarı" nın dağıdılması, Almaniyanın birləşməsi Sovetlər İttifaqı kimi böyük bir imperiyanın qısa bir müddətdə dağılmasına da səbəb oldu" [XXIc.s.109].

Bir fəsil ilə Heydər Əliyev nitqinə daxilən xas olan fəlsəfiliyi araşdırmaq fikrindən uzağıq. Sadəcə dialektika, onun inkişaf qanunları, kateqoriyaları, müasir fəlsəfə və onun istiqamətləri, ən başlıcası isə insan fəlsəfəsinin böyük natiqin nit-

qində yerini müəyyənləşdirmək, gələcəkdə bu sahənin daha da dərindən tədqiqi üçün fikir yürütməkdir. Heydər Əliyev nitqlərində dialektikanın əksliklərin vəhdəti və ziddiyyəti qanunu bu gün "dialektik ziddiyyətlər qanunu" kimi mühüm yer tutur. Bu qanun sadə xalq dilində müxtəlif çeşidli auditoriyaları düşündürür, nitqin cazibə qüvvəsini birə on, birə yüz qat artırır.

16 iyun 1997-ci il tarixdə, Prezident sarayında, 1992-ci ilin fevral-may hadisələri ilə bağlı bir qrup qaçqın və telejurnalist ilə görüşdəki kimi: "Mənim də həyatımda çox əziyyətli günlərim, illərim olubdur. Çox faciəli illərim olubdur. Ancaq yenə də taleyimdən çox razıyam. Bu mənim taleyimdir – onun çox parlaq cəhəti də, faciəvi cəhəti də mənim taleyimdir. Bu günkü də mənim taleyimdir. Amma bu gün zəhmətdən, əziyyətdən savayı heç bir şey yoxdur. Mən bunu da özümə böyük xoşbəxtlik hesab edirəm ki, xalqıma belə böyük çərçivədə xidmət etmək imkanı əldə etmişəm" [Xc.s.162].

Bu kiçik parçada taleyin parlaq və faciəvi cəhətləri, əziyyətli illər və xalqına geniş miqyasda xidmət etmək imkanı kimi əksliklər ziddiyyətdə olduğu qədər, həm də vəhdətdədir.

Nəzərə almaq lazımdır ki, – mən qeyd etdim, – cəmiyyətdə və dövlət quruculuğunda demokratiyanın əsasını qoyanlar – fransız filosofları XVIII əsrin ikinci yarısında bu prinsipləri meydana atıblar. Neçə əsr keçibdir. Bəzi ölkələr illər boyu, on illər boyu o prinsiplərdən istifadə edərək demokratiya sahəsində yüksək nailiyyətlər əldə ediblər. Ancaq Azərbaycan isə bu addımları indi atmağa başlayır.

Doğrudur, bu 25 il hamar yol olmayıbdır, enişli-yoxuşlu, çətin, əzab-əziyyətli keçibdir. Ancaq bizim cox böyük nailiyyətimiz ondan ibarətdir ki, nəhayət Azərbaycan xalqı öz dövlət müstəqilliyinə nail olubdur. Bu müstəqilliyə, azadlığa görə hər bir əzab-əziyyətə, itkiyə, hər bir qurbana razı olmaq olardı" [XIIc.s.157].

XX əsrin cəmiyyət fəlsəfəsinə uyğun olaraq cəmiyyətin mühüm hissəsi olan uşaqlara qayğını önə çəkir: “Biz XX əsrin son illərini yaşayırıq. Qarşıdan XXI əsr gəlir. Bu gün doğulan, dünyaya gələn uşaqlar, bu gün ilk addımlarını atan körpələr XXI əsrdə dünyanın məsələlərini həll edəcəklər, bəşəriyyəti yaşadacaqlar. Ona görə də bu sahə, yəni uşaqların sağlamlığı, onların fiziki və ruhi sağlamlığının təmin olunması və qorunması hər bir dövlət üçün çox böyük və müqəddəs vəzifədir. Müstəqil Azərbaycan Respublikasında bu vəzifəni biz məhz bu cür başa düşürük” [XIIc.s.167].

Müstəqil Azərbaycan naminə çətinliklərə sinə gərmək özlüyündə fəlsəfənin əksliklərin vəhdəti və ziddiyyəti qanununu əks etdirir: “Bilirsiniz, bu dövrdə yaşamaq həm çətindir, həm də şərəflidir. Çətindir ona görə ki, hamımız ağır vəziyyətdə yaşayırıq, ağır bir dövr keçiririk. Amma şərəflidir ona görə ki, biz müstəqil Azərbaycanın gələcəyinin əsasını yaradırıq, təməlini qoyuruq. Bizim gələcək nəsillərin xoşbəxt yaşamasının təməlini qoyuruq, himini qoyuruq, əsasını qoyuruq. Bu şərəflidir. Ona görə biz bu gərginliyə, çətinliyə dözməliyik, siz bu ağır vəziyyətə dözməlisiniz, gələcək naminə, müstəqil Azərbaycanın xoşbəxt gələcəyi naminə!” [VIIIc.s.211].

XX əsrdə baş verən etnik münaqişələr fəlsəfəsi Heydər Əliyev nitqində öz yerini tutur: “Amma Azərbaycan xalqı 1948-1949-cu illərdə və sonrakı illərdə yenidən deportasiyaya məruz qalmış, demək, yenidən repressiya altında olmuşdur. Bu, bizim xalqımıza qarşı edilən ədalətsizlikdir. Beləliklə, o vaxt Ermənistandan azərbaycanlıların çıxarılması, etnik təmizlənməsi baş veribdir. Onları öz yerlərindən, yurdlarından, doğma torpaqlarından o vaxt didərgin salıblar” [Xc.s.10].

22 iyul 1998-ci ildə Londonda azərbaycanlılarla görüşdə Heydər Əliyev məkan anlayışına xüsusi yer ayırır: “Bilirsiniz, dörd il bundan öncə biz belə şəraitdə görüşə bilməzdik. İndi

burada bizim səfirliyimiz var. Bu, Azərbaycanın mülküdür. Azərbaycan ilk dəfədir ki, İngiltərə kimi bir ölkədə mülk sahibidir. Bu Azərbaycanın mülküdür, səfirliyidir. Biz böyük işlərin əsasını qoymuşuq. İnkişaf edəcəyik, vaxt gələcək, burada bizim səfirliyimiz genişlənəcək, bəlkə bundan da böyük mülk alacağıq" [XVIc.s.400].

"Vaxt gələcək" proqnostik ifadə dahi şəxsiyyətin uzaqgörənliyinin bu gün təsdiqindən xəbər verir. "Bu ağır və çətin yolda, şübhəsiz ki, səhvlər də olacaqdır, nöqsanlar da, qüsurlar da olacaqdır, qanun pozuntuları da olacaqdır. Bunlar təbiidir və mən hesab etmirəm ki, buraxılmış səhvlər, nöqsanlar əldə etdiyimiz ümumi nailiyyətləri hörmətdən salır, yaxud ləkələyir. Xeyr! Əgər kim hesab edirsə ki, hər şey qüsursuz olacaqdır, onlar yəqin köhnə əhval-ruhiyyə ilə yaşayırlar" [Vc.s.11].

Qadınlar qurultayında – 15 sentyabr 1998-ci il tarixdə etdiyi çıxışda cəmiyyətdə də əksliklərin vəhdət və ziddiyyət qanunu işə düşür. Bu qanun Heydər Əliyev dilində qadınlar auditoriyasında da özünəməxsus tərzdə səslənir: "Qadınlar insan cəmiyyətinin ən gözəl, ən zəkalı hissəsi olduğuna görə, təssəvvür edin bu salonda nə qədər gözəllik var! Əgər ayrı-ayrı kişilər, bu nazirlər burada oturmasaydılar bu salon necə olardı. Ancaq bilirəm ki, siz buna razı olmazdınız, çünki siz də istəyirsiniz ki, aranızda bir az kişilər olsun. Həqiqətən çox gözəl bir mənzərədir, gözəl mühit, gözəl əhval-ruhiyyədir" [XVIIc.s.306].

Dialektikanın inkar qanunu Heydər Əliyev nitqində müxtəlif çeşidli auditoriyalarda səslənir.[1] Akademik Yusif Məmmədəliyevin yubiley mərasimində olduğu kimi: "Yusif Məmmədəliyevin qızı burada çox gözəl çıxış etdi və bu abidənin

---

[1] Şükürov A. "Fəlsəfə". Bakı, "Çıraq", 2008.

yaranmasında iştirak edənlərin hamısına təşəkkürünü bildirdi. Mən Sevda Məmmədəliyevanın bu sözlərinə qoşuluram və bu abidənin yaranmasında iştirak edənlərin hamısına təşəkkürümü bildirirəm. Çox sağ olun. Sevda Məmmədəliyeva çıxış edərkən mən düşündüm – o, həqiqətən atasının qızıdır. Çox gözəl, məzmunlu danışdı. Görünür ki, Yusif Məmmədəliyevin fitri istedadı onun övladlarında da öz əksini tapır. Güman edirəm ki, bu fitri istedad gələcək nəsillərdə də özünü göstərəcəkdir” [XVIIc.s.328-329].

Dialektikanın kəmiyyət dəyişmələrinin keyfiyyətə və əksinə keçməsi qanunu eləcə də, müasir fəlsəfədəki mülkiyyət fəlsəfəsi Heydər Əliyev nitqində çulğalaşır. Özəlləşdirmədən sonra kənd təsərrüfatında məhsuldarlığın yüksəlməsi birinci qanuna uyğundursa, özəl sektorun inkişafının azad sahibkar yaratması isə mülkiyyət fəlsəfəsinə aid olur. İqtisadi cəhətdən azad insanın siyasi azadlığının şəksiz olması fəlsəfəsi ortaya qoyulur: “Bilirsiniz ki, biz indi özəlləşdirmə proqramını həyata keçiririk, torpağı camaata paylayırıq. Camaat torpağın sahibi olur. Ət, süd, yağ istehsalı artmışdır. Siz bilirsiniz ki, özəl sektor necə böyük əhəmiyyətə malikdir. Keçmişdə bizdə olan kollektiv işlər isə öz nəticəsini vermədi” [VIIIc.s.328].

Dialektikanın kəmiyyət və keyfiyyətin vəhdəti kimi kateqoriyaları insan amilinə tətbiq olunur, insanın sayı kəmiyyət kimi başa düşülürsə, insanın gücü keyfiyyəti ehtiva edir. Londonda, 22 iyul 1998-ci il tarixdə, azərbaycanlılar qarşısında, kəmiyyət və keyfiyyətin vəhdətini verən böyük natiq insan amilinə, vətənpərvərlik amilinə-antropoloji fəlsəfəyə üstünlük verir: “Əgər biz buna nail ola bilsək və azərbaycanlılar yaşadıqları ölkələrdə özləri üçün lazımı mövqe tuta bilsələr, xaricdə yaşayan azərbaycanlılar sayca, bəlkə də, heç ermənilərdən az deyildir. Amma kəmiyyət və keyfiyyət anlayışları var. Yaxşı olar ki, keyfiyyət üstün olsun, kəmiyyət o qədər də

böyük əhəmiyyət kəsb etmir. Yəni, ola bilər, say az, amma güc çox olsun. Sayca çox olub, az güclü olmaqdansa, az saylı, amma çox güclü olmaq lazımdır. Son illər mən bu tərəqqini hiss edirəm" [XVIc.s.403].

Fəlsəfədə imkan və gerçəkliyin dialektikası Heydər Əliyev nitqində öz yerini çox səliscəsinə tapır: "Əlbəttə, bizim imkanımız olsa, bu, çox gözəldir, şəhəri çox gözəl göstərir. Məsələn, bu dəfə Moskvada olanda, axşam, gecə avtomobillə gedəndə baxırdım. Bəzi binaları kənardan işıqlandırırlar, – görmüsünüz, – elə gözəl görünür. Məsələn, Moskvada indi Nazirlər Kabineti yerləşən binanı elə işıqlandırırlar, baxırsan, adam heyran olur. Elə bizim bu bina da Ağ evdir. O da Ağ evdir, bu da Ağ evdir. Mən istərdim ki, bunu da elə edək, daha da gözəl görünsün. Amma bizim imkanımız yoxdur, onların imkanları var. İmkanımız olanda bunu da edəcəyik [XXIVc.s.319].

Gerçəkliyə hamı can atır: "Mən istərdim ki bunu da edək, daha da gözəl görünsün" gerçəkliyin reallaşması üçün imkana ehtiyac var. İmkan yoxsa gerçəklikdən danışmaq əbəsdir: "Amma bizim imkanımız yoxdur, onların imkanı var" sonda isə fəlsəfi tutumlu nitq nikbinliklə sona yetir: "İmkanımız olanda bunu da edəcəyik".

Dialektikanın mühüm kateqoriyalarından sayılan imkan və gerçəklik Heydər Əliyevin nitqlərində tez-tez səslənir: "Necə deyərlər gərək hərə ayağını yorğanına görə uzatsın. Bizim torpaqlarımız az da deyil, çox da deyil. Məsələn, elə rayon var ki, orada adam başına daha çox torpaq düşəcək, amma eləsi də var, az düşəcəkdir. Ona görə də hərə öz rayonunun xüsusiyyətini nəzərə alaraq iş görməlidir. Əməli fəaliyyətdə mövcud şəraitdən irəli gələn real imkana arxalanmaq lazımdır. Demək istəyirəm ki, hər rayonun öz xüsusiyyəti var və bunlar nəzərə alınmalıdır" [IIc.s.499].

Dialektikanın forma və məzmun kateqoriyalarının vəhdəti Heydər Əliyev nitqində tez-tez səslənir. Görkəmli şəxsiyyətlərə ucaldılan heykəllər haqqında onun fikirləri bu sıradandır. Heykəllər Heydər Əliyev üçün formadır. Əsas məzmun isə heykəlin qoyulduğu şəxslərin şəxsiyyəti ilə səciyyələnir. Heykəllər vasitədir. Şəxsiyyətlərin öyrənilməsi yolunda, xalqın yaddaşının qorunması yolunda, məzmuna açar olmaq yolunda heykəllər mühüm bir vasitədir:

"Biz bu gün, bu el bayramı günü Məhəmməd Füzulinin Azərbaycanın paytaxtı Bakıda, Füzuli meydanında ucaldılmış heykəlinin önünə getdik, onun heykəlinin qarşısına güllər qoyduq. Ancaq Füzulinin özünün yaratdığı mənəvi heykəl bizim hər birimizin qəlbindədir. O əbədi yaşayacaq, gələcək nəsillərin qəlbində yaşayacaqdır".

Öz nitqlərində "filosof", "fəlsəfi" ifadələrinə yer ayıran ulu öndərin bütün çıxış və nitqlərinə bir fəlsəfi ruh, müdrikliyə bir sevgi ruhu hakimdir: "Ancaq biz belə hesab edirik ki, Məhəmməd Füzulinin "Leyli və Məcnun" poeması o əfsanənin fəlsəfi mənasını ən yüksək zirvələrə qaldırmışdır" [VIIIc.s.25].

Heydər Əliyev istənilən məsələyə, predmet və hadisələrə öz fəlsəfi süzgəcindən baxır, öz fəlsəfi təfəkkürü əsasında qiymət verməyi bacarır, bizləri də forma ilə kifayətlənməyib məzmunun daxili qatlarına nüfuz etməyə sövq edir. Gülüş doğuran monoloqların, komik səhnələrin arxasında millətin formalaşması, milli özünüdərkə yönələn fəlsəfi düşüncələri görməkdə, anlamaqda bizə kömək edir. Üzeyir Hacıbəyovun "millət hamı papağını eyni tərzdə başına qoysa millətə oxşar" fəlsəfəsini bugünkü milli dünyagörüşlərlə əlaqələndirmək baxımından böyük natiqin fikirləri mühümdür: "Məsələn, Məşədi İbadın papağı başına necə qoyması barədə söylədiyi monoloqu götürək. Bunu adi bir söhbət kimi düşünmək olar. Deyir ki, "mən papağımı belə qoysam, deyəcəklər Şamaxı lotusudur.

Belə qoysam, deyəcəklər Gəncə qumarbazıdır. Belə qoysam, deyəcəklər ki, Qarabağın pambıq bəylərinə oxşayır". Bu sözlər adi sözlər deyildir. Üzeyir Hacıbəyov o vaxt deyib, – bəli, Bakı qoçusu da var, Şamaxı lotusu da var, Gəncə qumarbazı da var. Qarabağın pambıq bəyi də var. Əgər bunu bir az da uzatsaydı, başqalarını da deyə bilərdi. Yəni o dövrün xüsusiyyətlərini, cəmiyyətin tərkibini göstəribdir. Bu, adi bir şey deyildir. Heç kəs hesab etməsin ki, Üzeyir Hacıbəyov bu sözləri bir-birinə sadəcə qoşubdur, yaxud bu monoloqu da insanların gülməsi üçün yazıbdır. Yox, burada Üzeyir Hacıbəyov nə qədər dərin fəlsəfəyə malik fikirlər ifadə edibdir və o dövrün sosial problemlərini, siyasi, ictimai həyatını, bizim xalqımızın o dövrdəki problemlərinin müsbət və mənfi cəhətlərini çox gözəl göstəribdir".

Dialektikada forma və məzmunun vəhdəti Heydər Əliyev nitqində tez-tez rast gəlir. 10 oktyabr 1999-cu ildə Naxçıvan şəhərinin Sarvanlar Məhəlləsində, İran İslam Respublikasının "Bonyadə Mostezəfin" fondu tərəfindən tikilmiş "Həzrəti Zəhra (s)" məscidinin təntənəli açılışı mərasimindəki nitq forma və məzmunun dini üslubda anlaşılmasıdır:

"Nə üçün bu yeri seçmişdim? Çünki, birincisi, bu yer Naxçıvan şəhərinin gözəl bir guşəsidir. İkincisi də, naxçıvanlılar bilir, bu yerdə böyük bir seyidlər ailəsi yaşamışdır. Mircəfər Seyidov mənim müəllimim olubdur, onun qardaşı Əqil Seyidov müəllimlik edibdir, Mirhəsən Seyidov Naxçıvan teatrının aktyoru olubdur. Mən bu ailədən olanlara Seyidov dedim, çünki onlar seyid idilər. Amma əslində onlar Mircəfər Mirişli, Əqil Mirişli, Mirhəsən Mirişli və bu gün Azərbaycanın böyük bir bəstəkarı olan Ramiz Mirişlidir" [XXIIc.s.165].

Təkcə yuxarıdakı çıxışdan məlum olur ki, məscid üçün ayrılmış yer "Naxşıvan şəhərinin gözəl bir guşəsidir". Bu gözəl guşə formadır. Əsas məzmun, ana məzmunsa Məhəm-

məd peyğəmbər şəcərəsinə mənsub, xalqın inam, etiqad yeri olan seyidlərin həmin guşədə yaşamasıdır. "Mən bu ailədən olanlara Seyidov dedim, çünki onlar seyid idilər" deməklə əsas fikri, ideyanı, məzmunu böyük natiq xalqa çatdırır.

Heydər Əliyevin çıxışlarında dövlət xadimi kimi cəmiyyət fəlsəfəsinin, fəlsəfə və hüququn, fəlsəfə və dinin çulğalaşdığının, cəmiyyət fəlsəfəsinin tərkib hissəsi olan demokratiya problemlərinin çözülməsinin özünəməxsus bir nitqlə auditoriyaya çatdırılmasının şahidi oluruq. Cəmiyyətə müdaxilə etməyin mənfi nəticələrini qabaqcadan görən dahi siyasətçi özünəməxsusluq fəlsəfəsini auditoriyaya kəskin və sərt çalarlı qətiyyətlə anladır. "Mən heç razı ola bilmərəm ki", "Mən buna razı ola bilmərəm ki" kimi qətiyyətli ifadələrlə özünəməxsusluq fəlsəfəsini, milli mənəvi dəyərlər əsasında Azərbaycan dövlətini qurmağı özünün həyatda başlıca işi hesab edir: "Azərbaycan demokratik, hüquqi, dünyəvi dövlətdir. Biz müstəqilliyimizi əldə edəndən sonra bu yolu tutmuşuq, bu yolla gedirik və bu yolla da gedəcəyik. Çünki son iki əsrdə Azərbaycanın həyatında yaranmış proseslər Azərbaycanı məhz demokratik, hüquqi, dünyəvi dövlət kimi inkişaf etdirməyin əsasını qoymuşdur. Bu, bizim yolumuzdur. Biz bu yolla gedirik. Dünyəvi dövlət, eyni zamanda vicdan azadlığı; dünyəvi dövlət, eyni zamanda islam dininin bütün mənəvi dəyərlərinin hamısından istifadə etmək – bundan kim necə istəyirsə, o cür istifadə etsin – bu yol ilə gedirik. Görürsünüz, nə qədər maraqlı, gözəl bir siyasətdir. Biz bu siyasəti aparırıq və bu siyasəti də aparacağıq. Ancaq təbiidir ki, hər ölkənin özünəməxsus xüsusiyyəti var. Mən heç razı ola bilmərəm ki, Azərbaycanda hər bir şey Fransadakı, İngiltərədəki, Amerikadakı kimi olsun. Mən buna razı ola bilmərəm. Mən Azərbaycanda demokratik dövlət yaradıram. Amma Azərbaycanın öz milli-mənəvi ənənələri vardır. İranın da özünün milli-

mənəvi ənənələri vardır. İran islam dövlətidir. Belə bir şəraitdə demokratik seçkilər keçirmək, bir neçə namizədin içərisindən xalqın iradəsi ilə prezident seçmək İran İslam İnqilabının ən gözəl nəticələrindən biridir" [XXIIc.s.170-171].

Tam və hissə fəlsəfəsi Heydər Əliyevin fəlsəfi düşüncələrində xüsusi yer tutur. Bu fəlsəfə dini üslublu çıxışlarda da özünə layiqli yer tapır, qəlblərə yol açır. "Bibiheybət məscid-ziyarətgah kompleksinin" açılışı mərasimindəki nitqdə (12 iyul 1998-ci il) biz bunun şahidi oluruq. Eyni zamanda bu nitqdə tarix fəlsəfəsinin və onun bir hissəsi kimi İslam tarixi fəlsəfəsinin də tədqiq olunmasının zəruriliyini böyük natiqin özündən eşidirik: "Biz İslam aləminin bir hissəsiyik. İslam dünyasında İslam tarixinə məxsus olan müqəddəs yerlərdən, ziyarətgahlardan Azərbaycanda da vardır. Onların ən hörmətlisi və ən qiymətlisi bu gün bizim toplaşdığımız yerdir. Ona görə də İslam aləminin müqəddəs ziyarətgahı kimi bu yer dünyada tanınmalıdır, təbliğ olunmalıdır ki, islam tarixi bu yerin bu gününün və keçmişinin izahı ilə daha da dolğunlaşsın. Bir də ona görə ki, islam tarixinin hər bir müqəddəs yeri ümumi tarix kitablarında öz yerini tapsın. Bu işi də görmək lazımdır. Hesab edirəm ki, bunların hamısını etmək üçün mənim irəliyə sürdüyüm təkliflər cox lazımdır" [XVIc.s.234].

Bakıda, akademik Yusif Məmmədəliyevin abidəsinin açılışı mərasimindəki nitq fəlsəfiliklə çox zəngindir. Elə bu çıxışda heykəllərə münasibətini bildirən böyük natiq heykəlləri həyatımızı zənginləşdirən, gözəlləşdirən formalar kimi qəbul edir. Əsas, ana məzmun isə Azərbaycan xalqının görkəmli şəxsiyyətlərinin, insanlarının yaddaşlarda əbədiləşdirilməsidir. Forma və məzmun arasındakı dialektik vəhdət Heydər Əliyev nitqində səliscəsinə, sadə xalq dilində, alimləri heyrətləndirə biləcək səviyyədə akademiya auditoriyasında səslənir: "Azərbaycan xalqının qədim adət-ənənələrinə görə bizim ölkədə,

ümumiyyətlə, şərq aləmində insan heykəli dəb olmayıbdır. Ancaq xalqımız inkişaf edib dünya mədəniyyətinin gözəl nümunələrini öz həyatına tətbiq etməyə çalışıb, dünya mədəniyyətindən bəhrələnib və XX əsrdə Azərbaycan torpağında, Azərbaycanın paytaxtında çox qədim, gözəl, əzəmətli, memarlıq abidələri ilə yanaşı, heykəltəraşlıq abidələri də yaranmışdır. Bu bizim vətənimizin həyatını daha da zənginləşdirmiş, gözəlləşdirmişdir. Hesab edirəm ki, bu çox gözəl bir ənənədir. Ona görə ki, heykəltəraşlıq abidələri, heykəllər adətən insan yaşayan hər bir yeri abadlaşdırır, gözəlləşdirir. Bir də ona görə ki, bu abidələr Azərbaycan xalqının görkəmli şəxsiyyətlərinə, insanlarına, öz tarixinə, elminə, mədəniyyətinə, dövlətinə göstərilən hörmət və ehtiramını əks etdirir" [XVIIc.s.328-329].

Gerçəkliyin – "müstəqilliyin" reallaşması üçün "imkan" lazımdır ideyası böyük natiqin nitqində tez-tez səslənir: "Azərbaycanın dövlət müstəqilliyi, milli azadlıq qazanması, Rusiya Federasiyası tərkibində Tatarıstanın geniş hüquqlar və səlahiyyətlər əldə etməsi elə bir kəmiyyət mərhələsi və elə bir imkandır ki, biz bunlardan əməkdaşlığımızı, dostluq münasibətlərimizi möhkəmləndirmək və inkişaf etdirmək üçün istifadə edirik".

"Həm", "həm də" bağlayıcıların köməyi ilə tamı hissələrə bölmək, bu zaman bağlayıcıların köməyi ilə nitqə ekspressivlik verə bilmək yenə də Heydər Əliyev nitqinə xasdır. İnkişafın spiralvariliyi, əksliyi burada da özünü göstərir: "Çünki Azərbaycan ayrı-ayrı bölgələrdən ibarətdir və ölkəmizin hər bir şəhəri, hər bir yaşayış məntəqəsi, hər bir rayonu Azərbaycanın ayrılmaz hissəsidir və onun ərazi bütövlüyünü təşkil edən məntəqədir, bölgədir. Buna görə də əgər biz Zəngilan problemləri haqqında danışırıqsa, demək, bütün Azərbaycanın problemləri haqqında danışırıq. Zəngilan problemlərinin təhlili, müzakirəsi yolu ilə biz – bu gün bütün çıxışlarda bu hiss

olundu, – görüşümüzü Ümumazərbaycan problemlərinin təhlilinə, müzakirəsinə çevirdik" [VIIIc.s.66].

Tarix fəlsəfəsinə aid fikirlər sadə, hamı tərəfindən asanlıqla anlaşılan cümlələrlə auditoriyaya çatdırılır: "Tarix, tarixdir. Onun hər bir mərhələsinin, hər bir səhifəsinin özünəməxsus mənası, müsbət və mənfi cəhətləri vardır. O illərdə yaşamış, yazıb-yaratmış yazıçılarımız, şairlərimiz, mədəniyyət xadimlərimiz şübhəsiz ki, o illərin çərçivəsində olmalı idilər. İndi kimsə istəyir desin ki, belə olmamalı idi, – o, sadəcə həqiqətdən kənardır" [XVc.s.99].

Bu gün həmişəkindən daha aşkar görünür ki, bəşəriyyətin fəlsəfə tarixinə ehtiyacı vardır. Onun vəzifəsi dövrlərin və sivilizasiyaların əlaqələrini bərpa etmək, sosial və sosial-mədəni amillərdən çıxış edərək Qərb-Şərq, Şərq-Qərb problemini izah etməkdir.[1] Heydər Əliyev "tarixi böyük ipək yolunu", "Azərbaycanın mühüm geostrateji mövqeyini", "III minillik. Əsrin yekunları, gələcəyə baxış" beynəlxalq konqresi iştirakçılarının diqqətinə çatdıraraq Qərb-Şərq qarşıdurması yaradanlara tutarlı cavab verərək, dünyanın rifahının iqtisadi maraqlar üzərində qurulması ideyasını önə çəkir. Müstəqil daxili və xarici siyasət yeridən Azərbaycan Respublikasının dünya birliyinə inteqrasiyası yolunda yürütdüyü siyasətin dəyişməz qalacağını konqresdə bir daha xatırladır: "Dünyanın ən qədim elm və mədəniyyət mərkəzlərindən olan Azərbaycan artıq doqquzuncu ildir ki, xalqımızın sarsılmaz iradəsi sayəsində öz tarixi haqqına – milli müstəqilliyinə nail olmuşdıır. Dünya Birliyinin tam və bərabər hüquqlu üzvü olan suveren Azərbaycan Respublikası müstəqil daxili və xarici siyasət xətti yeridərək sivilizasiyalı beynəlxalq aləmlə inteqrasiya istiqa-

---

[1] Mehdiyev R.Ə. "Fəlsəfə". Dərs vəsaiti. Bakı, "Şərq-Qərb", 2010.

mətində mühüm nailiyyətlər əldə etmişdir. Demokratik dövlət quruculuğu prosesi, hüquqi islahatlar ardıcıl və dönməz xarakter almışdır. Azərbaycanın mühüm geostrateji mövqeyi, zəngin yeraltı-yerüstü sərvətləri, tarixi böyük İpək yolunun Şərqi Qərblə qovuşduran strateji məntəqəsi olması barədə, güman edirəm ki, sizlərin kifayət qədər məlumatınız vardır. Bu gün dünyanın bir çox aparıcı dövlətləri, nüfuzlu şirkət və iqtisadi qurumları Azərbaycan Respublikasında neft sənayesinə və digər sahələrə böyük investisiyalar qoymaqla perspektivli iqtisadi proqramlar həyata keçirməkdədirlər” [XXIVc.s.162].

Bakı Dövlət Universitetinin 80 illiyi münasibətilə BDU-nun və bir sıra xarici ölkə universitetlərinin rəhbərləri ilə görüşdəki nitqində (11 fevral 2000-ci il) Heydər Əliyevi tarix fəlsəfəsini alimlərə izah edən filosof kimi görürük: “O tarixin təhrif olunması faktlarına qətiyyən dözmür. “Tarix obyektiv bir prosesdir” deyərək tarix fəlsəfəsini alimlər auditoriyasına anladır. Tarixin təhrif olunmasına təəssüf edən böyük natiq alimlər auditoriyasını səfərbər edir. “Siz alimlərsiniz bunu bilirsiniz. Hesab edirəm ki, bu sözləri sizə deməyimin elə bir əhəmiyyəti yoxdur” – cümlələrində sabahkı gün üçün səhvlərin düzəldilməsinə yönələn incə bir məzəmmət duyulur. Sonra isə özünün düzgün, sarsılmaz elmi dünyagörüşə əsaslanan mövqeyini bildirir. Fəlsəfi baxımdan tarix şüurdan asılı olmadan həyata keçən təbii-tarixi prosesdir. Tarix fəlsəfəsi üzrə mütəxəssis də tarixi öyrənərkən müxtəlif dövrlərin əlaqəsini bərpa etməyə, indiki dövrlə gələcəyi fikrən də olsa birləşdirməyə çalışır: “Tarixi təhrif etmək olmaz. Tarixdə hər şeyin öz yeri vardır. O nə sizdən, nə bizdən, nə də heç kəsdən asılı deyildir. Tarix obyektiv bir prosesdir. Bu obyektiv prosesə təsir etmək, müəyyən vaxtlarda onu zəiflətmək, gücləndirmək, məcrasından çıxarmaq olar. Müxtəlif hallar ola bilər. Amma bu obyektiv prosesi dayandırmaq və ona ciddi təsir göstərmək

mümkün deyildir. Bu tarixdir. Bizdə tarixi təhrif edənlər olubdur. Sovet hakimiyyəti qurulandan sonra keçmiş tariximiz təhrif edilibdir. Təəssüflər olsun ki, indi, sovet hakimiyyəti dağılandan sonra yenə də keçmişi təhrif edirlər. Bilirsiniz, o vaxtkı dövrdən ibrət götürmürlər. Siz alimlərsiniz, bunu bilirsiniz. Hesab edirəm ki, bu sözləri sizə deməyimin elə bir əhəmiyyəti yoxdur. Ancaq bu sözləri sizə deyərkən mən öz mövqeyimi bildirirəm. Mənim də mövqeyim ondan ibarətdir ki, Azərbaycan xalqı, təhsili 70 illik sovet hakimiyyəti dövründə böyük inkişaf yolu keçibdir [XXVc.s.37-38].

Tarix fəlsəfəsində Qərb-Şərq, Şərq-Qərb problemləri bu gün də mövcudluğunu saxlayır. Bu gün fəlsəfədə "Şərq-Qərb" dedikdə ilk növbədə Avropa düşüncə tərzi, rasionalizm, demokratiya, hüquqi dövlət, elmi-texniki tərəqqi və sənayenin inkişafı nəzərdə tutulur.[1] Azərbaycan iqtisadiyyatını dirçəltməyi qarşısına ümdə problemlərdən biri kimi qoyan Heydər Əliyev üçün Qərbin elmi-texniki tərəqqi və sənayenin inkişafı kimi dəyərlərinin tətbiq edilməsi mühümdür. Eləcə də iqtisadiyyatımızın dirçəlməsi gerçəkliyi imkanlardan asılıdır ki, Heydər Əliyev ipək yolu üstündə yerləşməyimizi "əlverişli imkan" hesab edir. "Şübhəsiz" modal sözü ilə imkanlardan istifadəni önə çəkir. İmkan və gerçəklik dialektik kateqoriyalarının harmonik vəhdətini verir: 22 mart 2000-ci il tarixdə Gürcüstan ictimaiyyətinin nümayəndələri ilə görüşdə nitq: "Azərbaycan Şərqdən gələn İpək yolunun üstündə yerləşir. Gürcüstan da İpək yolunun üstündədir, bu yol Azərbaycan vasitəsilə Şərq ilə Qərbi birləşdirir. Azərbaycan Xəzər dənizində iri bir liman olaraq, Şərqdən Qərbə doğru gedən İpək yolu proqramının həyata keçirilməsi üçün qapıdır. Gürcüstan

[1] Mehdiyev R.Ə. "Fəlsəfə". Dərs vəsaiti. Bakı, "Şərq-Qərb", 2010.

Qara dənizdəki limanları ilə Qərbi Şərqlə birləşdirmək üçün qapıdır. Bir sözlə, ölkələrimizin coğrafi mövqeyi, – şükürlər olsun ki, Allah bizi məhz burada yerləşdirmişdir, – çox əlverişli imkanlar yaradır. Lakin bu imkanlardan istifadə etmək, şübhəsiz, bizim işimizdir. Sevinc hissi ilə deyə bilərəm ki, Gürcüstan da, Azərbaycan da bu işin öhdəsindən gəlirlər [XXVIc.s.45].

Tarix fəlsəfəsinə aid fikirlər sadə, hamı tərəfindən asanlıqla anlaşılan cümlələrlə auditoriyaya çatdırılır: "Tarix, tarixdir. Onun hər bir mərhələsinin, hər bir səhifəsinin özünəməxsus mənası, müsbət və mənfi cəhətləri vardır. O illərdə yaşamış, yazıb-yaratmış yazıçılarımız, şairlərimiz, mədəniyyət xadimlərimiz şübhəsiz ki, o illərin çərçivəsində olmalı idilər. İndi kimsə istəyir desin ki, belə olmamalı idi, – o, sadəcə həqiqətdən kənardır" [XVc.s.99].

"Belə faktları çox gətirmək olar ki, tarixi təhrif etmək istəyənlər anlasınlar ki, tarixi təhrif etmək lazım deyildir. Bizim həyatımızda, indi oturduğumuz binanın möhkəm himi var, bu himi yaradanlar olubdur – bizdən öncə yaşayıb yaratmış, qurmuş insanlar, Azərbaycanın fədakar insanları olubdur. Bu gün bütün o fədakar insanlara, onların xatirəsinə öz hörmət-ehtiramımızı bildirməliyik" [Xc.s.13].

"Aşkar olanda hər bir məsələyə çarə tapmaq asan olur" xalq deyimi ilə üzünü auditoriyaya tutan böyük natiq "tarix həqiqətləri sevir" fəlsəfəsini ortaya qoyur: "Düzdür, o vaxt o kadrları göstərməyə imkan verilməyib, ancaq həqiqəti həmişə göstərmək lazımdır. Ona görə yox ki, mənfi və ya müsbət nöqteyi nəzərdən kiməsə aiddir, ona görə ki həqiqətdir. Aşkar olanda hər bir məsələyə çarə tapmaq asan olur. O vaxt bəlkə də bizim məğlubiyyətimizin, xalqımızın başına gələn bu faciələrin səbəblərindən biri o olub ki, həqiqət gizlədilib, xalqa, ictimaiyyətə, millətə çatdırılmayıbdır. Bu baxımdan bizim

televiziya işçilərinin fədakarlığı nəticəsində bu kadrların qorunub saxlanılması, tarixi indiki və gələcək insanlara müəyyən qədər düzgün çatdırmaq üçün çox əhəmiyyətlidir" [Xc.s.155].

Heydər Əliyev insanın tarixin bir hissəsi olaraq tarixi yaratması fikrini ortaya qoyur, keçmiş tariximizə hörmət qoymağı, eləcə də digər xalqların keçmiş tarixinə hörmət qoymaq fəlsəfəsini anladır: "Biz belə bir rəyə gəldik ki, iqtisadi əməkdaşlığımızı genişləndirmək üçün böyük imkanlar var. Srağagün Fransa və Azərbaycan prezidentlərinin iştirakı ilə Yelisey sarayında Azərbaycan milli neft şirkəti və Fransanın "Elf Akten", "Total" şirkətləri arasında iri neft müqaviləsinin imzalanması da bunu təsdiq etdi.

Mən sizinlə söhbət edir, sizə baxıram və düşünürəm ki, sizin bir çoxunuz Fransa tarixinin bir hissəsidir, De Qoll, Pompidu və başqa prezidentlərini hökumətində nazirlər olmusunuz, bu gün isə parlamentdə işləyirsiniz. Necə böyük səadətdir. Şəxsən mən ümumiyyətlə tarixə, eləcə də öz xalqımın, başqa xalqların tarixinə hörmətlə yanaşıram. Artıq tarixə çevrilən nə varsa, hamısının qədir-qiymətini bilmək və hamısını obyektiv qiymətləndirmək lazımdır" [VIIIc.s.303].

18 avqust 1995-ci il tarixdə, Təzəpir məscidində dindarlarla görüşdəki çıxışda nikbinliklə dolu, nəzərləri gələcək üfüqlərə dikilmiş bir nitq özünü qabarıq büruzə verir. Bir tərəfdən çətinliklər, problemlər, dərdlər və keçən zamanlardan fərqli olaraq gözəl və bol süfrə: "Müstəqil Azərbaycan respublikası öz tarixinin mürəkkəb bir dövrünü yaşayır. Bu dövrün çox müsbət, xoşbəxt cəhətləri var. Eyni zamanda ağır, çətin, kədərləndirici cəhətləri də var. Bilirsiniz əgər bir axşam oturub plov yeyərdiksə özümüzü xoşbəxt hiss edərdik. İndi çətinliklərimiz də, problemlərimiz də, dərdimiz də çoxdur. Amma Allaha şükürlər olsun ki, süfrəmiz keçən zamanlardan

daha da gözəldir, daha da boldur. Bundan sonra da bol olacaqdır. Arxayın olun ki, ilbəil daha da çox olacaqdır" [XVc.s.67].

"Azərbaycan yeddi ildir ki, öz dövlət müstəqilliyini elan edibdir. Mən Azərbaycan dilində danışıram. Bilirsiniz, mən sizinlə Türkiyə türkcəsində sizin kimi danışa bilərəm. Yəni Türkiyə türkcəsində danışmaq imkanım var. Ancaq mən bunu etmirəm. Çünki mən istəyirəm ki, siz də mənim dilimi biləsiniz. Ancaq bu dillərin də fərqi yoxdur. Bunlar eyni dildir. Bizim ən böyük uğurumuz, ən böyük xoşbəxtliyimiz odur ki, əcdadlarımız, ulu babalarımız bizi eyni dildə yaşadıbdır. Dünyada türkdilli millətlər çoxdur. Biz bir soydanıq, Özbəkistan da, Qazaxıstan da, Türkmənistan da, Qırğızıstan da, Azərbaycan da, Türkiyə də və digərləri də eyni soydanıq. Hamımızın bir kökü, bir soyu vardır, bir dilimiz də vardır. Ancaq Azərbaycan ilə Türkiyədə olan dilin bir-birinə yaxınlığı qədər heç bir dilin yaxınlığı yoxdur. Mən slavyan dilləri qrupunu da yaxşı bilirəm. Slavyan dilləri qrupuna bir çox dillər daxildir. Ancaq Ukrayna ilə Rusiyanı götürsək, onlarda Azərbaycan-Türkiyə qədər yaxınlıq yoxdur. Bu, bizim – Türkiyə ilə Azərbaycanın bir-biri ilə nə qədər əlaqəli olmasını göstərir. Ona görə də bizə tərcüməçi lazım deyildir. Mən dediyimi siz anlayırsınız, siz dediyinizi isə mən anlayıram. Mən sizi Azərbaycan dilində danışmağı öyrətmək istəyirəm. Ona görə də mənim dilimi dinləyin və hansı sözü anlamasanız məndən soruşun. Mən onu sizə izah edərəm. Əziz dostlar, beləliklə, bu günkü görüş Türkiyə-Azərbaycan dostluğunun yeni bir təzahürüdür. Bilirsiniz, dostluq hisslərdən ibarətdir. İnsanların, ailələrin, qrupların bir-biri ilə dostluğu, əlaqələri, xalqların, ölkələrin, dövlətlərin dostluğunu yaradır. Biz, bax, beləliklə, belə görüşlərlə dostluğumuzu daha da inkişaf etdiririk, daha da möhkəmləndiririk" [XVIIIc.s.135-136].

Fəlsəfə və incəsənət mövzusu üzrə mübahisəli hallara aydınlıq gətirmək üçün Heydər Əliyevin Tahir Salahovun yaradıcılığı ilə bağlı aşağıdakı fikirləri çox önəmlidir. Burada o incəsənətdə fərdiliyin, vahidliyin üstünlüyü ilə yanaşı həm də ümumi inikas etdirdiyini göstərir. Burada insan fəlsəfəsi: "yaradıcılığınızda insan kainatın ən başlıca, ən böyük dəyəri kimi həmişə ön plandadır", zaman və məkan fəlsəfəsi: "müasiri olduqları əsrin cizgiləri mütəfəkkir sənət salnaməsinin fırçası ilə öz əksini tapmışdır" nəhayət ekoloji fəlsəfəyə gətirib çıxaran təbiət fəlsəfəsi insanla təbiətin harmoniyasını ortaya qoya bilir: "Azərbaycanın təbiətini və insanlarını vəsf edən tablolarınız doğma diyara bəslədiyiniz səmimi və dərin övlad məhəbbətindən xəbər verir. Yaratdığınız mənzərə və natrümotlar ətraf mühitlə, təbiətlə təmasdan doğan hədsiz sevinc və nikbinlik duyğularını ifadə edir".

Böyük natiq incəsənət xadimlərinin özlərinin insana olan münasibətinin də mühüm oluğunu vurğulayır: "Yaradıcılığınızda insan kainatın ən başlıca, ən böyük dəyərləri kimi həmişə ön plandadır. Portretlərinizdə qəhrəmanlarınızın mürəkkəb daxili aləmi ilə yanaşı, müasiri olduqları əsrin cizgiləri mütəfəkkir sənət salnaməçisinin fırçası ilə öz əksini tapmışdır. Mirzə Ələkbər Sabir, Dmitri Şostakoviç, Qara Qarayev, Fikrət Əmirov, Rəsul Rza və başqa görkəmli şəxsiyyətlərin portretləri təkcə obrazların möhtəşəmliyini, onların mənəvi-fəlsəfi düşüncələrini deyil, eləcə də sizin özünüzün insana, yaşadığınız dövrə olan münasibətinizi açıqlayır. Sizin istedadlı teatr rəssamı kimi xidmətləriniz böyükdür. Səhnə əsərlərinizə verdiyiniz tərtibat obrazların parlaqlığı, bu janrın mürəkkəb məsələlərinin həllində böyük məharət, hadisələrin cərəyan etdiyi dövrün xüsusiyyətlərini duymaq bacarığı ilə səciyyələnir" [XVIIIc.s.278].

30 noyabr 1998-ci ildə Azərbaycan Dövlət Akademik Opera və Balet Teatrında Əlillərin birinci ümumrespublika

bədii yaradıcılıq baxış-müsabiqəsi qaliblərinin yekun konserti başa çatdıqdan sonra tədbir iştirakçıları qarşısında çıxış fəlsəfədə incəsənət məsələlərinin çözülməsinə mühüm töhfədir: “Bu gün bizə təqdim olunan incəsənət nümunələri bizi həddindən artıq sevindirdi, heyran etdi, həyəcanlandırdı. Bu gün bu səhnədən çıxış edənlər özlərinin yüksək istedadlarını nümayiş etdirdilər. Eyni zamanda onlar böyük iradəyə malik olduqlarını nümayiş etdirdilər. Bu günkü tamaşa insanın nə qədər böyük imkanlara malik olduğunu bir daha bizə göstərdi. Bizi sevindirən odur ki, fiziki cəhətdən qüsuru, çatışmazlığı olan insanlar nikbin yaşayırlar və öz iradələrinə söykənərək istedadlarını inkişaf etdirirlər və hətta ölkənin festivallarında, müsabiqələrdə çıxış edərək onları ictimaiyyətə nümayiş etdirirlər. Bu, insanın ən gözəl xüsusiyyətlərindən biridir. Bu, insanın nə qədər yüksək iradəyə malik olduğunu bir daha göstərir. Biz bu halları qiymətləndirməliyik və hər bir insanın cəmiyyətdə özünün daxilində olan imkanlardan istifadə etməsi üçün, öz istedadını nümayiş etdirməsi üçün ona şərait yaratmalıyıq. Mən məmnuniyyətlə deyə bilərəm ki, son illər Azərbaycanda bu işlər dövlət orqanları tərəfindən, cəmiyyyət tərəfindən görülür və bunların hamısı bir daha onu göstərir ki, Azərbaycanda hər bir insana qayğı vardır. Xüsusən, vətənini, torpağını, ölkəsinin müstəqilliyini, suverenliyini, ərazi bütövlüyünü qoruyarkən əlil olmuş, şikəst olmuş insanlara qayğı daha da çoxdur. Mən bu gün bir daha bəyan edirəm ki, Azərbaycanın dövləti, Azərbaycanın hökuməti, Azərbaycanın bütün dövlət xidmət orqanları əlillərə, şikəstlərə və xüsusən döyüşlərdə əlil olmuş insanlara bundan sonra da bütün qayğıları göstərəcəklər, əllərindən gələni əsirgəməyəcəklər.

Bugünkü mərasim çox böyük əhəmiyyət kəsb edir. Güman edirəm ki, bu, bizim cəmiyyətdə olan insanların hamısına müsbət təsir göstərəcək və insanlarda daha da yaşamaq eşqi, yarat-

maq eşqi nümayiş etdirəcəkdir. Bəli, insan çox şeyə qadirdir. İnsan nikbin olmalıdır. İnsan nə qədər çətinliklərlə rastlaşsa da, öz istedadını, öz biliyini, öz bacarğını cəmiyyətə təqdim etməlidir, cəmiyyətə, ölkəsinə həsr etməlidir. Bu gün bu möhtəşəm salonda, bu teatr səhnəsində böyük məharətlə öz istedadlarını nümayiş etdirən insanlar məhz belə insanlardır. Mən onları ürəkdən təbrik edirəm və onlara, bütün müsabiqədə iştirak edənlərə cansağlığı, səadət arzulayıram. Qarşıdan gələn Beynəlxalq Əlillər günü münasibətilə bütün əlilləri təbrik edirəm. Bir daha bəyan edirəm ki, Azərbaycanda hər bir vətəndaş dövlətin qayğısı altındadır və xüsusən əlillik ömrü keçirən, yaşayan vətəndaş dövlətin qayğısı altındadır" [XVIIIc.s.297-298].

"Bu heykəltəraşlıq əsəri kimi mürəkkəb əsərdir. Görürsünüz, bu heykəlin çox incə, nazik, zərif fraqmentləri vardır. Yenə də deyirəm, bunların hamısı bir tərəfdən bir heykəltəraş kimi Ömər Eldarovun əsərinin dəyərini nümayiş etdirir, amma eyni zamanda mənim üçün bu mücərrəd əsər deyil. Deyə bilərəm ki, Zərifə xanımın mərhum ata-anası da bəlkə onu mənim kimi tanımayıblar. Ona görə də mən Zərifə xanımın daxili mənəviyyatını tam bildiyim üçün görürəm ki, bu əsərdə bunların hamısı öz əksini nə qədər tapıbdır. Ona görə də bu əsər həm bədii, həm də fəlsəfi xarakter daşıyır və yüksək heykəltəraşlıq səviyyəsini nümayiş etdirir" [IXc.s.156].

"Səhiyyə sosial sahədir" deyən Heydər Əliyevin 6 avqust 1999-cu ildə Mustafa Hacıqasımov adına Azərbaycan Mamalıq və Ginekologiya mərkəzinin açılışı mərasimində nitqi: "Təbiidir, səhiyyə sosial sahədir. Bir dövlət olaraq, hökumət olaraq biz xalqımızın, millətimizin, vətəndaşlarımızın sosial tələblərini təmin etməliyik. Ona görə də insanların sağlamlığını və vətəndaşların müalicəsini təmin etmək üçün səhiyyədə mövcud imkanlardan daha da səmərəli istifadə etmək lazımdır.

Bununla bərabər, səhiyyədəki islahatların digər hissəsi həmin sahədə özəl sektor yaratmaqdan ibarətdir” [XXIc.s.162].

31 avqust 1999-cu ildə Azərbaycan təhsil işçiləri və bu il ali məktəblərə daxil olmuş tələbələrlə görüşdə nitq: “Təhsilin özündə aparılan islahatlar çox vacibdir. Siz onları aparırsınız. Bugünkü çıxışlarda bu barədə məlumatlar verildi. Mənim sizə tövsiyəm ondan ibarət olar ki, islahatları düşünülmüş qaydada aparasınız, formalizmə, konyunkturaya yol verməyəsiniz, Azərbaycanın milli ənənələrinin üstündən keçməyəsiniz. Bunlar həqiqətən həm Azərbaycan təhsilini dünyanın inkişaf etmiş ölkələrinin təhsil səviyyəsinə ardıcıl surətdə çatdırsın, həm də burada səhvlər buraxılmasın, mövcud yaxşı işlər pozulmasın. Nəsə qurub-yaradan adam gərək düşünsün ki, o, mövcud olandan daha yaxşısını yaradır. Əgər onu yarada bilirsə, mövcud səviyyədən imtina edib onu yaratsın. Amma yarada bilmirsə, qoy mövcud olandan əl çəkməsin, həmin onunla yaşasın. Mən bunları ona görə deyirəm ki, keçmiş zamanlarda da – bu, yeni bir məsələ deyildir – Sovetlər İttifaqı dövründə də həmin sistemin içərisində cürbəcür formalarda dəyişikliklər edilirdi. «Gözə torpaq atmaq» məsəli var. Bəziləri deyir ki, «bundan ötrü onu etdim, bunu etdim, bu islahatı keçirdim, bunu dəyişdirdim, bu belə deyildi, mən onu dəyişdirdim». Nəticəsi nədir? Nəticəsi yoxdur. Keçmişdə mən belə insanları görmüşəm. Belə insanlar 3-4 il üzdə olurlar. Bəzi dəyişikliklər edir, yeniləşdirir, yenidən qurur, ona görə də təriflənirlər. Mən bəzən elə adamlar görmüşəm ki, bir neçə il belə yaşayır, başqa yolla dəyişikliklər edir, sonra görür bunun nəticəsi yoxdur [XXIc.s.249]. “Dövlət müstəqilliyinin xalqımıza bəxş etdiyi nemətlərdən biri də odur ki, biz artıq öz təhsil sistemimizi xalqımızın, millətimizin tarixinə, mənəviyyatına, ənənələrinə uyğun qururuq” [IXc.s.156].

Ekloji problemlər təbiətdə yaranmazdan və ekoloji böhranın təzahürü olmazdan əvvəl insanın mənəvi aləmini ehtiva edən böhranı əks etdirir, bu isə artıq fəlsəfənin maraq sahəsidir.[1] Ekoloji proqnozlarla zəngin Heydər Əliyev nitqi Azərbaycan ekologiyasını qorumağa yönəlir ki, bu gün iqtisadi imkanlarımız problemləri çözməyə, yoluna qoymağa əsas verir. Ekoloji problemlərin həllinə biganəlik göstərməyi "xəyanət" adlandıraraq doğurdanda bu problemin yaranmasında insan amilinin rolunu önə çəkir. Dövlətin ekoloji problemlərin vaxtında həll olunmasında roluna xüsusi önəm verir: "Türkiyə Respublikasının Prezidenti Süleyman Dəmirəl ilə görüşdəki söhbətdən: "Mən nədən ötrü getdiyimi sizə bildirmişdim. Ona görə də dediklərimin hamısı oldu. Dünən Ankaraya gəldim. Orada böyük bir təşkilat var, – torpaq eroziyası ilə mübarizə, ətraf mühitin qorunması və başqa problemlərlə məşğul olur. Həm dövlət, həm də onunla bərabər iş adamları, böyük şirkətlər bu təşkilatla öz güclərini birləşdiriblər, adı da Türkiyə Eroziya ilə Mübarizə, Yaşıllaşdırma və Ətraf Mühitin Mühafizəsi Vəqfi – TEMA-dır. Bu vəqf yeddi il bundan qabaq dövlətlə birlikdə yaradılıbdır. Dediyim kimi, torpaq eroziyası ilə mübarizə, torpaqların şoranlaşmasının qarşısının alınması, meşələrin, ağacların inkişaf etdirilməsi, həm də onların məhv olunmasının qarşısının alınması ilə məşğul olur. Çox əhəmiyyətli bir işdir. Keçmişdə, Sovet İttifaqı vaxtında eroziyaya qarşı mübarizəyə, meliorasiyaya, torpaqların şoranlaşmasının qarşısının alınmasına, yaxud şoranlaşmış torpaqların yuyulmasına çox pul xərclənirdi. İndi isə bizim iqtisadi imkanımız pisdir. Ancaq hər halda meşələri qoruya bilərik, yaşıllaşdırmanı inkişaf etdirə, yeni meşələr saldıra bilərik. Məsələn, otuz

---

[1] Mehdiyev R.Ə. "Fəlsəfə". Dərs vəsaiti. Bakı, "Şərq-Qərb", 2010.

il öncə biz Bakının yaşıllaşdırılması problemini qaldırdıq. Düzdür, arada beş-altı il buna xəyanət oldu, amma görürsünüz, son beş-altı ildə Bakıda yenə də hər yerdə ağaclar əkilir, yaşıllaşdırmaya diqqət artırılır" [XXIIIc.s.269-270].

"Azərbaycanın özündə də bu günümüzün, gələcəyimizin zəmanəti, rəhni birlikdir və bütün dünyada da soydaşlarımızın bir olması vacibdir. Əlbəttə bu asan məsələ deyil. İnsanlar bir-birindən çox fərqlidir. Dünyada eyni xasiyyətə malik iki insan tapmaq çətindir. Hətta qardaş-qardaşla eyni xasiyyətdə deyil. Bəzən görürsən, əkiz qardaş-bacı da bir-biri ilə eyni xasiyyətdə olmur. Bu təbiidir. Biz təbiətə qarşı heç bir zor işlədə bilmərik. Təbiətin yaratdığı təbii qanunlar heç kəsin istəyindən, yaxud səyindən asılı olmayaraq işləyir. Amma bu təbii qanunlar içərisində də bir olmaq, daha da sıx olmaq, bir-birinə dayaq olmaq, əl uzatmaq üçün imkanlar çoxdur" [VIIc.s.17].

Burada böyük natiq dini-fəlsəfi baxımdan insanların fərqliliyini ortaya qoyur. Allah-Təbiət deməklə müəyyən mənada dünyəvi dövlət qurmaq niyyətimizi açıqlayır. Fəhmli auditoriya isə hər şeyin yaradılış baxımından fövqündə Allahın durduğunu onun nitqində anlayır. Yəni Azərbaycanın hər bir sahibkarı özünü respublika iqtisadiyyatının bir hissəsi bilməli və ölkənin iqtisadi tərəqqisi üçün səylər göstərməlidir.

"Burada ekologiya fondu barədə təklif oldu. Mən hesab edirəm ki, bu da maraqlı təklifdir. Həqiqətən, 150 il, bəlkə bundan da öncə bizim Azərbaycanda, Bakıda, Abşeronda neft istehsalı başlanandan Abşeronun torpaqlarına çox böyük zərər vurulur. Mənim xatirimdədir, 70-ci illərdə biz ittifaq dövləti qaşısında dəfələrlə bu məsələni qaldırırdıq. Abşeron torpaqlarını təmizləmək, rekultivasiya aparmaq və torpağa hopmuş nefti təmizləmək, torpaqları münbitləşdirmək qarşımızda duran əsas vəzifələrdən biri idi. Ancaq indi dünyanın böyük neft şirkətlərini Azərbaycana cəlb edərkən, onlarla müştərək iş gö-

rərkən ekologiya məsələsini xüsusi nəzarətdə saxlamalıyıq” [XIIIc.s.373].

Heydər Əliyev ekoloji fəlsəfədən danışır, bu ekoloji fəlsəfənin içində sanki estetik bir fəlsəfə də yaradır. Xəzər kimi dənizin heç yerdə olmadığını, onun sərvətlərinin də heç yerdə olmadığını göstərməklə Xəzərə hamımızın sevgisini yüksəldir. Milli təəssübkeşlik hissi burada da böyük natiqi tərk etmir: “İndi görürəm ki, siz o böyük təcrübəyə, o biliklərə Xəzərin problemlərinə dair böyük biliklər və böyük təcrübə də əlavə etmisiniz. Bu da çox mühüm işdir, çünki Xəzər dünyada nadir hövzədir, ikinci belə hövzə yoxdur. Yaxud, məsələn, qara kürü Xəzərdən başqa ayrı heç yerdə yoxdur və ya Xəzərdəki kimi uzunburun və nərə balıqları ayrı heç yerdə yoxdur və Xəzər kimi dəniz də dünyada yoxdur. Digər məsələlərə – gəmiçilik, balıq ovu, ekologiya məsələlərinə gəldikdə, əlbəttə, onlar mühüm məsələlərdir və Xəzər dənizinin dibində neft və qaz çıxarılmasından heç də az əhəmiyyətli deyildir. Biz bunlara eyni dərəcədə maraq göstəririk” [XVIIc.s.16].

“Bu da” bağlayıcısı ilə söylənilən təkrar-anafora ilə nitq ecazkarlıqla auditoriyaya çatdırılır. Bu nitqdə həyatı olduğu kimi qəbul edən, reallıqdan çıxış edən bir filosof görürük. İnsanla təbiətin harmoniyası məsələsi ekoloji harmoniya məsələsidir. Həyatın bütün müxtəlif təzahürlərinin hifz olunması, bəşər övladının qorunub saxlanması və tərəqqisi naminə bu harmoniyanın zəruriliyini dərk etmək vacibdir.[1] Ekoloji təhlükələri yaxşı görən böyük natiq iqtisadi rifahımız üçün Xəzər neftindən istifadə etməklə yanaşı bioloji ehtiyatların gələcək nəsillər üçün qorunmasına diqqət yetirir və bütün Xəzəryanı dövlətləri ekoloji sazişə çağırır. Xəzər dənizinin hüquqi statusunun müəy-

[1] Mehdiyev R.Ə. “Fəlsəfə”. Dərs vəsaiti. Bakı, “Şərq-Qərb”, 2010.

yənləşdirilməsi ilə bağlı Prezident sarayındakı 29 iyul 1998-ci il görüşdəki kimi: "Eyni zamanda ekologiya və bioehtiyatlarla bağlı məsələlər barəsində bütün Xəzəryanı dövlətlər tərəfindən hazırlanmış və təsdiqlənmiş saziş qəbul etmək lazımdır. Lakin suyun bütün səthi və qalınlığı sərbəst gəmiçiliyin ümumi vahid qaydaları naminə hamının istifadəsində olmalıdır ki, vahid ekoloji normalar və prinsiplər işləsin, bioloji mühitin vəziyyətinə nəzarətin vahid sistemi işləsin və bioloji ehtiyatların, ən əvvəl balıq ehtiyatlarının bərpasına aid birgə fonddan maliyyələşdiriləcək vahid sistem işləsin" [XVIIc.s.5-7].

13 dekabr 1998-ci ildə Bakıda Uşaqların Beynəlxalq Televiziya və Radio Günü münasibətilə "Uşaqlar dünyanın sevincidir" devizi altında keçirilən mərasimdəki çıxışda Heydər Əliyev cəmiyyət fəlsəfəsini ortaya qoyur, uşaqları cəmiyyətin mühüm tərkib hissəsi – "gülü, çiçəyi" hesab edir. Müstəqil Azərbaycanın gələcəyinin uşaqlara məxsus olmasını auditoriyaya göstərməklə yanaşı nitqini "hər bir sağlam düşüncəli insan uşağı sevməlidir", "xidmətlərini göstərməlidir" qətiyyətlilik bildirən ifadələrlə cəmiyyətə onun mühüm hissəsinin inkişafına kömək göstərməyə borclu olmasını xatırladır: "Əziz uşaqlar, balalar, qızlar, oğlanlar! Mən sizi bu gün münasibətilə – Uşaqların Beynəlxalq Televiziya və Radio günü münasibətilə ürəkdən təbrik edirəm. Azərbaycanın bütün uşaqlarına şən həyat, səadət və xoşbəxt gələcək arzulayıram. Uşaqlar hər bir insanın sevincidir. Uşaqlar həmişə insanları sevindirib, qəmdən, kədərdən, faciədən xilas etməyə yardım ediblər. Hər bir insan öz həyatının mənasını və gələcəyini uşaqlarda görür. Uşaqlar hər bir ailəyə xoşbəxtlik bəxş edir. Uşaqlar cəmiyyətin gülüdür, həm də gələcəyidir. Mən hər bir insan kimi, uşaqları hədsiz dərəcədə sevirəm. Öz övladlarımı sevirəm, nəvələrimi sevirəm, bütün uşaqları sevirəm. Bütün Azərbaycan uşaqlarını sevirəm, əziz balalar, sizi sevirəm. Mən bu söz-

lərimlə Azərbaycandakı bütün sağlam düşüncəli insan uşağı sevməlidir, uşağa qayğı göstərməlidir, uşaqların yaşaması üçün onların təhsil alması üçün, inkişafı üçün öz xidmətlərini göstərməlidir" [XVIIIc.s.399].

Cəmiyyətin inkişafı onun istehsalda və insanların davranışının idarə edilməsində toplanmış təcrübəni qoruyub saxlamaq və onu gələcək nəsillərə çatdırmaq üsullarını təkmilləşdirmək qabiliyyəti təmin edilir. Cəmiyyət üçün "xoşbəxtlik" hesab olunan uşaqlar cəmiyyətin mühüm bir hissəsidir. Heydər Əliyev uşaqların cəmiyyətin inkişafındakı aparıcı rollarını nəzərə çatdırır. Uşaqları ölkəmizin, XXI əsrin qurucuları hesab edən böyük natiq yaddaqalan çıxış edir. Şəhid, Qaçqın və Köçkün uşaqları, habelə valideyn himayəsindən məhrum olmuş uşaqlar üçün yeni il yolka şənliyindəki çıxış cəmiyyət fəlsəfəsinin dərkinə gözəl töhfədir:

"Əziz balalar, sevimli uşaqlar!

Siz öz varlığınızla, istedadınızla məni hər dəfə sevindirirsiniz. Uşaq hər insan üçün, hər ailə üçün, cəmiyyət üçün xoşbəxtlikdir. Uşaq həyata, cəmiyyətə, insanlara sevinc gətirir. Uşaq hər bir insanı yaşamağa, yaratmağa həvəsləndirir. Hər bir valideyn həyatda yaşayaraq, işləyərək, çalışaraq ilk növbədə qəlbində öz uşaqlarını, öz övladlarını düşünür, onları nəzərə alır və təsadüfi deyil ki, valideynlərin çoxu həmişə belə bir söz işlədirlər ki, mən uşaqlarım üşün yaşayıram. Uşaqlar üçün yaşamaq sözü hər bir valideynin öz uşaqlarına aiddirsə, eyni zamanda hər bir uşağa aiddir. Cəmiyyəti sizin nə qədər sevindirməyiniz, ona nə qədər ruh verməyiniz hədsiz-hüdudsuzdur. Siz cəmiyyətin, ölkənin, millətin gülüsüz, çiçəyisiniz. İnsan cəmiyyəti daim inkişafdadır. Bu inkişafı təmin edən yeni-yeni nəsillərdir. Əziz balalar, əziz övladlar, siz XXI əsrin qurucularısınız, yaradıcılarısınız. Sizin üzərinizə gələcəkdə çox böyük məsuliyyət düşəcəkdir" [XVIIIc.s.485].

Cəmiyyəti tam kimi verən ulu öndər uşaqları onun ən gözəl hissəsi kimi təqdim edir. Cəmiyyətin inkişafı onun istehsalda və insanların davranışının idarə edilməsində toplanmış təcrübəni qoruyub saxlamaq və onu gələcək nəsillərə çatdırmaq üsullarını, təkmilləşdirmək qabiliyyəti ilə təmin edilir. Uşaqların Beynəlxalq Televiziya və Radio günü münasibətilə "Uşaqlar dünyanın sevincidir" devizi altında keçirilən şənlikdəki nitqində "gələcək sonsuzdur" deyən böyük natiq mövcud dünya xalqları içərisində inkişaf baxımından irəliyə getməyi hamımızın borcu hesab edir. "Mənim üçün hər bir uşağın həyatı bizim ümumi cəmiyyətimizin həyatıdır" deməklə Azərbaycanın gələcəyi olan uşaqlara hədsiz məhəbbətini dünyaya bildirir: "Uşaqlar cəmiyyətin ən gözəl hissəsidir. Hər bir insan, hər bir ana, hər bir ata öz xoşbəxtliyini birinci növbədə öz uşağında, öz övladında görür. Ailədə yeni uşağın dünyaya gəlməsi ailə üçün bütün sevinclərdən də üstündür. Bu təbiidir, çünki insan yaşayır, yaradır və cəmiyyətin gələcəyini yaradır. Bu, Allahtəalanın buyurduğu bir prosesdir. Azərbaycan prezidenti kimi, mənim üçün hər bir ailədə uşağın dünyaya gəlməsi, bu ailənin sevinci elə mənim də sevincimdir. Mənim üçün hər bir uşağın həyatı bizim ümumi cəmiyyətimizin həyatıdır. Müstəqil Azərbaycan tarixinin ilk dövrünü yaşayır. Gələcək isə həm böyükdür, həm də uzundur, yəni əbədidir, sona qədərdir, bu gələcəyin sonu yoxdur. Ancaq qarşımızda duran məsafəni nə qədər tez qət edə bilsək, bizim xalqımız dünya xalqları içərisində o qədər tez yüksələcəkdir. Bu, bizim hamımızın borcudur. Biz bunu hamımız etməliyik. Ancaq bunu təmin etmək üçün gərək bu prosesin ardıcıllığı yaransın. Ardıcıllıq isə odur ki, məhz uşaqlar, gənclər, onların təhsili, tərbiyəsi, onların istedadlarının meydana çıxarılması, istedadlarını göstərmək üçün onlara imkanlar yaradılması – bunların hamısı hər bir nəsli əvvəlki nəsildən yüksək edə bilər" [XXIIIc.s.394-396].

"Biz XX əsrin son illərini yaşayırıq. Qarşıdan XXI əsr gəlir. Bu gün doğulan, dünyaya gələn uşaqlar, bu gün ilk addımlarını atan körpələr XXI əsrdə dünyanın məsələlərini həll edəcəklər, bəşəriyyəti yaşadacaqlar. Ona görə də bu sahə, yəni uşaqların sağlamlığı, onların fiziki və ruhi sağlamlığının təmin olunması və qorunması hər bir dövlət üçün çox böyük və müqəddəs vəzifədir. Müstəqil Azərbaycan Respublikasında bu vəzifəni biz məhz bu cür başa düşürük" [XIIc.s.167].

Fəlsəfədə dövlətçilik, siyasi plüralizm məsələləri böyük natiqin nitqlərini tərk etmir: "Nəhayət bizim ən böyük nailiyyətimiz ondan ibarətdir ki, Azərbaycanda demokratik, hüquqi, dünyəvi dövlət qurulur, demokratiya bərqərar olur, insanlara azadlıq verilibdir. Hərə öz fikrini deyə bilir və fikir, söz azadlığı, vicdan azadlığı, mətbuat azadlığı tamamilə təmin olunubdur. Biz bu yolla gedirik və gedəcəyik. Bunun nəticəsində də Azərbaycanda sağlam bir cəmiyyət formalaşıbdır. Bu, bizim ən böyük nailiyyətimizdir. Biz demokratik cəmiyyət yarada bilmişik. Şübhəsiz ki, bu cəmiyyətdə fikirlər müxtəlif ola bilər, – bu təbiidir. Heç kəs buna görə narahat olmasın. Ancaq əsas odur ki, biz fikir müxtəlifliyini təmin edərək cəmiyyətin tam əksəriyyətinin Azərbaycanın dövlət siyasətini, Azərbaycan prezidentinin siyasətini dəstəkləməsinin şahidi olmuşuq" [XVc.s.71].

Tarixdə şəxsiyyətlərin roluna qiymət verməyən sovet fəlsəfəsinin əksinə olaraq Heydər Əliyevin dilində "O, təkbaşına da çox işlər görə bilər" ifadəsi şəxsiyyətin real gerçəkliyə təsir gücünü ortaya qoyur, auditoriyanı bir daha insan gücünə, insan şəxsiyyətinə hörmətə, ehtirama səsləyir: "Mən xanım Bettinin və Firuz Xanlının təşəbbüsünü və ötən illərdə gördükləri işləri, Azərbaycana göstərdikləri münasibəti, dostluğu və ölkəmiz haqqında çəkdikləri bu qədər zəhməti çox yüksək qiymətləndirirəm. Onların gördükləri iş, əldə etdikləri nailiy-

yət onu göstərir ki, insan bir işə həvəslə, ürəklə, canla yanaşarsa, həqiqətən xalqa xidmət etmək istəyərsə, o, çox işlər görə bilər" [XIIIc.s.219].

Azərbaycan Prezidentinə "9 Eylül" Universitetinin fəxri adı verilməsi mərsimindəki nitq dövlət quruculuğu fəlsəfəsinə gözəl nümunədir: "İndi biz müstəqil olmuşuq, öz taleyimizin sahibiyik və müstəqil demokratik dövlət qururuq. Biz istəyirik ki, dövlətimiz tam demokratik, tam hüquqi, tam dünyəvi bir dövlət olsun. Bunun üçün də Azərbaycanda demokratiyanın bərqərar olması, inkişaf etdirilməsi, hüququn aliliyinin təmin olunması bizim əsas vəzifəmizdir və bunu da yerinə yetirməyə çalışırıq" [IXc.s.355].

"Hər bir xalqın səviyyəsini onun bilik səviyyəsi müəyyən edir. Bilik səviyyəsinə də nail olmaq üçün təhsil daim mövcud olmalıdır və o, ardıcıl surətdə inkişaf etməlidir" [XIIc.s.136].

Böyük natiq dövlət quruculuğu məsələlərində də özünəməxsusluq fəlsəfəsinin müddəalarını rəhbər tutur, milli-fəlsəfi dünyagörüşündən geri çəkilmir: "Əlbəttə, Türkiyə kimi bir dövlətin, cümhuriyyətin qurulması, inkişafı bizim üçün böyük örnəkdir. Ancaq xalqımızın, ölkəmizin, dövlətimizin özünə məxsus xüsusiyyətləri var. Biz dünya təcrübəsindən istifadə edirik və etməliyik. Ancaq öz milli, mənəvi ənənələrimiz əsasında, xalqımızın, həyatımızın xüsusiyyətlərini nəzərə alaraq öz dövlətimizi qururuq və quracağıq. Ona görə indi ən ümdə vəzifəmiz, ən şərəfli borcumuz hüquqi, dünyəvi, demokratik dövləti yaratmaqdır" [XIIIc.s.114].

Dövlətçilik fəlsəfəsi siyasi natiqliyimizin banisinin nitqlərini tərk etmir: "Bizim dövlət siyasətimizin əsas məqsədlərindən biri Azərbaycanın mütərəqqi mətbuat ənənələrinin davam etdirilməsi və müasir beynəlxalq təcrübə ilə zənginləşdirilməsi, kütləvi informasiya vasitələrinin maddi-texniki vəziyyətinin yaxşılaşdırılması, onların imkanlarından respubilkada

hüquqi dövlət quruculuğu, vətəndaş cəmiyyətinin formalaşdırılması və inkişafı, demokratik islahatların həyata keçirilməsində səmərəli istifadə edilməsindən ibarətdir" [XVIIc.s.73].

XX əsrin ziddiyyətlər fəlsəfəsini çox gözəl bilən ulu öndər "regional münaqişələrin, separatizmin, terrorizmin" Qafqazı da bürüməsini təəssüflə qeyd edir: "Dünyada bir çox politoloqlar regional münaqişələri, separatizmi və terrorizmi obrazlı şəkildə Dünya Birliyinin xərçəng şişi adlandırırlar. Təəssüf ki, bu gün Qafqazı məhz belə bir xəstəlik bürümüşdür. Biz siyasətçilər dinc Qafqaz ideyasını elan etməklə, bütün mövcud münaqişələrin aradan qaldırılması ilə məşğul olmaqla Qafqazın bütün xalqlarının dinc və xoşbəxt gələcəyinə nail olmaq istəyirik. Dünyada ən humanist peşənin nümayəndələrinin əməkdaşlığa hazır olması da bir daha göstərir ki, "Ümumqafqaz evi" konsepsiyasının tamamilə gerçəkləşdirilməsi üçün hər cür əsası vardır" [XVIIIc.s.167].

Fəlsəfi təlimlərdə regional münaqişələri əsl bəla hesab edirlər. Qlobal münaqişə regional münaqişələrdən başlayanda isə bu daha böyük bəla ola bilər.[1] Bunun səbəbi isə çox sadədir. Yerli münaqişələr başqa regionlarda təkrarlanmaq üçün nümunə rolu oynaya bilər: İstanbul Zirvə Görüşü başa çatdıqdan sonra Bakıya qayıdarkən təyyarədə jurnalistlərlə görüşdəki söhbətdə Heydər Əliyev diqqəti ümumi məsələlərlə yanaşı konkret məsələlərə, regional münaqişələrə yönəltməyi mühüm hesab edir: "Bilirsiniz ki, ondan sonra, siyasi bəyannamə qəbul olundu. Sammitin gedişində müzakirə edilən məsələlər bu sənəddə əksini tapıbdır. Orada ümumi məsələlər vardır. Amma konkret məsələlər Avropa qitəsinin ayrı-ayrı ölkələrindəki münaqişələrə – Bosniya və Herseqovina, Yuqoslaviya, Dnestrya-

---

[1] Mehdiyev R.Ə. "Fəlsəfə". Dərs vəsaiti. Bakı, "Şərq-Qərb", 2010.

nı, Ermənistan-Azərbaycan, Gürcüstan və başqa münaqişələrə, onlara münasibətə aiddir. Hesab edirəm ki, orada Azərbaycan haqqında yazılmış maddə – 20-ci maddə bu günün reallığını əks etdirir və biz bundan məmnunuq" [XXIIIc.s.174].

Müasir elmi-texniki inqilab cəmiyyətlə təbiətin qarşılıqlı münasibətlərini həddindən artıq mürəkkəbləşdirmişdir.[1] Türkiyə Respublikasının Prezidenti Süleyman Dəmirəl ilə görüşdəki söhbətdən Heydər Əliyev ekoloji fəlsəfənin gələcək inkişafı üçün böyük imkanlar yarandığını qeyd edir. "Dünyaya gəlmək" frazeoloji birləşməsini işə salan böyük natiq dünyaya gəldiyi torpağın qorunmasının humanist xarakter daşıdığını, ekoloji problemlərin həllinin xalqın rifahına xidmət etdiyini Türkiyə prezidenti Süleyman Dəmirəlin diqqətinə çatdırır: "Cənab prezident, yeri gəlmişkən mən Türkiyə Eroziyaya qarşı Mübarizə, Yaşıllaşdırma və Ətraf Mühitin Mühafizəsi Vəqfinin (TEMA) təşəbbüsü ilə keçirilən "Eroziyaya qarşı mübarizə həftəsi"nin açılışı mərasimi ilə əlaqədar təəssüratlarımı bildirmək istərdim. Məsələnin böyük əhəmiyyəti var, ekologiya və ətraf mühitin mühafizəsi sahəsində ölkələrimizin əməkdaşlığı üçün böyük imkanlar yaranmışdır. "Eroziyaya qarşı mübarizə həftəsi"nin və cənab prezident, dünyaya gəldiyiniz İsparta şəhərində bir sıra sağlamlığı mühafizə ocaqlarının açılışı ilə əlaqədar tədbirlər böyük humanist xarakter daşıyır. Bu tədbirlərin həyata keçirilməsi qardaş türk xalqının rifahı üçün əhəmiyyətlidir. Onu da deyim ki, mən bu mərasimlərdə iştirak edəcəyimdən məmnunluq duyuram" [XXIIIc.s.252].

Müasir dövrün mənəvi mühiti elmi-texniki tərəqqi və bəşəri dəyərlər, dövlət aparatının qüdrətinin artması, eləcə də

---

[1] Mehdiyev R.Ə. "Fəlsəfə". Dərs vəsaiti. Bakı, "Şərq-Qərb", 2010.

müasir cəmiyyətin üzləşdiyi təhdidlər və təhlükələrlə xarakterizə olunur.

Elmi-texniki tərəqqinin bizim ölkəmiz üçün də qaçılmaz olduğunu göstərən böyük natiq elmi-texniki tərəqqinin törətdiyi bəşəri dəyərlərə münasibətdə etinasızlığa qarşı mübarizəyə çağırır: “Mən təhsil məsələsi üzərində çox dayandım. Çünki təhsili olmayan gənc, şübhəsiz, həyatda lazımi yer tuta bilməz. İndi dünya mədəniyyət dünyasıdır, intellektual dünyadır, elmi texniki tərəqqi dünyasıdır. Azərbaycanı elmi texniki tərəqqi səviyyəsində inkişaf etdirmək üçün şübhəsiz ki, yüksək təhsilə, elmə nail olmalıyıq. Bununla yanaşı istərdik ki, gənclərimiz həm milli ənənələrimiz əsasında, həm də bəşəri mənəvi dəyərlər əsasında əxlaq, mənəviyyat məsələlərinə çox fikir versinlər”.

Filosoflar və sosioloqlar müasir cəmiyyət üçün səciyyəvi olan bir sıra problemlər – inflyasiya, işsizliyin artması, biganəlik, süstlük, narazılıq, dəyərlərin böhranı, alkoholizm, narkomaniya, korrupsiya və sair göstərirlər ki, bunlar bu gün cəmiyyətin üzləşdiyi təhlükələrdəndir. Bu təhlükələr, onların mövcudluğu, bu təhlükələrin aradan qaldırılması yollarını Heydər Əliyev bir filosof kimi auditoriyalar üçün çözə, qiymət verə, çıxış yollarını göstərə bilir: “Azərbaycanda gənclər arasında cinayətkarlığın artması, əxlaq pozğunluğunun olması, sərxoşluğa, narkomaniyaya meyilin çoxalması haqqında məlumatları ürək ağrısı ilə qarşılayırıq. Gənclər bizim gələcəyimizdir. Azərbaycanın gen fondu gənclərdir. Biz onları hərtərəfli qorumalıyıq. Şübhəsiz ki, dövlət orqanları da bu mənfi halların gənclərə sirayət etməsinin qarşısını almaq üçün lazımi tədbirləri görməlidirlər. Ancaq bunlar təkcə cəza tədbirləri olmamalıdır. Birinci növbədə profilaktik tədbirlər görülməli, təlim-tərbiyə işləri aparılmalı, valideynlər tərəfindən təhsil ocaqlarında gənclərin tərbiyəsinə ciddi fikir verməliyik”.

İslam fəlsəfəsinə dair Heydər Əliyevin baxışları xüsusilə mühümdür: “Dünyada bir çox böyük dinlər mövcuddur. Hər dinin özünəməxsus yeri var. Biz azərbaycanlılar İslam dini ilə fəxr edərək, eyni zamanda heç vaxt başqa dinlərə qarşı mənfi münasibət göstərməmişik, düçmənçilik etməmişik, ədavət aparmamışıq və heç bir başqa xalqı da öz dinimizə itaət etməyə məcbur etməmişik. Ümumiyyətlə, başqa dinlərə dözümlülük, başqa dinlərlə yanaşı və qarşılıqlı anlaşma şəraitində yaşamaq İslam dəyərlərinin xüsusiyyətidir. Bu, tarix boyu Azərbaycanda da, Qafqazda da öz əksini tapıbdır. Azərbaycanda İslam dini ilə yanaşı xristian dini də, yəhudi dini də əsrlər boyu yaşayıb və indi də yaşayır. Qafqazda da bu mənzərə var. Hesab edirik ki, insanlar hansı dinə, hansı mədəniyyətə mənsubluğundan asılı olmayaraq, bütün başqa mədəniyyətlərə, dinlərə, mənəvi dəyərlərə hörmət etməli, o dinlərin bəzən kimlərəsə xoş gəlməyən adət ənənələrinə dözümlü olmalıdırlar. Dini nöqteyi-nəzərdən ədavət, münaqişə, müharibə yolverilməzdir. Hər halda XX əsrin sonunda və qarşıdan gələn XXI əsrdə dünyada belə hallara son qoyulmalıdır.

Bu baxımdan biz çox ürək ağrısı ilə deyirik ki, on il bundan öncə Ermənistanın Azərbaycana torpaq iddiası əsasında başladığı hərbi təcavüz böyük müharibəyə, hərbi münaqişəyə çevrilibdir. Bunun nəticəsində, indi Ermənistan adlanan ərazidən islam dininə mənsub olan azərbaycanlılar zorla sürgün ediliblər, çıxarılıblar, yerlərindən-yurdlarından, ata-baba evlərindən, öz milli-dini, müqəddəs ocaqlarından, məscidlərindən, qəbirstanlıqlarından, tarixi abidələrindən məhrum olublar. Bu, tarixi cinayətdir və tarixi ədalətsizlikdir! Dünya Birliyi buna biganə qalmamalıdır və güman edirəm ki, biganə qalmayacaqdır. İslam dini Qafqazın, demək olar əksər hissəsini əhatə edib və bu gün də əhatə edir və islam mədəniyyəti hər yerdə öz izlərini buraxıbdır. Kimlərsə bu izləri dağıtmaq, pozmaq istəsə

də, bəşəriyyət buna yol verməməlidir və verməyəcəkdir. Hesab edirəm ki, bu məsələlər Bakıda keçirilən və indi işinə başlayan beynəlxalq simpoziumda öz əksini tapır” [XVIIIc.s.352].

Heydər Əliyev “islam fundamentalizmi, ekstremizm” deyərək islamı gözdən salmaq istəyənlərə müqəddəs kitabımız Qurani-şərifə diqqət yetirməyi tövsiyə edir: “Millilik, islamilik, ümumbəşəri dəyərlərin sintezi ilə xalqı inkişaf etdirə bilər. İndi dünyadakı bəzi mərkəzlərdə “İslam fundamentalizmi, islam ekstremizmi, fanatizmi” haqqında da fikirlər söylənilir. “Hesab edirəm ki, bizim müqəddəs kitabımız Qurani-şərif heç vaxt fundamentalizmin əsasını qoymayıbdır. Kimsə bu fundamentalizm, ekstremizim meyllərini islam dinindən istifadə edərək yaradır və inkişaf etdirirsə, hesab edirəm ki, onlar islamın əsas prinsiplərindən müəyyən qədər uzaqlaşırlar. Biz islam mədəniyyətini, islam mənəvi dəyərlərini müqəddəs kitabımız Qurani-kərimdə olduğu kimi qəbul edirik. Onların təhrif olunması, əgər dini dildə desək, günahdır. Biz istəmirik ki, kimsə günaha batsın” [XVIIIc.s.358].

“Müsəlman dünyasının bir hissəsi kimi, bu gün Azərbaycan xalqı bizim üçün müqəddəs olan Qurban bayramını qeyd edir. Azərbaycanda Qurban bayramının bu qədər geniş və bu qədər təmtəraqlı qeyd olunması onu göstərir ki, xalqımız artıq öz doğma köklərinə, ənənələrinə qayıdır və bunlara sadiqdir”. Burada böyük natiq müsəlman dünyasını bir tam kimi, bütöv qəbul edir. Azərbaycan xalqının isə bu tamın, bütövün, vahidin hissəsi hesab edir. “Öz doğma kökünə qayıtmaq” frazeoloji söz birləşməsi ilə o hissənin tama qovuşmasını göstərir. Və bu qovuşma sədaqətlə, sadiqliklə baş verir.

“Xalqlarımızın uzun əsrlər boyu yaratdıqları nadir memarlıq abidələri, öz əzəmətli, orjinal üslubu və yüksək sənətkarlıq keyfiyyətləri ilə mütəxəssisləri bu gün də heyran edir. İslam memarlıq məktəbinin bəşəriyyətə bəxş etdiyi misilsiz sənət

inciləri dinimizin humanist, fəlsəfi dəyərlərinin parlaq ifadəsi, müsəlmanların daim qurub-yaratmaq eşqinin əyani maddi təcəssümüdür".

Dünya sivilizasiyasının inkişafında islamın böyük roluna Heydər Əliyevin nitqlərində həmişə müşahidə olunur:

"İslam memarlığı minilliklər ayrıcında" beynəlxalq Bakı seminarının iştirakçılarına ünvanlanan məktubda: "Dünya sivilizasiyasının formalaşıb inkişaf etməsində islam elminin və mədəniyyətinin böyük rolu danılmazdır. Müxtəlif müsəlman xalqlarının birgə səyləri ilə təşəkkül tapmış islam mədəniyyətinin ən mühüm tərkib hissələrindən biri isə memarlıqdır" [VIIIc.s.73].

Beləliklə, milli mədəniyyətimizin, ədəbiyyatımızın, inkişafının qarşısını almaq cəhdləri nə qədər çox olmuşdursa da, milli ədəbiyyatımızda, mənəviyyatımızda, mədəniyyətimizdə olan bir o qədər, bəlkə ondan da çox olan güclər özünə cürbəcür yollar açmış və ümumbəşəri dəyərlərdən istifadə edərək daha da yüksək səviyyələrə çatmışdı.

Heydər Əliyev nitqinə xas olan fəlsəfilik dini üslubda da özünü göstərir. "İnanıram ki" modal sözün köməyi ilə böyük natiq müasir fəlsəfənin qloballaşma fəlsəfəsi kimi mühüm bölməsini burada yada salır. Bəşəriyyəti müstəqillik qazanan ölkələrin tərəqqisi və çiçəklənməsi yolunda səfərbər edir. Ağlın, zəkanın qalib gələcəyi fikrini ortaya qoyur:

"Qlobal tarixi hadisələrlə, keşməkeşlərlə dolu iyirminci yüzillik artıq arxada qalmış, dünya xalqları böyük ümidlərlə yeni əsrə, yeni minilliyə qədəm qoymuşdur. İnanıram ki, xristianlığın iki minilliyinini təntənə ilə bayram edəcəyimiz iyirmi birinci yüzillik bəşəriyyətin həyatında sülh, əmin-amanlıq və tərəqqi əsri, müstəqil ölkələrimiz üçün yeni inkişaf və çiçəklənmə dövrü olacaqdır".

İnsan, onun cəmiyyətdə yeri məsələsi fəlsəfi bir problem kimi filosofları həmişə düşündürüb. İnsanın nələrə qadir olması, insanın hansı potensiala malik olması Heydər Əliyevin fəlsəfi düşüncələrində özünü qabarıq büruzə verir: "Bu əsərlər və ümumiyyətlə, sərgi bir daha onu sübut edir ki, insan nə qədər böyük istedada və böyük potensiala malikdir. Bu onu göstərir ki, biz hələ insanların nə qədər böyük potensiala malik olmasını bəlkə də tam dərk edə bilməmişik. Əgər insanın əlləri yoxdursa, ayaq barmaqları ilə şəkil çəkir və o şəkil hər bir rəssamın şəklindən də bəlkə yaxşıdır, yaxud elə onun səviyyəsindədir. Bu onu göstərir ki, insan nəyə qadirdir. İradə, öz gücünə inam, öz imkanlarından istifadə etmək üçün çalışqanlıq – bunlar hamısı insanlarda olan daxili potensialı biruzə verir və belə əsərlərin yaranmasına gətirib çıxarır" [XIIIc.s.161].

Sağlam bədəndə sağlam ruh olar deyimi Sovetlər İmperiyası vaxtı da tez-tez səslənən fikirlərdən idi. İnsanın meymundan əmələ gəlməsini sübut etməyə çalışan marksist-leninçi ideologiya daşıyıcıları özləri də bilmədən sövq-təbii insanın ruhi varlıq olduğunu qəbul edirdilər. İnsana xas olan milli şüur, milli hissiyatlar vətənpərvərlik, bəşərilik və sair kimi əxlaqi-estetik dəyərlərin özünün yüksək inkişaf dərəcəsinə çatması yolunda güclü fiziki sağlamlığa ehtiyacın olduğunu dilə gətirən Heydər Əliyev idmana xüsusi yer ayırır. Eləcədə, idmanın qloballaşma dövründə yaranmış problemlərin həllində rolunu bizlərə anladan ulu öndər idman çempionatlarına ciddi önəm verir. Onun Boksçuların Avropa Çempionatının iştirakçılarına etdiyi müraciət bu qəbildəndir: "İdman hər bir sivilizasiyalı ölkədə vətəndaşların həyat tərzinin mühüm bir hissəsi hesab olunur. Əhalinin fiziki sağlamlığının qorunub saxlanılmasında və möhkəmləndirilməsində, xüsusilə yeni nəslin daha sağlam və güclü olmasında bədən tərbiyəsi və idmanın müstəsna rolu vardır. Ayrı-ayrı ölkələri təmsil edən idmançıların

əlaqələri, beynəlxalq idman yarışları xalqlar arasında qarşılıqlı anlaşma, əməkdaşlıq və dostluğun möhkəmləndirilməsi işinə də böyük xidmət göstərir. Bu baxımdan Avropanın 27 ölkəsinin idmançılarının iştirakı ilə keçirilən bu nüfuzlu çempionatın da əhəmiyyəti danılmazdır" [XXIc.s.109].

Heydər Əliyev nitqindəki xəlqilik hətta fəlsəfi baxışlarını belə ortaya qoyarkən özünü qabarıq biruzə verir. Xalq arasında harda doğulmağın insanın xarakterinə təsiri təzə şey deyildir. Böyük natiq öz cazibədar nitqi ilə insan xarakteri ilə doğulub boya başa çatdığı, yaşadığı coğrafi məkan arasındakı əlaqəni təsvir edir. 12 oktyabr 1999-cu ildə Naxçıvan MR-nın təşkil olunmasının 75 illiyinə həsr edilmiş təntənəli yubiley iclasında nitq buna əyani misaldır: "Naxçıvanın çox gözəllikləri var. Birincisi, onun təbiətidir. Azərbaycanın hər yerində gözəl guşə tapmaq olar. Haraya gedirsən, Azərbaycan gözəl bir yerdir. Amma mən bu gün Naxçıvandayam və Naxçıvan haqqında danışıram. Naxçıvanın təbiətinin gözəlliyi məğrurluq rəmzidir. Bax, ətrafda görünən dağlar, qayalar, çılpaq torpaqlar, – burada yaşıllıq azdır, – bu diyara xüsusi gözəllik verir. Ancaq bu gözəllik, yenə də deyirəm, qəhrəmanlıq, məğrurluq rəmzidir. O məğrur dağlar kimi, insanlar da məğrurdurlar. Mən bu fikri bir dəfə demişəm, bir də təkrar etmək istəyirəm, – Naxçıvanın gözəlliyi kişi gözəlliyidir. Güman edirəm, siz məni düzgün başa düşəcəksiniz. Mən bu sözü izah etməliyəm, ola bilər, sonra başqa cür başa düşərlər".

Ulu öndər estetik fəlsəfə ilə insan fəlsəfəsini harmonik şəkildə auditoriya üçün açıqlayır. Öncə qadın gözəlliyini bütün gözəlliklərin rəmzi hesab edir. "Sərt təbiətin", "sərt iqlimin" başlanğıc verdiyi millilik, azərbaycançılıq, milli şüur kişi gözəlliyi yaradır. Bu estetik fəlsəfədə kişi gözəlliyinə verilən Heydər Əliyev tərifidir desək yanılmarıq: "Ümumiyyətlə, həyatda hamı "gözəl" deyəndə ancaq qadını nəzərdə tutur:

qadın gözəlliyi. Tarix boyu bizim ulu babalarımız həmişə gözəl qadınlar haqqında yazıblar. Nizami Gəncəvi də gözəl qadınları vəsf edib – "Leyli və Məcnun"da. Füzuli də, başqası da. Təkcə Azərbaycanda deyil, ümumiyyətlə, bəşəriyyətdə qadın gözəlliyi gözəlliyin rəmzidir. Kişiyə, adətən, gözəl deməzlər. Bəzən gözəl desən də, bəlkə acığına gələr. Amma, kişiyə məxsus da gözəllik var. O gözəllik həmin o dağların gözəlliyidir, burada olan gözəl, ancaq sərt təbiətin, iqlimin gözəlliyidir. Bütün bu təbiət buradakı insanlara müəyyən qədər xüsusiyyətlər verir. Bu xüsusiyyətlərdən isə, – mənə elə gəlir, mən belə düşünürəm, – ən dəyərlisi odur ki, naxçıvanlılar həmişə milli şüurla yaşamışlar. Millilik, azərbaycançılıq, milli şüur Azərbaycanda həmişə yüksək olmuşdur" [XXIIc.s.201].

Dahi musiqiçi Mstislav Rostropoviç ilə görüşdə "kişi" sözünün fəlsəfi tərəfləri auditoriyaya çatdırılır. Burada Heydər Əliyev əxlaq fəlsəfəsinə söykənərək "kişi" sözünün "tutumlu söz" olduğuna diqqəti çəkir. Tutumlu dedikdə əxlaq şüurunun əsas anlayışları olan vicdan, borc, şərəf, yaxşılıq, xeyirxahlıq və digər anlayışlar "kişilik"də özünü büruzə vermişdir. Bu anlayışlara o, "sözü bütöv olmaq", "sözünün sahibi", "ləyaqət", "sözü ilə əməli bir olmaq" kimi yeni anlayışları qoşaraq əxlaq fəlsəfəsi lüğətini zəngiləşdirir: "Yaxşı ki, siz bizə yenə də gəldiniz, biz üz-üzə oturub söhbət edə bilərik, nəinki söhbətinizi, həm də müsiqinizi dinləyə bilərik. Mən sizi salamlayıram. Mstislav Rostrapoviç: Bilirsinizmi, sözümə nə üçün əməl edirəm? Ona görə ki, necə deyirlər, kişi, əsl kişi belə olmalıdır. Bax, buna görə. Heydər Əliyev: Siz əsl kişisiniz. Bizim Azərbaycanda kişi sözü çox tutumlu sözdür. Bir var ki, «kişi» sözünü elə-belə deyəsən. Amma sözün əsl mənasında «kişi» o deməkdir ki, bu adam sözü bütöv adamdır, sözünün sahibidir, kişilərə xas hər cür ləyaqətə, keyfiyyətlərə malikdir, sözü ilə əməli birdir" [XXIIIc.s.195].

Hələ Mövlana Cəlaləddin Rumi öz zamanında "insanın cismi ruhların gəmisidir" deyirdi. Heydər Əliyevsə "fiziki cəhətdən sağlam xalqın mənəviyyatı da yüksək olar" kəlamını ortaya qoyur. Heydər Əliyevin nitqində insan, insanın cəmiyyətdə yeri, insanın kamilləşməsinə aparan yollar həmişə diqqət mərkəzindədir. Müstəqilliklə mənəviyyatı yüksək insan arasında əlaqəni aşağıdakı nitq parçasında görürük. Son illərin olimpiadalarında üçrəngli Azərbaycan bayrağının ucaldılması buna əyani sübutdur: Məhz vətənpərvərlik hissi, vətənə məhəbbət, sevgi hissi kimi dəyərlər, müstəqillikdən sonrakı dövrlərdə öz real, həqiqi qiymətini alır. Bu dəyərlərin həyata keçirilməsi yolunda idamanın inkişafına dövlət qayğısı ulu öndərin diqqət mərkəzindədir. 2 fevral 2000-ci il tarixdə, Azərbaycanın bir qrup tanınmış idmançıları və yığma komandanın baş məşqçıləri ilə görüşdə söhbət: "Bizim xalqımız fiziki cəhətdan sağlam xalqdır. Xalqımızın mənəviyyatı da yüksəkdir. Ancaq keçmiş zamanlarda biz idman sahəsində heç vaxt indiki qədər nailiyyətlər əldə etməmişik. Ona görə yox ki, bizim gənclərimiz, idmançılarımız buna qadir olmayıblar. Ona görə ki, birinci növbədə, biz müstəqil olmamışıq və Sovet İttifaqı, SSRİ tərkibində bizim idmançıların özlərini göstərmək və öz fəaliyyətləri nəticəsində onlara layiq olan yerləri tutmaq imkanları məhdud olubdur. İkinci də ona görə ki, indi müstəqil Azərbaycanda idmana, olimpiya hərəkatına xüsusi diqqət yetirilir və bir də bugünkü nailiyyətlər keçmişdən ona görə artıqdır, yüksəkdir ki, indi hər bir Azərbaycan idmançısında vətənpərvərlik hissi, vətənə məhəbbət, sevgi hissi əvvəlkilərdən, təbiidir ki, yüksəkdir" [XXIVc.s.427].

Təbiət fəlsəfəsi insanı təbiətlə vəhdətdə götürür ki, vaxtilə belə fəlsəfi fikirləri burjua fəlsəfəsinə aid edirdilər. Heydər Əliyev fəlsəfi fikrində bu ideya yenidən gündəmə gəlir, insanların xarakteri ilə yaşadığı ərazi arasındakı münasibət bir daha

açıqlanır: “Kəlbəcərdə yaşayan insanlar da o gözəl təbiətin, məğrur qayaların, dağların təsiri altında daim cəsur olublar, qəhrəman və rəşadətli olublar. Eyni zamanda zəkalı olublar, elmə, biliyə, mədəniyyətə həmişə böyük maraq göstəriblər. Ona görə də Azərbaycanın ucqar və dağlıq rayonu olan Kəlbəcərdə eyni zamanda həmişə yüksək mədəniyyət və yüksək mənəviyyat olmuşdur. Təbiidir ki, Kəlbəcər rayonundan çıxmış adamlar, kəlbəcərlilər Azərbaycanın hər yerində, xüsusən Bakıda ölkəmizin ictimai-siyasi, mədəni, elmi həyatında özlərinə məxsus görkəmli yer tutmuşlar və ölkəmizin inkişafında öz xidmətlərini göstərmişlər” [IXc.s.111-112].

“Böyük əraziyə malik olan Kəlbəcər Azərbaycanın gözəl və qiymətli guşələrindən biridir. Respublikamızın ucqar rayonu olmaqla bərabər Kəlbəcər ölkəmiz üçün həm də strateji əhəmiyyəti olan bir rayondur. Allah Kəlbəcərə hər cür nemətlər, gözəl təbiət, zəngin sərvətlər veribdir. Kəlbəcər məğrur dağları, gözəl meşələri, otlaqları, çəmənləri, obaları, bulaqları olan, vətənimizin təbiət gözəlliyini və zənginliyini özündə əks etdirən bir parçasıdır. Kəlbəcərin həm yeraltı sərvətləri, həm də yerüstü sərvətləri Azərbaycanın milli sərvətlərinin bir hissəsidir” [IXc.s.111].

Burada hissə və tam fəlsəfəsi poetik bir dillə auditoriyaya çatdırılır. Auditoriya Kəlbəcərin Azərbaycanımızın “bir parçasıdır”, “bir hissəsidir” fikirlərini böyük natiqin dilindən eşidir. Gözəl bir parçasını, mühüm bir hissəsini itirən Azərbaycanın dərdi hər birimizin dərdidir fikrini ortaya qoyur: “Bu bizim hər birimiz üçün, Azərbaycan xalqı üçün ürək ağrısıdır, böyük dərddir”.

Hətta gözəllik anlayışında da milli mənafeləri böyük natiq öndə saxlayır: “Bilmirəm kimin gözünə hansı ölkədəki qadınlar necə görünür, amma mənim gözümə görə, dünyanın heç bir yerində Azərbaycandakı qadınlar kimi qadın yoxdur. Azər-

baycan qadınlarının bir xüsusiyyəti də vardır. Azərbaycan qadınları çox gözəldirlər, ümumiyyətlə gözəllik anlayışını insanlar cürbəcür anlayırlar, dərk edirlər. Bu da təbiidir. Təbiətin də gözəlliyi vardır, hər bir insanın da gözəlliyi vardır. Amma gözəllik əsl mənada cəmiyyətdə olan gözəllikdir və bu sadəcə bir xarici görünüş deyildir. Gözəllik həm xarici olur, həm də daxili olur. Ancaq bu gözəllik anlayışının daşıyıcısı həmişə qadınlar olur. Hər bir millətin gözəlliyini nümayiş etdirən qadınlar olur" [XVc.s.43].

"İnsan yaranandan bəri idman onunla bərabər inkişaf edibdir. İnsan idmansız yaşaya bilməz. Hər bir insan idmanla məşğul olmadığını bəyan etsədə onsuz da məşğul olur. İnsanın hər bir fiziki hərəkəti idmandır. Ancaq idmanın formalaşmış nümunələrindən istifadə etmək və onu insan həyatının ayrılmaz hissəsi kimi qəbul etmək – bu, idmanın yüksək nümunələridir. Hesab edirəm ki, xalqımız bütün əsrlərdə qəhrəmanlıq, cəsurluq, döyüş nümunələri göstərərkən məhz fiziki cəhətdən sağlam, dözümlü, dəyanətli olduğuna görə belə zirvələrə çatıbdır" [VIIIc.s.344].

Fəlsəfənin müxtəlif hissələri çox vaxt onun bir kiçik parça çıxışında çulğalaşaraq hamoniya yarada, audiroriyanı heyran qoya bilir. Aşağıdakı parçada bütöv və hissə fəlsəfəsi (millət və hər bir insan), forma və məzmun fəlsəfəsi (zahiri və daxili gözəllik), eləcədə fəlsəfədə insan (qadın və estetika) problemlərinə toxunulur: "Bilirsiniz, məhşur rus yazıçısı Çexov demişdir ki, insanda hər şey gözəl olmalıdır. Şübhəsiz ki, gözəllik insan üçün xüsusi əhəmiyyət kəsb edən amildir. Millətin gözəlliyi hər bir insanın gözəlliyindən meydana gəlir. Ona görə də mən həmişə millətim haqqında düşünürəm. Mən millətin həm mənəviyatı haqqında düşünürəm, həm əxlaqı haqqında, həm də onun gözəlliyi haqqında düşünürəm. Həm zahiri gö-

zəllik, həm daxili gözəllik. Bunların hamısını anlamaq üçün qadınların gözəlliyi həmişə nümunədir".

Heydər Əliyev nitqində fəlsəfi düşüncələr müxtəlif çeşidli auditoriyaları bəzəyir. İnsan fəlsəfəsi, insana daxilən xas olan fəlsəfi kateqoriyaların vəhdətdə olmasını ortaya qoyan böyük natiq insanı elə ziddiyyətləri ilə birgə qəbul edir. Səməd Vurğunun "Fərhad və Şirin" pyesinin yeni quruluşda tamaşasına baxdıqdan sonra yaradıcı kollektivlə görüşdə çıxış buna əyani misaldır: "Əgər Şapur təkcə Fərhada və yaxud Şirinə, elə Xosrovun özünə xəyanət etdisə, amma bu gün xəyanət edənlər bütün millətə xain çıxıblar, ölkəmizə, dövlətimizə, dövlətçiliyimizə xəyanət ediblər. Ona görə də Səməd Vurğunun əsərləri bu gün də aktualdır, 10 ildə, 50 ildə bundan sonra aktual olacaqdır. Nə qədər ki insan cəmiyyəti yaşayır, insanlar arasında gedən bu proseslər daimidir. Mən istərdim ki, məhəbbət, sevgi həmişə olsun, xəyanət, satqınlıq heç vaxt olmasın. Siz də bunu istərdiniz. Ancaq bu, nə sizdən, nə də məndən asılı deyildir" [Xc.s.52].

Heydər Əliyevin çıxışlarında hər bir şəxsə, hadisəyə fərdi yanaşma fəlsəfəsinin şahidi oluruq. "Ümumiyyətlə" yekunlaşdırıcı modal sözlə nitqini qurtaran böyük natiq Azərbaycanın dahi şəxslərini antroponomik olaraq sıralamaqla onların təkrarolunmaz şəxslər olduğunu auditoriyaya anladır. Sonda isə iki yerdə "bəli" təsdiq ədatının köməyi ilə müasir tarix fəlsəfəsini fərdi yanaşma ilə uzlaşdırır.

"Ümumiyyətlə ədəbiyyatımızda, mədəniyyətimizdə çox şəxsiyyətlər olub. Amma elə şəxsiyyətlər olur ki, onlar özünəməxsus bir yer tutur, təkrarolunmazdırlar, onları heç kim əvəz edə bilmir. Məsələn, Süleyman Rəhimov da, Mirzə İbrahimov da, Hüseyn Cavid də, Rəsul Rza da, Səməd Vurğun da, Cəlil Məmmədquluzadə də, Sabir də, Süleyman Rüstəm də belədir. Bu gün bizim dövrümüzdə yaşayanlardan söhbət açsaq Bəxti-

yar Vahabzadə də belədir. İkinci bir Bəxtiyar Vahabzadə yox-dur. O başqasına bənzəmir və onu heç kim əvəz edə bilməz. Sabah başqa bir şəxs yaranacaqdır, onun bəlkə də başqa xüsusiyyətləri olacaqdır. Bəli, xalqımız elə bir xalqdır ki, tarixin hər bir mərhələsində böyük, dahi insanlar yetişdirir və biz bununla fəxr etməliyik. Biz kasıb xalq deyilik. Yəni biz intellekt cəhətdən kasıb deyilik. Bəli, xalqımızın zəkası çox zəngindir".

Reallığa söykənən görkəmli dövlət başçısının nitqində utopiyaya yer yoxdur. Böyük natiq bəşəri zəka sahibi olan insana, insanın gələcək səviyyəsinə, inamını itirmir. Əsl insan səviyyəsinə çatmağın da yolunun hamar olmadığını, "inkişafın yüksək sivilizasiyasına çatmaq üçün" çalışmağın, qayda-qanunlara riayət olunmasını vurğulayır:

"Müstəqil dövlətimiz əsrlər boyu yaşayacaqdır. Nə qədər yaşayacaqsa o qədər də onun sərhədləri olacaq və o qədər də o sərhədləri qorumaq lazım olacaqdır. Şübhəsiz dünyada elə bir əmin-amanlıq dövrü gələcək ki, bəlkə də sərhədləri qorumaq lazım olmayacaqdır. İnsanlar elə bir səviyyəyə gəlib çatacaqlar, dövlətlərarası münasibətlər eləbir yüksək sivilizasiyalı səviyyəyə gəlib çatacaqdır ki, bəlkə bunlara ehtiyac olmayacaqdır. Ancaq o səviyyəyə çatmaq üçün də, nizam-intizamı möhkəmləndirmək, sərhədlərimizi hər yerdə həkk etmək, nümayiş etdirmək, tanıtmaq, qorumaq lazımdır. İnkişafın yüksək sivilizasiyasına çatmaq üçün insanlar çalışmalı, nizam-intizama tabe olmalıdırlar" [VIIIc.s.197].

Dünyagörüşün formalaşması yolunda dünya mədəniyyəti xəzinəsindən istifadəni önə çəkir, bəşəriyyətin topladığı zəngin təcrübənin gələcək nəsillərə çatdırılmasını şüurlara yeridir: "Bilirsiniz, əgər insan bir kənddə doğulursa və ömrü boyu həmin kənddə yaşayırsa, yaxud bir qəsəbədə doğulursa, həmin qəsəbədə ömrü boyu yaşayırsa, yaxud bir şəhərdə doğulursa və ömrü boyu o şəhərdə yaşayırsa, təhsil almaq, işləmək üçün

başqa bir yerə getmirsə, nə qədər kitab oxusa da, başqa vəsaitlərdən istifadə etsə də, onun dünyagörüşü o çərçivədən çox kənara çıxa bilməz. Ancaq insan öz baxış dairəsini nə qədər genişləndirərsə, öz ölkəsindən, şəhərindən, kəndindən çıxıb başqa ölkələrdə, şəhərlərdə olanları nə qədər görüb götürürsə və öyrənirsə, insan daha da zənginləşir. Bax, o illər mən bu prinsipi nəzərə alırdım” [XVIIc.s.215].

Azərbaycanın ədəbiyyat, mədəniyyət, incəsənət, elm, din və idman xadimlərinin böyük bir qrupuna “Şöhrət” ordeninin təqdim edilməsi mərasimində – 21 avqust 1998-ci ildə etdiyi çıxışda insanın cəmiyyətdə yerini müəyyənləşdirir. Hər şeyə reallıqdan baxmaq xüsusiyyətini bu çıxışında da auditoriyaya açıqlayır: “Bilirsiniz ki, mənim həyatım xalqa, millətə, Azərbaycana həsr olunubdur. Bu mənim həyatımın mənasıdır. Əgər insanlar bunu görürsə və qiymətləndirirsə, bu mənim üçün ən yüksək mükafatdır. Ancaq kimsə qiymətləndirir, kimsə qiymətləndirmirsə, bu da mənim üçün heç bir narahatlıq hissi doğurmur. Cəmiyyətdə hamı üçün yaxşı olmaq mümkün deyildir. Xüsusən də hakimiyyətdə olan insan üçün. Hakimiyyətdə olan insan kimisə təltif edir, amma onun hakimiyyəti dövründə kimsə cəzalanır. Bu təbiidir. Qanunu pozan, cinayət edən cəzalanmalıdır. Amma təəssüf ki, cəzalanan həmin insan bəzən öz cinayətini unudaraq, hakimiyyəti, onu cəzalandırmış orqanları günahlandırır. Bu da var. Bu da bizim reallığımızdır. Bu da məndə heç bir təəccüb doğurmur” [XVIIc.s.165-166].

İnanırıq ki, Heydər Əliyevin fəlsəfi dünyagörüşünün araşdırılması Sovet İmperiyasının süqutundan sonra Azərbaycan fəlsəfəsinin inkişafına böyük təkan verəcək, yeni insan, yeni dünyagörüşü məsələləri öz həllini tapacaqdır.

## VI FƏSİL

## HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ SƏMİMİYYƏT

Heydər Əliyevin səmimiyyəti təvazökarlığa söykənir. Özünün heç bir günahı olmadığı halda xalq qarşısında məsuliyyətini gizlətmir. Elə bu nəcib hərəkətlər də onu xalqın gözündə ucaldır: "Doğrudur, son illərdə bizim acı təcrübəmiz də vardır. Bu iki il müddətində bu salonda mən artıq üçüncü dəfədir ki, baş nazir vəzifəsinə təyin olunan şəxsləri təqdim edirəm. Çox təəssüf edirəm ki, keçən təyinatlar mənim arzu etdiyim, istədiyim ümidləri və respublika ictimaiyyətinin, xalqının ümidlərini doğrultmadı.

Ola bilər ki, bu, bizim də günahımızdır, ancaq o şəxslərin özlərinin günahıdır. Eyni zamanda, bu gün yenə də açıq-aydın demək istəyirəm ki, mən çalışıram hər bir şəxsdə müsbət tərəfi, meyilləri daha çox görüm. İnsanda müsbət tərəfi, meyilləri görməyə çalışmaq Allah dərgahına gedən yolda hər bəndəyə qismət olmayan xüsusiyyətdir desək qətiyyən yanılmarıq" [VIIIc.s.76].

Heydər Əliyev səmimiyyəti etirafladır. O bu etirafı özündən yaş etibarilə çox gənc olan insanlar qarşısında edə bilir. Etiraf etmək mədəniyyətini dövlətçilik elementi kimi siyasi səhnəyə gətirir. Prezident sarayında Azərbaycan yazıçılarının X qurultayı ərəfisində gənc nəsildən olan yazıçı və şairlərin bir qrupu ilə görüşdə bu özünü göstərir: "Əsrimizin sonunda Azərbaycanın gənc yazıçıları ilə görüşə gəlmişəm. Əksəriyyətinizlə şəxsən tanış deyiləm. Təəssüflər olsun ki, sizin əsərlərinizi oxuya bilməmişəm. Həqiqətən etiraf etməliyəm" [XIIIc.s.65]

Heydər Əliyevin səmimiyyəti keçmiş həyatını olduğu kimi danışmaqdadır. Türkiyənin TQRT telekanalının "Üz-üzə" proqramına müsahibədə müxbirin – "Kommunist partiyasına

siz özünüz daxil oldunuz, yoxsa sizi qəbul etdilər" sualına verdiyi cavab bu gün də hər birimizi keçmişimizi səmimiyyətlə xatırlamağa və keçmişimizə hörmət etməyə çağırır: "Bilirsiniz ki, o vaxt vəziyyət belə idi. Kommunist partiyası elə bir hörmətli partiya idi ki, burada başqa bir partiya yox idi, hər bir gənc, yəni gənclərin əksəriyyəti, – o vaxt komsomol, gənclər təşkilatı var idi, – bu təşkilatdan sonra kommunist partiyasına daxil olmaq imkanı alırdısa, bu onun üçün şərəf idi. Mən də o vaxt istedadlı bir gənc idim. Ona görə də mənim kommunist patiyasına daxil olmağım çətin olmadı". Heydər Əliyev kommunist partiyası sıralarında olduğu illərdə gördüyü işlərlə bir mühüm məsələni anlatdı:

Hansı partiyanın üzvü olmağın xalqa, millətə qulluq etməyə maneçiliyi yoxdur! [VIIIc.s.240]

Heydər Əliyev həyəcanını, kövrəlməsini auditoriyadan gizlətmir. Əksinə səmimiyyətə söykənən bir dillə ürəyindən keçənləri auditoriya ilə bölüşür. 30 avqust 1996-cı ildə Əliağa Vahidin anadan olmasının 100 illik yubileyi gecəsi başa çatdıqdan sonra mədəniyyət və incəsənət xadimləri ilə görüşdəki çıxış bu sıradandır: "İndiyədək Əliağa Vahidin heç bir yubileyi keçirilməmişdir. Bu il, bu günlər keçirilən tədbirlər, xüsusən bu gecənin – şairin 100 illik yubileyinin bu qədər təntənəli, çox məzmunlu, mənalı olması, mən hesab edirəm, onun indiyədək yubileyinin keçirilməməsini əvəz etdi. Mən səmimi deyirəm, bu gün salonda oturarkən hisslərim həddindən çox canlandı, həyəcanlandım, xalqımızın, millətimizin, ədəbiyyatımızın, şeirimizin, incəsənətimizin nə qədər böyük olduğuna görə sizinlə bərabər böyük iftixar hissi keçirdim" [VIIc.s.256].

"Sözün düzü" səmimilik ifadəsi Heydər Əliyev nitqlərində əsasən səmimi etirafı daha çox əks etdirir. Bu etiraflar xüsusilə, keçid dövrü üçün xarakterik olan iqtisadi məsələlərlə

bağlı konfranslarda, müşavirələrdə daha çox səslənir: "Mənə dedilər ki, daha bir məsələni əlavə olaraq aydınlaşdırmaq lazımdır. Bu, xarici səhmləri sığortalamaq məsələsidir. Bilirsiniz, ümumiyyətlə, sığorta işi bizim üçün də yeni bir işdir. Biz köhnə sosilaist sistemində yaşayarkən orada dövlət sığortası var idi: Mən Azərbaycanda da, Sovet İttifaqında da bir çox rəhbər vəzifələrdə işləmişəm. Amma, sözün düzü, bir əməlli-başlı təsəvvür edə bilmədim ki, bu dövlət sığortası nəyi sığortalayır. Axı hər şey dövlətin sərəncamında idi. Deyəsən hansısa bir təşkilat bu işlə bir növ məşğul olurdu"[Vc.s.57]. Belə səmimi çıxışlar "axı" qüvvətləndirici ədatla, eləcə də, "deyəsən" modal sözü ilə yumorostik bir ovqatla çıxışın ekspressivliyini artıraraq onu auditoriya üçün yadda qalan edir.

Heydər Əliyevin səmimi nitqlərində "mən açıq deyirəm" ifadəsi qarşı tərəf üçün qaranlıq bir məsələnin qalmadığını göstərir: "Şübhəsiz ki, neft yataqlarının istismarında iqtisadi marağı olan xarici ölkə şirkətlərinin mənafeyi təmin edilməlidir. Mən açıq deyirəm, Azərbaycan dövlətinin bu sahədə mövqeyi tam aydın, mənfəətlər isə qarşılıqlı olmalıdır. İlk növbədə, dövlətin, xalqın mənafeyinə üstünlük verilməlidir, eyni zamanda, xarici şırkətlərin iqtisadi mənafeyi ödənilməli və bu işlər qarşılıqlı fayda, qarşılıqlı anlaşılma zəminində təşkil olunmalıdır" [Ic.s.84].

Heydər Əliyevin böyüklüyü, Heydər Əliyevin səmimiyyəti özünü xalqın qarşısında borclu saymaqdır. "Xalqa minnət qoymamaq, özünü həmişə xalq qarşısında, Vətən qarşısında borclu bilmək" – bax budur Heydər Əliyev böyüklüyü. Bu böyüklük səmimi səslənir, zamansa həmişə həmin səmimiyyətin doğruluğunu göstərir: "Əgər biz işğal olunmuş torpaqlarımızın azad edilməsinə nail ola bilməmişiksə və yerindən-yurdundan didərgin düşmüş insanları öz evlərinə, yurdlarına qaytara bilməmişiksə, demək bu problem həll olunmayıbdır. De-

mək biz qaçqınlara və köçkünlərə daha da borcluyuq və onlara daha da diqqətli olmalıyıq" [XIIIc.s.154].

Böyük natiq səmimiyyət dolu çıxışlarında sanki xalq qarşısında hesabat verir, obyektiv səbəbləri sıralayır, təəssüf hissi ilə çatışmamazlıqları bəyan edir: "Bunun müəyyən obyektiv və subyektiv səbəbləri var. Obyektiv səbəblər məlumdur: müharibə, iqtisadiyyatın çətinlikləri, yolun kəsilməsi, şimalla bizim aramızda inteqrasiyanın pozulması – bütün bunları inkar edə bilmərik. Ancaq bu obyektiv səbəblər şəraitində də çox işlər görmək olardı: Təəssüf ki, bu işlər görülməmişdir" [IIIc.s.40].

Hökumət, dövlət orqanlarında bəzi şəxslərin yarıtmaz işlərini, nöqsanlara yol vermələrini Heydər Əliyev səmimi etiraf edir. Bu nöqsan və qüsurların yaranması şəraitini auditoriyaya izah edir: "Doğrudur, şikayətlər də var ki, gəlib Azərbaycanda iş görmək üçün şərait bəzən o qədər də uyğun deyil, yaxud bəzi bürokratik əngəllər meydana çıxır. Hökümətin, dövlətin ayrı-ayrı orqanlarında bəzi şəxslər bu məsələləri anlamadıqlarına, yaxud işlərimizə qəsdən mane olmaq istədiklərinə görə belə əngəlləri süni surətdə yaradırlar. Ola bilər, bunlar var. Mən buna etiraz etmirəm, hesab edirəm ki, yəqin respublikamızda belə qüsurlar mövcuddur. Ancaq mən demişdim və bir də demək istəyirəm: Azərbaycanla Türkiyənin əlaqələri elədir ki, gərək Türkiyənin iş adamları bizim aramızda bəziləri tərəfdən yaradılan buzu yara-yara ölkəmizə gəlsinlər" [Vc.s.156].

Heydər Əliyevin nitqində əgər "səhvlərə yol verilibdir" etirafı səslənirsə, qısa bir zaman müddətində auditoriyanın "bu nə səhv?", "görəsən hansı səhvə yol verilib" suallarına böyük natiq məntiqə söykənən, onunla heç bir əlaqəsi olmayan səhvlərin yaranmasına izah verir. Öz liderində səhv görməyə adət etməyən auditoriyanın çiynindən necə deyərlər dağ götürülür. Ciddi bir maraqla böyük natiqi izləməyə başla-

yır. 2 iyun 1996-cı ildə Sumqayıt şəhərində "Azərbaycan Respublikasında insan inkişafına dair hesabat" kitabının təqdimat mərasimindəki çıxışında öncə səhvlər deyilir: "Bu sənaye müəssisələrini qurarkən, tikərkən, işlədərkən şübhəsiz ki, müəyyən səhvlərə də yol verilibdir. Bu da təbiidir... Qeyd etmək lazımdır ki, bu böyük, nəhəng sənaye müəssisələri yaradılarkən ekologiya məsələləri lazımi səviyyədə planlaşdırılmamışdır". Sonrakı nitq mərhələsində bu səhvlər analiz olunur, gələcəkdə bu səhvlərin təkrarlanmaması üçün qətiyyətli tədbirlər görülməsi diqqətə çatdırılır: "Bunun müəyyən obyektiv səbələri olmuşdur. Çünkü o zamanlar, təəssüf ki, Sumqayıt müəssisələrinin əksəriyyətinin planlaşdırılması, onlara vəsait ayrılması Sovetlər İttifaqının paytaxtından həyata keçirilirdi. Əgər onlar zavodun tikilməsinə vəsait ayırırdılarsa, onun təmizləmə sexinin işləməsinə vəsait nəzərdə tutmamışdılar, deyirdilər ki, bunu sonra ayıracağıq və sairə. Bu sahədə müəyyən uyğunsuzluq o vaxtdan yaranıbdır və bunlar da Sumqayıtda ətraf mühitin çirklənməsinə, zəhərlənməsinə təsir göstəribdir. Sumqayıtda ekoloji vəziyyət pozulubdur. Bu həqiqətdir" [VIc.s.387].

Səmimi çıxışları ilə Heydər Əliyev ziyalılarımızı ictimai-siyasi proseslərə biganə qalmamağa, bir-birmizdən incisək də xalqdan inciməməyə çağırır. Xalqımızın ağır günlərində bir-birimizə kin saxlamamağı tövsiyə edir. Bu gün hamının qəbul etdiyi "Xalqdan heç kəs inciyə bilməz" səmimi bir aforizminin müəllifinə çevrilir: "Ancaq gərək alimlərimiz də, ziyalılarımız da kənarda qalmasınlar, çalışsınlar, çarpışsınlar, həyatımızın bu ağır dövründə biganəlik etməsinlər.

Burada mən bir çıxışdan belə başa düşdüm ki, mən kimdənsə inciməliyəm. Bilirsinizmi xalqdan heç kəs inciyə bilməz. Ola bilər, ayrı-ayrı adamlardan inciyəsən. Ancaq incikliyi saxlamaq lazım deyil, kinli olmaq da lazım deyil. Çünkü xalqımı-

zın bu ağır dövründə gərək bu hisslər kənara atılsın. Labüdlük hissiyyatı var. Hamımızın şüurunda bu hissiyyat gərək hakim mövqe tutsun. Biz bu ülvi hissiyyatla yaşamalıyıq" [Ic.s.153].

Tariximizi təhrif etməmək, keçmişimizi olduğu kimi gələcək nəsillərə çatdırmaq Heydər Əliyev dilində özünəməxsus bir səmimiyyətlə auditoriyaya izah olunur: "Hər şey heç vaxt tam gül-çiçək içində olmayıbdır. Biz keçmişdə hansı itkilər vermişik, amma hansı nailiyyətlər də əldə etmişik – hamısı məlumdur. Ona görə də keçmişi pisləmək lazım deyil. Keçmişdə pis olana pis, yaxşı olana yaxşı demək lazımdır. Mən belə fikirdəyəm" [XIIIc.s.84].

Səmimi nitqlərində fəlsəfilik onun nitqlərini cilalayır. Auditoriya məntiqi təfəkkürdən süzülən "zənnimcə" modal sözünün işləndiyi nitqin sehrinə düşür, Heydər Əliyev səmimiyyətinə ürəkdən inanır: "Biz iqtisadiyyatı yenidən qururuq, özəlləşdirmə haqqında qanun qəbul etmişik və onu həyata keçiririk. Amma ağıl-kamalla, iqtisadiyyatımızın sosial yönümünü nəzərə alaraq. Zənnimcə demək olmaz ki, səhv buraxmayacağıq, səhvlərdən heç kəs sığorta olunmayıb" [IXc.s.103].

Heydər Əliyev nitqində səmimiyyət fəlsəfi çalarlarla birgə təsadüf edir. "Tarixi qaralamaq olmaz" kimi fikirlər dahi şəxsiyyətlərə xasdır. "Həqiqətləri unutmaq" siyasi xadimlərə yad olan bir fikirdir. Bu baxımdan Heydər Əliyevin Sovet dönəmində Azərbaycan dilinin inkişafı ilə bağlı söylədiyi tarix fəlsəfəsinə aid mülahizələri səmimiyyətlə, elmi izahlarla auditoriyaya çatdırılır: "Bilirsiniz, Anadoluda, Özbəkistanda, Azərbaycanda yaşayanların hərəsinin özünəməxsus xüsusiyyətləri var. Məsələn, mən fəxr edirəm ki, Azərbaycan dili Sovet hakimiyyəti dövründə çox inkişaf etdi, daha da zənginləşdi. Adətən Sovet hakimiyyəti dövrünü çox tənqid edirlər. Amma olan həqiqətləri də unutmaq, qaralamaq olmaz. Bizim dilimiz məhz o illərdə inkişaf etdi. Dilimizin qrammatikası, qanunları haq-

qında o dövrdə nə qədər əsərlər yazıldı. Azərbaycan dili haqqında harada belə əsərlər yazılıb? Bəli, belə əsərlər sovet hakimiyyəti dövründə yazıldı. Yenə də deyirəm, tarixi qaralamaq olmaz" [VIIc.s.23].

Tarix fəlsəfəsini həmişə əldə rəhbər tutan Heydər Əliyev "indi də bu sözlərin üstündə dururam ki" deyərək tarixi təhrif etməməyə çağırır. "Bu gün üçün, gələcək üçün" tariximizin dəqiq yazılmasını elm adamlarından tələb edir. Sovet dövründə tarixin nə üçün təhrif olunmasına aydınlıq gətirir, "bunu deməklə biz heç də özümüz-özümüzü ləkələmirik" səmimi ifadəsi ilə auditoriyaya real tarixi həqiqətlərlə barışmaq lazım gəldiyini bildirir: "Mən o vaxtlar – Azərbaycanda işlədiyim dövrdə də deyirdim, indi də bu sözlərin üstündə dururam ki, tarixçilərimiz üçün bütün şəraiti yaratmağa hazıram. Bir şərtlə ki, bu şərtin əvəzində biz tarixçilərimizdən Azərbaycan tarixini bu gün üçün, gələcək nəsillər üçün və bütün gələcək üçün yaxşı əks etdirən əsərlər ala bilək. Odur ki, bu baxımdan bir məsləyə də toxunmaq istəyirik, tarixi təhrif etmək olmaz. Bu 70 illik Sovet dövründə tarix, ümumiyyətlə, dünya tarixi, o cümlədən Azərbaycan tarixi, habelə keçmiş Sovetlər İttifaqının ərazisində yaşayan digər millətlərin tarixi təhrif edilib. Nə üçün təhrif edilib? Çünkü o vaxt vəziyyət belə idi və bu, çox adi bir hal idi. Bunu deməklə biz heç də özümüz-özümüzü ləkələmirik. Bu bizdən asılı olmayan bir şeydir. Çünkü marksizm-leninizm ideologiyası vardı. Hər bir sistemin ideologiyası olmalıdır" [Ic.s.155].

Heydər Əliyev səmimiyyəti insanlardan keçmişimizə hörmət qoymağı tələb edir. 21 sentyabr 1993-cü il tarixdə, Azərbaycan Milli Elmlər Akademiyasında, ziyalılarla görüşdə Şərq ölkələri ilə müqayisədə Azərbaycanda təhsil səviyyəsinin yüksək olduğunu dilə gətirir. "Düzdür" modal sözü ilə başlayan cümlədə "nöqsanlar"ın da olmasını göstərir. Səmimiyyət-

lə "bu həqiqətdir" etirafını edir, "böyük nailiyyətləri də" diqqətə çatdırır. Qazanılanları itirməməyə çağırır: "Azərbaycanda savadsız adam tapmaq çətindir. Ətrafdakı Şərq ölkələrinə baxın, orada nə qədər savadsız adam var. Azərbaycanda ali təhsil səviyyəsi çox yüksəyə qalxmışdır. Dünənə qədər ali məktəblərimizi bəyənmirdilər, düzdür ali məktəblərin işində çoxlu nöqsan var, xüsusən rüşvətxorluq və s. çirkin hallar var. Bu həqiqətdir. Ancaq bütün bunlarla yanaşı, ali məktəblərimizin yaranması və inkişaf etməsi bu gün üçün nə qədər böyük nailiyyətdir! İndi siz başqa ölkələrin ali məktəbləri ilə müqayisə etdikdə görə bilərsiniz ki, biz ötən dövrdə böyük nailiyyətlər əldə etmişik. Bunları itirmək olmaz" [Ic.s.159].

Nitqdə Heydər Əliyev səmimiyyəti izahlara söykənir. O izahlara ki, səmimi ifadələrin arxasında dayanan problemlər çözülür. Auditoriya o izahlardan razı qalır, dinləyicilər üçün maraqlı məqamlar aydınlaşır: "Mən çox açıq danışan adamam. Həmişə söz xoş gəlməsə də, mən onu açıq deməliyəm. İndi bizim maliyyə sistemimiz elədir ki, biz bütün güzəştləri ləğv etdik və edirik. Sona qədər ləğv edilməlidir, heç bir güzəşt qalmamalıdır. Çünkü güzəşt ancaq sosialist iqtisadi sisteminə aiddir. Bazar iqtisadiyyatı, sərbəst iqtisadiyyatı sistemində güzəşt ola bilməz. İnsanlara başqa vasitələrlə kömək etmək olar. Biz başqa vasitələrlə kömək etməyə çalışacağıq" [XIIIc.s.112].

Heydər Əliyev səmimiyyəti təkcə ürəkdən gələn, auditoriyanı riqqətə gətirən sözlərlə ölçülmür. Bu səmimiyyət dərin məntiqə, fəlsəfiliyə, auditoriyanı inandırmaq gücündə olan düşündürücü izahlara söykənir.[1,2] Məşhur heykəltəraş, xalq

[1] "Heydər Əliyev dil haqqında və Heydər Əliyevin dili". Bakı, "Elm", 1998. səh.87

[2] Məmmədov M.B. "Ana dili və nitq mədəniyyəti məsələləri". Bakı, "Nurlan", 2004. səh.100

rəssamı Ömər Eldarovun görkəmli oftalmoloq, akademik Zərifə Əliyevanın xatirəsinə həsr etdiyi "Elegiya" əsərinin – mərmər abidənin, bu abidədən bəhs edən albomun təqdimat mərasimindəki çıxışı buna misaldır: "Şübhəsiz Moskva heykəltəraşları tərəfindən bir neçə təklif gəldi ki, onlar mənə kömək etmək, bu arzumu yerinə yetirmək istəyirlər. Amma bunların hamısını nəzərdən keçirəndən sonra fikirləşdim ki, mənim istədiyim bu abidənin müəllifi mütləq azərbaycanlı, öz həmvətənim olmalıdır. Həmvətənlərim içərisində Ömər Eldarovu seçdim... Bu abidəyə gəldikdə isə, Zərifə xanım xarakterini başqa bir adam aça bilməzdi. Mən isə Ömər Eldarovu tanıyıram, – o, sınaqdan çıxmış adamdır. Mənə başqa təkliflər də olmuşdu, onlarla görüşmüşdüm də, ancaq Ömərin yerini verə bilməzdilər" [IXc.s.155-161].

Heydər Əliyevin nitqində səmimiyyət xəlqiliyə söykənir. Sadə xalq dilində auditoriyaya müraciətlər edilir, real vəziyyət "bilirsiniz" kimi modal sözlərlə dinləyicilərə çatdırılır. Xalq ruhundan qidalanan belə səmimi nitqlərdə biz tez-tez sinonim cərgələrə – "yaramaz ünsürlər, düşmən ünsürlər", "düzgün, doğru daxili siyasət", təkrarlara – "ay yoldaşlar, ay qardaşlar, ay bacılar", qüvvətləndirici "axı" ədatına və s. rast gəlirik ki, bunlar da onun nitqinin ecazkarlığını artıran elementlərdir: "Bilirsiniz, indi insanlar rahat yaşayır və artıq keçmişi unudurlar. Bəziləri elə bilir ki, belə olmalı idi, belə də normaldır. Amma ay yoldaşlar, ay qardaşlar, ay bacılar, axı bu belə deyildir. Biz buraya nə qədər çətinliklərlə gəldik. Azərbaycanı daxildə nə qədər yaramaz ünsürlərdən təmizlədik, düşmən ünsürlərdən təmizlədik. Azərbaycana xaricdən təzyiq etmək, respublikanı təsir altına almaq, Azərbaycanı öz əlinə keçirmək cəhdlərinin qarşısını aldıq. Bunlar hamısı bizim düzgün, doğru daxili və xarici siyasətimizin nəticəsidir" [XIIIc.s.27].

Hər bir məqamda yeri gəldikcə böyük natiq insanları həmişə səmimiyyətə səsləyir. Səmimi olmaqdan utanmamağı tövsiyə edir. Həyat elə səmimiyyət üzərində qurulur fikrini bizlərə öyrədir:[1] “Həyatda elə sahələr var ki, keçmişdə biz adətən bu barədə danışmırdıq. Guya ki, bundan danışmaq ayıbdır və ya insanlar utanırlar. Guya ki, heç kim evlənmir. Amma hər bir gənc sevir, hər bir gənc tanış olur – qız oğlanla, oğlan qızla, hər bir gənc evlənir. Belə olmasa həyat olmaz ki!” [XIIIc.s.77]

Heydər Əliyev səmimiyyəti sadə, ümumişlək xalq ifadələri ilə dolu təvazökarlığa söykənir: “Qoy sizə həyatımdan maraqlı əhvalat danışım. Bir dəfə ölkənin görkəmli ustaları Moskvaya, Arxitektor Evinə toplaşmışdılar. Mənə söz verdilər. Sonra da başıma toplaşıb təəccüblə soruşdular: Siz arxitekturanı haradan belə dərindən bilirsiniz? Özünü tərifləmək olmasın, arxitekturadan, gözümdə qalan arzumdan söhbət getdikdə belə hallar mənim üçün son dərəcə xoşdur” [Ic.s.49].

Heydər Əliyev səmimiyyəti müxtəlif çeşidli auditoriyaları “sözün düzün, sözün düzünü deyirəm” ifadələrlə inandırır, inanadırdığı qədər də heyranlıqda saxlayır. Londonda keçirilən “Azərbaycanda investisiya imkanları” Beynəxalq konfransdakı yekun nitq (30 noyabr 1995-cı il) məhz belə ifadələrlə zəngindir: “Mən bu konfransın hazırlanmasının və keçirilməsinin sponsorlarına təşəkkürümü bildirmək istəyirəm. Sözün düzü, sponsor anlayışı, sponsor rolu bizim üçün bu sistemə ümumiyyətlə, yenicə qoşulan adamlar üçün o qədər də yaxşı anlaşıqlı və tanış deyildir. Mən sizinlə çox açıq, səmimi danışıram və sözün düzünü deyirəm. Düşünürdük ki, sponsor sponsordur. Əvvəllər biz bilirdik ki, sponsor olur və o, hər

---

[1] “Heydər Əliyev dil haqqında və Heydər Əliyevin dili”. Bakı, “Elm”, 1998.

hansı bir aktyorun, yaxud hər hansı bir bədii tamaşanın işinə sponsorluq edir və sair. Bizim üçün bütün bunlar yeni anlayışlardır. Lakin indi biz sponsorun kim olduğunu, nə kimi rol oynadığını, necə bir həqiqətən nəcib rol oynadığını yavaş-yavaş başa düşürük" [Vc.s.52]

Azərbaycanın müstəqilliyi ilə bağlı ciddi danışıqlarda Heydər Əliyevin səmimi fikirləri auditoriyaya yol açır, izahlarla çatdırılan məzmun şüurlara işıq saçır. "Qoy heç kəs deməsin ki" xəlqiliyə söykənən ifadə siyasi natiqin təvazökarlığını bir daha nümayiş etdirir: "Biz müstəqilliyi silahla, dava ilə, üsyanla əldə etməmişik. Bu müstəqillik tarixi prosesdir, onun ictimai siyasi proseslər əsasında əldə etmişik. Qoy heç kəs deməsin ki, kimsə bir qəhrəman kimi bu müstəqilliyin sərkərdəsidir, yaxud müstəqilliyi əldə edən bir siyasi xadimdir. Müstəqillik heç kəsə, heç bir təşkilata mənsub deyildir. Müstəqillik xalqa mənsubdur. Bu, tarixin, taleyin xalqa bəxş etdiyi böyük bir nemətdir. Biz bunu qiymətləndirməliyik" [Ic.s.50].

Heydər Əliyev səmimiyyəti təfəkkürə söykənən məntiqi izahlarla müxtəlif çeşidli auditoriyaları bəzəyir. Ölkədə aqrar islahatların təzəcə aparıldığı dövrlərdə "islahatların ləngiməsini təbii qəbul edən" ulu öndər iqtisadi islahatların ləngiməsini səmimiyyətlə izah və etiraf edir: "Respublikamızda, ölkəmizdə iqtisadiyyatın böyük bir hissəsini aqrar bölmə təşkil edir. Ola bilər ki, həmin bölmə bu islahatları aparmaq üçün daha mürəkkəb sahədir. Bu mürəkkəbliyinə görə aqrar bölmədə islahatların ləngiməsi müəyyən qədər təbiidir. Amma eyni zamanda etiraf etməliyik ki, aqrar bölmədə islahatların ləngiməsi bizim özümüzün bu məsələlərlə qətiyyətlə, cəsarətlə yanaşmamağımızın nəticəsidir" [IIIc.s.32]

İqtisadiyyatımızla bağlı canlı yayımlanan müşavirələrdə situasiyanın ağırlığı xalqın diqqətinə çatdırılır, islahatları düzgün aparmasaq hətta "dərin quyunun dibinə düşmək", təhlü-

kəsini də göz önünə gətirir, sonda "yol vermək olmaz" qətiyyətli ifadə ilə vəziyyətdən çıxış yolunu tapa bilir və bu islahatlar xalqın gələcəkdə bəhrələnməsi əminliyini yaradır: "İndi aqrar bölməmiz ağır bir mərhələdədir. İslhatlar isə gərək bizi bu ağır mərhələdən çıxarıb iqtisadiyyatın inkişafı üçün əsas yaratsın və bu inkişafı ardıcıl olaraq təmin etsin. Əgər islahatlar bizi çox hissəsi dağılmış aqrar bölmənin daha da dağılmasına doğru aparsa, onda dərin quyunun dibinə düşmüş olarıq. Ona görə də bu islahatların aparılmasında mühafizəkarlığa qətiyyən yol vermək olmaz. Bir fikir də əsas yer tutmalıdır: aqrar bölmədə hər bir adam bu islahatların aparılmasından bəhrələnməlidir, hər bir vətəndaşımız bəhrələnməlidir" [IIIc.s.32].

Müstəqilliyimizin ilk illərində iqtisadi vəziyyətimizin ağırlığını, xalqın rifah halındakı böyük çətinlikləri səmimiyyətlə dilinə gətirən böyük natiq auditoriyanı əminliklə gələcək günlərə hazırlayır. Səmimiyyətin nikbinliklə sintezini verə bilən nitqini yaddaqalan edə bilir: "İqtisadi vəziyyətimiz ağırdır. Biz keçid dövründə yaşayırıq. Bunlar hamısı iqtisadiyyatda, xalqın rifah halında böyük çətinliklər yaradıbdır. Bunlar təkcə bizim respublikaya aid olan məsələlər deyil, bir iqtisadi sistemdən başqa bir iqtisadi sistemə keçən digər respublikaların həyatında da mövcud olan proseslərdir. Əminəm ki, 1996-cı ildə nəzərdə tutulmuş tədbirlər iqtisadiyyatda tədricən yüksəlişə nail olmaq üçün əsas yaradacaqdır və xalqın rifah halının yaxşılaşdırılması üçün yeni şərait əldə olunacaqdır. Mən buna əminəm, buna inanıram və bu inamla da 1996-cı ildə biz öz işimizə başlayacağıq" [Vc.s.249].

Heydər Əliyev səmimiyyəti qardaş ölkələrə yönələrkən özü demiş "ərk edir", "ərklə deyir". Qardaş Türkiyə Respublikasının iş adamlarını qətiyyətlə Azərbaycan iqtisadiyyatına sərmayə qoymağa çağırır. Bu zaman "mən açıq danışıram, çünkü biz qardaşıq" deməklə söhbətə səmimi körpü salır, Tür-

kiyəli iş adamlarını inandıra bilir: "Mən açıq danışıram. Çünkü biz qardaşıq. Qardaş ilə qardaş arasında söhbət tamamilə açıq olmalıdır. Ona görə də mən ərk edirəm və bu sözləri də ərklə deyirəm. Bunu bir də ona görə deyirəm ki, mən bu işləri izləyirəm, görürəm ki, Türkiyə ilə Azərbaycan arasında olan iqtisadi əlaqələr, əksərən ticarət əlaqələrindən ibarətdir. Şübhəsiz ki, ticarət də olmalıdır və biz ticarət əlaqələrini bundan sonrada inkişaf etdirməliyik. Bu necə deyərlər, iqtisadi əlaqələrin başlanğıcıdır. Ticarət əlaqələri olmasa, başqa əlaqələr də olmayacaqdır. Ancaq Türkiyə ilə Azərbaycan arasında olan əlaqələr respublikamıza sərmayə qoymaq, ölkəmizdə müştərək iş görmək, müştərək işlər nəticəsində həm mənfəət götürmək, həm də Azərbaycanın iqtsadiyyatını inkişaf etdirməkdən ibarət olmalıdır" [VIc.s.357].

İqtisadi vəziyyətin ağırlığını bütün çılpaqlığı ilə söyləyən Heydər Əliyev xalqımızın çətin vəziyyətdə yaşadığını dilə gətirərək nikbin notlarla çıxışını sona çatdırır. Çətinliklər səmimiyyətlə dilə gətirilir, çətinliklərin sonu olacağı inamı nikbinliklə auditoriyalara çatdırılır: "Respublikamız ağır böhran içindədir. İqtisadi-böhran bir tərəfdən müharibənin altı ilə yaxın davam etməsi ilə əlaqədardır. İkinci tərəfdən bəzi obyektiv və subyektiv səbəblərlə bağlıdır. Bunların hamısı xalqımızın rifah halının aşağı düşməsinə səbəb olubdur. Xalqımız çətin vəziyyətdə yaşayır. Ancaq biz bilirik ki, xalqımız dözümlü xalqdır, bu çətinliklərə dözəcək, bu ağrı-acılı 1993-cü ili başa çatdıracaq və 94-cü ildə iqtisadiyyatımızın inkişafında dönüşlər olacaq, xalqımızın rifah halı günü gündən yaxşılaşacaqdır" [Ic.s.308].

Heydər Əliyev nitqinə daxilən xas olan səmimiyyət ölkə iqtisadiyyatının böhranlı dövrləri sayılan XX əsrin 90-cı illərində daha da qabarıq şəkildə üzə çıxır. Düşdüyümüz iqtisadi vəziyyətləri "gəlin açıq danışaq" ifadələri ilə auditoriyalara

izah olunur: "İndi gəlin açıq danışaq. Belə çıxır ki, Azərbaycanda daim tənqid olunmuş, bəzən söyülmüş Sovet İttifaqının, imperiyanın yaratdığı təsərrüfat ondan sonrakı dövrdə dağılıb, üstünə də bir şey gəlməyibdir. Əgər biz müstəqilliyi bundan ötrü əldə etmişiksə ki, olan-qalanı da dağıdaq, özümüz bir şey yaratmayaq, qorumayaq, – axı belə getsə, müəyyən bir vaxtdan sonra hər şey dağılacaq və biz boş yerdə qalacağıq" [Ic.s.268].

Ziyalılarımızın – alimlərimizin, yazıçılarımızın mədəniyyət işçilərimizin maddi vəziyyətini həmişə nəzarətdə saxlayan dövlət başçısı müstəqilliyimizin ilk illərində, özü demiş "Keçid dövrünün gerçəkliyində" onların ağır maddi şəraitdə yaşamasını qeyd edir, bütün bunları "ürək ağrısı ilə" qarşılayır. Lakin "bu belə olmamalıdır" qətiyyətli ifadəsi ilə auditoriyanı pessimist ovqatdan çıxararaq, onları "əmin edirəm ki" nikbinlik ifadəsi ilə gələcək günlərə hazırlayır: "İndi iqtisadiyyatımızda vəziyyət ağırdır, müharibə şəraitindəyik, çətin yaşayırıq və məlumdur ki, əhalimizin böyük hissəsi ağır maddi vəziyyətdədir. O cümlədən ziyalılarımızın – alimlərimizin, yazıçılarımızın, mədəniyyət işçilərimizin çox hissəsi ağır maddi şəraitdə yaşayır. Bunlar keçid dövrünün gerçəkliyidir. Mən bunları ürək ağrısı ilə deyirəm. Belə olmamalıdır. Yaradıcı adamlar, ziyalılar, mədəniyyətimizi, elmimizi yaradanlar, inkişaf etdirənlər daim cəmiyyətin və dövlətin qayğısı ilə əhatə olunmalıdırlar. Əmin edirəm ki, biz bundan sonra da əlimizdən gələni edəcəyik və çalışacağıq. "Əhalinin bu təbəqəsinə, bu ağır dövrdə imkan dairəsində müəyyən yardımlar olsun" [IIIc.s.47].

1990-1995-ci illərdə sənət adamlarının maddi güzəranının ağır olduğunu dilə gətirən Heydər Əliyev vəziyyətin heç də çıxılmaz olmadığını, vətənpərvərlik mövzusunda yazılan əsərlərə dövlətin qayğı göstərəcəyi inamını auditoriyaya çatdırır: "Mən bilirəm, indi rəssamlar üçün yaşamaq çətindir. Maddi

vəziyyət ağırdır. Ümumiyyətlə yaradıcı ziyalılarımız üçün çətindir. Keçmişdəki kimi dövlət sifarişi yoxdur. Ancaq inanın ki, bizim vətən müharibəmiz, yəni torpaqlarımızın müdafiəsi ilə əlaqədar mövzularda yaxşı əsərlər yaradılsa, dövlət onlara müəyyən qayğı göstərə bilər, vəsait ayıra bilər və belə dəyərli əsərləri biz lazımi dərəcədə qiymətləndirə bilərik, onları dövlət üçün ala da bilərik" [IIIc.s.70].

Azərbaycan xalqının görkəmli oğul və qızlarının yubiley şənliklərində, təntəli mərasimlərdə Heydər Əliyevin səmimiyyəti ılıq və nurlu bahar yağışı kimi auditoriya üzərinə səpələnir.

Dünyanın ən səmimi sözlərini həmin şəxslərə ünvanlayır. "Görkəmli bəstəkar, Azərbaycanın xalq artisti Tofiq Quliyevin 80 illiyinə həsr edilmiş yubiley gecəsindəki çıxışda olduğu kimi: "Əziz Tofiq! Mən sənin 80 illik yubileyin münasibətilə sənə təbrik məktubu göndərmişəm. Onu da bil ki, mən göndərdiyim və ümumiyyətlə, yazdığım məktubların hamısını əvvəldən axıradək özüm yazıram. Siz də, hamınız da bilirsiniz ki, mənim dediyim sözlərin də hamısı öz beynimdən gələn sözlərdir, heç vaxt əlimdə kağız olmayıbdır. Sənin bu yubileyini belə təntənəli şəkildə keçirməklə biz hamımız borcumuzu yerinə yetirmişik. Bəlkə də mən buraya qalxmazdım. Ancaq hesab edirəm, sən bu yubileydə mənim haqqımda o qədər sözlər dedin ki, mən buraya gəldim sənə deyəm ki, bu sənin yubileyindir, bu gün sənin günündür" [XIIIc.s.214].

Səmimiyyət Azərbaycan Milli Elmlər Akademiyasının rəhbərliyi, həqiqi və müxbir üzvləri, institut direktorları və aparıcı alimləri ilə görüşdə də özünü göstərir. Səmimi deyilən "sizin də məvacibiniz azdır", "bizim ziyalıların, alimlərin maddi vəziyyəti məni narahat edir" ifadələri alimlər auditoriyasını inandıra və gələcəyə hazırlaya bilir: "İndi də sizin məvacibiniz dövlət orqanlarında işləyən adamların məvacibindən az deyil, ancaq onlarınkı da, sizinki də azdır, hamınınkı

azdır. Bilirəm ki, bu da böyük çətinliklər yaradır. Bu şəxsən məni narahat edir. Ümumiyyətlə, əhalinin sosial-iqtisadi vəziyyəti, maddi vəziyyəti məni narahat edir. Ona görə bu sahədə də çalışırıq və bundan sonra da çalışacağıq ki, mövcud imkanlardan istifadə edək və sizin, yəni Elmlər Akademiyası işçilərinin məvacibini artıraq" [XIIIc.s.363]

"Bunları etiraf etmək lazımdır" deyən Heydər Əliyev dühası etirafı ilə auditoriyaların gözündə ucalır. Həmin etirafları zamanla, məkanla uzlaşdıran böyük natiq öz səmimi izahı ilə dinləyicilərini heyran qoyur. O müstəqil Azərbaycan Respublikası gənclərinin birinci forumundakı nitqdə (2 fevral 1996-cı il, Respublika sarayı) Azərbaycanın ilk Konstitusiyasına az istinad edilməsinə təəssüf edərək, qanunçuluq, konstitusiyaçılıq ənənəsi yarada bilməməyi etiraf edir. Etirafın ardınca güclü məntiqə söykənən izahedici nitqlə bu təəssüfə, bu etirafa aydınlıq gətirir: "Mən təəssüf edirəm ki, bu gün burada gənclərin çıxışlarında Azərbaycanın ilk Konstitusiyası haqqında sözlər az deyildi. Bu, təkcə gənclərə aid deyil, ümumiyyətlə bizim cəmiyyətimizə aid olan bir haldır. Çünkü bunu etiraf etmək lazımdır, biz hələ qanunçuluq, konstitusiyaçılıq ənənəsi yarada bilməmişik. Biz hələ ki, qanunun, Konstitusiyanın daim təbliğ olunmasına nail ola bilməmişik, qanunların hər bir vətəndaş tərəfindən dərk olunmasına nail ola bilməmişik. Bunları etiraf etmək lazımdır, ancaq bunları böyük bir xəta da hesab etmək olmaz. Çünkü indiyə qədər Azərbaycanda hüquqi dövlət olmayıbdır, qanunların işlənib-işlənməməsi vətəndaşlar üçün o qədər də əhəmiyyətli olmayıbdır və keçmişdə qəbul olunmuş konstitusiyalar, şübhəsiz ki, bizim dövlət orqanlarının, cəmiyyətin fəaliyyətini tənzimləmişdir, ancaq Əsas Qanun adı daşısa da Əsas Qanun olmamışdır" [Vc.s.309].

Müstəqilliyimizin ilk illərində iqtisadi vəziyyətimizin ağırlığını, xalqın rifah halındakı böyük çətinlikləri səmimiyyətlə dilinə gətirən böyük natiq auditoriyanı əminliklə gələcək günlərə hazırlayır. Səmimiyyətin nikbinliklə sintezini verə bilə, nitqini yaddaqalan edə bilir: "İqtisadi vəziyyətimiz ağırdır. Biz keçid dövründə yaşayırıq. Bunlar hamısı iqtisadiyyatda, xalqın rifah halında böyük çətinliklər yaradıbdır. Bunlar təkcə bizim respublikaya aid olan məsələlər deyil, bir iqtisadi sistemdən başqa bir iqtisadi sistemə keçən digər respublikaların həyatında da mövcud olan proseslərdir. Əminəm ki, 1996-cı ildə nəzərdə tutlmuş tədbirlər iqtisadiyyatda tədricən yüksəlişə nail olmaq üçün əsas yaradacaqdır və xalqın rifah halının yaxşılaşdırılması üçün yeni şərait əldə olunacaqdır. Mən buna əminəm, buna inanıram və bu inamla da 1996-cı ildə biz öz işimizə başlayacağıq" [Vc.s.249].

Səmimiyyətə söykənən, səmimiyyətdən güc alan dövlət başçısı sələflərini yüksək hörmətlə yad edir, insanların bir-birinə, xalqımızın dəyərli insanlarının xatirəsinə biganəliyi onun qəlbinə dəyir. 21 iyun 1996-cı il tarixdə, görkəmli alim və Dövlət xadimi Vəli Yusif oğlu Axundovun 80 illiyinə həsr olunmuş yubiley yığıncağındakı nitqdə o böyük bir səmimiyyətlə V.Axundovun Azərbaycan Respublikasına on il rəhbərlik etdiyi dövrü onun bütün xidmətlərindən şərəfli və üstünü hesab edir: "Sizin qarşınızda mən həmişə səmimi olmuşam. Bu gün də səmimi danışıram. Təəsüflər olsun ki, belə bir yubileyin keçirilməsi haqqında mən heç bir təşkilatdan şəxsən təşəbbüs almamışam. Bu gün bu salona ziyalılarımız, Vəli Axundovu tanıyanlar, ona hörmət edənlər, onun qohum-əqrəbası toplaşıblar. Amma heç kim təşəbbüs göstərmədi ki, Vəli Axundovun yubileyi yaxınlaşır, onu da qeyd etmək lazımdır. Yada salmalıdırlar. Mən çox düşündüm. Uzun illər siyasi fəaliyyətim zamanı mən belə addımlarla rastlaşmışam. Hər dəfə

belə insanların bir-birinə xalqımızın dəyərli insanlarının xatirəsinə belə biganəliyi məni narahat edibdir və bu gün də narahat edir. Ona görə də mən bu addımla istəyirəm xalqımızı, millətimizi, cəmiyyətimizi tariximizə, insanlara lazımi münasibət göstərmək istiqamətinə yönəldim” [VIc.s.447].

“Gülüstan” sarayında yazıçı Yusif Səmədoğlunun 60 illiyinə həsr olunmuş təntənəli mərasimdə (19 dekabr 1995-ci il) respublikamızın, xalqımızın, eləcədə mədəniyyət xadimlərinin də yaşayış tərzlərinin çətinliyini, ağırlığını dilə gətirir, keçmişimizi unutmamağa çağırır. Lakin milli azadlığa çıxmağımız, Dövlət müstəqilliyini əldə etməyimiz müqabilində bu çətinliklərə dözməyin mümkünlüyünü auditoriyaya çatdırır. Ən böyük nailiyyətimizin, ən böyük qazancımızın müstəqillik olduğunu bəyan edir: “Respublikamız, xalqımız ağır dövrünü yaşayır. Burada Elçin 70-ci illəri çox həyəcanla, onun sözü ilə desək, nostalgiya ilə xatırladı. Buna əsas var. Doğrudan da o illərdə 60-70-ci illərdə ədəbiyyata, mədəniyyətə gəlmiş gözəl bir nəsil indi artıq ədəbiyyatımızın, mədəniyyətimizin aparıcı qüvvələridir: Yusif də, Anar da, Maqsud da, Elçin də, başqaları da. Ona görə də bir daha deyirəm, o illəri xatırlamağa və onun qiymətini unutmamağa əsas var. Ancaq nə qədər ağır olsa da bugünkü günümüz də qiymətlidir. Çünkü biz indi milli azadlığa çıxmışıq, Dövlət müstəqilliyini əldə etmişik, müstəqil Dövlət kimi yaşayırıq. Yaşayışımız çətindir, ağırdır. Bilirəm ki, mədəniyyət xadimləri üçün də ağırdır, çətindir. Amma bunların hamısının müqabilində bizim böyük nailiyyətlərimiz var: Azərbaycanın dövlət müstəqilliyi. Bu ən böyük nailiyyətdir” [Vc.s.201].

Nitq və çıxışlarında səmimiyyətə söykənmək hələ Sovet dövründə böyük natiqə xas olan bir xüsusiyyətdir: “Mən çalışırdım ki, jurnalistlər bacardıqca daha açıq, yazsınlar” ifadəsi yetərlidir ki, auditoriya imperiya dövründə Heydər Əliyevin

səmimi dövlət xadimi olması qənaətinə gəlsin: "Mən jurnalist peşəsinə həmişə çox hörmətlə yanaşmışam. Biz Sovet İttifaqında olduğumuz illərdə, hamımız kommunist ideologiyasına xidmət etdiyimiz dövrlərdə çalışırdım ki, jurnalistlər hadisələrin fövqündə olsunlar, jurnalistlərə daha böyük imkanlar verilsin. Mən çalışırdım ki, jurnalistlər bacardıqca daha açıq yazsınlar, hərçənd o vaxtlar bu, dövlətdə və cəmiyyətdə mövcud olmuş ümumi konsepsiyaya görə çox çətin idi. Sözün düzü, bu gün iftixar hissi ilə deyə bilərəm ki, 1969-cu ildə mən Azərbaycan KP MK-nın birinci katibi, yəni Azərbaycan rəhbəri seçildikdə ilk addımlarım məhz aşkarlıqla, açıqlıqla əlaqədar olmuşdur. İstəyirdim ki, heç nə gizlədilməsin, hər şey mətbuatda dərc edilsin və adamlara cəmiyyətimizdə nə varsa hamısını – yaxşını da, pisi də, qiymətli olanı da, mənfi olanı da bilməyə imkan verilsin.

Yeri gəlmişkən, deyim ki, "Oqonyok"un nömrələrində dərc edilən məqalələrimdən, müsahibələrimdən danışarkən (bunları qaldırıb baxmaq olar) bildirmək istəyirəm ki, öz yazdıqlarımın və ya müxbirlərlə söhbətlərimin hamısını o dövrün mənfi hallarına, bu halların, korrupsiyanın, rüşvətxorluğun, qəyyumçuluğun və əslində həmin quruluşun dağılmasına gətirib çıxaran bir çox digər mənfi halların kökünü kəsməyin zəruriliyinə həsr etmişəm. Mən bu barədə açıq danışır və açıq yazırdım. Ona görə də bu gün də o zamanlar yazdıqlarım barədə, o cümlədən "Oqonyok" jurnalının səhifələrində yazdıqlarım haqqında təmiz vicdanla danışıram" [VIIc.s.375].

Ölkəmizin ziyalı insanları ilə görüşlərdə Heydər Əliyev səmimiyyəti auditoriyalara hakim kəsilir. Belə görüşlər ulu öndərdə bayram ovqatı yaradır. Ziyalılarla "yan-yana", "üz-üzə" durmaqdan fəxr duyur: "Ziyalılarla görüşmək həmişə böyük bir bayram təsəvvürü yaradır. Mən həyatım boyu belə düşünmüşəm, belə fikirləşmişəm. Ona görə, bəlkə görüş sizin

üçün də əhəmiyyətlidir, ancaq mənim üçün həqiqətən artıq dəyərlidir. Çünkü uzun müddət belə bir imkandan məhrum olmuşdum. Yalnız qəlbim, ürəyim həmişə Vətənlə, xalqımla və xalqımın qabaqcıl dəstəsi olan ziyalılarla, onların yaradıcılığı, işləri ilə bağlı olmuşdur. Ancaq indi yan-yanayıq, üz-üzə durmuşuq. Bu mənim üçün böyük hadisədir. Təşəkkür edirəm" [Ic.s.148].

Azərbaycanın dövlət xadimlərinə münasibətdə Heydər Əliyev səmimidir. Heydər Əliyevə görə "şəxsiyyətləri itirmək olmaz". Nəriman Nərimanovla bağlı onun səmimi fikirləri buna əyani misaldır. Öz fikrini "açıq demək istəyən" lider natiq tarixi təhrif etməməyə, xalqa xəyanət etməməyə, onu çaşdırmamağa səsləyir: "...Eləcədə şəxsiyyətləri itirmək olmaz. Bizdən ötrü Mirzə Fətəli Axundov da, Əhməd bəy Ağayev də, Məmmədəmin Rəsulzadə də böyük şəxsiyyətlərdir, Nəriman Nərimanov da.... Amma onu da bilin ki, Nəriman Nərimanov müstəqil demokratik dövlətin xadimlərinin hamısını qoruyub saxlayan adamlardan olmuşdur. Məmmədəmin Rəsulzadəni də o qoruyub saxlamışdır. Məşhur generallar Mehmandarov və Şıxlınskini həbs etmək istəyirdilər. O zaman Nərimanov Leninə məktub yazaraq bildirmişdir ki, əvvəllər çar ordusunda, sonra isə müstəqil dövlətin ordusunda xidmət etmiş bu adamlar dəyərli şəxsiyyətlərdir və onlardan istifadə etmək lazımdır. Bütün bunlarla mən öz fikrimi açıq demək istəyirəm: tarixi təhrif etmək olmaz. Tarixi təhrif edənlər xalqa xəyanət edir, onu çaşdırırlar. Buna son qoymaq lazımdır. Gələcəkdə buna yol vermək olmaz" [Ic.s.159].

Auditoriya sadə zəhmət adamları, qaçqın və köçkün, müharibə əlillərindən təşkil olunursa səmimiyyətin dərəcəsi də artır. 15 sentyabr 1997-ci il tarixdə şəhid ailələrinə mənzillər veriləndə söylədiyi nitq buna bariz nümunədir: "Mən hər şeyi açıq deyirəm. Həyatım belədir ki, mən həmişə hər bir sözü

olduğu kimi açıq demişəm. Bu həqiqətdir. Həqiqətin də üstünü örtmək olmaz. Bu gün mənzil alanlar arasında nazir yoxdur ki, gəlib burada bir xüsusi təmir aparsın. Bu gün mənzil alanlar hamısı sadə insanlardır. Amma bəlkə maliyyə nazirinə bu binada ev versək, o da bu mənzili təmir etməzdi, necə var olduğu kimi yaşayardı. Bu gün dedim ki, bəlkə mən özüm də gəlib bu binadakı mənzillərdən birini özümə götürüm" [XIIIc.s.208].

Xalqla sadə zəhmət adamları ilə köçkün və qaçqınlarla Heydər Əliyev səmimiyyəti sanki aşıb-daşır. "Heç kəs heç nədən çəkinməsin və utanmasın" kimi səmimi ifadədən sonra auditoriyada hər bir kəs ürək sözlərini öz rəhbərinə, dövlət başçısına çatdıra bilir: "Bu görüş bu gün məhz bu məqsədlə təşkil olunubdur. Mən hesab edirəm ki, bu gün burada açıq, səmimi söhbət aparmalıyıq. Heç kəs heç nədən çəkinməsin və utanmasın. Biz hər bir şeyi, hər bir tədbiri, fikrimizi, sözümüzü hər zaman aşkarlıq şəraitində həyata keçiririk, deyirik. Mən istərdim ki, bu gün də bu şəraitdə səmimi söhbətimiz olsun" [VIIc.s.272].

Heydər Əliyevin səmimiyyəti ciddi beynəlxalq məsələlərin həllində, beynəlxalq təşkilatların fəaliyyəti ilə bağlı məsələlərdə də görünür. Öz fikirlərini çox vaxt "zənnimcə" modal sözü ilə auditoriyaya çatdıran böyük natiq məntiqə söykənən, "açıq söhbətdən istifadə" yolu ilə səmimiyyətini ortaya qoyur. Müstəqil Dövlətlər Birliyi ilə əlaqədar onun nitqi səmimi olduğu qədər də qətiyyətlidir: "Zənnimcə, MDB-nin fəaliyyətini təkmilləşdirməyin real yollarını tapmaq üçün biz bu açıq söhbətdən istifadə edə bilsək, – hökmən istifadə etməliyik, – onda şübhəsiz bu MDB-nin fəaliyyətinin sonu olmayacaqdır. Biz onu dağıtmaq istəmirik. Biz istəyirik ki, MDB bütün dövlətlərin maraqlarına cavab versin, onlardan hər birinin milli mənafelərini gözləyən, lakin eyni zamanda düzgün

istiqamətdə inteqrasiyaya, səylərin birləşdirilməsinə kömək edən bir təşkilata çevrilsin” [XIIIc.s.252].

Heydər Əliyevin səmimiyyəti ölkələr arasındakı qarşılıqlı münasibətlərdə özünü göstərir. Fransada Milli Məclisdə Azərbaycan Prezidentinin şərəfinə təşkil edilmiş rəsmi qəbuldakı nitqdə Azərbaycan-Fransa münasibətlərinə səmimi bir aydınlıq gətirir: “Qarşılıqlı münasibətlərdə səmimilik hiss etdikdə heç nəyi gizlətmirsən və hər şeyi açıqca bildirirsən. Buna görə də bizi burada, Fransada narahat edən məsələlərdən açıq danışdıq. Təbiidir ki, bu erməni lobbisinin, erməni diasporunun fəaliyyətinə aiddir. Bununla yanaşı, mən hiss edirəm, siz ürəkdən istəyirsiniz ki, Ermənistan-Azərbaycan münaqişəsi mümkün qədər tez bir vaxtda aradan qaldırılsın. Buna görə sağ olun” [XIIIc.s.28].

Heydər Əliyevin nitqində səmimilik real faktlara əsaslanır. Bu özünü xüsusilə mətbuat konfranslarında verilən sualların cavablandırılmasında göstərir. 3 iyul 1996-cı ildə Bonn şəhərində mətbuat konfransında jurnalist Mançuryanın erməni xislətli sualına verilən cavab səmimiyyətin bariz nümunəsidir.

Sual: “Cənab, prezident. Siz Azərbaycanda hüquqi dövlətin qurulmasından danışdınız. Lakin seçkiləri müşahidə edən ekspertlərin fikrincə, Azərbaycanda seçkilər demokratik keçirilməyib, müxalifət partiyaları qadağan olunub, qəzetlərin hamısı bağlanıb, jurnalistlər dustaqxanalarda yatırlar. Belə bir ölkədə demokratiyadan necə danışmaq olar”?

Bu cür məkrli suala verilən cavab nitq mədəniyyəti baxımından öyrənilməyə layiqdir. Elə erməni məkrli, erməni xislətli suala qarşı cavab kəskin notlarla başlayır: “Güman edirəm ki, cənab Mançuryanın sualı onun Azərbaycana qarşı nə qədər qərəzli olduğunu göstərir. Birincisi, onu demək istəyirəm ki, cənab Mançuryanın dediyi sözlər hamısı yalandır, heç

biri həqiqətə uyğun deyil. Güman edirəm ki, o, bunların hamısını özü uydurur".

Cavabına davam edən prezident real faktlara söykənərək səmimiyyətlə auditoriyanı inandıra bilir: "Azərbaycanda 30-dan çox siyasi partiya rəsmi qeydiyyatdan keçibdir. Noyabr parlament seçkilərində 8 siyasi partiya iştirak edirdi. Budur, deyirlər ki, 560 qəzet çıxır. Bunların böyük əksəriyyəti müxalifət partiyalarına, siyasi təşkilatlara məxsus olan qəzetlərdir. Heç bir senzura yoxdur. Hansı jurnalist nə istəyirsə onu da yazır. Mən bunların hamısını normal hesab edirəm. Mançuryanın sualını da ümumiyyətlə, sual kimi normal hesab edirəm, əgər yalan danışmasaydı. Mən açıq deyirəm ki, Azərbaycan həbsxanalarında bir nəfər də olsa jurnalist yoxdur. Mən sizin sualınıza ümumi sözlərlə yox faktlarla cavab verdim. Amma eyni zamanda mənə bu sualı verdiyinizə görə təşəkkür edirəm. Çünkü bu, mənə imkan yaratdı ki, Azərbaycanda gedən demokratik proseslər haqqında burada olan jurnalistlərə ətraflı məlumat verim" [VIIc.s.59-60].

Ən sonda erməni jurnalistinə təşəkkür edən böyük natiq öz cazibədar, real faktlara söykənən səmimi fikirləri ilə nitqin etik xüsusiyyətlərini gələcək gənc diplomatlara öyrədir.

Uşaqlar və yeniyetmələrlə bağlı Ulu Öndərin çıxış və nitqləri səmimiyyət və nikbinliklə doludur. Uşaqların problemlərinin həlli isə qətiyyətsiz keçinmir. 1997-ci il Uşaqların Beynəxalq Televiziya və Radio günü münasibətilə "Uşaqlar dünyanın sevincidir" devizi altında keçirilən şənlikdədə "hər bir uşağa", "hər bir övladımıza" ürəyi istədiyi kimi qayğı göstərə bilmədiyini dilə gətirən ölkə rəhbəri nitqini uşaqlara göstərilən qayğının artırılması nikbinliyi və qətiyyəti ilə yekunlaşdırır: Azərbaycanda uşaqlara qayğı gündən-günə artır və artacaqdır. Təbiidir ki, respublikamızın həyatının keçid dövründə, ağır dövründə uşaqların hamısına istədiyimiz kimi,

bir ata kimi, valideyn kimi, bəlkə də hər bir uşağa, hər bir övladımıza ürəyimiz istədiyi kimi qayğı göstərə bilmirik. Ancaq biz bunun üçün çalışırıq. Hesab edirəm ki, gün-gündən biz bu qayğını artıra bilirik və gələcəkdə də artıracağıq".

"Mən demək istəmirəm ki, bizdə hər şey yaxşıdır" kimi səmimi ifadədən sonra Heydər Əliyevin əleyhdarlarına, onun müxaliflərinə deməyə söz qalmır. Sonda isə analitik təfəkkürlə müqayisə aparan, paralellər aparan böyük natiq bizdə vəziyyətin heç də pis olmadığını, "şübhəsiz" işlərimizin müsbət qiymətləndirilməsini lazım bilir: "Siz Moskva televiziyasına baxırsınız, görürsünüz ki, maaşların 3 ay, 4 ay, 5 ay verilməməsi, pulun oradan götürülüb buraya, buradan götürülüb oraya göndərilməsi haqqında hər gün danışırlar. Mən demək istəmirəm ki, bizdə hər şey yaxşıdır. Mən daim maraqlanıram, – bizdə maaşlarla, pensiyalarla əlaqədar borc bir aylıqdır. Yaxşı olar ki, hər ayınkı, vaxtında verilsin və buna da çalışmaq lazımdır. Biz başqa ölkələrin televiziyasını görmürük, təkcə Rusiya televeziyasına baxırıq. Başqalarını görsək bəlkə oradakı vəziyyəti də bilərdik. Hər halda Rusiya televiziyasından aldığımız məlumata baxanda, şübhəsiz ki, bizim bu sahədə də işlərimizi müsbət qiymətləndirmək lazımdır" [VIIIc.s.83].

Heydər Əliyev səmimiyyəti! Bu elə bir səmimiyyətdir ki, onu müxalifləri də qəbul edir. Bu elə bir səmimiyyətdir ki, siyasi əleyhdarlarına da ünvanlana bilir. 29 noyabr 1997-ci il tarixdə YAP-ın yaradılmasının 5-ci il dönümü münasibətilə keçirilən təntənəli mərasimdə, Heydər Əliyevin Azərbaycan Xalq Cəbhəsi haqqındakı səmimi fikirləri dünya siyasəti və diplomatiyası sahəsində səmimi sayıla biləcək nitqlərdən biridir. Azərbaycan xalqının imperiyaya qarşı etirazına rəhbərlik edən AXC-nin yaranmasını, o dövrdəki fəailiyyətini müsbət qiymətləndirən siyasi lider, siyasi rəqiblərlə münasibətdə özünəməxsus təvazökarlıq, səmimiyyət, dözümlülük nümayiş

etdirir: “Amma onlar ki, o vaxt xalqın hakimiyyətinə qarşı etirazına rəhbərlik ediblər və ondan sonra da bunu bir təşkilat kimi yaradıblar, Azərbaycanın o vaxt ki, hakimiyyətinə, kommunist rejiminə qarşı olan nifrətin, etirazın hamısını bir yerə toplayıb bu xalqı təşkilatlandırıblar və nəticədə Xalq Cəbhəsi yaranıb, – bu, tariximizdə müsbət hadisədir. Mən onların kimliyindən, şəxsiyyətindən, mənə münasibətlərindən, mənim onlara münasibətimdən asılı olmayaraq bunu müsbət qiymətləndirirəm. Bu baxımdan o dövrdə Xalq Cəbhəsinin fəaliyyətini müsbət qiymətləndirirəm” [XIIIc.s.283].

Səmimiyyət müxalifət partiyalara münasibətdə də özünü göstərir. Azərbaycanda müxalif qüvvələr olmasını təbii bir hal hesab edən ulu öndər bundan sonra da müxalifətə böyük hörmətlə münasibət göstərəcəyinə söz verən Heydər Əliyev konstruktiv əməkdaşlığa həmişə hazır olduğunu bəyan edir: “Çoxpartiyalı cəmiyyətdə müxalifətin də böyük rolu var. Biz müxalifətə bundan sonra da böyük hörmətlə münasibət göstərəcəyik və əmin olduğumu bildirmək istəyirəm ki, Azərbaycan cəmiyyətində müxalifət mövqeyində olan partiyalar, siyasi qüvvələr konstruktiv əməkdaşlıq mövqeyindən çıxış edəcəklər və bu da Azərbaycanda həqiqi demokratiyanın inkişafı üçün daha geniş imkanlar yaradacaqdır. Bir sözlə, biz Azərbaycanda müxalif qüvvələr olmasını təbii bir hal hesab edirik, eyni zamanda Dövlət müxalif qüvvələrlə konstruktiv əməkdaşlığa həmişə hazır olduğunu bildirir” [Ic.s.204].

Demokratiya və səmimiyyət analyışları böyük natiqin çıxışlarında vəhdətdədir. Azərbaycan Yazıçılarının Qurultayı ərəfəsindəki çıxışdan (29 oktyabr 1997-ci il) bir parça bu vəhdətə misaldır: “Hesab edirəm ki, sabah qurultayımız da birincisi, demokratik şəraitdə keçəcək. İkincisi, tam sərbəstlik şəraitində keçəcək, üçüncüsü, mehribanlıq şəraitində keçəcək, dördüncüsü, bir-birinə hörmət və ehtiram şəraitində keçəcək,

beşincisi, tənqid və özünütənqid – bu, köhnə söz olsa da bunu bu gün də demək olar – şəraitində keçəcəkdir. Heç kəs çəkinməsin, heç kəs utanmasın. Biz gördüyünüz işləri də, səhvləri də, çatışmazlıqları da, qüsurları da göz qabağında qoyuruq. İndi xalqdan heç bir şey gizlədilmir və gizlədilməməlidir. Nə var, odur" [XIIIc.s.95].

Heydər Əliyev vəd vermir. Onun çıxışlarında populizmə yer yoxdur. O yalnız bir şeyi vəd edə bilir ki, bu da – həyatının son dəqiqəsinədək xalqına xidmət etməyi və ömrümün bundan sonrakı illərini də xalqına bəxş etməkdir: "Mən sizə səmimi deyirəm. İndi heç kimə heç bir vəd vermək istəmirəm. Ali Sovetin sədri seçiləndə də məndən soruşurdular ki, nə vəd edirəm. Cavab verdim ki, mən peyğəmbər deyiləm. Azərbaycanın bu vəziyyətdən necə çıxacağını deyə bilmərəm. Ancaq əgər mən bu vəzifəni öz üzərimə götürürəmsə, deməli, Azərbaycanı bu vəziyyətdən çıxarmağın yollarını (əlbəttə, xalqla, onun ağıllı, düşünən adamları ilə birlikdə) arayıb-axtarmağı bacararam. İndi də təkrar edirəm ki, mən heç bir vəd vermirəm. Yalnız bir şeyi vəd edə bilərəm: Azərbaycan xalqına, millətinə, torpağına sadiq olmuşam və ömrüm boyu da sadiq olacağam. Həyatımın son dəqiqəsinədək xalqıma xidmət edəcəyəm və ömrümün bundan sonrakı illərini də xalqıma bəxş edirəm" [Ic.s.163].

Heydər Əliyevin nitqində səmimiyyət nikbinliklə birgə səslənir. O, real həyatımızda nə varsa onu da auditoriyaya deməyə cəsarət tapır. Səmimiyyətə söykənən bir cəsarətlə fikirlərini açıqlayır və sonda bir nikbinliklə fikrini yekunlaşdıra bilir: "Mən bilirəm ki, indi gənc yazıçı əsər yazır, amma evi yoxdur. Ancaq yeni meydana çıxmış iş adamı, biznesmen qısa bir müddətdə böyük pul qazanır, gedib özünə üçotaqlı yox, beşotaqlı mənzil alır. Bu da indi bizim həyatımızın qanunudur. Bir halda ki, biz keçmiş sovet quruluşundan

demokratik quruluşa keçdik, sovet iqtisadiyyatı, sosialist iqtisadi sistemindən sərbəst iqtisadiyyata keçdik, bu iqtisadiyyatın da qanunları bundan ibarətdir. Biz buna da dözməliyik. Ancaq bu heç kəsdə heç vaxt ümidsizlik yaratmamalıdır" [XIIIc.s.134].

"Çatışmazlıqlarımız hələ çoxdur" – səmimi ifadəsi böyük natiqin dilində tez-tez eşidilir. Bu səmimi ifadənin arxasınca çatışmazlıqların aradan qaldırılmasına yönələn qətiyyətli ifadələr işə düşür, auditoriyanın gələcək günlərə inamı artır: "Mən deyə bilmərəm ki, biz bu qayğını tamamilə təmin edə bilirik. Əgər belə desəydim bu ədalətli olmazdı. Çatışmamazlıqlarımız hələ çoxdur. Müharibə əlillərinə, torpaqlarımızın müdafiəsində şikəst olmuş adamlara, fiziki cəhətdən zədə almış insanlara qayğımız hələ istənilən səviyyədə deyildir. Biz bunu artırmalıyıq. Bunu həm dövlətin ümumu proqramlarında artırmalıyıq, həm də ki, ümumi proqramlarımızın həyata keçirilməsində müvafiq orqanlar bunu etməlidir" [XIIIc.s.162-163]

Ölkənin, vətəndaşların düşdüyü ağır vəziyyəti olduğu kimi auditoriyalara çatdıran ulu öndər vəziyyətin çıxılmaz olmadığını nikbinlik bildirən ifadələrlə söyləyərək, sabahkı günlərə inamı artırır. 21 mart 1996-cı ildə Bakının Gənclər Meydanında – Qoşa Qala qapısı önündə Novruz şənliyindəki çıxışda olduğu kimi: "...Lakin bu yol asan yol deyildir. Bu, çətin, ağır yoldur. Çünkü biz zərbələr almışıq, torpaqlarımız işğal edilibdir, çətin işdir. Ona görə biz tariximizin çətin dövrünü yaşayırıq. Ancaq xalqımızın iradəsi ilə, millətimizin iradəsi ilə, dövlətimizin iradəsi ilə biz bu çətinliklərdən çıxacağıq. Əminəm ki, çıxacağıq. Bu gün Azərbaycanın hər yerində, o cümlədən Bakıda xalqımızdakı bu bayram əhval-ruhiyyəsi, bu nikbinlik, bu sevinc, bu şənlik ümid verir ki, biz bu çətinliklərdən çıxacağıq" [VIc.s.12]

Heydər Əliyev səmimiyyəti qətiyyətlə sintez olunur. “Biz burada səmimi söhbət aparırıq” deyən böyük natiq harada doğulub böyüməyindən asılı olmayaraq Azərbaycanın hər bir güşəsini sevməyi bizlərə vəzifə kimi tapşırır. Dövlət başçısına gəldikdə isə bu xalq qarşısında, Vətən qarşısında borcdur, vəzifədir: “Yeri gəlmişkən mən bir məsələni də demək istəyirəm. Biz burada səmimi söhbət aparırıq. Bir çoxları belə hesab edirlər ki, əgər kim hansı yerdə doğulub-böyüyübsə, o həmin yeri başqasına nisbətən daha çox sevir. Bu, belə deyil. Ümumiyyətlə, biz Azərbaycanın hər bir yerini doğma Vətən kimi sevməliyik. “Kim haralıdır – oranı sevir” kimi əhval-ruhiyyəni aradan götürmək lazımdır. Vətən hamımız üçün Vətəndir. Vətənin hər bir yeri, hər bir nöqtəsi bizim üçün vətəndir. Hər bir adam üçün Şuşa da, Laçın da Vətəndir. Bu yerlər təkcə şuşalılar, laçınlılar üçün yox, hamımız üçün Vətəndir. Şəxsən mən belə fikirdəyəm, belə duyğularla yaşamışam və bu gün də belə duyğularla yaşayıram. Ona görə də mən Şuşanı özüm üçün doğma bir yer hesab edirəm. Bu doğmalıq mənim daxili insani hisslərimlə əlaqədardır. Bir də, bir halda ki, mən Azərbaycanda rəhbər olmuşam demək bu mənim borcum, vəzifəm olub” [VIIc.s.242].

Heydər Əliyevin nitq və çıxışlarında səmimiyyətin üzə çıxmasına yardım edən aşağıdakı ifadələrə rast gəlmək olar.

“yaşayışımız çətindir, ağırdır” – Yaşayaşımız çətindir, ağırdır. Bilirəm ki, mədəniyyət xadimləri üçün də ağırdır, çətindir. Amma bunların hamısının müqabilində bizim böyük nailiyyətimiz var: Azərbaycanın dövlət müstəqilliyi [Vc.s.201].

“iqtisadi vəziyyətimiz ağırdır” – İqtisadi vəziyyətimiz ağırdır. Biz keçid dövründə yaşayırıq. Bunlar hamısı iqtisadiyyatda, xalqın rifah halında böyük çətinliklər yaşadıbdır [Vc.s.249].

"bunları etiraf etmək lazımdır" – Bunları etiraf etmək lazımdır, ancaq bunları böyük bir xəta da hesab etmək olmaz. Çünkü indiyə qədər Azərbaycanda hüquqi dövlət olmayıbdır... [Vc.s.309].

"mən çox açıq danışan adamam" – Mən çox açıq danışan adamam. Həmişə söz xoş gəlməsə də, mən onu açıq deməliyəm [IIIc.s.112].

"mən hər şeyi açıq deyirəm" – Mən hər şeyi açıq deyirəm. Həyatım belədir ki. Mən həmişə hər bir sözü olduğu kimi açıq demişəm [XIIIc.s.208].

"heç birimiz həqiqəti inkar etməməliyik" – Doğrudur, Milli Məclisin deputatlarının seçilməsi ilə əlaqədar ayrı-ayrı şikayətlər var, beynəlxalq müşahidəçilər tərəfindən nöqsanlar, qüsurlar göstərilibdir. Bunlar həqiqətdir və heç birimiz həqiqəti inkar etməməliyik [Vc.s.11].

"səhvlər də olacaqdır, nöqsanlar da..." – Bizim respublikamız demokratiya dərsi keçir, demokratiya təlimi keçir. Bu ağır və çətin yolda, şübhəsiz ki, səhvlər də olacaqdır, nöqsanlar da, qüsurlar da olacaqdır, qanun pozuntuları da olacaqdır [Vc.s.11].

"Sizə açığını deyim" – Sizə açığını deyim, mən belə mötəbər Beynəlxalq Konfransda ilk dəfə iştirak edirəm [Vc.s.51].

"Sözün düzü" – Sözün düzü, sponsor anlayışı, sponsor rolu bizim üçün, bu sistemə ümumiyyətlə, yenicə qoşulan adamlar üçün o qədər də yaxşı anlaşıqlı və tanış deyildir. Mən sizinlə çox açıq səmimi danışıram və sözün düzünü deyirəm [Vc.s.52].

"doğrudur, şikayətlər də var" – Doğrudur, şikayətlərdə var ki, gəlib Azərbaycanda iş görmək üçün şərait bəzən o qədər də uyğun deyil, yaxud bəzi bürokratik əngəllər meydana çıxır [Vc.s.156].

“çatışmamazlıqlarımız hələ çoxdur” – Çatışmamazlıqlarımız hələ çoxdur. Müharibə əlillərinə, torpaqlarımızın müdafiəsində şikəst olmuş adamlara fiziki cəhətdən zədə almış insanlara qayğımız hələ istənilən səviyyədə deyildir [XIIIc.s.163].

“hər bir övladımıza ürəyimiz istədiyi kimi qayğı göstərə bilmirik” – Təbiidir ki, respublikamızın həyatının keçid dövründə, ağır dövründə uşaqların hamısına istədiyimiz kimi, bir ata kimi, valideyn kimi bəlkə də hər bir uşağa, hər bir övladımıza ürəyimiz istədiyi kimi qayğı göstərə bilmirik.

“Gəlin bu gün səmimi olaq” – Gəlin, bu gün səmimi olaq, gəlin, bu gün açıq olaq, heç kəs heç kəsdən çəkinməsin. Kimin nə sözü var desin, hamısını çıxaraq, ataq ortaya, danışaq [Ic.s.76].

“tarixi qaralamaq olmaz” – Bəli, belə əsərlər Sovet hakimiyyəti dövründə yazıldı. Yenə də deyirəm, tarixi qaralamaq olmaz [VIIc.s.23].

“gəlin, açıq danışaq” – Ancaq gəlin, açıq danışaq bizim respublikada da belə deyilmi? Bizim republikada belə hallar var və geniş yayılıb.

“açığını deyirəm” – Açığını deyirəm, mən Azərbaycan Respublikasının Prezidenti vəzifəsində ilk dəfədir ki, mükafat alıram. Öz respublikamda indiyədək heç bir mükafat almamışam [IXc.s.49].

“Mən açıq deyirəm” – Mən açıq deyirəm, Azərbaycan dövlətinin bu sahədə mövqeyi tam aydın, mənfəətlər isə qarşılıqlı olmalıdır [Ic.s.84].

“müstəqillik xalqa mənsubdur” – Müstəqillik heç kəsə, heç bir təşkilata mənsub deyildir. Müstəqillik xalqa mənsubdur [Ic.s.150].

“qoy heç kəs deməsin ki,” – Bu müstəqillik tarixi prosesdir, onu ictimai-siyasi proseslər əsasında əldə etmişik. Qoy heç kəs deməsin ki, kimsə bir qəhrəman kimi bu müstəqilliyin

sərkərdəsidir, yaxud müstəqilliyi əldə edən bir siyasi xadimdir [Ic.s.150].

“xalqdan heç kəs inciyə bilməz” – Bilirsinizmi xalqdan heç kəs inciyə bilməz. Ola bilər, ayrı-ayrı adamlardan inciyəsən [Ic.s.153].

“bu, həqiqətdir” – Düzdür, ali məktəblərin işində çoxlu nöqsan var, xüsusən rüşvətxorluq və sair kimi çirikin hallar var. Bu, həqiqətdir [Ic.s.158].

“tarixi təhrif etmək olmaz” – O zaman Nərimanov Leninə məktub yazaraq bildirmişdir ki, əvvəllər çar ordusunda, sonra isə müstəqil dövlətin ordusunda xidmət etmiş bu adamlar dəyərli şəxsiyyətlərdir və onlardan istifadə etmək lazımdır. Bütün bunlarla mən öz fikrimi açıq demək istəyirəm. Tarixi təhrif etmək olmaz [Ic.s.159]

“mən sizə səmimi deyirəm” – Mən sizə səmimi deyirəm. İndi heç kimə heç bir vəd vermək istəmirəm [Ic.s.163].

“ömrüm boyu da sadiq olacağam” – Yalnız bir şeyi vəd edə bilərəm: Azərbaycan xalqına, millətimə, torpağıma sadiq olmuşam və ömrüm boyu da sadiq olacağam [Ic.s.163].

“illuziyaya qapılmıram” – Mən, şübhəsiz, illuziyaya qapılmıram və sizi də aldatmaq niyyətində deyiləm ki, bu ağır problemlər qısa müddətdə dərhal həll oluna bilər [Ic.s.168].

“vəzifə tutmaq üçün gəlməmişəm” – Lakin mən dünən ziyalılar qarşısında çıxışımda da demişəm, sizə, gənclərə də, – hamınıza öz övladların kimi baxıram və hər birinizi şəxsən özümə övlad bilirəm – sizə də deyirəm ki, mən vəzifə hərisi deyiləm, Azərbaycana, Bakıya bir daha vəzifə tutmaq üçün gəlməmişəm [Ic.s.181-182].

“müxalifətə bundan sonra da böyük hörmətlə münasibət göstərəcəyik” – Biz müxalifətə bundan sonra da böyük hörmətlə münasibət göstərəcəyik və əmin olduğumu bildirmək istəyirəm ki, Azərbaycan cəmiyyətində müxalifət mövqeyində

olan partiyalar, siyasi qüvvəllər konstruktiv əməkdaşlıq mövqeyindən çıxış edəcəklər...

"Xalqımız çətin vəziyyətdə yaşayır" – Xalqımız çətin vəziyyətdə yaşayır. Ancaq biz bilirik ki, xalqımız dözümlü xalqdır, bu çətinliklərə dözəcək, bu ağrılı-acılı 93-cü ili başa çatdıracaq... [Ic.s.308].

"dərhal nəticə verəcəyini deyə bilmərəm" – Güman edirəm ki, bu tədbirlə iqtisadi vəziyyəti bir qədər tarazlaşdıracaq və əhalinin maddi vəziyyətini, həyat tərzini də müəyyən qədər yüngülləşdirəcəkdir. Ancaq bunların hamısının dərhal nəticə verəcəyini deyə bilmərəm [Ic.s.9].

# VII FƏSİL

# HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ QƏTİYYƏT

Müstəqilliklə bağlı verdiyi bəyanatlarda Heydər Əliyevin qətiyyəti aydın şəkildə, sərt çalarlarla, geridönməz xarakterlə auditoriyalara çatdırılır. 1991-ci il dekabrın 8-də Rusiyanın, Ukraynanın və Belarusiyanın imzaladığı "Belovejsk" sazişini ləğv etmiş Rusiya Federasiyası Dövlət Dumasının 1996-cı il 15 mart tarixli qərarı ilə əlaqədar verdiyi bəyanat qətiyyətli dövlət başçısının nitqini əks etdirir. Müstəqilliyə qovuşmuş xalqların liderlərinin nitqləri arasında belə qətiyyətli nitqə rast gəlmək olmur. Qətiyyətlilik cümlədən-cümləyə yüksələn xətlə inkişaf edir: "Sovet İttifaqı dağılmalı idi, geriyə yol yoxdur, bərpa edilə bilməz, Azərbaycanın mövqeyi aydındır, müstəqilliyimizdən əl çəkə bilmərik, Azərbaycanın dövlət müstəqilliyi əbədidir: "Bu barədə nə deyə bilərəm? Təəccüb doğuran bir qərardır. Hesab edirəm ki, bu mənasız bir işdir. Çünki 1980-ci ilin əvvəlırindən başlayaraq dünyada o cümlədən keçmiş Sovet İttifaqında gedən tarixi, ictimai-siyasi və tamamilə təbii, obyektiv qanunlara uyğun olan proseslərin nəticəsində Sovetlər İttifaqı dağılmışdır. O dağılmalı idi və dağıldı. Geriyə yol yoxdur. Heç kəs yenidən Sovetlər İttifaqını bərpa edə bilməz. Biz öz dövlət müstəqilliyimizdən əl çəkə bilmərik, yəni onu əlimizdən verə bilmərik. Mən dəfələrlə demişəm, bu gündə bəyan edirəm ki, Azərbaycanın dövlət müstəqilliyi əbədidir. Biz də onu əbədi etmək üçün çalışacağıq və hamı çalışmalıdır".

Sovetlər imperiyasından qopmuş, təzəcə müstəqillik yoluna qədəm qoyan respublikanın dünya birliyinə qovuşması, inteqrasiyanın yolunda beynəlxalq ictimaiyyəti inandırmaq, gənc respublikaya kömək edilməsinə nail olmaq baxımından

Heydər Əliyevin XX əsrin 90-cı illərindəki qətiyyətli çıxış, nitq və bəyanatları xüsusi diqqətə layiqdir. O, bu qətiyyətli nitqləri ilə demokratiyanın inkişafına, siyasi plüralizm və insan haqlarının müdafiə prinsiplərinə əməl olunacağına təminat verir: "Azərbaycan Respublikasında bütün beynəlxalq hüquq normaları, beynəlxalq qanunlar tətbiq olunacaqdır. Azərbaycan Respublikasında insan hüquqları bundan sonra da qorunacaqdır, bu işlərə daha ciddi fikir veriləcəkdir. Heç kəsin şübhəsi olmasın ki, Azərbaycanın bir demokratik respublika kimi, bundan sonra inkişaf etməsinə kimsə mane ola bilməz. Azərbaycan dünya demokratik birliyinə daxil olmuş bir dövlətdir və siyasi plüralizm və insan haqlarının qorunması prinsipləri əsaında bundan sonra da inkişaf edəcəkdir" [Ic.s.86-87].

Müstəqilliyimizlə bağlı dünyanın müxtəlif çeşidli auditoriyalarında Heydər Əliyevin qətiyyətli nitq və çıxışlarının şahidi oluruq: "Mən təkcə orada (Fransada - red.) yox, hər yerdə demişəm ki, respublikamızın müstəqilliyi tarixi nailiyyətimizdir, müstəqilliyimiz sarsılmazdır, dönməzdir və biz onu heç vaxt əlimizdən verə bilmərik" [VIIIc.s.335].

Müstəqilliyimizin qorunmasına yönələn çıxışlarındakı qətiyyət sərt barışmaz mövqe şəklində ortaya qoyulur. "İndi siz görürsünüz ki, artıq dövlət müstəqilliyi reallığa çevrilibdir. İndi isə mən deyirəm ki, biz nəyin bahasına olursa olsun, bütün çətinliklərə dözərək, bütün məhrumiyyətlərə dözərək Azərbaycanın dövlət müstəqilliyini qoruyub saxlamalıyıq". Müstəqillik yolunun asan, çətinliksiz olmadığını xatırladır "şəxsi iddia və ambisiyalardan" əl çəkməyi qətiyyətlə tələb edir: "Bu bizim müqəddəs borcumuzdur. Yenə də deyirəm bunun üçün Azərbaycanın hər bir vətəndaşı öz payını verməlidir. Bunun üçün Azərbaycanın keçid dövründə, xüsusən xaricdən

cürbəcür təsirlərə məruz qaldığı bir dövrdə öz şəxsi iddialarından, öz şəxsi ambisiyalarından əl çəkməlidirlər".

Heydər Əliyev nitqində qətiyyətlilik müstəqilliyin ilk illərində xüsusi kəskinliyi ilə seçilir. Bu da təbiidir. Ağır, müstəqilliyimizə təhlükələrin mövcud olduğu həmin illərdə ölkəni vəziyyətdən çıxarmaq yolunda ciddi addımlar atılırdı. Məhz həmin illərdəki nitqlər gələcəyə tuşlanan nikbin notlarla yanaşı qətiyyətlə daha çox zəngin idi. Müstəqilliyin ilk illərində təhsilimizlə bağlı məsələlərdə Heydər Əliyevin qətiyyəti aidiyyati nazirlikləri səfərbər edir, təhsil işçiləri arasında sabahkı günə inam yaradır: "Mən sizə tapşırıram, başqa sahələrdə də təmin olunmalıdır, amma həm şəhərlərdə, həm də kəndlərdə müəllimlərin dekabr və yanvar ayları üçün məvacibləri təcili surətdə bir həftənin ərzində ödənilməlidir. Aydındırmı? Bir həftənin içində ödəyib, mənə şəxsən məlumat verməlisiniz! İşğal olunmuş ərazilərdən qaçqın düşmüş müəllimlərin, habelə onların yerləşdirildiyi məktəblərin vəziyyətinə xüsusi diqqət yetirilməlidir" [IIIc.s.190].

Azərbaycanın ərazi bütövlüyü, müstəqilliyi məsələləri ilə bağlı çıxışlardakı qətiyyət bugünkü qətiyyətli siyasətimizin ana xəttini təşkil edir. "Bir araya sığmır", "yol verə bilmərik" kimi qətiyyət bildirən frazeoloji birləşmələr ATƏT-in Lissabon zirvə görüşündə (2 dekabr 1996-cı il) özünü göstərir: "Dağlıq Qarabağın müstəqilliyi barədə qanunsuz iddialar beynəlxalq hüququn hamı tərəfindən bəyənilmiş normaları ilə bir araya sığmır. Biz həmin iddialarla heç vaxt razılaşmayacağıq, biz Azərbaycan ərazisində ikinci bir erməni dövlətinin yaranmasına yol verə bilmərik" [VIIIc.s.92-93].

Beynəlxalq miqyaslı hər bir görüşdə ölkəmizin taleyüklü məsələləri barədə ulu öndərin qətiyyətlə dolu ifadələri işə düşür, xarici auditoriyaları polad məntiqə söykənmiş təfəkkürdən

süzülən cümlələrlə inandırır, ədalətsiz qərarlara qarşı onları səfərbər edir. Elə, Nyu-Yorkda, "Böyük İpək Yolu üzərində yerləşən ölkələrin regional əməkdaşlığın zirvə görüşü"ndəki (8 sentyabr 2000-ci il) çıxış da ABŞ konqresini, ABŞ hökumətini ədalətsiz qərarın ləğvinə çağıran qətiyyətin şahidi oluruq: "Bu gün mən Amerika Birləşmiş Ştatlarının Konqresini və Amerika Birləşmiş Ştatlarının Hökumətini bir daha Azərbaycan barəsində ayrı seçkiliyi aradan qaldırmağa və ədalətsiz 907-ci maddənin ləğvinə nail olmağa çağırıram" [XXXc.s.40].

Heydər Əliyevin qətiyyətli nitqi beynəlxalq tribunalarda səslənir, yüksək səviyyədə müstəqilliyin qorunmasına yönəlir. BMT Təhlükəsizlik Şurasınının sədrinə ünvanlanan bəyanat qətiyyətli siyasi rəhbər bəyanatıdır: "İndiki şərait BMT nizamnaməsinə uyğun olaraq Təhlükəsizlik Şurasına verilmiş səlahiyyətlər əsasında onun işə qarışmasını təkidlə tələb edir. Təcavüzkarın cilovlanmasına, qan tökülməsinin dayandırılmasına və işğal olunmuş Azərbaycan ərazilərinin azad edilməsinə yönəldilmiş təxirəsalınmaz tədbirlər gərəkdir. Deyilənlərlə əlaqədar Təhlükəsizlik Şurasının dərhal çağırılmasını xahiş edirəm" [Ic.s.44-45].

"Təcavüzkarın cilovlanması", "təxirəsalınmaz tədbirlər" kimi ifadələr qətiyyəti gücləndirməklə nitqin təsir gücünü artırır.

Qətiyyətli çıxış və nitqlər təbiətcə qətiyyətli insanlara xas ola bilər. 20 Yanvar faciəsi ilə bağlı Moskvada tarixi hadisə – Kommunist Partiyasını, Sovetlər Birliyini ifşa etmək, təqiblərə məruz qalmaq cəsarətli siyasi xadimə xas olan bir xarakterdir.

Prezident Sarayında Türkiyənin TQRT telekanalının "Üz-üzə" proqramına verdiyi müsahibədə biz qətiyyətli siyasi xadim çıxışının (13 noyabr 1996-cı il) şahidi oluruq: "1990-cı ilin yanvarında Azərbaycana qarşı bir təcavüz edildi. Onda mən Moskvada idim. Mən o vaxt Moskvada bununla əlaqədar

keçirilən mitinqə getdim. Orada Qorbaçovun, Kommunist Partiyasının, Sovetlər Birliyinin əleyhinə sözlər dedim. Onları mühakimə etdim ki, siz Azərbaycana qarşı ədalətsizlik, təcavüz etmisiniz, insanlar şəhid olub, qan tökmüsünüz, siz cinayətkarsınız. Bundan sonra məni həbs etməyə çalışdılar" [VIIIc.s.48]. Bu kiçik çıxışda qətiyyət Heydər Əliyev dilində ittiham səviyyəsində səslənir. Xalqına, vətəninə qarşı yönələn təcavüzə qarşı ittiham səviyyəsində səslənir.

Xəzərin Azərbaycan sektorundakı "Şahdəniz" yatağında əldə edilmiş nəticələrin təqdimat mərasimindəki yekun nitqdə neft strategiyamız qətiyyətlə müəyyənləşdirilir: "Bizim bu işimizə indi də mane olanlar vardır. Ancaq heç kəs heçbir şeyə nail ola bilməyəcəkdir. Azərbaycan dövlətinin yeni neft strategiyası müəyyənləşdirilibdir. Biz bu strategiyanı bundan sonra da ardıcıl surətdə həyata keçirəcəyik" [XXc.s.470].

Qətiyyətli çıxış və nitqlər torpaqlarımızın işğaldan azad olunması, eləcə də ərazi bütövlüyümüzlə bağlı məsələlərdə özünü daha bariz şəkildə nümayiş etdirir. Bu çıxışlar gah beynəlxalq miqyasda yüksək tribunalarda, gah da Azərbaycanda – doğma divarlar arasında səslənir. 2 aprel 1997-ci il tarixdə Kəlbəcər qaçqınları ilə görüşdəki kimi: "Biz öz torpaqlarımızın bir qarışını belə heç vaxt Ermənistana verməyəcəyik, – bunu onlar bilməlidirlər. İşğal olunmuş torpaqlarımızın hamısı azad edilməlidir. Respublikamızın ərazi bütövlüyü bərpa olunmalıdır – bunu onlar bilməlidir. Dünyanın böyük dövlətləri, beynəlxalq ictimaiyyət, Minsk qrupuna həmsədrlik edən dövlətlər bunu artıq dərk edir və bəyan edirlər" [IXc.s.120-121].

Azərbaycanın ərazi bütövlüyü ilə bağlı çıxışlarda qətiyyət öz kəskinliyi ilə seçilir: "Eyni zamanda torpaqlarımızın işğal altında qalmasına heç vaxt razı olmayacağıq. Biz heç vaxt

torpağımızın bir qarışın da, bir metrin də heç kəsə verilməsinə razı ola bilməyəcəyik. İşğal edilmiş torpaqlarımız azad olunmalıdır. Azərbaycanın ərazi bütövlüyü bərpa edilməlidir”. (Bakının Gənclər meydanında Qoşaqala qapıları önündə Novruz şənliyində çıxış) [IXc.s.43].

“Beynəlxalq təşkilatlar tərəfindən tanınmış sərhədlər çərçivəsində olan ərazimizi biz heç vaxt, heç kəsə verməyəcəyik” fikirlərini istiqlal günündə xalqa bəyan edən ulu öndər auditoriyanı tarixi keçmişimizə aparır, poetik bir dillə qədim Azərbaycan torpaqlarının nisgilinin bu gün də xalqın çəkdiyini yada salır. “Torpaqların nisgilini indi də çəkir”, “xalq torpaqların arzusu ilə yaşayır”, “Zəngəzur deyəndə xalqımızın ürəyi ağrıyır” ifadələrinin ardınca yuxarıdakı qətiyyətli fikir xalqımızı gələcək günlərə səfərbər edir: “Xalqımız əldən getmiş torpaqların nisgilini indi də çəkir. İngi də Göyçə mahalı, Zəngəzur deyəndə xalqımızın ürəyi ağrıyır, xalq o, torpaqların arzusu ilə yaşayır. Amma eyni zamanda Azərbaycan Respublikası dövlət müstəqilliyini əldə edərkən beynəlxalq təşkilatlar tərəfindən tanınmış sərhədlər çərçivəsində olan ərazimizi biz heç vaxt heç kəsə verməyəcəyik” [VIc.s.307-308].

Heydər Əliyev auditoriyanı qətiyyətə hazırlayır. Qətiyyətli çıxışdan öncə izahedici fikirlər auditoriyanı həqiqətin dərkinə çağırır. Bu dərkin ardınca qətiyyət çəkic zərbəsi kimi ayıldıcı effekt verir: “Dövlətimizin suverenliyini, sərhədlərinin toxunulmazlığını və ərazi bütövlüyünü bütün Dünya Birliyi təsdiq etmişdir. Bu prinsiplərin hər hansı şəkildə pozulması, sülh və sabitlik yaradılmasına əngəl törədir, qarşıdurmanı gücləndirir, xalqların dinc və firavan gələcəyə bəslədikləri ümidləri puça çıxarır. Dağlıq Qarabağın müstəqilliyi barədə qanunsuz iddialar beynəlxalq hüququn hamı tərəfindən bəyənilmiş normaları ilə bir araya sığmır. Biz həmin iddialarla heç vaxt razılaşma-

yacağıq, biz Azərbaycan ərazisində ikinci bir erməni dövlətinin yaranmasına yol verə bilmərik" [VIIIc.s.93].

Heydər Əliyev qətiyyətli çıxışları ilə beynəlxalq təşkilatları Azərbaycan həqiqətlərini dərk etməyə, hüquqları pozulmuş ölkəmizə yardım etməyə çağırır, onları iradə bildirməyə, "ədalətli mübarizəmizə" tərəfdar çıxmağa səsləyir: "Hazırda sülhə nail olmaq üçün beynəlxalq həmrəyliyin, təcavüzkara beynəlxalq səviyyədə təzyiq göstərilməsinin çox böyük əhəmiyyəti var. İslam Konfransı Təşkilatı kimi nüfuzlu təşkilat və onun hər bir üzvü tərəfindən təzyiq göstərilməsi də son dərəcə vacibdir. Ona görə də, hörmətli görüş iştirakçıları, mən sizə üz tutub xahiş edirəm ki, siyasi iradənizi qətiyyətlə bildirəsiniz və Azərbaycan dövlətinin ərazi bütövlüyü uğrunda bizim ədalətli mübarizəmizə tərəfdar çıxasınız" [IIIc.s.21-22].

Əzəli Azərbaycan torpaqlarının geri qaytarılması yolunda çıxışlarında qətiyyət əzmkarlıqla nümayiş etdirilir. "Əldən gedən torpaqlar qaytarılmalıdır" ifadəsi vətəndaşların şüuruna hakimdir: "Bunları bilmək lazımdır. Mən hesab edirəm ki, əldən gedən torpaqlar nə vaxtsa qayıtmalıdır. Azərbaycanın tarixi torpaqları qayıtmalıdır. Xalqımız da daim bilməlidir ki, bizim tarixi torpaqlarımız hansılar olubdur, hansılar nə vaxtsa əlimizdən gedibdir, nəyə görə əlimizdən gedibdir və şübhəsiz ki, bunlar geri qayıtmalıdır. Biz də qaytara bilməsək, gələcək nəsillər bunları qaytaracaqdır" [XIVc.s.82].

Özbaşınalıqlara imkan verməmək, qanunlara riayət olunmasını hamıya şamil etmək böyük natiqin nitqində xüsusi yer tutur. Azərbaycan Milli Elmlər Akademiyasının əməkdaşları ilə görüşdə də bu qətiyyətli fikirlər auditoriyanı silkələyir, Azərbaycan elminin tərəqqisinə xidmət edir: "Yenə də deyirəm Akademiya bizim ən yüksək elm müəssisəmizdir, bütün elmin zirvəsində duran təşkilatdır. Heç kəsə özbaşınalıq etmək

imkanı vermək olmaz. Azərbaycanda da, başqa yerlərdə də bəlaların çoxu ondan irəli gəlirdi ki, dağıntı, özbaşınalıq, sahibsizlik gətirib bu vəziyyətə çıxartdı. Mən imkan verə bilmərəm ki, Azərbaycanda özbaşınalıq olsun. Qanun-qayda, qanunun aliliyi hamı üçün eyni olmalıdır. Heç kəs özü üçün xüsusi qanun icad edə bilməz. Bizim dövlətimiz var, dövlətin qanunları var və hamı bunlara tabe olmalı, riayət etməlidir. Bu məsələyə baxın" [VIIIc.s.372].

Qətiyyətli dövlət başçısının çıxış və nitqləri ölkə qanunlarına söykənir ki, bu da çıxışların auditoriyaya olan təsir gücünü birə on qat artırır: "Yenə də deyirəm heç bir partiyanın, təşkilatın silahlı dəstəsi ola bilməz. Silah ancaq dövlətə mənsubdur və qeyri-qanuni silah saxlayan heç bir şəxs, heç bir təşkilat Cinayət Məcəlləsinin müvafiq maddələrinə görə cinayət məsuliyyətinə cəlb olunmalıdır. Bunu hamı bilməlidir" [XIIIc.s.284].

Heydər Əliyev nitqində "heç vaxt imkan verilməyəcəkdir", "heç kəs mənim iradəmi sındıra bilməz" ifadələri ilə dövlətçiliyimizin qorunması yolunda iqtidar-müxalifət qarşıdurmasının sivil, demokratik yolla aradan qaldırılmasını önə çəkir, problemlərin dialoq yolu ilə həll olunmasının tərəfdarı olduğunu diqqətə çatdırır: "Mən bütün müxalifət qüvvələrini dialoqa dəvət edirəm, məsələləri ancaq danışıq yolu ilə həll etməyə dəvət edirəm. Heç kəs Azərbaycanda güc yolu ilə, zorla heç bir şeyə nail ola bilməz. Bu artıq xülyadır. Bu artıq 1991-ci, 1992-ci il deyil, 1993-cü il də deyildir. Azərbaycanın müstəqil, qüdrətli dövləti vardır, Azərbaycanın dövlətçiliyini qorumaq üçün ölkənin dövlət strukturları vardır. Onlar Azərbaycanda kimsə tərəfindən güc işlətməyə, güclə nəyəsə nail olmağa heç vaxt imkan verməyəcəkdir. Prezident kimi mən bəyan edirəm ki, bəli, mən Azərbaycan xalqının, onun müs-

təqilliyinin keşiyində 1993-cü ildən durduğum kimi, bundan sonra da duracağam və heç kəs mənim iradəmi sındıra bilməz” [XVIIIc.s.237].

Ölkəmizdə hüquqi dövlət yarandığını, bu hüquqi dövlətdə qanunları heç kəsin pozmağa haqqı olmadığını Heydər Əliyev öz qətiyyətli çıxışları ilə xatırladır: “Bilirsiniz, heç kəs deyə bilməz ki, mənim filan vaxt filan xidmətim olubdur, filan vaxt meydanda bir az çox qışqırmışam, yaxud da az qışqırmışam, mənim qanunu pozmağa ixtiyarım var. Yox, artıq bizdə hüquqi dövlət yaranıbdır, artıq bizim çox dəyərli Konstitusiyamız var, çox dəyərli qanunlarımız var, bizim çox dəyərli parlamentimiz var və çox dəyərli dövlət sturukturlarımız var. Ona görə də kiminsə qanunu pozmasına yol vermək olmaz. Bilmək lazımdır ki, biz buna yol verməyəcəyik” [XIIIc.s.278]. Qətiyyətlə dolu bu çıxışda “yox” inkar ədatı ilə hüquqi dövlətin qanunlarının pozulmasına qətiyyətli dövlət başçısı yox deyir. Dörd yerdə təkrarlanan “Çox” qüvvətləndirici ədatının köməyi ilə qanunlarımızı pozmağa cəhd edənlərə ciddi xəbərdarlıq edilir.

Əksər hallarda Heydər Əliyevin nitqində qətiyyət “mən göstəriş vermişəm” ifadəsi ilə auditoriyaya yol açır. Göstəriş vermək rəhbər siyasi xadimə, sözü ilə əməli bir olan müdriklərə xasdır ki, bütün bunlar böyük natiq Heydər Əliyevdə cəmləşib: “Mən göstəriş vermişəm, hesab edirəm ki, Nazirlər Kabinetnin strukturu yaxın vaxtlarda təkmilləşdirilməlidir və bu cür işlərlə məşğul olan adamlar buradan kənarlaşdırılmalıdır. Nazirlər Kabinetinin aparatında sağlam, işi bilən, işə can yandıran və saf insanlar olmalıdır. Əgər belə olmasa, bu günkü mərhələdə iqtisadiyyatla bağlı böyük-böyük problemləri həll edə bilmərik”.

Vəzifəli şəxslərə münasibətdə qətiyyətli nitq özünü hər yerdə, hər məqamda göstərir. Bu zaman "hamı bilməlidir ki", "etimadı doğrultmaq lazımdır" kimi qətiyyətli ifadələr məmurlar ordusunu səfərbər edir. O, cəmiyyətdəki yarıtmazlıqlarla "barışa bilmədiyini" bəyan edir: "Mənim bu təşkilati qərarlarım hamı üçün xəbərdarlıq olmalıdır, hamı bilməlidir ki, göstərilən etimadı işlə və sağlam mənəviyyatla, professionallıqla doğrultmaq lazımdır. Ancaq təəssüf ki, mən bu halların keçmişdə də şahidi olmuşam, indi də bunları müşahidə edirəm – bəzi şəxslər yüksək vəzifəyə keçəndən sonra başlayırlar normadan çıxmağa. Ruslarda bir söz var: "zaznaystvo", onun Azərbaycanca tərcüməsi bir az kobuddur, "qudurmaq" sözüdür, mən bunu işlətmək istəmirəm ancaq belə olur. Bəziləri təəssüf ki, pozulurlar. İndi bəzi rəhbər işçilərimiz onların üzərinə qoyulan vəzifəni yerinə yetirmək əvəzinə, çalışmaq əvəzinə, bu vəzifədən öz şəxsi məqsədləri üçün istifadə etməyi daha üstün tuturlar. Bunlar bizim mənəviyyatımıza zidd olan keyfiyyətlərdir. Mən bununla barışa bilmərəm" [VIIc.s.153].

Qətiyyətli nitq çox vaxt "xəbərdarlıq edirəm" ifadəsi ilə yekunlaşır. Siyasi mübarizə üçün yaradılmış müxalifətin mövcudluğunu qəbul edən, onun normal fəaliyyətinə imkan yaradan dövlət başçısı silahlı müxalifəti qəbul etmir. Silahlı müxalifətin mövcud olduğu ölkələrdə hansı dağıntıların, dövlətçilik ənənələrinin süqutunun bu gün də şahidiyik: "Ona görə də müxalifətdə olan partiyalar bilməlidirlər ki, Azərbaycanda müxalifət mövcuddur və bundan sonra da olacaqdır. Müxalifətin normal fəaliyyət göstərməsi üçün bütün imkanlar yaradılıb, bundan sonra da yaradılacaqdır. Ancaq heç kəs bundan sui-istifadə etməməlidir. Mən bunu xüsusi vurğulayıram və xəbərdarlıq edirəm ki, heç bir partiyada heç bir silahlı qüvvə ol-

mamalıdır və hər bir siyasi partiya ancaq siyasi yollarla mübarizə aparmalıdır, başqa yollara əl atmamalıdır" [XIIIc.s.282].

Qətiyyət müəyyən məqamlarda böyük natiqin dilində ittihama çevrilir. "Cəzalandırılmalı", "məsuliyyətə cəlb olunmalıdır" ifadələri ölkə qanunlarına sayğı ilə yanaşmağı, qanunlara hörmət etməyə və riayət olunmasına çağırır. "Belə yardımlar gəlir, lazımdır ki bu yardımlardan yalnız bu kontingent istifadə etsin. Ayrı-ayrı adamlar vəzifələrindən sui-istifadə edib bunları dağıtmaqla, satmaqla, özlərinə sərvət yığmaqla məşğul olanlar, yenə də deyirəm, ən qatı cinayət edirlər. Belə adamlar cəzalandırılmalı, məsuliyyətə cəlb olunmalıdırlar" (Zəngilan qaçqınları ilə görüş – 29 dekabr 1996-cı il) [VIIIc.s.223-224].

Partiyalara münasibətdə Heydər Əliyev çıxışları dərindən tədqiq olunmağa layiqdir. "Dövlət və siyasi partiya münasibətləri necə olmalıdır" sualına ən dolğun, ən məzmunlu cavabı böyük natiqin nitqlərində görmək olar: "Hər bir partiya qanun çərçivəsində fəaliyyət göstərməlidir və qanundan kənara çıxmamalıdır. Əgər hansısa partiyanın qanuni hüquqları pozulursa, şübhəsiz ki, dövlət bunun qarşısını almalıdır. Biz buna cavabdehik. Ancaq eyni zamanda biz qanunun pozulmasına da yol verməyəcəyik. Qanunu pozanlar qanun qarşısında cavabdehdirlər və cavabdeh olmalıdırlar". "Şübhəsiz ki" modal sözlə partiyaların qanuni haqlarının qanunla təsbit olunmuş hüquqlarının qorunmasına təminat verən dövlət başçısı partiyaların da qanunu pozmasına "yol verməyəcəyik" deməklə qətiyyət nümayiş etdirir.

Heydər Əliyev nitqində xüsusilə Prezident sarayında keçirilən müşavirələrdə qətiyyətli cümlələr bir-birinin arxasınca düzülür. 21 iyun 1994-cü il tarixdə, Prezident sarayında, Respublika iqtisadiyyatına həsr olunmuş müşavirədə o hər

kəsi “öz məsuliyyətini dərk” etməyə çağırır, məmurları “doğru-düzgün, ədalətli yollarla” getməyə, “düz işləməyə”, xalqın və respublikanın “mənafeyini hər şeydən üstün” tutmağa, nazirlik və idarələrdən “lazımi tədbirlər görülməsini” tələb edir: “Ona görə də mən bu gün, bu müşavirədə öz fikirlərimi açıq bildirirəm və tələb edirəm ki, hərə öz sahəsində öz məsuliyyətini dərk etsin. İndi iqtisadiyyatımızda vəziyyət nə qədər ağır olsa da xalqın sosial vəziyyətini müəyyən səviyyədə saxlamaq üçün imkanlarımız var. Lakin bu imkanlardan istifadə etmək üçün vəzifəli şəxslər, nazirlər, idarə rəhbərləri, müxtəlif rəhbər işçilər, o cümlədən şəhər, rayon icra hakimiyyəti başçıları gərək doğru-düzgün, ədalətli yollarla getsin, düz işləsin və xalqın mənafeyini, Respublikanın mənafeyini hər şeydən üstün tutsunlar. Bu baxımdan mən aprelin 5-dən verilmiş fərmanın icrasının sürətlə həyata keçirilməsini bu gün bir vəzifə olaraq qarşıya qoyuram. Eyni zamanda iyunun 15-də imzalanmış fərmanın icrası üçün əlaqədar nazirlik və idarələrdən lazımı tədbirlər görülməsini tələb edirəm” [IIc.s.30].

Heydər Əliyevin Prezident sarayında, Nazirlər Kabinetində, bir sözlə, dövlət strukturlarındakı çıxışları büsbütün qətiyyətlə yoğrulub desək, səhv etmərik. Doğrudur, bu çıxışlarda da səmimiyyət, nikbinlik, poetizm və s. olsa da əsas yeri qətiyyət tutur. Nöqsanlara, çatışmamazlıqlara qarşı barışmaz mövqedən çıxış edən qətiyyətli nitqin şahidi oluruq. 27 noyabr 1996-ci il tarixdə, Azərbaycan Respublkası Nazirlər Kabinetinin iclasındakı nitq tapşırıq xarakterli qətiyyətdən xəbər verir: “Lakin bu vəzifələr hələ ki, həyata keçirilməyibdir. Buna görə də mən Nazirlər Kabinetindən tamamilə və xüsusən Nazirlər Kabinetinin rəhbərliyindən, baş nazirdən, onun müavinlərindən, Nazirlər Kabinetinin üzvlərindən bu

gün bir daha tələb edirəm ki, işdə ciddi dönüş yaradılmalıdır" [VIIIc.s.78].

"Tələb edirəm ki" ifadələri işlənən yerlərdə biz qətiyyətin şahidi oluruq. Böyük natiqin qətiyyətlə dolu çıxışlarında "tələb edirəm ki" ifadəsi xüsusi yer tutur.

Rəhbər işçilərlə keçirdiyi müşavirələrdə, iclaslarda bürokratiyaya qarşı mübarizə onun qətiyyətli nitqini tərk etmir. "Belə işləmək olmaz", "son qoyulmalıdır", "tamamilə kənar edilsin" kimi ifadələr ölkədə bürokratik əhval-ruhiyyədə işləməyə son qoyulmasını təkidlə tələb edir: "Belə işləmək olmaz ki! Mənə nə qədər şikayət edirlər. Siz özünüz də bunu bilirsiniz. Bunlar hamısı bürokratiyanın ən yüksək səviyyədə olmasını göstərir. Bütün bunlara son qoyulmalıdır. Yenə də deyirəm, bürokratiya hər yerdə var, yerli icra hakimiyyəti orqanlarında da, icra hakimiyyəti başçılarında da var. Bu barədə mənə çox siqnallar gəlir. Tələb edirəm ki, onlarla da lazımi iş aparılsın və bu bürokratik əhval-ruhiyyə, xasiyyət icra orqanlarından tamamilə kənar edilsin. Bizim nazirliklərdə, komitələrdə, şirkətlərdə, o cümlədən Nazirlər Kabinetində bürokratiya çox geniş yayılıbdır. Buna son qoymaq lazımdır" [VIc.s.226-227].

Sosialist təsərrüfat sistemindən özəl, azad, bazar iqtisadiyyatına keçidin inamsızlıqla qarşılandığı bir dövrdə kütlələri inandırmaq gücündə olan Heydər Əliyevin qətiyyətli nitqi işə düşür. Auditoriya öncə Heydər Əliyevin "mən bunu sizə açıq deyirəm" səmimi ifadəsi ilə gələcək günlərə hazırlanır. Sonda xoşbəxt gələcəyə aparan yolda "yol vermək olmaz" qətiyyətli ifadələri ilə nitq yekunlaşır: "Aqrar bölmədə, kənd təsərrüfatında bu islahatlar sürətlə aparılmalıdır. Bunu bilməlisiniz. Ona görə də bu yola nə qədər tez düşsəniz, addımlarımız nə qədər iri olsa, siz o qədər tez gəlib mənzilə çatacaqsınız, o

qədər də tez nailiyyətlər əldə edəcəksiniz. Mən bunu sizə açıq deyirəm. Başqa yol yoxdur.. Ona görə də mən tələb edirəm ki, hərə öz rayonunda öz təsərrüfatında bu barədə nə edə bilir etsin. Ancaq bir şeyə yol verməк olmaz. Dövlətin əmlakı dağıdılmamalıdır, mənimsəməyə yol vermək olmaz, cinayətə, oğurluğa, quldurluğa, talançılığa yol vermək olmaz. Xalqımızın, millətimizin, respublikamızın əmlakının bu son illərdə dağıldığı bəsdir. Bundan sonra yol vermək olmaz. Bunların qarşısı alınmalıdır" [XIc.s.64-65].

Heydər Əliyev nitqində qətiyyət Azərbaycan iqtisadiyyatının dirçəldilməsi, qorunması yolunda da özünü göstərir. 16 aprel 1997-ci il tarixdə Prezident sarayında keçirilən "Azərbaycanda iqtisadi islahatların gedişinə, eyni zamanda kənd təsərüffatında cari işlərin vəziyyətinin müzakirəsinə həsr olunmuş müşavirədə iqtisadiyyatımıza zərbə vuranlara qarşı "ədalətli və kəskin" çıxış edir: "Rüşvətxorluqdan, oğurluqdan, əyrilikdən, korrupsiyaya qurşanmaqdan əl çəkin! Bilin ki, biz bu mübarizədən geri dönməyəcəyik... Hesab edirəm ki, mənim bu ədalətli və kəskin sözlərimdən hər bir vəzifəli şəxs və hər bir vətəndaş nəticə çıxaracaqdır. Respublikmaızın iqtisadiyyatının bu çətin mərhələdən keçməsi üçün təkcə iqtisadi islahatların keçirilməsi, islahatlarda vəziyyətin yaxşılaşdırılması yox, eyni zamanda ölkənin varidatının, əmlakının qorunması, saxlanılması çox vacibdir. Respublikanın, xalqın, dövlətin əmlakını dağıdanlar, mənimsəyənlər ən yüksək cəzaya məhkum olunmalıdırlar" [IXc.s.181-182].

Qətiyyətli nitq Azərbaycan iqtisadiyyatının yüksəlməsinə xidmət edir. 17 avqust 1993-cü il tarixdə aparıcı neft şirkətlərinin və korporasiyalarının nümayəndələri ilə görüşdəki çıxışda neft sənayesinin inkişafına yönələn qətiyyətli çıxışın şahidi oluruq. Neftin "bəzi rəhbərlərin əlində" gəlir mən-

bəyinə çevrilməsi hallarını xalqımıza xəyanət hesab edir və “biz buna dözə bilmərik” qətiyyətlilik ifadəsi ilə fikrinə aydınlıq gətirir: “Neftçilərimizin bugünkü nəsli tarixi nailiyyətlərdən, sələflərinin təcrübəsindən faydalanaraq mövcud şəraitdə neft sənayesini qaldırmalı, neftçıxarma prosesini inkişaf etdirməli, neft və qaz hasilatını artırmalıdırlar. Açıq demək lazımdır, neft bəzi rəhbərlərin əlində yalnız kommersiya vasitəsinə çevrilib, belələri ancaq öz mənfəətlərini güdür. Bu Azərbaycan xalqına xəyanətdir. Biz buna dözə bilmərik” [Ic.s.26-27].

Heydər Əliyev nitqindəki qətiyyət iqtisadi həyatımızda da özünü göstərir. Kollektiv təsərüffatın effekt vermədiyi, iqtisadi cəhətdən azad, sonda siyasi cəhətdəh azad insanın inkişafına stimul verən, kömək edən bazar iqtisadiyyatının inkişaf etdirilməsinə ciddi önəm verir, dövlət orqanlarını bu yolda səfərbər edir: “Mən bildirmək istəyirəm ki, bizim iqtisadi siyasətimizdə bazar iqtisadiyyatının gələcəkdə də inkişaf etdirilməsi əsas istiqamətdir. Ancaq eyni zamanda sosial yönümlü bazar iqtisadiyytı respublikamız üçün əsas, prinsipial məsələdir. Bizim iqtisadiyyatla, siyasətlə məşğul olan orqanlarımız bunu bilməlidirlər və bu işlərə riayət etməlidirlər”. Müstəqilliyin ilk illərində ölkə iqtisadiyyatının yüksəldilməsi üçün xarici investisyaları cəlb etmək naminə Heydər Əliyevin qətiyyətli çıxışları mühüm rol oynamışdır. Məhz, o dövrdə böyük natiqin xarici investorları inandırmaq gücündə olan qətiyyətli nitqləri xarici kapitalın böhran vəziyyətində olan iqtisadiyyata yönəlməsinə səbəb oldu. Sərmayəçilərin müstəqilliyimizə inamsız yanaşdığı o illərdə böyük natiqin nitqləri investisyaları ölkəmizə yönəldə bildi: “Azərbaycan heç vaxt keçmişə dönməyib və dönməyəcəkdir. Azərbaycan irəli, sərbəst iqtisadiyyat, bazar iqtisadiyyatı yolu ilə gedəcəkdir, öz iqtisadiyyatını

dünya iqtisadiyyatına bağlayır və bağlayacaqdır. Ölkəmiz dünya iqtisadiyyatı, dünya sərmayəçiləri üçün açıqdır. Bu sahədə bir neçə addım atmışıq və bundan sonra da atacağıq və heç bir qüvvə bizi bu yoldan döndərə bilməyəcəkdir" [VIc.s.121-122].

Heydər Əliyev nitqində iqtisadiyyatımızın yüksəldilməsi xüsusi yer tutursa, ekoloji məsələlər də heç vaxt yaddan çıxmır. Sumqayıt şəhərinin ekologiyası ilə əlaqədar söylənilən qətiyyətli fikirlər uzunmüddətə yaddaqalan çıxışlardandır: "Sumqayıt sənayesinin modernləşdirilməsi, yeniləşdirilməsi, müəssisələrin bəzilərinin yenidən qurulması, onların müasir texnologiya və texnika ilə təmin olunması proseslərini həyata keçirərkən bu ekologiya məsələləri, tələbatları mütləq nəzərə alınmalıdır. Respublikamızı gözdən salmaq niyyəti ilə deyilən "Sumqayıt ölülər şəhəridir, ölü zonadır, bədbəxtlər şəhəridir" kimi qərəzli fikirlərə münasibətini bildirən Heydər Əliyev sonda "Mən bunlara tamamilə etiraz edirəm. Mən bu fikirləri tamamilə rədd edirəm. Sumqayıt xoşbəxtlər, gözəl insanlar şəhəridir" ifadələri ilə fikrini yekunlaşdırır.

Böyük natiqin dilində qətiyyət "böyük narazılıq və hiddət" şəklində ölkə problemlərinin çözülməsində üzə çıxır. 26 noyabr 2000-ci il tarixdə ölkəmizdə baş verən zəlzələ ilə əlaqədar Prezident sarayında keçirilən müşavirədəki nitq bir çox məziyyətləri ilə fərqlənən qətiyyətli çıxışdır. "Yəni zəlzələnin qarşısını almaq mümkün deyildir. Amma deyirlər ki, zəlzələnin olma ehtimalını müəyyən etmək olar", – cümlələri Heydər Əliyev zəkasının, hadisələrdə təmkinli, ədalətli mövqe tutmasından xəbər verir. Bunun ardınca: "Ancaq zəlzələ baş verən kimi, zəlzələ hardan başladı, nə oldu, gücü nə qədərdir və s. – bunları bizim seysmoloji xidmətimiz bilməlidir" – qətiyyətli cümləsi seysmoloji xidməti öz işini düzgün qurmağa çağırır: "Sadəcə həm seysmoloji xidmətə, həm də Elmlər

Akademiyasına böyük narazılığımı və hiddətimi bildirmək istəyirəm" – deyən ölkə başçısının böyüklüyünü, ağsaqqal öyüdünü, ölkəni bir vahid ailəyə bənzətsək onun ailə başçısı kimi təəssüf qarışıq, şükranlıqla söylədiyi qətiyyətli fikir auditoriyanın yaddaşına həkk olur: "Belə yaşamaq, belə işləmək olmaz ki! Biz müstəqil ölkəyik və bizim, Allaha şükürlər olsun ki, böyük kadr potensialımız var" [XXXIc.s.93-94].

Prezident sarayında, Müstəqil Azərbaycan Respublikası gənclərinin I forumunun birinci ildönümü münasibətilə forum nümayəndələrinin bir qrupu ilə görüşdə (1 fevral 1997-ci il) gənclərin mənəvi tərbiyəsi yolunda qətiyyətli çıxış özünü bariz şəkildə göstərir: "Gənclər xalqımızın milli ənənələri, milli, mənəvi dəyərləri əsasında tərbiyələnməlidir. Gənclərin tərbiyə edilməsində, təhsillənməsində, eyni zamanda ümumbəşəri dəyərlərdən geniş istifadə olunmalıdır. Milli, mənəvi, ümumbəşəri dəyərlərdən geniş istifadə olunmalıdır. Milli, mənəvi, ümumbəşəri dəyərlərin hamısı birlikdə bütün vətəndaşlarımızın və gənclərimizin mənəvi kodeksini təşkil etməlidir. Gənclər arasında aparılan iş bu istiqamətlərdə olmalıdır" [VIIIc.s.388].

Heydər Əliyevin qətiyyəti ölkənin iqtisadi vəziyyətində mühüm rol oynayan iş adamlarının, sahibkarların hüquqlarını qorumağa, onların normal fəaliyyət göstərmələri üçün şərait yaradılmasına yönəlir. Bu qətiyyətli çıxışlarda auditoriya Heydər Əliyev zəkasının, fəhminin, iqtisadi sahədə də parladığının şahidi olur, iqtisadiyyatın incəliklərinə bələd olan dövlət xadiminin, siyasi xadimin iqtisadiyyatın fəlsəfəsinə bələdliyindən valeh olur: "Ona görə də mən sahibkarlara bu tövsiyəni verərkən, eyni zamanda dövlət orqanlarından tələb edirəm və qəti tələb edirəm ki, sahibkarlığın inkişaf etdirilməsi üçün indiyə qədər yaradılan və mövcud olan əngəllər aradan

götürülsün, sahibkarlara onların normal fəaliyyət, qanuni fəaliyyət göstərməsi üçün şərait yaradılsın, kömək edilsin. Onlar hansı qanunları bilmirlərsə o qanunları öyrətsinlər, başa salsınlar. Bu sahədə, mən hesab edirəm ki, hüquqi təhsil çox vacibdir. İndi bu bütün cəmiyyət üçün və o cümlədən sahibkarlar üçün lazımdır. Sahibkarlar gərək bütün hüquq normalarını bilsinlər. Qanunları bilmək nə deməkdir? Yəni bütün hüquq normalarını bilsinlər. Onda öz hüquqlarını və dövlət orqanlarının hüquqlarını biləcəklər. Onlar öz hüquqları çərçivəsində iş görərək arxayın ola bilərlər ki, hüquqları dövlət orqanları tərəfindən pozularsa, onlar bu orqanların qarşısında dura bilərlər. Sahibkarların da hüquqları pozulmamalıdır və dövlətin də mənafeyinə zərər dəyməməlidir" [VIIc.s.231].

Onun nitqlərində "mütləq" ifadəsi qətiyyətin kəskinliyinə işarədir. İqtisadiyyatdakı köhnəliklə yeniliyin mübarizəsini Heydər Əliyev bir filosof kimi qəbul edir. Bu zaman keçmişi özündə ehtiva edən "köhnə üsul-idarə", "köhnə iqtisadi sistemə bağlılıq", "mühafizəkarlıq meylləri" kimi sinonim cərgələr obyektiv proseslərin təbii nəticəsi olan "yeniliklər", "dəyişikliklər", "islahatların aparılması meylləri" kimi sinonim cərgələrlə ziddiyyətdə verilir ki, bu da nitqin ecazkarlığını artırmaqla sonluğu "islahatlar yolu ilə getməliyik" qətiyyəti ilə başa vurur: "Cəmiyyətdə bir tərəfdən köhnə üsul idarəyə, köhnə iqtisadi sistemə bağlılıq, mühafizəkarlıq meylləri, ikinci tərəfdən isə həyatın təbii, obyektiv prosesləri ilə əlaqədar yeniliklər, dəyişikliklər, islahatların aparılması meylləri mövcuddur. Bütün bunlar təbiidir. Eyni zamanda bu proses bizim gələcək yolumuzun daha da doğru-düzgün müəyyən olunması üçün zəruridir. Bunların hamısının nəticəsində cəmiyyətimizdə ümumi fikir əksərən iqtisadi islahatların həyata keçirilməsi xeyrinə formalaşıbdır. Ona görə də biz dövlətin,

hökumətin bu mövqeyini dəfələrlə bəyan etmişik ki, respublikamızın iqtisadiyyatında inkişafı təmin etmək üçün, əhalinin rifahının yaxşılaşmasına nail olmaq üçün mütləq iqtisadi islahatlar yolu ilə getməliyik" [IIIc.s.32].

Heydər Əliyevin qətiyyətlə dolu fikirləri ədəbiyyatımızla, incəsənətimizlə bağlı tədbirlərdə də özünü göstərir. Poetik duyğuların ardınca bugünkü ictimai-siyasi vəziyyətlə həmahəng səsləşən qətiyyətli ifadələr işə düşür. Dahi Azərbaycan şairi və mütəfəkkiri Məhəmməd Füzulinin anadan olmasının 500 illik yubileyinə həsr edilmiş təntənəli gecədə Heydər Əliyev sinonim cərgələrin köməyi ilə Füzulinin insanları birliyə, həmrəyliyə çağırışlarını dinləyicilərə çatdırır. Öncə poetizm işə düşür: "Eşqi, məhəbbəti, sevgini vəsf edən Füzuli", "Saf mənəviyyatı, ülvi duyğuları vəsf edən Füzuli", "Dostluğa, mehribanlığa çağıran Füzuli" deməklə auditoriyanı Füzuli dünyasına aparan böyük natiq sonda altı yerdə "üçün" epifora stilistik fiqurundan istifadə edərək xalqımızı birliyə, həmrəyliyə səsləyir: "Məhəmməd Füzuli insanları dostluğa, mehribanlığa dəvət edibdir. Eşqi, məhəbbəti, sevgini vəsf edərkən, insanlarda saf mənəviyyatı, ülvi duyğuları vəsf edərkən Məhəmməd Füzuli insanları birliyə, həmrəyliyə, dostluğa, mehribanlığa çağırıbdır. Bu gün Məhəmməd Füzulinin bu fikirləri bizim üçün hər şeydən vacibdir. Biz ölkəmizi bu ağır mərhələdən keçirmək, ölkəmizin ərazi bütövlüyünü bərpa etmək üçün, işğal olunmuş torpaqlarımızı azad etmək üçün, ölkəmizdə demokratik prosesləri inkişaf etdirmək üçün, ölkəmizin dünya birliyində özünə layiq yer tutması üçün, onu daha da irəliyə aparmaq üçün daxilimizdə olan birliyi, həmrəyliyi möhkəmləndirməliyik" [VIIIc.s.29-30].

Heydər Əliyev nitqində qətiyyət Azərbaycan elminin qorunmasına yönəlir: "Mən o vaxt yalnız və yalnız elmin

zibillənməsinin qarşısını almaq istəyirdim. Çünki o insanlar vəzifələrindən sui-istifadə edirdilər. Şübhəsiz ki, özləri elmi əsər, yaxud dissertasiya yazmırdılar, kiməsə yazdırır, müdafiə edirdilər. Mən o vaxt da bunun əleyhinə olmuşam, indi də əleyhinəyəm. Bu mənim mənəvi prinsipimdir" [VIIIc.s.363].

Azərbaycanın gələcəyinin elmə söykənməyini özünün başlıca mənəvi prinsipi elan edir. 20 noyabr 1997-ci il. Amerikada nəşr edilən "Azərbaycan İnternəşnl" jurnalının beş illiyinə həsr olunmuş mərasimindəki nitqdə Ulu Öndər bu jurnal barədə özünün fəlsəfi, poetik düşüncələrini mərasim iştirakçıları ilə bölüşür. Aşağıdakı adları çəkilən ölkə təşkilatlarını, qurumlarını Azərbaycan həqiqətlərinin dünyaya göstərilməsi yolunda səfərbər edir. Bu səfərbərlik qətiyyətli sözlərlə auditoriyaya çatdırılır: "İnformasiya orqanlarımız da, ictimai təşkilatlarımız da və bizim Yazıçılar Birliyi, Bəstəkarlar İttifaqı, elmi təşkilatlarımız, Elmlər Akademiyası və başqaları da bu sahədə bir çox işlər görmüş və nailiyyətlər əldə etmişlər. Ancaq bunlar heç də yetərli deyil, hələ çox işlər görülməlidir. Çox səylər qoymalıyıq ki, Azərbaycanı hər yerdə, hər ölkədə oluğu kimi tanısınlar, bilsinlər. Azərbaycan xalqının tarixini, nailiyyətlərini, xüsusiyyətlərini, keyfiyyətlərini həqiqətən bilsinlər" [XIIIc.s.218].

Xalqın, millətin təhsil alması, savadlı olması, milli ənənələrinə sahib çıxması yolunda humanitar elmləri mənimsəməsi məsələlərində Heydər Əliyev "ciddi məşğul olsun" deyərək üzünü Təhsil Nazirliyi, Nazirlər Kabinetinə tutur, onları necə deyərlər yerindən tərpədir: "Bilirəm, bu asan iş deyil. Bu, bir çox böyük amillərlə bağlıdır, onlardan asılıdır. Ancaq mən bu gün həm Təhsil Nazirliyinə, həm də Nazirlər Kabinetinə qəti təklif edirəm ki, onlar dərsliklərin dəyişməsi, müstəqil Azərbaycanın tarixinə, həyatına uyğun yazılması işi ilə daha da

ciddi məşğul olsunlar çünki, məktəblərdə tarix, ədəbiyyat dərsləri, humanitar sahəyə aid başqa dərslər köhnə dərsliklər əsasında aparılırsa, onlar bizə xeyir gətirmir. Onsuz da keçmiş zamanda həmin dərsliklərlə təhsil alan insanlar hələ var, onların zehnində, fikirində dəyişilmə prosesi gedir və getməkdədir. Ancaq indi dərs alan uşaqlar, gənclər gərək mütləq və mütləq bizim yeni dərsliklər əsasında oxusunlar” [XIIc.s.137].

Heydər Əliyev nitqlərində Azərbaycan gənclərinin intellektual səviyyəsinin dövlət işlərində xidmət göstərməyə imkan verməsi qətiyyətlə auditoriyalara çatdırılır. 6 mart 1998-ci il tarixdə, Respublika Xarici İşlər Nazirliyinin kollektivi ilə görüşdə, dövlət əhəmiyyətli strukturlardan təsadüfi adamları, ciddi dövlət işlərinə yaramayanları uzaqlaşdırmağı qətiyyətlə tələb edir. “İstedadlı”, “bacarıqlı”, “dəyərli” kadrları qorumağın, onlara kömək göstərilməsinin vacibliyini anladır: “Bilirsiniz, sizin bu sistemdə olan təsadüfi adamları, bu işə yaramayan adamları uzaqlaşdırmaq, nazirliyi belə adamlardan təmizləmək lazımdır. Gələcəkdə burada proteksionizmə yol vermək olmaz, cürbəcür vasitələrlə Xarici İşlər Nazirliyi sistemində işləməyə gələn, keyfiyyətləri olmayan adamları buraya buraxmaq olmaz. Ona görə də təkrar edirəm, istedadlı, bacarıqlı, dəyərli kadrları qorumaq lazımdır, onlara kömək etmək lazımdır, onları irəli çəkmək lazımdır. Bacarıqsız, perspektivi olmayan, yaxud buraya təsadüfi düşmüş adamları bu işdən kənar etmək lazımdır və güclü kadr ehtiyatı yaratmaq lazımdır. Hesab edirəm ki, Azərbaycanın bugünkü intellektual səviyyəsi, xüsusən Azərbaycan gənclərinin intellektual səviyyəsi bu işləri uğurla aparmaq üçün çox gözəl imkanlar yaradır” [XVc.s.33].

Ölkə əhalisinin inanc, istinad, güvənc yeri olan islam dininin təbliği və qorunması yolunda Heydər Əliyevin qətiyyətli nitqi müxtəlif auditoriyalarda şəfəq kimi parlayır, dini-

mizə uzanan qara əlləri, şər qüvvələri günəş kimi yandırır. “Biz buna yol verə bilmərik”, “lazımi tədbirlər görülməlidir” kimi qətiyyətli ifadələrlə İslamın qorunması və təbliği kütlələrin şüuruna yeridilir, dövlət strukturlarını səfərbər edir: “Ancaq gənclərimizin islam dinini mənimsəməsi üçün, hesab edirəm ki, lazımi tədbirlər görülməlidir. Çünki bu tədbirlərin olmaması nəticəsində bəzi mənfi hallar meydana çıxır, ayrı-ayrı qruplar gənclərə fanatizm əhval-ruhiyyəsi aşılamaq istəyirlər və bunlar da bizim gənclərin tərbiyəsinə zərər vurur. Ona görə də İslam dininin tədris olunması, hesab edirəm ki, günün tədbirlərindən biridir və bu barədə Təhsil Nazirliyi, müvafiq təşkilatlar düşünməlidirlər, lazımi tədbirlər görməlidirlər. Biz heç vaxt yol verə bilmərik ki, ayrı-ayrı şəxslər, ayrı-ayrı qüvvələr öz şəxsi mənafelərini güdərək İslam dini pərdəsi altında Azərbaycan gənclərinin tərbiyəsinin zədələnməsinə gətirib çıxarsınlar. Biz buna yol verə bilmərik” [Vc.s.31].

Qətiyyətli nitq dini auditoriyaları da bəzəyir. 9 dekabr 1996-cı il Təzəpir məscidində Məbəs bayramı – Məhəmməd salavatullaha peyğəmbərlik verilən gün münasibətilə keçirilən mərasimdə xalqı, milləti birliyə çağırış kimi səslənən qətiyyət sonda poetikcəsinə olaraq dindarlar auditoriyasının qəlbinə yol tapır: “Respublikamızı bu ağır vəziyyətdən çıxarmaq üçün xalqımız daha da sıx birləşməlidir, həmrəy olmalıdır, millətimiz bir olmalıdır...

Azərbaycan dövlətinin müstəqilliyinin yaşaması və möhkəmlənməsi naminə, respublikamızın ərazi bütövlüyünün bərpa olunması naminə, işğal edilmiş torpaqlarımızdakı Ermənistan silahlı qüvvələrinin çıxarılması və bu torpaqların azad olunması naminə hamınızı birliyə, həmrəyliyə dəvət edirəm” [VIIIc.s.160].

Qətiyyətli çıxış və nitqlər dini auditoriyalarda da səslənir. İslam dinimizin inkişafı yolunda çalışmağı ümdə məsələ hesab edən böyük natiq burada da qətiyyətli mövqe göstərir: "Müsəlman ölkələri arasında əməkdaşlığı möhkəmləndirmək, xalqlarımızın əmin-amanlığını təmin etmək, onların rifahını yüksəltmək, dinimizi, ənənələrimizi, mədəniyyətimizi və mənəvi dəyərlərimizi qoruyub inkişaf etdirmək İslam Konfransı Təşkilatının ən ümdə vəzifəsidir. Bu müqəddəs amalları həyata keçirmək üçün biz daim çalışmalıyıq. Mən hamınızı daha da fəal əməkdaşlıq etməyə dəvət edirəm". (İKT üzvü olan ölkələrin rəhbərlərinin VIII zirvə görüşündə nitq. 10 dekabr 1997-ci il) [XIIIc.s.338].

Heydər Əliyevin qətiyyətli çıxışlarının İslam Konfransı Təşkilatının Zirvə toplantısında səslənməsini eşidirik. 13 dekabr 1994-cü il tarixdə, Kasablanka Zirvə toplantısındakı XX əsrin regional münaqişələr, onlara olan münasibətini filosofcasına izah edir. Müsəlman dünyasını bir-birinə kömək etməyə, "parçalanmanın və təklənmənin" qarşısını almağa, "dara düşmüş qardaşlara" kömək etməyə çağırır. Buradakı qətiyyətli çıxışı ilə Heydər Əliyev İslam dünyasını – Dünya sivilizasiyasına töhfələr vermiş İslam dünyasını səfərbər edir: "Bu gün dünyada mürəkkəb, ziddiyyətli proseslər getməkdədir, viranedici qlobal müharibənin qarşısının alınması, dünyanın təhlükəsizliyinin yeni təməlinin qoyulması kimi müsbət meyllər, regional münaqişələrin artması ilə, yırtıcı millətçiliklə və dövrün başqa bəlaları ilə qarşılaşır. Bizim ölkələrimiz bu proseslərin qaynağındadırlar və biz beynəlxalq təhlükəsizliyin möhkəmlənməsinə, sülh və tərəqqi qüvvələrinin qələbəsinə layiqli yardım etməliyik, öz səylərimizi göstərməliyik. Bunun naminə biz müsəlman ölkələrinin inkişafına mane olan əngəlləri aradan qaldırmalı, bir-birimizə yardım əli uzatmalıyıq, parça-

lanmanın və təklənmənin qarşısını almalıyıq, dara düşmüş qardaşlarımıza birlikdə kömək etməliyik, qanlı müharibələrin və silahlı münaqişələrin alovunu söndürməliyik" [IIIc.s.19-20].

Adətən dini üslubun tələb etdiyi səmimiyyət və nikbinliklə yanaşı dindarlar qarşısında da Heydər Əliyevin qətiyyətli nitqi özünü göstərir. "Yox" inkar ədatı ilə başladığı "müstəmləkə ola bilmərik", "bir daha qul ola bilmərik" kimi kəsərli qətiyyətli ifadələr dindarlar qarşısında siyasi-dini lider obrazını yaradır. "Allah evində and içən" ölkə başçısına olan inam – etimad birə min artır: "Yox! Mən bu gün sizə deyirəm və bu Allah evində and içirəm ki, biz bundan sonra heç vaxt müstəqilliyimizi əldən verməyəcəyik! Hər bir Azərbaycanlı bunu anlamalı, bilməlidir. Biz bir daha müstəmləkə ola bilmərik, bir daha qul ola bilmərik. Biz azad olmuşuq, Azərbaycan xalqı azad yaşamalıdır. Ancaq ölkəmizin daxilində olan ayrı-ayrı xəyanətkarlar, satqınlar öz şəxsi mənafelərini xalqın mənafeyindən, milli mənafeyimizdən, ənənələrimizdən üstün tutaraq yenə də müstəqilliyimizi dağıtmaq istəyirlər. Biz buna yol verməyəcəyik" [IVc.s.198-199].

Milli-dini dəyərlərimizi qorumaq yolunda Heydər Əliyevin qətiyyətli nitqlərinin araşdırılması çox vacibdir. Bakı Xəzər Bitkisel Yağ fabrikinin açılışı mərasimindəki nitqdə üzünü soydaşlarına tutan böyük natiq öncə spirtli içkilərdən xalqımızın heç vaxt istifadə etməməsini dilə gətirir, ənənələrimizi nəsihətamiz şəkildə qorumağa çağırır: "Mən bunu ona görə xüsusi qeyd edirəm ki, son illər Azərbaycanda bəzi iş adamları ilə əlaqəyə girərək cəmiyyətin tələbatını yox, özlərinin qazancını son illər Azərbaycanda araq, spirt istehsalını artırmağa başlayıblar... Necə olubdur ki, xalqımız bu qədər spirtli içkilər içməyə başlayıbdır? Bu bizim üçün zərərlidir. Bir tərəfdən bol olanda onun qiyməti də aşağı düşür. Spirtli

içkilər, xüsusən araq istehsal etməklə bizim xalqımızın ənənələri pozulur. Bunu sübut etmək lazım deyil ki, xüsusən araq hər bir insan üçün zərərlidir. Xalqımız keçmiş zamanlarda heç vaxt araq, spirtli içki içməyibdir. Bizim İslam dinimiz də bunu yasaq, qadağan edibdir. Ancaq yenə də deyirəm, bəzi iş adamları fikirləşirlər ki, daha çox qazancı araq istehsalından götürmək olar. Biri orada, biri burada araq sexi, spirt sexi yaradır. Mənə məlumat gəlir ki, bizim yüksək vəzifəli bəzi şəxslər də belə araq, spirt istehsalına himayədarlıq edirlər, çünki oradan qazanc götürməyə çalışırlar" [XIVc.s.34].

İslam dinimizin qadağan etdiyi spirtli içkilərdən qazanc götürmək istəyənləri bu işlərə son qoymağa çağırır. "Belə hallara son qoyulmalıdır", "qarşısı alınmalıdır", "hətta onun qarşısını alaq" qətiyyətli ifadələri spirtli içkilərin xalqımıza vuracağı zərərin onun istehsalından gələn xeyirlə müqayisə olunmadığını auditoriyaya çatdırır: "Mən bu gün bir daha bəyan edirəm: Azərbaycanda belə hallara son qoyulmalıdır. Mən Azərbaycanda spirtli içkiləri qadağan etmirəm. Ancaq üzümü öz soydaşlarıma tutub, sadəcə demək istəyirəm ki, gəlin bizim milli, dini, mənəvi ənənələrimizi – ulu babalarımızdan əsrlərdən-əsrlərə bizə qalmış ənənələrimizi pozmayaq. Gəlin onlara sadiq olaq, arağa bu meylin artmasına nəinki imkan verməyək, hətta onun qarşısını alaq. Bu, mənim ümumi fikirimdir. Amma konkret istehsalla əlaqədar onu demək istəyirəm ki, Azərbaycanda spirt, araq, yaxud da ki, spirtli içkilər əhaliyə nə qədər lazımdır, o qədər istehsal olunmalıdır. Başqa istehsalın qarşısı alınmalıdır. Mən bizim Nazirlər Kabinetinə, müvafiq nazirliklərə, komitələrə bu haqda göstəriş vermişəm. Bu gün bir daha bunu təkrar edirəm – bunların qarşısı alınmalıdır" [XIVc.s.35].

Heydər Əliyev ölkə həyatında, eləcə də dünyada təşviş doğuran məsələlər haqqında öz qətiyyətli sözünü deyir. Ümumbəşəri bir problem olan narkomaniya və narkobiznes ilə mübarizəyə qarşı qətiyyətlə çıxış edir. Problemi incələyir, bu problemin cəmiyyət üçün təhlükəliliyini açıb göstərir, sonda isə mübarizə tədbirlərini qətiyyətlə önə çəkir. BMT-nin Yaxın və orta şərqdə narkotik vasitələrin qanunsuz dövriyyəsinə nəzarət və bununla bağlı problemlər üzrə yardımçı komissiyasının 32-ci sessiyasındakı nitqdə olduğu kimi: "Bu problem bir neçə cəhətdən ibarətdir. Biz ölkəmizdə Azərbaycanda bu problemin bütün istiqamətləri sahəsində lazımi tədbirlər görürük. Biz Azərbaycanda belə hesab edirik ki, birinci növbədə hər bir ölkədə narkomaniyanın qarşısının alınması üçün çox ciddi təşkilati profilaktik tədbirlər görülməli, lazımi izahat işi aparılmalı, səhiyyə, təbliğat orqanları narkomaniyanın insan üçün, bəşəriyyət, cəmiyyət üçün nə qədər təhlükəli, faciəli olduğunu hərtərəfli açıb göstərməli və insanları bu xəstəliyə qurşanmaqdan çəkindirməlidirlər" [VIIIc.s.409].

Qətiyyət dilimizin qorunması sahəsində də özünü göstərir. 30 oktyabr 1997-ci ildə Azərbaycan yazıçılarının X qurultayındakı nitq bu baxımdan mühümdür: "Hər bir Azərbaycanlı öz ana dilini bilməlidir, bu dildə səlis danışmalıdır və bu dili sevməlidir. Bununla yanaşı biz çalışmalıyıq ki, məktəblərimizdə, universitetlərimizdə gənclərimiz bir neçə dil öyrənsinlər" [XIIIc.s.136].

Dil məsələsinə münasibətdə millətçilik meyillərinə öz münasibətini göstərən ulu öndər milli mənafeləri öndə saxlayır, milli mənafelərin qorunmasında heç bir güzəştə getmir və bu gün də bizləri bu sahədə qəti mövqedə durmağa çağırır: "Biz artıq dünyaya qovuşmuşuqsa, dünya birliyinə daxil olmuşuqsa, gərək insanlarımız bir neçə dil bilsinlər – ingilis

dilini də bilsinlər, fransız dilini də bilsinlər. Bunu yasaq etmək olmaz, bunun qarşısını almaq lazım deyil. Amma birinci növbədə öz ana dilini bilməlidirlər" [XIIIc.s.136].

Çıxışın yekununda isə qətiyyət sərt xəbərdarlıq çalarları ilə özünü göstərir: "Bəli Azərbaycanda indi də insanlar var ki, əsasən rus dilində danışırlar, Azərbaycan dilində danışmırlar. Bizim dövlət orqanlarında da beləlәri var. Mən dəfələrlə xəbərdarlıq etmişəm ki, Azərbaycan dilini öyrənin, öyrənməsəniz işdən çıxaracağam" [XIIIc.s.136].

Heydər Əliyevin nitqində qətiyyət dost, qardaş ölkələrə münasibətdə də özünəməxsusluqla özünü göstərir. Qardaş Türkiyə ilə bağlı fikirlər bu qəbildəndir: "Türkiyə ilə Azərbaycan arasında olan dostluq, qardaşlıq əlaqələri sarsılmazdır. Bunu artıq heç kəs sarsıda bilməz. Azərbaycanın Dövlət müstəqilliyi yenilməzdir, dönməzdir, əbədidir. Azərbaycan əbədi müstəqil bir Dövlətdir. Müstəqil dövlət kimi Azərbaycan Türkiyəni özünə ən yaxın bir qardaş, dost ölkə kimi qəbul edibdir" [VIIIc.s.54].

Heydər Əliyevin ölkəmizə isti münasibətdə olan ölkə və təşkilatlar qarşısındakı qətiyyətli çıxışı ərkyanadır, onları ölkəmizə kömək etməyə çağırır. 13 dekabr 1994-cü ildə İslam Konfransı Təşkilatının üzvü olan ölkələrin dövlət və hökumət başçılarının Kasablanka zirvə toplantısındakı çıxış bu qəbildəndir. Təcavüzkar Ermənistana qarşı bu təşkilatın "siyasi iradəsini qətiyyətlə bildirməsini" və ədalətli mübarizəmizə "tərəfdar çıxmasını" ərklə tələb edir: "İslam Konfransı Təşkilatı kimi nüfuzlu təşkilat və onun hər bir üzvü tərəfindən təzyiq göstərilməsi də son dərəcə vacibdir. Ona görə də, hörmətli görüş iştirakçıları, mən sizə üz tutub xahiş edirəm ki, siyasi iradənizi qətiyyətlə bildirəsiniz və Azərbaycan dövlə-

tinin ərazi bütövlüyü uğrunda bizim ədalətli mübarizəmizə tərəfdar çıxasınız” [IIc.s.17].

Qətiyyətli çıxış və nitqlər türkdilli xalqların gələcək inkişafına yönəlir. Bu inkişaf üçün indiki dövrdə böyük imkanlar yarandığını göstərən ulu öndər yazıçı və şairlərin üzərinə düşən məsuliyyət yükünü yada salır. “Türk dünyası yazıçılarının III qurultayı”ndakı nitqində (6 noyabr 1996-cı il) olduğu kimi: “Amma indi isə, türkdilli xalqların müstəqil dövlətlər olduğuna görə və bizim əlimizdə böyük imkanlar yarandığına görə bu prosesləri daha da gücləndirə, daha da mütəşəkkil edə bilərik. Bu bizim vəzifəmizdir, borcumuzdur. Bir də qeyd etmək istəyirəm ki, bu sahədə yazıçıların böyük xidməti, böyük rolu var və onların üzərinə bundan sonra da böyük vəzifələr düşür” [VIIIc.s.10].

4 noyabr 1997-ci il tarixdə Şeyx Şamilin 200 illik yubileyinə həsr edilmiş təntənəli gecədəki nitq xalqlar arasında dostluq və əməkdaşlığa həsr olunmuşdur. İşgüzar, tarixi köklərə söykənən çıxış sonda xalqlar dostluğuna kənar əllərin, müdaxilələrin uzanmasının qarşısını kəsən qətiyyətli cümlələrlə yekunlaşır: “Ona görə də biz Dağıstanı daim qədimdən, həmişə tarixi dostumuz kimi qəbul etmişik və qəbul edirik. Dağıstanla Azərbaycan arasında heç vaxt, heç bir münaqişə olmayıbdır və bundan sonra da olmayacaq və ola da bilməz” [XIIIc.s.146].

Azərbaycançılıq ideyalarını qətiyyətlə davam etdirən Heydər Əliyev ölkə daxilində etnik münaqişə törədənlərə öz nifrətini gizlətmir. Yerindən-yurdundan didərgin düşmüş soydaşlarımıza təkəbbür və lovğalıqla yanaşanları ədəbsiz, mənəviyyatsız adlandıraraq onları düzgün yola çağırır. Heydər Əliyevə görə, millətimizə ən böyük xəyanət edən adamlar millətimizi, xalqımızı içindən təbəqələrə bölənlər, bir-birindən

ayıranlardır: "Kəlbəcərdə, Laçında ya da Zəngəzurda, yaxud Göyçə mahalında anadan olub, ya da Borçalıda, Bakıda, Maştağada anadan olub fərqi yoxdur hamısı bir millətin adamlarıdır, azərbaycanlılardır. Ancaq yerlərə görə, yaxud müəyyən qruplara görə insanların hamısına mənfi münasibət göstərmək olmaz, yaxud kimi isə xüsusi bir dəstə kimi çox mötəbər hesab etmək olmaz. Bu bizim mənəviyyatımıza zidd olan bir amildir" [VIc.s.42-43].

Qətiyyətli çıxışlar qaçqın və köçkünlərlə keçirilən görüş və onların üzləşdiyi problemlərin həlli ilə bağlı müşavirələrdə özünü göstərir: "Sizin problemlərlə əlaqədar yerli icra hakimiyyəti orqanları, – mən bunu bir daha deyirəm, televiziya ilə veriləcəkdir, bilsinlər, – öz fəaliyyətlərini gücləndirməlidirlər, bütün rayonlarda, şəhərlərdə məskunlaşmış köçkünlərin problemlərinə qayğı və ciddi münasibət göstərməlidirlər. Nazirlər Kabineti, onun müvafiq şöbələri, müvafiq işçiləri qarşıya çıxan məsələlərlə ciddi məşğul olmalıdırlar. Prezidentin icra aparatı, onun şöbələri bu məsələlərlə daim məşğul olmalıdırlar" [VIIIc.s.222].

BDU-nun tələbə şəhərciyində, müvəqqəti yerləşdirilmiş qaçqınlarla görüş (23 aprel 1997-ci il) qətiyyətin nikbinliklə, səmimiyyətlə sintezi kimi dərk oluna bilən bir çıxışdır. "Bilirik ki, belə vəziyyətdə yaşamaq çətindir. Əlimizdən gələni edirik ki, sizin yaşayışınızı müəyyən qədər yüngülləşdirək, vəziyyətinizdə müəyyən müsbət halların əldə edilməsinə nail olaq. Bilin ki, Azərbaycan prezidenti kimi, mənim üçün sizin həyatınıza olan qayğı kimi, başqa birinci dərəcəli məsələ yoxdur. Mənim üçün işğal olunmuş torpaqların azad edilməsi, Azərbaycan Respublikasının ərazi bütövlüyünün bərpa olunması kimi, başqa bir ali vəzifə yoxdur. İnanın, bilin ki, mən

sözümü yerinə yetirmək üçün həyatımın son dəqiqəsinə qədər çalışacağam” [IXc.s.217].

Vətənimizin müdafiəsi yolunda şəhid olmuş, əlilliyə düçar olmuş vətəndaşların ailə üzvlərinə, özlərinə dövlət qayğısı göstərilməsi Heydər Əliyevin qətiyyətli çıxışlarında özünə yer tapır: “Ümumiyyətlə, vətənin müdafiəsində iştirak etmiş və qəhrəmanlıq, şücaət göstərmiş insanların hamısı cəmiyyətimizin diqqət mərkəzində olmalıdır, dövlət orqanları onlara qayğı göstərməlidir. Onlar cəmiyyətdə həmişə hörmətlə qarşılanmalıdırlar. Şəhid ailələri bizim hamımızın, həm dövlətin, hökumətin, həm də cəmiyyətin daimi qayğısı altında olmalıdır” [XIIIc.s.210].

Heydər Əliyev qətiyyəti şəhid uşaqları və kimsəsiz uşaqlar üçün təşkil olunmuş şənliklərdə, görüşlərdə xüsusilə özünü göstərir. Uşaq evlərinə qayğını “əsas vəzifə” hesab edərək, dövlət orqanlarından xüsusi diqqət tələb edir. Valideynsiz, ata-anasız uşaqlara “xüsusi qayğı göstərilməlidir” ifadəsi isə hakimiyyət orqanlarını ölkənin gələcəyi olan uşaqlar üçün mühüm işlər görməyə səfərbər edir: “Sizin əksəriyyətiniz, bilirəm, uşaq evlərində yaşayır... Bütün dövlət orqanları, icra hakimiyyəti orqanları uşaq evlərinə xüsusi diqqət verməlidirlər. Valideynsiz, ata-anasız uşaqların yaşamasına, tərbiyə, təhsil almasına xüsusi qayğı göstərilməlidir. Mən bunu bir daha qeyd edir və vəzifə kimi hakimiyyət orqanlarının qarşısında qoyuram. Ümumiyyətlə, məktəblərə, uşaqlara, onların təlim-tərbiyəsinə, təhsilinə qayğı bizim əsas borcumuzdur” [VIc.s.7-8].

Heydər Əliyevin qətiyyətli çıxışlarına xəlqilik ruhu hakimdir. Xocalı soyqırımının dördüncü ildönümü ilə əlaqədar Xocalı sakinləri ilə 24 fevral 1996-cı il tarixli görüşdə “Dünya həmişə belə qalmayacaqdır” fikri Xocalı soyqırımını törə-

dənlərə qarşı ittiham kimi səslənir. Azərbaycan xalqına qarşı Xocalı soyqırımı kimi törədilən vəhşiliklərin cavabsız qalmayacağı fikrini dünya ictimaiyyətinə qətiyyətlə çatdırır: "Beynəlxalq məhkəmə onların cəzasını verəcəkdir. Həmin 366-cı alay gələcəkdə cəzasını alacaqdır və beynəlxalq məhkəmə onların da cəzasını verəcəkdir. Dünya həmişə belə qalmayacaqdır" [Vc.s.363-364].

Heydər Əliyevin qətiyyəti informasiya blokadasını yarmaq yolunda mühüm rol oynayır. Bu yolda həyata keçirilən tədbirləri, görülən işləri o, kampaniya şəklində yox, "mütəmadi, davamlı, ardıcıl" şəkildə aparmağı tələb edir. O, bu təbliğatı bir anda olsa unutmamağı tələb edir. "Bunu unutmaq olmaz!" xitabını təkrarlayaraq bu soyqırımı, bu vəhşiliyi unutmamağı tələb edir. Bu zaman onun nitqi xitablar şəklində, ədatlardan istifadə olunması ilə öz ecazkar gücünü auditoriyalara çatdırır: "Bilirsiniz tək onunla kifayətlənmək olmaz ki, Xocalı soyqırımı haqqında kitab da yazıldı, bir film də çəkildi. O vaxtlar təzə-təzə, hələ o yaralar soyumamış bu barədə məlumat çatdırıldı. Yox, bunu daim etmək lazımdır. Daim! Hər il, hər gün! Beş il də bundan sonra, on il də bundan sonra! Bunu unutmaq olmaz, bunu unutmaq olmaz! Və burada yeni güclü bir hərəkət etmək lazımdır, kampaniya aparmaq lazımdır. Ancaq bu tək kampaniya şəkli almamalıdır, mütəmadi olmalıdır, ardıcıl olmalıdır!" [Vc.s.361-362].

Heydər Əliyev nitqində qətiyyət poetikliklə çulğalaşır. Səməd Vurğunun 90 illik yubileyinə həsr edilmiş gecədəki nitqdə bunun şahidi oluruq: "Biz Səməd Vurğunun ruhu qarşısında baş əyərək deyə bilərik: Əziz şairimiz, sənin canın qədər sevdiyin Azərbaycan bu gün müstəqil dövlətdir. Sənin canın qədər sevdiyin xalqın bu gün azaddır. Bu gün mən bir daha bəyan edirəm ki, biz Səməd Vurğunun ruhunu gələcəkdə

də şad edəcəyik. Müstəqil Azərbaycan yaşayacaq. Azərbaycanın dövlət müstəqilliyi əbədi, dönməz olacaqdır. Xalqımız daim sərbəst, öz taleyinin sahibi olacaqdır" [IXc.s.23].

Heydər Əliyevin qətiyyəti döyüşdən geri çəkilməyən komandan qətiyyətidir. Fransada akkreditə olunmuş xarici jurnalistlərin suallarına cavabda (Paris, 15 yanvar 1997-ci il) Azərbaycan əleyhinə böhtan yazan "Mond" qəzetini ciddi tənqid edir, qətiyyətli cavabı ilə qəzetləri düzgün, qərəzsiz, doğru mövqe tutmağa çağırır: "Dünən axşam "Mond" qəzeti Azərbaycanın əleyhinə böhtanla dolu uydurmalara bütöv bir səhifə həsr edibdir. Burada Fransada səfərdə olduğum vaxt belə bir yazıdan çox təəssüfləndim. Burada ermənilərin böyük diasporunun olduğunu bilirəm. Mən Fransada yaşayan ermənilərin hamısına böyük hörmətlə yanaşıram. Ancaq Ermənistandakı, digər ölkələrdəki, o cümlədən də Fransadakı ekstremist, millətçi, təcavüzkar erməni dairələri qəzetlərdə böhtançı uydurmalar dərc edir, Fransa ictimaiyyətinə yalan məlumat verirlər. Bütün bunlara inanmayın. "Mond" qəzetində yazılanların hamısı başdan-başa iftiradır. Fransa prezidentinin dəvəti ilə burada rəsmi səfərdə olduğum vaxtda "Mond" qəzetinin bu cür qeyri-etik hərəkəti özünə rəva bilməsindən təəssüflənirəm. Sağ olun, xudahafiz" [VIIIc.s.315].

Azərbaycanın işıqlı gələcəyini uşaqlarla və gənclərlə görən böyük natiqin uşaq auditoriyasındakı çıxışları nikbinliklə dolu notlar əsasında qurulur, lakin uşaqların inkişafı yolunda qətiyyətlilik mühüm yer tutur. Dolğun ifadələrlə dövlətin uşaqlarla bağlı siyasəti açıqlanır. Sonluq isə "biz uşaqlarımızı yaxşı tərbiyə etməliyik, yaxşı şəraitdə yaşatmalıyıq" qətiyyətli fikri ilə tamamlanır: "Dövlətin qayğısı ilə hər bir vətəndaşın, hər bir təşkilatın qayğısı, hər bir cəmiyyətin qayğısı, xeyriyyəçilik edən hər bir adamın qayğısı birləşməlidir, qovuşma-

lıdır. Biz uşaqlarımızı yaxşı tərbiyə etməliyik, yaxşı şəraitdə yaşatmalıyıq. Uşaqlarımıza təhsil veməliyik. Onları gələcəyə hazırlamalıyıq. Azərbaycan dövlətinin uşaqlar haqqında siyasəti məhz bundan ibarətdir" [IIc.s.19].

Nitq və çıxışlarında qətiyyət ilə poetikliyi birləşdirmək Heydər Əliyev zəkasına mənsubdur. "Çətin günlər müvəqqətidir ancaq həyat daimidir" deyən böyük natiq məşhur Azərbaycan rəssamı Səttar Bəhlulzadənin anadan olmasının 85 illiyi münasibətilə təntənəli yubiley gecəsindəki çıxışda mədəniyyətimizə qayğı göstərilməsini qətiyyətlə tələb edir. Bu çıxışda "mədəniyyətə qayğı göstərməliyik", "Səttar Bəhlulzadə irsinə çox böyük diqqət yetirməliyik" və s. kimi qətiyyət dolu ifadələrlə Azərbaycan mədəni irsinin inkişafı yolunda müasirlərini qətiyyətli addımlar atmağa çağırır: "İndi həyatımız nə qədər çətin, ağır olsa da, biz heç vaxt mədəniyyəti unutmamalıyıq. Mədəniyyət həmişə bizimlə bərabər olmalıdır. Mədəniyyətə qayğı göstərməliyik, onu inkişaf etdirməliyik. Çünki bu çətin günlər müvəqqətidir. Ancaq həyat daimidir. Buna görə də gələcək nəsillərin tərbiyəsi üçün, onları Səttar Bəhlulzadə həyatının nümunəsində tərbiyə etmək, onun sənətə bağlılığı, fədakarlığı, işgüzarlığı, təvazökarlığı nümunəsində böyütmək və eyni zamanda gələcək nəsilləri rəssamın yaratdığı əsərlərin mənəvi və fəlsəfi təsiri altında yetişdirmək üçün biz Səttar Bəhlulzadə irsinə çox böyük diqqət yetirməliyik. Biz buna çox ehtiyatla yanaşmalıyıq, buna qayğı göstərməliyik və elə etməliyik ki, bu əsərlər toplansın, bizim böyük bir mədəniyyət mərkəzində olsun, indi və gələcəkdə Səttar Bəhlulzadənin yaradıcılığı timsalında mədəniyyətimizi inkişaf etdirib irəli apara bilək" [IIIc.s.49].

Heydər Əliyev nitqindəki qətiyyət yüksək tribunalarda belə kəsərdən düşmür. 14 yanvar 1997-ci il tarixdə, Parisdə,

“Frans-press” agentliyinin müxbirinə müsahibədə təəssüflə dolu qətiyyətli bir cavabın şahidi oluruq: “Erməni diasporu Fransanın siyasi həyatında da fəal iştirak edir. Təəssüf ki, burada olan erməni lobbisi obyektiv mövqe tutmur. Onlar məsələnin məzmununa varmadan, bu münaqişənin səbəbini araşdırmadan birtərəfli olaraq Ermənistanı dəstəkləyirlər. Azərbaycana qarşı çox mənfi münasibət göstərirlər. Burada Erməni mənşəyindən olan adamların çoxu dövlət orqanlarında işləyirlər. Təəssüf ki, onların bir çoxu qeyri-obyektiv mövqe tutur” [VIIIc.s.271].

Heydər Əliyev nitqində qətiyyət “təəssüf” modal sözündən sonra auditoriyanı silkələyir. Auditoriyada dərin təəssüf hissi doğurmağa nail olan böyük natiq vəziyyətdən çıxışı göstərən qətiyyətli nitqə keçir. Əlillərin III Respublika yaradıcılıq sərgi – müsabiqəsinin açılışındakı çıxış (6 noyabr 1997-ci il) bu qəbildəndir: “Təəssüf ki, bəzən belə olur: bu sahəyə, bu təbəqəyə qayğı göstərilməsi üçün ayrılan maddi və maliyyə vəsaitləri öz ünvanlarına çatmır. Bu da həqiqətdir. Ona görə də biz bu nöqsanları aradan qaldırmalıyıq. Bir tərəfdən dövlət, hökumət proqramlarında bu sahəyə daha çox vəsait ayırmaq və bu sahədə daha çox işlərin görülməsi üçün lazımi tədbirlər görməliyik. Amma bununla bərabər, bizim müvafiq araşdırmalarımız – nazirlər, yerli icra hakimyyəti orqanları, başqa hökumət orqanları bu hökumət, dövlət proqramlarının həyata keçirilməsinə sədaqətlə xidmət etməli, əyintilərə yol verməməlidirlər. Bu sahə də bizim üçün çox vacib sahədir” [XIIIc.s.163].

Təəssüf hissi yaşayan auditoriya qətiyyətli dövlət başçısının ayıldıcı, silkələyici, təəssüfü aradan qaldırmaq gücündə olan nitqinin şahidi olur.

Heydər Əliyev nitqlərində cəmiyyətimizdəki təəssüf doğuran neqativ hallar, nöqsanlar, çatışmamazlıqlar sadalanır.

"Təəssüf ki", "təəssüflər olsun ki" modal sözləri ilə aydınlaşan situasiya, vəziyyət, fikir sonda "mübarizə aparmaq lazımdır", "mübarizə aparılmalıdır" kimi qətiyyətli ifadələrlə yekunlaşır. Auditoriya təəssüf doğuran halların qətiyyətli dövlət başçısı tərəfindən aradan qaldırılacağı proqnozuna inanır: "Rüşvətxorluq, dövlətin, xalqın, millətin malını dağıtmaq, qarət etmək, vəzifədən sui-istifadə etmək, korrupsiya, cəmiyyətimizi zəhərləyən cürbəcür belə hallar mövcuddur. Təəssüflər olsun ki, bunlar Silahlı Qüvvələrimizə də sirayət edibdir. Sərhəd dəstələrində də belə cinayətkar, mənəviyyatsız adamlar var. Onlar tutduğu vəzifədən, yerdən, durduğu sərhəd nöqtəsindən şəxsi mənafeyi üçün istifadə edərək dövlətin, xalqın mənafeyinə zərbələr vururlar. Bununla kəskin mübarizə aparmaq lazımdır. Sərhəd dəstələrində bu hallarla ən ciddi mübarizə aparılmalıdır" [VIIIc.s.195-196].

Təkcə rəsmi görüşlərdə yox, qeyri-rəsmi görüşlərdə də Heydər Əliyevin qətiyyətli nitqi üzə çıxır, auditoriyanı səfərbər edir. Görkəmli musiqiçı Mstislav Rostropoviçin 70 illik (29.04.2012) yubiley şənliyindəki çıxış da bu qəbildəndir: "Xalqımız bu çətinliklərdən keçmiş, çox böyük itkilər vermişdir, lakin bu gün də öz dövlət müstəqilliyi və milli azadlığı mövqelərində qətiyyətlə dayanmışdır" [IXc.s.241].

Torpağa sevgi, torpağın qiymətini vermək Heydər Əliyevin nitqlərində önəmli yer tutur. Onun torpaq haqqında dediyi fikirlər Heydər Əliyevin torpaq fəlsəfəsini yaradır. Hər kvadratmetri "əziz və əvəzsiz" sərvət hesab olunduğu torpağa diqqətlə, qayğı ilə yanaşmağı tələb qoyur, torpaqdan istifadə olunması üçün ciddi tədbirlər görülməsi fikrini qətiyyətlə irəli sürür: "Torpaq daim insanların ən böyük sərvəti olubdur. Hər şey torpaq üzərində qurulur. Bəşər tarixi torpaqdan istifadə üzərində meydana gəlib və əsrlər boyu bəşəriyyətin bu günkü

vəziyyətinə gəlib çıxmasına xidmət edibdir. Ona görə də bir tərəfdən biz torpağı qorumalıyıq, ona çox diqqətlə, çox qayğı ilə, çox ehtiyatla yanaşmalıyıq. Torpağın hər kvadratmetri bizim üçün əziz və əvəzsizdir. Biz torpağa bu mövqedən yanaşmalıyıq. Bununla yanaşı, torpaqdan səmərəli istifadə olunması üçün bundan sonra çox ciddi işlər, çox ciddi tədbirlər görməliyik" [IXc.s.241-242].

Qətiyyətli çıxış özünü hansı auditoriyalarda göstərmir ki?! Beynəlxalq Qadınlar günü münasibətilə "Sevil" Azərbaycan Qadınları Məclisinin təşkil etdiyi görüşdə (8 mart 1997-ci il) qadınların cəmiyyətdə mövqeyi açıqlanır. Ölkənin problemləri qadınlarımıza qətiyyətlə çatdırılır: "Cəmiyyətimiz daha sıx birləşməli, əsas hədəflərimiz yolunda – dövlət müstəqilliyimizin möhkəmlənməsi və inkişaf etməsi, ölkəmizin ərazi bütövlüyünün bərpası, işğal olunmuş torpaqlarımızın azad edilməsi, respublikamızın dünya miqyasında özünəməxsus layiqli yerini tutması yolunda siyasi dünyagörüşündən, fikir müxtəlifliyindən asılı olmayaraq, respublikamızın bütün vətəndaşları bir olmalı, həmrəy olmalı, birləşməlidirlər, bundan sonra ölkəmizdə heç bir təxribata, qarışıqlığa yol verməməlidirlər. Bütün bu vəzifələrin yerinə yetirilməsində qadınların rolu da böyükdür, imkanları da çoxdur və qadınlar çox iş görüblər, bundan sonra da görə bilərlər" [IXc.s.25-26].

Heydər Əliyev nitqindəki qətiyyət rəqəmlərə, faktlara söykənən qətiyyətdir. XX əsrin problemi kimi başa düşülən separatçılıq, davakar millətçilik ideyası böyük natiqin dilində kəsərli dəlillərlə auditoriyalara çatdırılır. XX əsrin ziddiyyətlər və münaqişələr fəlsəfəsi, onun doğura biləcəyi qlobal fəsadlar, dünya ictimaiyyətini sadə, anlaşıqlı cümlələrlə ayıldır: "Deyirlər ki, statistikaya görə dünyada 20 milyon qaçqın var. Azərbaycanda isə Respublikanın 7 milyonluq əhalisinin

bir milyonu qaçqındır. Separatçılığın, davakar millətçiliyin, şovinizmin inkişafına yol vermək olmaz, buna yol verilməməlidir. Nəticələr bax burada, gözlərimiz qarşısındadır. Nəticələr nəinki buradadır, həm də keçmiş Sovet İttifaqının bir çox regionunda, xüsusən Qafqazdadır” [VIc.s.221-222].

Heydər Əliyevin qətiyyətli çıxışları çox vaxt “qətiyyən” modal sözü ilə auditoriyaları ayıldır. Ayılan auditoriya siyasi natqin “tapşırıq verirəm” ifadəsi ilə özünü səfərbər edir. Auditoriya komandan əmrinə hazır olan orduya bənzəyir: “Bu dövrdə, bu zaman dövlət əmlakını dağıtmaq, quru-quru yerləri gətirib özəlləşdirməyə vermək qətiyyən yaramaz bir haldır. Ona görə də mən bütün inzibati orqanlara, Gömrük Komitəsinə, yerli icra hakimiyyəti orqanlarına bu tapşırığı verirəm. Nazirlər Kabineti bu işlə ciddi məşğul olmalıdır. Çünki belə siqnallar bizi çox narahat edir” [VIIIc.s.84].

Böyük natiqin dilində qətiyyət səmimiyyətlə birgə səslənir. Türkiyənin iş adamları ilə söhbətdə (12 aprel 1995-ci il) o, ölkədəki ictimai-siyasi vəziyyəti səmimi şəkildə açıqlayır. Son üç ildə üç dəfə dövlət çevrilişi cəhdini qeyd edir, hətta “bu barədə Azərbaycan dünyada rekord vura bilər” ifadəsini də işlətməklə iş adamlarının diqqətini ölkədəki vəziyyətə yönəldir. Bu fikirlərin arxasınca “Dövlət çevrilişinə cəhd etmək istəyənləri vurub dağıtdıq. Onlara da, dünyaya da göstərdik ki, müstəqil Azərbaycan dövlətinin özünü qorumaq üçün, xalqını qorumaq üçün gücü var və buna qadirdir”. Öncə səmimiyyət, sonra qətiyyət, sonda isə çıxışın nikbinlik dolu “siz buna arxayın ola bilərsiniz”, “siz buna əmin ola bilərsiniz” ifadələrlə nikbin əhval-ruhiyyə yaradır: “Ola bilsin ki, Azərbaycan müharibə şəraitində olduğuna görə bəzi adamlar respublikamızda iş görməyə ehtiyat ediblər. Bəzən də iş adamları Azərbaycanda daxili ictimai-siyasi vəziyyət sabit olmadığına

görə, mənə belə gəlir ki, təkcə Türkiyənin yox, digər ölkələrin də iş adamları bura gəlib sərmayə qoymaqdan çəkinirlər. O ki qaldı Respublikamızın daxilində ictimai-siyasi vəziyyətin sabitliyinə, doğrudan da, bu məsələdə də müəyyən əsas var. Çünki üç il ərzində burada üç dəfə dövlət çevrilişi cəhdi olubdur. Ona görə də bu barədə Azərbaycan dünyada rekord vura bilər. Ancaq sizə demək istəyirəm ki, artıq bunlara da son qoyulub, arxayın olun.

Dövlət çevrilişinə cəhd etmək istəyənləri vurub dağıtdıq. Siz buna arxayın ola bilərsiniz, Azərbaycanda bir daha dövlət çevrilişi olmayacaqdır" [IIIc.s.170].

Qətiyyətli ifadələr təkrar yolu ilə dalbadal səslənərək stilistik fiqurların köməyi ilə Heydər Əliyevin nitqinin ecazkarlığını artırır. Azərbaycan Respublikasının Prezidenti seçilməsi münasibətilə andiçmə mərasimində (18 oktyabr 1998-ci il) "bilməlidir" qətiyyətlilik ifadəsi epifora şəklində "dünya"ya, "hamı"ya, "ATƏT"-ə, "Minsk qrupu"na ünvanlanır, "heç vaxt" qətiyyətinin xarakterini daha da gücləndirir: "Ancaq dünya da bilməlidir, hamı bilməlidir və ATƏT, onun Minsk qrupu da bilməlidir ki, məsələnin sülh yolu ilə həll olunması Azərbaycanın ərazi bütövlüyü prinsipinə söykənməlidir. Biz heç vaxt, heç bir qonşu ölkənin torpağına qəsd etməmişik və bu gün də etmirik. Heç kəsin torpağına göz dikməmişik. Biz Azərbaycan dövlət müstəqilliyini əldə edən zaman Birləşmiş Millətlər Təşkilatı tərəfindən tanınmışıq, Azərbaycanın dövlət sərhədləri çərçivəsində olan müstəqil Azərbaycanın tam bütövlüyünü müdafiə edirik və bundan sonra da müdafiə edəcəyik" [XVIIIc.s.70].

Heydər Əliyevin qətiyyəti bəzən lakonik cümlə ilə xalqa çatdırılır. 12 noyabr 2000-ci ildə Konstitusiya günü münasibətilə Azərbaycan xalqına ünvanlanan təbrikdən bir cümlədə

“yerinə yetirilməli”, “sevməli”, “qorumalı” və “çalışmalıdır” kimi ifadələr hər bir vətəndaşı, ictimai-siyasi qurumu silkələyir, səfərbər edir: “Eyni zamanda Azərbaycanın hər bir vətəndaşı, onun ərazisində fəaliyyət göstərən hər bir ictimai-siyasi qurum özünün dövlət və xalq qarşısındakı Konstitusiyada müəyyən edilmiş vəzifə və borcunu da vicdan və ləyaqətlə yerinə yetirməli, vətənini sevməli, onu qorumalı və tərəqqisinə çalışmalıdır” [XXXIc.s.33].

Heydər Əliyevin nitqində qətiyyətlilik bəzən bir kəlmə, bir söz birləşməsi vasitəsilə təzahür edir. Bu bir cümlə, bu bir söz birləşməsi bütöv bir mətnin məzmununa uyğun gəlir. Qətiyyətli dövlət başçısı hər birimizi əməli işə keçməyə çağırır, sözdən işə keçməyə çağırır. 6 may 1996-cı il tarixdə, Prezident sarayında, Şuşa və Laçın rayonları sakinlərinin bir qrupu ilə görüşdəki kimi: “Müəyyən bir hədd var, əgər bu həddə qədər biz bu məsələni sülh yolu ilə həll etməyə nail ola bilməsək, şübhəsiz ki, bütün vasitələrdən istifadə etməliyik. Buna görə də şuşalılar da, laçınlılar da, ağdamlılar da, füzulililər də, cəbrayıllılar da, kəlbəcərlilər də, zəngilanlılar da, qubadlılılar da, tək onlar yox, Azərbaycanın bütün vətəndaşları, gənclərimiz bilməlidirlər ki, öz torpağını müdafiə etmək, öz torpağını işğalçılardan azad etmək üçün hər kəs gərək hazır olsun. Sözlə yox!” [VIc.s.236-237].

Auditoriyanı qətiyyətə səsləyən Heydər Əliyev nitqi stilistik fiqurlardan, xüsusilə anafora və epiforalar şəklində təkrarlardan istifadə yolu ilə daha da güclənir. 2 fevral 1996-cı il Respublika Sarayında gənclərin birinci forumundakı nitq dediklərimizi bir daha sübut edir. “Heç bir” inkar əvəzliyi anafora, “Lazımdır” epiforaları ilə birgə nitqin emosionallığını, təsir gücünü, şüurlara çatma sürətini şiddətləndirir. Auditoriya qətiyyətlilik ovqatına yüklənir: “Heç bir qüvvə bizi bu müs-

təqillik yolundan çəkindirə bilməz, heç bir qüvvə Azərbaycanın dövlət müstəqilliyini əlindən ala bilməz. Bu dövlətin borcudur, bu, hər bir vətəndaşın borcudur. Bunun üçün çox iş görmək lazımdır. Müstəqilliyi təmin etmək üçün çox düşünülmüş xarici siyasət aparmaq lazımdır. Müstəqilliyi qoruyub saxlamaq üçün ölkəmizdə, respublikamızda vətəndaş həmrəyliyi, vətəndaş birliyi yaratmaq lazımdır, ictimai-siyasi sabitlik yaratmaq lazımdır, qanunların aliliyini təmin etmək lazımdır. Sabitliyi təmin etmək lazımdır. Biz bunu edirik və edəcəyik" [Vc.s.309-310]

"Şübhəsiz ki" modal söz böyük natiqin dilində qətiyyətlilik tələb olunan yerlərdə bu qətiyyətə auditoriyalarda zərrə də olsa şübhə yeri qoymur. Maraqlı hal kimi çıxışının birində "Şübhəsiz ki"dən öncə "qara günün ömrü çox gödək olur" xalq deyimi də bir-birini tamamlayır. Beş yerdə anafora şəklində cümlənin başlanğıcında "Şübhəsiz ki" sözünün təkrarlanması nitqin ekspressivliyini artırmaqla yanaşı, qətiyyətliliyi də artırmış olur: "Ancaq mən dəfələrlə demişəm, sizə bir daha deyirəm qara günün ömrü çox gödək olur. Şübhəsiz ki, biz bu vəziyyətdən çıxacağıq. Şübhəsiz ki, işğal olunmuş torpaqlarımızın azad edilməsinə nail olacağıq. Şübhəsiz ki, işğal olunmuş torpaqlarımızdan Ermənistan silahlı qüvvələrinin çıxarılmasına nail olacağıq. Şübhəsiz ki, Azərbaycan Respublikasının ərazi bütövlüyünün təmin olunmasına nail olacağıq. Şübhəsiz ki, biz sərhədlərimizin toxunulmazlığına nail olacağıq. Müstəqil Azərbaycan özünün bütün ərazisinin sahibi olacaq. Müstəqil Azərbaycan Respublikası öz taleyinin sahibi olacaqdır" [VIc.s.38-39].

Böyük natiqin dilində bəzən də ritorik sualların köməyi ilə qətiyyətli ifadələr auditoriyalara yönəlir. Ritorik suallı qətiyyətli nitq dinləyicilərə səfərbəredici ruh aşılayır. Bu zaman

"bəs" sual ədatının köməyindən istifadə olunur: "Bizdə Əmlak Komitəsi var, o nəyin sahibidir təkcə fabriklərin, zavodaların? Bəs Əmlak Komitəsi bunların sahibi deyilmi? Bunlar Əmlak Komitəsində uçotda var? Bəs nə cür olub ki, ayrı-ayrı nazirlər, yaxud komitə sədrləri, institut direktorları, müəssisə rəhbərləri dövlət əmlakını özbaşına dağıdıblar? Bunları bərpa etməliyik, hamısının qarşısı alınmalıdır. Mən bunu qətiyyətlə deyirəm və biz bu tədbirləri həyata keçirəcəyik. Bunu indi xüsusən ona görə deyirəm ki, təkmilləşdirmə prosesi gedəcək. Bu müəyyən ixtisarlara gətirib çıxaracaqdır və bu prosesdə də belə hallara yol verilməsin" [Vc.s.133].

Auditoriyanı silkələyən ardıcıl ritorik suallar "bərpa etməliyik", "qarşısı alınmalıdır", "belə hallara yol verilməsin" kimi qətiyyət dolu ifadələrlə yekunlaşır. Qarşıda xalqı gözləyən problemləri öncəgörən bir filosof lider kimi nitqi ilə xalqı gələcək günlərə və bu yoldakı çətinliklərin həllinə hazırlayır.

Qətiyyətli ifadələrin təkrar edilməsi nitqin ekspressivliyini artırır, bu qətiyyət auditoriyanın yaddaşına möhkəm həkk olur: "Xalqımız buna yol verməyəcəkdir" epiforaları sonda, "bu məqsədlərə nail olacağıq" deməklə gələcəyə inam yaradır: "Ona görə də bizə düşmən olan qüvvələr artıq 1995-ci ildə üfüqdə sezilən dəyişiklikləri pozmaq üçün cürbəcür çirkin yollara əl atır, ictimai-siyasi sabitliyi pozmaq istəyirlər. Ancaq mən əminəm, inanıram ki, xalqımız buna yol verməyəcəkdir. Dözümlü xalqımız – bu isə onun ən yüksək keyfiyyətlərindən biridir – nə qədər ağır vəziyyətdə yaşasa da, buna yol verməyəcəkdir. Mən buna əminəm, inanıram ki, bizim sağlam qüvvələrimiz buna yol verməyəcək, biz tutduğumuz yolla gedəcək və bu məqsədlərə nail olacağıq" [Vc.s.134].

Heydər Əliyev nitqinin bir özünəməxsusluğu da nitq elementlərinin bir neçəsinin birgə təsadüf etməsidir. Necə ki,

böyük natiqin nitqində vahid bir üslubu ayırmaq çətin olur. Sonda isə məlum olur ki burada "çətinlik" yox, Heydər Əliyevin ecazkar nitq "qəlibindən" söhbət açmaq olar. Bir qisim nitqlərdə auditoriyada həm gələcəyə tuşlanan nikbin notlu ifadələr, həm də o gələcəyə aparan yolda qətiyyətli ifadələr üst-üstə düşür. 25 dekabr 1995-ci il tarixdə, Bakı Kondisioneri Elm-İstehsalat Birliyindəki nitq bu qəbildəndir: "Zavodun qarşısında duran problemlər həll olunacaqdır. Əgər zavodu 20 il yaşatmışıqsa bundan sonra onu nəinki yaşadacağıq, həm də inkişaf etdirəcəyik. Sizin hamınızı yaşatmaq üçün və irəliyə getmək üçün Azərbaycan dövləti, bir prezident kimi mən də səylərimi əsirgəməyəcəyəm. Biz bu çətin günlərimizi keçib gedəcəyik. Azərbaycanın işıqlı gələcəyi görünür, xoşbəxt gələcəyi görünür və əmin olun ki, biz gedib o gələcəyə çatacağıq" [Vc.s.111].

"Səylərimi əsirgəməyəcəyəm", "bu çətin günlərimizi keçib gedəcəyik", "gedib o gələcəyə çatacağıq" ifadələrində nikbinliklə qətiyyəti ayırmaq çətin olur. Belə nitqin bir gücü də onların ayrılmamasıdır.

Heydər Əliyev qətiyyəti fəlsəfiliklə harmoniya yaradır. XX əsrin ziddiyyətlər və münaqişələrə problemi onun qətiyyətli nitqində yerini tapır. Regional münaqişələr, separatçılq meyllərinə qətiyyətli cavab verərək auditoriyanın diqqətini bu məsələlər üzərində cəmləşdirə bilir: "Ümumiyyətlə, biz separatçılığın əleyhinəyik. Yeddi ildir ki, Azərbaycanın özü separatçılıqdan əziyyət çəkir. Biz separatçılığın əleyhinəyik, ekstremizmin, terrorizmin əleyhinəyik. Bir daha təkrar edirəm biz özümüz də bundan ziyan çəkirik. Buna görə də mən belə uydurmaları qəti şəkildə rədd edirəm" [Vc.s.441].

"Xalqın zəhməti ilə, əzabı ilə, ağır zəhməti ilə" qazanılan pulların hara xərclənməsinin hesabını aparan dövlət başçısı

ritorik suallarla, ədatlarla, qətiyyətli ifadələri auditoriyanın nəzər-diqqətinə çatdırır. "Bu sizin malınız deyil axı!" qətiyyətli ifadəsi ilə xalqın malının sahibi elə xalq özüdür müddəasını irəli sürür: "Xalqın zəhməti ilə, əzabı ilə, ağır zəhmət nəticəsində hasilə gələn neftdən emal olunan məhsulun satılmasında alınmış valyutadan bu cür istifadə etmək olarmı?... Yoxsa, zavodun direktoru, yaxud da ki, şirkətin prezidenti götürüb özü xeyriyyəçilik edir. Bu, sizin malınız deyil axı!

Sonra siz dediniz ki, başqa-başqa təşkilatlara avtomaşın almısınız. Bu nə xəstəlikdir? Sizin nə işiniz var başqa təşkilatlara avtomaşın alırsınız? Buna sizin ixtiyarınız yoxdur. Bu, hamısı, yenə də deyirəm, fəhlənin zəhmətidir, xalqın malıdır" [VIIc.s.136].

Böyük natiqin nitqlərində qətiyyətlə əminlik, qətiyyətlə gələcək günlərə olan inam birgə səslənir. "Əminəm ki", "əmin olduğumu bildirmək istəyirəm ki" ifadələri "cinayətkarlar qanun qarşısında cavab verəcəkdir" qətiyyətli ifadəsi ilə harmoniya yarada, xalqda dövlətçiliyimizin qorunması yolunda nikbin əhval-ruhiyyə formalaşdıra bilir. 4 avqust 1995-ci il tarixdə, Prezident sarayında, Respublika hüquq-mühafizə orqanları rəhbərlərinin iştirakı ilə keçirilmiş müşavirədə "artıq bəsdir", "dövlətə sədaqətlə xidmət etmək lazımdır" ifadələri ilə ağsaqqal öyüdü verərək yolundan sapanları düz yola yönəldir: "Ona görə də hüquq mühafizə orqanlarından bir daha tələb edirəm ki, işlərini, bütün əməliyyatlarını daha da gücləndirsinlər. Son dövrdə əldə etdikləri müsbət nəticələr onu göstərir ki, onlar həm yaxşı əməliyyat işi, həm yaxşı istintaq işi apara bilirlər, həm də hüquq mühafizə orqanları kimi daxili ictimai-siyasi asayişin qorunması, qanunlara riayət olunması işinin öhdəsindən gələ bilərlər. Əmin olduğumu bildirmək istəyirəm ki, onlar əldə etdikləri nailiyyətlərdən,

bunlara verilən yüksək qiymətdən ruhlanaraq bundan sonra daha yaxşı işləyəcəklər. Əminəm ki, bütün cinayətkarlar aşkar olunacaq, heç bir cinayətkar öz istəyinə nail ola bilməyəcəkdir. Onların hər biri qanun qarşısında cavab verəcəkdir. Ona görə bu gün cinayətkarlara da, onların qohum-əqrabalarına da müraciət edirəm ki, artıq bəsdir, bu cinayət əməllərindən əl çəkib, dövlətin qanununa, qaydasına riayət edərək yaşamaq işləmək lazımdır. Dövlətə sədaqətlə xidmət etmək lazımdır" [IVc.s.160-161].

Heydər Əliyevin nitqində qətiyyət bildirən ifadələri aşağıdakı kimi təsnif etmək olar.

**1.**Azərbaycanın müstəqilliyi ilə bağlı istifadə edilən ifadələr:

"Heç kəs mənim iradəmi sındıra bilməz" – Prezident kimi mən bəyan edirəm ki, bəli, mən Azərbaycan xalqının, onun müstəqilliyinin keşiyində 1993-cü ildən durduğum kimi, bundan sonra da duracağam və heç kəs mənim iradəmi sındıra bilməz [XVIIIc.s.237].

"Bunları dəyişmək olmaz" – Bizim sərhədlərimiz beynəlxalq hüquq normalarına görə BMT tərəfindən tanınıb, qəbul olunubdur. Bunları dəyişmək olmaz [Vc.s.49].

"Ağır vəziyyətdən çıxacağıq" – Bunların hamısından istifadə edərək xalqımızı ağır vəziyyətdən çıxaracağıq, xalqımızı xoşbəxt gələcəyə aparacağıq və müstəqil Azərbaycanı daha da inkişaf etdirəcəyik [Vc.s.75].

"O gələcəyə çatacağıq" – Azərbaycanın işıqlı gələcəyi görünür, xoşbəxt gələcəyi görünür və əmin olun ki, biz gedib o gələcəyə çatacağıq [Vc.s.111].

"Dövlət dilini qəbul etməliyik" – Bu gün biz tarixi bir addım atmalıyıq: müstəqil Azərbaycan Respublikasının dövlət

dilini qəbul etməliyik. Müstəqil Azərbaycan Respublikasının dövlət dili Azərbaycan dilidir [Vc.s.226].

"Bir araya sığmır" – Dağlıq Qarabağın müstəqilliyi barədə qanunsuz iddialar beynəlxalq hüququn hamı tərəfindən bəyənilmiş normaları ilə bir araya sığmır [VIIIc.s.92-93].

"Heç bir təsir edə bilməz" – Bizim Rusiya ilə əlaqələrimiz bundan sonra da gündən-günə inkişaf edəcək və ayrı-ayrı quldurların, cinayətkarların orada yerləşməsi bizim siyasətimizə heç bir təsir edə bilməz [IIc.s.27].

**2.**Ərazimizin, vətənimizin, torpağımızın müdafiəsinə yönələn qətiyyətli ifadələr:

"Sözlə yox" – Azərbaycanın bütün vətəndaşları, gənclərimiz bilməlidirlər ki, öz torpağını müdafiə etmək, öz torpağını işğalçılardan azad etmək üçün hər kəs gərək hazır olsun. Sözlə yox [VIc.s.133].

"Hazır olmalıdır" – Azərbaycanın hər bir vətəndaşı işğal edilmiş torpaqlarımızın azad edilməsi uğrunda mübarizəyə qalxmağa hazır olmalıdır [VIc.s.118].

"Qüdrətini möhkəmləndirməliyik" – Sülh istəməklə yanaşı biz eyni zamanda dövlətimizin hərbi qüdrətini möhkəmləndirməliyik [VIc.s.118].

"Heç vaxt imkan verməyəcəyik" – Bunu bilin və arxayın olun. Azərbaycan torpaqlarının bir qarışını da, başqa dövlətin əldə saxlamasına heç vaxt imkan verməyəcəyik [Vc.s.73].

"Hamı bilməlidir" – Ancaq dünya da bilməlidir, hamı bilməlidir və ATƏT, onun Minsk qrupu da bilməlidir ki, məsələnin sülh yolu ilə həll olunması Azərbaycanın ərazi bütövlüyü prinsipinə söykənməlidir [XVIIIc.s.70].

"Yol verə bilmərik" – Biz həmin iddialarla heç vaxt razılaşmayacağıq, biz Azərbaycan ərazisində ikinci bir erməni dövlətinin yaranmasına yol verə bilmərik [VIIIc.s.94-95].

“Əraziləri boşaltmalıdırlar” – Erməni hərbi birləşmələri Dağlıq Qarabağdan başqa, Azərbaycanın bütün işğal edilmiş ərazilərini boşaltmalıdırlar [IIc.s.24].

“Son dərəcə vacibdir” – İslam Konfransı Təşkilatı kimi nüfuzlu təşkilat və onun hər bir üzvü tərəfindən təzyiq göstərilməsi də son dərəcə vacibdir [IIc.s.17].

“Siyasi iradənizi qətiyyətlə bildirəsiniz” – Ona görə də, hörmətli görüş iştirakçıları, mən sizə üz tutub xahiş edirəm ki, siyasi iradənizi qətiyyətlə bildirəsiniz və Azərbaycan dövlətinin ərazi bütövlüyü uğrunda bizim ədalətli mübarizəmizə tərəfdar çıxasınız [IIc.s.17].

“Heç vaxt geri çəkilməyəcəkdir” – Kommunist rejiminin bərpasına dair Rusiyada özünü göstərən meyllərə qəti şəkildə mənfi münasibət bəsləyirəm, Azərbaycan öz müstəqilliyindən heç vaxt geri çəkilməyəcəkdir [VIc.s.149-150].

**3.**Dövlət başçısı kimi üzərinə götürdüyü vəzifələrin həllində irəli sürdüyü qətiyyətli ifadələr:

“Aparmağa qadirəm və aparacağam” – Hər halda burada oturanlar da bilir, yəqin ki, Azərbaycan vətəndaşlarının əksəriyyəti də bilir ki, mən üzərimə düşən vəzifəni aparmağa qadirəm və aparacağam [Vc.s.234].

“Mane ola bilməz” – Ancaq bir halda ki, məni tale buraya gətirib, xalqın iradəsi gətirib, mənim üzərimə bu böyük yük düşübdür, mən bu məsuliyyəti, bu yükü və bütün qüvvəmi, biliyimi buna sərf edəcəyəm. Heç kəs də bu işdə mənə mane ola bilməz [XIc.s.241].

“Şəxsən nəzarət edəcəyəm” – Əmin ola bilərsiniz ki, respublika prezidenti kimi mən sizə verdiyim vədlərin həyata keçirilməsinin gedişinə şəxsən nəzarət edəcəyəm [IVc.s.30]

**4.**Separatçılğa, millətçiliyə, şovinizmə qarşı yönələn qətiyyətli ifadələr:

“Buna yol verilməməlidir” – Separatçılığın, davakar millətçiliyin, şovinizmin inkişafına yol vermək olmaz, buna yol verilməməlidir [VIc.s.221-222].

“Belə halların qarşısı alınmalıdır” – Xalqımızın arasında ayrı-seçkilik salmaq istəyən, onu ayrı-ayrı qruplara, dəstələrə bölmək istəyən, hansısa mənfi münasibət göstərmək istəyən adamlara nifrət edirəm. Belə adamların, belə halların qarşısı alınmalıdır [Vc.s.42-43].

“qəti şəkildə rədd edirəm” – Bir daha təkrar edirəm, biz özümüz də bundan (separatçılıqdan – red.) ziyan çəkirik. Buna görə də mən belə uydurmaları qəti şəkildə rədd edirəm [VIIIc.s.141].

“bu yoldan çəkinsinlər” – Dövlət terroru etmək yoluna düşən adamlar anlasınlar, dərk etsinlər, bilsinlər: onların getdiyi yol çox yanlış, xəyanətkar yoldur, bu yoldan çəkinsinlər [IIIc.s.232].

**5.**Köçkün və qaçqınlarla bağlı söylənilən qətiyyətli ifadələr:

“doğma yurdlarına qayıtmalıdırlar” – Yerlərindən-yurdlarından didərgin düşmüş qaçqınlar doğma yurdlarına qayıtmalıdırlar [VIc.s.148-149].

“davamlı olmalıdır, ardıcıl olmalıdır” – Ancaq bu tək kampaniya şəkli almamalıdır, mütəmadi olmalıdır, davamlı olmalıdır, ardıcıl olmalıdır.

“Xüsusi diqqət yetirilməlidir” – İşğal olunmuş ərazilərdən qaçqın düşən müəllimlərin, hebelə onların yerləşdirildiyi məktəblərin vəziyyətinə xüsusi diqqət yetirilməlidir [Vc.s.99].

**6.**Ölkə iqdtisadiyyatının, kənd təsərrüfatının inkişafı ilə bağlı qətiyyətli fikirlər:

“bizi bu yoldan döndərə bilməyəcəkdir” – Ölkəmiz dünya iqtisadiyyatı, dünya sərmayəçiləri üçün açıqdır. Bu sahədə bir

neçə addım atmışıq və bundan sonra da atacağıq və heç bir qüvvə bizi bu yoldan döndərə bilməyəcəkdir [VIc.s.121-122].

“hamıdan bunu tələb edirəm” – Sizdən – aqrar bölmədə çalışan bütün təşkilatlardan, nazirliklərdən, komitələrdən, şirkətlərdən, rayon təşkilatlarından – hamıdan bunu tələb edirəm [VIc.s.38]

“Tədbirlər görməyə qadirik” – Xarici investorları cəlb edən layiqli tərəfdaş olmaq üçün biz bundan sonra da maliyyə sahəsində bank sistemi, valyuta sistemi sahəsində tədbirlər görməyə qadirik [Vc.s.20].

“Hər cür əlverişli şərait yaradılacaqdır” – Əmin edirəm ki, sərmayələr qoyulması üçün fəal əməkdaşlıq üçün hər cür əlverişli şərait yaradılacaqdır [Vc.s.206-207].

“Belə hallara yol verilməsin” – Bunu indi xüsusən ona görə deyirəm ki, təkmilləşdirmə prosesi gedəcək. Bu müəyyən ixtisarlara gətirib çıxaracaqdır və bu prosesdə də belə hallara yol verilməsin.

“Ciddi məşğul olsunlar” – Mən Kənd Təsərrüfatı Nazirliyindən tələb edirəm ki, bu işlərlə ciddi məşğul olsunlar [IVc.s.108].

“Mən bunu bilməliyəm” – Dövlət Neft şirkəti mənə yazılı hesabat versin. Mən bunu bilməliyəm [IVc.s.146].

“Ciddi tədbirlər görməliyik” – Bununla yanaşı torpaqdan səmərəli istifadə olunması üçün bundan sonra çox ciddi işlər, çox ciddi tədbirlər görməliyik [VIc.s.241-242].

**7.**Ölkəmizdə məmur özbaşınalığına, bürokratiyaya qarşı işlədilən qətiyyətli ifadələr:

“Bütün bunlara son qoyulmalıdır” – Bunlar hamısı bürokratiyanın ən yüksək səviyyədə olmasını göstərir. Bütün bunlara son qoyulmalıdır.

“Böyük narazılığımı və hiddətimi bildirmək istəyirəm” – Sadəcə həm seysmoloji, həm də Elmlər Akademiyasına böyük narazılığımı və hiddətimi bildirmək istəyirəm [XXXIc.s.93-94].

“Belə yaşamaq, belə işləmək olmaz ki!” – Mən dünən axşam Baş Nazir Rasizadəyə göstəriş verdim ki, Azərbaycanın seysmoloji xidmətinin vəziyyətini araşdırsınlar, lazımi tədbirlər görsünlər. Belə yaşamaq, belə işləmək olmaz ki! [XXXIc.s.93-94].

“Yox belə olmayacaqdır” – Amma bu o demək deyil ki, biz özlərini belə aparan rəhbər vəzifəli şəxslərə daim güzəştə gedəcək, onların bu cür fəaliyyətinə dözəcəyik. Yox belə olmayacaqdır [IIc.s.29].

**8.**Mənəviyyata səsləyən, layiqli vətəndaş olmağa çağıran qətiyyətli ifadələr:

“Dəqiq, düz, doğru işləməlidir” – Bütün bunlarla yanaşı hər bir bank işçisi başqa sahələrin işçilərindən dəqiq, düz, doğru işləməlidir [VIc.s.244].

“Əl çəksinlər” – Mən martın 16-da əfv fərmanı vermişdim və elan etmişdim ki, kim bu cinayətkar əməllərindən əl çəkərsə, onları əfv edirəm. Bunu bu gün də deyirəm: Bu hərəkətlərdən əl çəksinlər [Vc.s.234].

**9.**Dövləti qorumağa, dövlətçiliyi möhkəmlətməyə istiqamətlənmiş qətiyyətli ifadələr:

“Yol vermək olmaz” – Ancaq bir şeyə yol vermək olmaz. Dövlətin əmlakı dağıdılmamalıdır, mənimsəməyə yol vermək olmaz, cinayətə, oğurluğa, quldurluğa, talançılğa yol vermək olmaz [VIc.s.41].

“Mübarizəni bir yerdə aparmalıyıq” – Xalq üçün, millət üçün rüşvətxordan daha xain düşmən yoxdur. Amma bu mübarizəni biz bir yerdə aparmalıyıq [Vc.s.240].

"Heç kəs bağışlanmayacaqdır" – Ola bilər indi təyin olunanlardan bəziləri də sabah ya işi bacarmadılar, yaxud yolunu azdılar, ya da xəyanət etdilər, heç kəs bağışlanmayacaqdır [Vc.s.241].

"Ciddi mübarizə aparmalıdırlar" – Mən tələb edirəm, bunlara son qoyulsun. Bizim hüquq mühafizə orqanları ciddi mübarizə aparmalıdırlar.

"Ciddi tədbirlər görməliyik" – Bununla yanaşı torpaqdan səmərəli istifadə olunması üçün bundan sonra çox ciddi işlər, çox ciddi tədbirlər görməliyik [VIc.s.241-242].

"Qarşısı alınıb və alınacaqdır" – Azərbaycana qarşı yenə də təxribat işləri görürlər. Ancaq bunların hamısının qarşısı alınıb və alınacaqdır [IVc.s.192].

"Siyasi iradənizi qətiyyətlə bildirəsiniz" – Ona görə də, hörmətli görüş iştirakçıları, mən sizə üz tutub xahiş edirəm ki, siyasi iradənizi qətiyyətlə bildirəsiniz və Azərbaycan dövlətinin ərazi bütövlüyü uğrunda bizim ədalətli mübarizəmizə tərəfdar çıxasınız [IIc.s.17].

**10.**Qanunlara hörmətə səsləyən qətiyyətli ifadələr:

"Qanun qarşısında cavab verəcəkdir" – Əminəm ki, bütün cinayətkarlar aşkar olunacaq, heç bir cinayətkar öz istədiyinə nail ola bilməyəcəkdir. Onların hər biri qanun qarşısında cavab verəcəkdir [IVc.s.84].

"Razı ola bilmərik" – Ona görə mən bu gün sizə sizin vasitənizlə Amerika Birləşmiş Ştatları dövlətinə bu barədə Azərbaycanın narazılığını bildirirəm. Bildirmək istəyirəm ki, biz bu cür əlavə ilə heç vaxt razı ola bilmərik [VIc.s.226].

"Əsasən cəzasını alacaqdır" – İndən belə biz heç kəsə qanunlarımızı pozmağa, cəmiyyətimizi, dövlətçiliyimizi laxlatmağa imkan verməyəcəyik, əgər kimsə belə cinayətkar hə-

rəkətlərə cəsarət edərsə, qanunlarımıza əsasən cəzasını alacaqdır [Vc.s.197].

**11.**Qonşu ölkələrlə münasibətlərin nizama salınması yolunda qətiyyətli ifadələr:

"Mane ola bilməz" – İran ilə münasibətlərimiz yaxşıdır. Kimsə buna mane olmaq istəyir, amma mane ola bilməz [IIc.s.27].

"Dərk etsinlər" – Biz sülhsevərik. İstəyirik ki, xalqımızın sülhsevərliyini dünya ictimaiyyəti də dərk etsin. Rusiyada da dərk etsinlər, Rusiyanın dövlət başçıları da dərk etsinlər [IIc.s.64].

"Sipər çəkməlidirlər" – Rusiyada kommunistlərin qayıtması təhlükəsi var və zənnimcə, demokratik qüvvələr bunun qarşısına sipər çəkməlidirlər [VIc.s.149-150].

**12.**Ölkədə vətəndaş həmrəyliyinə nail olmağa yönələn qətiyyətli ifadələr:

"Heç kəs zorla heç bir şeyə nail ola bilməz" – Mən bütün müxalifət qüvvələrini dialoqa dəvət edirəm, məsələləri ancaq danışıq yolu ilə həll etməyə dəvət edirəm. Heç kəs Azərbaycanda güc yolu ilə, zorla heç bir şeyə nail ola bilməz [XVIIIc.s.237].

Bütün bunlar göstərir ki, Heydər Əliyevin nitqində qətiyyət bildirən ifadələrin və onların digər nitq elementləri ilə əlaqəsinin daha dərindən öyrənilməsinə ehtiyac vardır.

# VIII FƏSİL

# HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ NİKBİNLİK

Sadə, səmimi cümlələrlə insanlarda nikbin əhval-ruhiyyə yaratmaq Heydər Əliyevin nitqlərinin əsas xüsusiyyətlərindəndir.[1] Nikbinliklə dolu, məntiqi ardıcıllığa söykənən sadə, anlaşıqlı cümlələr auditoriyanı sehrləyir və inandırır: "Mən Azərbaycanın gözəl gələcəyinə inanıram və xalqımızın gələcəkdə firavan yaşayacağına inanıram" deyən böyük natiqin bu inamını xalq səmimi qəbul edir. Bu yolda "bütün həyatını, bütün biliyini, zəkasını, varlığını" sərf edən bir öndərə – siyasi liderə inanmamaq olmur. "Ümidvaram ki" modal sözü ilə nitqinə başladığı çıxışların əksəriyyətində Azərbaycanın pozulmuş ərazi bütövlüyü öndə durur. "Ümidvaram ki, biz bu dərddən də qurtaracağıq. İşğal olunmuş torpaqlar azad ediləcək, yerindən-yuvasından didərgin düşmüş bacı və qardaşlarımız öz evinə, elinə-obasına qayıdacaqlar, yenidən həyat qurulacaq. Azərbaycanın ərazi bütövlüyü təmin olunacaq, müstəqil Azərbaycan dövləti öz ərazisinin bütün hissələrinin sahibi olacaqdır. Azərbaycanın dövlət müstəqilliyi yaşayacaq, gündən-günə möhkəmlənəcək və görülən tədbirlər, aparılan strateji siyasət, görülən işlər, əziz bacı və qardaşlar, sizin, bütün Azərbaycan vətəndaşlarının rifah halını gündən-günə yaxşılaşdıracaqdır. Mən Azərbaycanın gözəl gələcəyinə inanıram və xalqımızın gələcəkdə firavan yaşayacağına inanıram, mən bunun üçün çalışıram, bütün həyatımı, bütün biliyimi, zəkamı, varlığımı sərf edirəm və bundan sonra da sərf edəcəyəm" [IXc.s.431-432].

[1] Kərimbəyli N. "Prezidentin nitqinə bir baxış". Bakı, "Sabah", 1996. səh.23

Müstəqilliklə bağlı nikbin çıxışlarında öncə müstəqilliyə gedən yolun "asan" olmadığını qeyd edir, "əgər çətin yolla getməsək düz, yəni geniş yola çıxa bilməyəcəyik" fikrini auditoriyaya çatdırır. Bəzən də nikbinlik bildirən "inanıram", "əminəm ki" ifadələrini birgə işlədərək nikbinlik notlarını gücləndirir. Müstəqilliyimizin "əbədi, dönməz" olduğunu, milli azadlığımızı heç kəsin, heç bir halda sarsıda bilməyəcəyi inamını ortaya qoyur: "Bu gün fəxr edirəm ki, mənim dediyim sözlər çin olub, reallığa çevrilib, Azərbaycan müstəqil dövlətdir. Ancaq o vaxt da demişdim və bu gün də deyirəm ki, müstəqillik yolu asan deyil, çətindir. Biz bu çətin yolla gedirik. Əgər getməsək, düz, yəni geniş yola çıxa bilməyəcəyik. Ancaq mən inanıram, əminəm ki, biz müstəqilliyin geniş yoluna çıxacağıq və Azərbaycan müstəqil dövlət kimi yaşayacaq, Azərbaycanın dövlət müstəqilliyi əbədi, dönməz olacaq və bizim müstəqilliyimizi, milli azadlığımızı heç kəs, heç bir yolla sarsıda bilməyəcəkdir" [XIc.s.177-178].

Nikbin ruhlu söhbətlərdə, çıxışlarda Heydər Əliyev "məmnuniyyətlə deyə bilərəm ki" ifadəsindən də istifadə edir. Pozulmuş ictimai-siyasi sabitliyin bərpası "xalqın rahat yaşaması üçün, inkişafı üçün əsas şərt olacaqdır" deməklə nikbinliyin əsasında ölkənin ictimai-siyasi durumunun mühüm rolunu açıqlayır: "Bir neçə il Azərbaycanın daxilində ictimai-siyasi sabitlik pozulubdur. İqtisadiyyat bir neçə il geriyə gedibdir, dağılıbdır, tənəzzül edibdir. Ancaq məmnuniyyətlə deyə bilərəm ki, biz bunların hamısını ötüb keçmişik. Artıq Azərbaycanın dövlət müstəqilliyi möhkəmdir, biz bu müstəqilliyi qoruyub saxlayırıq və saxlayacağıq. Azərbaycanın daxilində ictimai-siyasi sabitliyi təmin etmişik və bundan sonra da bu sabitlik Azərbaycan xalqının rahat yaşaması üçün, inkişafı üçün əsas şərt olacaqdır" [XXIc.s.52].

Böyük natiq üçün hansı auditoriya olursa-olsun müstəqillik, müstəqil Azərbaycanın gələcəyi həmişə öndə duran məsələdir. 6 avqust 1999-cu il tarixdə, Mustafa Hacıqasımov adına Azərbaycan Mamalıq və Ginekologiya Mərkəzinin açılışı mərasimindəki nitqdə "Azərbaycan xalqının inkişaf etməsi üçün burada yeni-yeni uşaqlar dünyaya gələcəkdir" deməsi buna misaldır: "Təbidir ki, belə bir müəssisənin yaranması ən müasir cihazlar, alətlər, ləvazimatlar alınmasa mümkün olmazdı. Bu barədə Almaniya şirkətinin də xidməti burada çox böyükdür. Yenə də deyirəm, bunlar hamısı sevindirici haldır və ümidvar olduğumu bildirmək istəyirəm ki, bu müəssisə yarandığı kimi, belə gözəl görünüşü kimi, gələcəkdə iş fəaliyyətində həmişə bu səliqəni saxlayacaqdır. Qadınlar bundan səmərəli istifadə edəcək, Azərbaycan xalqının inkişaf etməsi üçün burada yeni-yeni uşaqlar dünyaya gələcəkdir" [XXIc.s.164].

Ölkəmizin müdafiə qüdrətinin yüksəlməsini bir nömrəli vəzifəsi hesab edən ulu öndərin hərbçilərlə görüşləri nitq mədəniyyəti baxımından önəmlidir. Cəmşid Naxçıvanski adına hərbi liseyin Naxçıvan filialının açılışındakı nitq "ümidvar olduğumu bildirmək istəyirəm ki" ifadəsi ilə müdavimlərə ünvanlanır. "Əmin olduğumu bildirmək istəyirəm ki" deməklə gənc hərbçilər arasında yüksək vətənpərvərlik, sabahkı günə nikbinlik aşılayır: "Mən Cəmşid Naxçıvanski adına Hərbi Liseyin Naxçıvan filialına uğurlar arzulayıram. Buradakı müəllim, zabit heyətinə müvəffəqiyyətlər arzu edirəm. Ümidvar olduğumu bildirmək istəyirəm ki, onlar öz biliklərinin artması üzərində daim çalışacaqlar, hərb elminin bütün biliklərini filialın müdavimlərinə, kursantlarına çatdıracaqlar, burada yaxşı kadrlar hazırlanacaqdır. Əmin olduğumu bildirmək istəyirəm ki, Naxçıvan fılialının məzunlarının 100 faiz hamısı Azərbaycanın ali hərbi məktəblərinə qəbul olunacaqdır. Bunun üçün yaxşı oxumaq, çalışmaq lazımdır" [XXIIc.s.258].

"Sizinlə birlikdəyəm" deyən ulu öndər 1993-cü ilin ağır günlərində nikbin notlarla xalqı səfərbər edə bilir. "Bu ağır günlərdə" xalqına səbir arzulayan Heydər Əliyev Azərbaycan Respublikasının müstəqil dövlət kimi yaşayacağını, onun daxilində həmrəyliyin, qardaşlığın bərqərar olacağını böyük bir ümidlə xalqa çatdıra bilir: "Bir daha bütün xalqa müraciət edərək bu ağır günümüzdə ondan səbir, təmkin və ağıllı addımlar gözləyirəm. Azərbaycan xalqına bu ağır günlərdə səbir arzulayıram. Azərbaycan vətəndaşlarına sevgimi, məhəbbətimi bildirirəm. Bir daha demək istəyirəm ki, mənə göstərilən etimadı doğrultmağa çalışacağam. Sizinlə birlikdəyəm. Azərbaycan Respublikası yaşayacaq, müstəqil dövlət kimi inkişaf edəcək, Azərbaycanın ərazi bütövlüyü təmin olunacaq, onun daxilində milli həmrəylik, qardaşlıq təmin olunacaq" [Ic.s.100-101].

Düşdüyümüz vəziyyəti xalqdan gizli saxlamayan lider-natiq "imkanımız var" fəlsəfi kateqoriyasından yerindəcə yararlanaraq, bu imkanları sadalayaraq – "Bu gün Azərbaycanın böyük gücü, potensialı, xalqımızın zəngin qəhrəmanlıq ənənələri" – işğaldakı ərazilərimizin geri qaytarılacağı ümidini itirmir və xalqı da belə nikbinliyə hazırlayır: "Bir sözlə, vəziyyət ağırdır, gərgindir. Ancaq bu o demək deyil ki, biz vəziyyəti çıxılmaz hesab edirik. Xeyr. Yenə də deyirəm, bu gün Azərbaycanın böyük gücü, potensialı, xalqımızın zəngin qəhrəmanlıq ənənələri – bunların hamısı birləşdirilməlidir. Bütün imkanlardan istifadə edərək Azərbaycanın işğal olunmuş torpaqlarını geri qaytarmağa bizim imkanımız var" [Ic.s.241-242].

Xalqını gələcəyə inamla baxmağa dəvət edən Heydər Əliyev "böyük nikbinliklə baxıram" ifadəsi ilə əminlik yarada bilir: "Mən bu günə də, sabaha da böyük nikbinliklə baxıram və sizi də bu sızıltıdan, iniltidən uzaqlaşaraq gələcəyə baxmağa dəvət edirəm. Gələcəyimiz isə Azərbaycan Respublikasının

müstəqilliyinin möhkəmlənməsi, onun ərazi bütövlüyünün təmin olunmasıdır. Əmin olun ki, biz buna nail olacağıq. Sağ olun!” [Ic.s.343-344]

Nikbin notlarla zəngin nitq müxtəlif çeşidli auditoriyaları bəzəyir. İsveçrədə yaşayan soydaşlarımızla görüşdəki çıxışda böyük natiq “əminəm ki” və “ona da əminəm ki” ifadələri ilə həm Azərbaycanın, həm də xaricdə yaşayan azərbaycanlıların xoşbəxt gələcəyinə öz inamını dilə gətirir, soydaşlarımızda sabahkı günə inam yaradır: “Əminəm ki, Azərbaycanın gözəl, xoşbəxt gələcəyi var. Ona da əminəm ki, Azərbaycanın sərhədlərindən kənarda yaşayan soydaşlarımız da öz səviyyələrini yüksəldərək, təhsillərini artıracaq, yaşadıqları ölkələrdə biznesdə, başqa sahələrdə yaxşı yer tutacaq və Azərbaycana layiq olacaqlar” [IIIc.s.154-155].

Hadisələr arasında paralellər aparmaqla auditoriyada canlanma yaratmaq Heydər Əliyev nitqinin mühüm xüsusiyyətlərindən biridir. Öz ərazi bütövlüyünə nail olmuş Almaniyanın timsalında Azərbaycan da vaxt gələcək ki, bu sevinci dadacaqdır nikbinliyini auditoriyaya aşılayır: “Bu gün istər Almaniyada, istərsə də ondan kənarda yaşayan hər bir alman öz ölkəsinin, xalqının birləşməsini bayram edir və sevinc içərisindədir. Biz də bu sevinci burada sizinlə bölüşdürürük. Ümidvaram ki, vaxt gələcək, Azərbaycan xalqı da öz ərazi bütövlüyünü bərpa etməsinin sevincini hiss edəcək və alman dostları ilə birlikdə həmin sevinci bölüşəcək və bayram edəcəkdir” [IVc.s.325-326].

Heydər Əliyevin nikbinliyi təkcə insanlarla bağlı deyil. O, həm də istehsal sahələrinin, sənayemizin, kənd təsərrüfatımızın gələcəyi ilə bağlı nikbindir. Həmin sahələrdəki uğurların, islahatların həyata keçirilməsi sonda insanların rifahına xidmət edəcəyinə inanır: “Mən respublikada aparılan və artıq öz müsbət nəticələrini verən islahatlardan, xüsusən aqrar sek-

torda, maliyyə sahəsində və bütövlükdə iqtisadiyyatda həyata keçirilən islahatların əhəmiyyətindən danışarkən bildirmək istəyirəm ki, bu islahatlar nəticəsində artıq iqtisadiyyatda durğunluğa son qoyulmuş və hətta istehsalda artım əmələ gəlmiş, yığılan vergilərin məbləği çoxalmışdır. Bir daha qeyd edirəm ki, Azərbaycan olduqca böyük sənaye potensialına malikdir. Düzdür, hələlik bir çox sahələr ağır vəziyyətdədir, lakin ümid var ki, özəlləşdirmə və islahatlar sənayedə vəziyyəti yaxşılaşdırmağa imkan verəcəkdir" [IXc.s.198-199].

Heydər Əliyevin nikbinliklə dolu çıxış və nitqləri əzab-əziyyətə qatlaşmaqdan, çətinliklərə dözməkdən başlayıb "uğurlu, çiçəkli, gözəl" gələcəklə qurtarır: "Biz bu müstəqilliyi möhkəmləndirmək və daha da yüksəklərə qaldırmaq, bu milli azadlığımızı əlimizdə daim saxlamaq naminə hər bir çətinliklərə dözmüşük, bundan sonra da dözəcəyik. Azərbaycan xalqı dözümlü xalqdır. Bu, bizim xalqımızın milli xüsusiyyətidir. Etimad göstərib məni Azərbaycan dövlətinin prezidenti seçmiş Azərbaycanın bütün vətəndaşlarına hörmət və ehtiramımı bildirirəm, dözümlülüyünə görə onlara təşəkkür edirəm və xalqımızı, millətimizi əmin edirəm ki, Azərbaycanın dövlət müstəqilliyi yolu uğurludur, çiçəklidir, gözəldir. Bu gözəl gələcək naminə sizin hamınıza cansağlığı, xoşbəxtlik arzu edirəm" [IXc.s.14].

1 avqust 1997-ci il tarixdə, ABŞ və Azərbaycan prezidentlərinin təkbətək görüşündəki söhbət öncə ölkədəki ictimai-siyasi proseslərin "çox geniş və əhatəli" olması prizmasından baxılır, "heç şübhəsiz" modal sözün köməyi ilə ölkədəki demokratiyanın, bazar iqtisadiyyatının inkişafı, insan hüquqlarının təmin edilməsi, islahatların uğurla həyata keçirilməsi kimi işlərin "yaxın gələcəkdə Azərbaycanın çiçəklənməsinə, inkişaf etmiş bir dövlətə çevrilməsinə səbəb olacaqdır": "Azərbaycana olan marağın, diqqətin daha da artdığı

barədə söylədiyiniz səmimi sözlərə cavab olaraq bildirirəm ki, Azərbaycanda gedən ictimai-siyasi proseslər çox geniş və əhatəlidir. Ölkəmizdə demokratiyanın, bazar iqtisadiyyatının inkişafı, insan hüquqlarının təmin edilməsi, islahatların uğurla həyata keçirilməsi, özəlləşdirmə sahəsində böyük işlər görülür və bu işlər, heç şübhəsiz, yaxın gələcəkdə Azərbaycanın çiçəklənməsinə, inkişaf etmiş bir dövlətə çevrilməsinə səbəb olacaqdır. Qeyd edim ki, Azərbaycanda aparılan islahatlar artıq öz müsbət nəticələrini verməkdədir. Bu, bizim strateji xəttimizdir və biz bu yolla da gedəcəyik" [XIc.s.219-220].

Ölkə iqtisadiyyatının inkişafını, insanların rifah halının yaxşılaşmasını özündə əks etdirən nikbinlik dolu zəngin nitqlərdə "hər bir Azərbaycan vətəndaşının xidməti gərəkdir və hər bir Azərbaycan vətəndaşının dərki gərəkdir" prinsipini irəli sürür. Vətəndaşın fəal mövqeyi olan cəmiyyətdə "böyük uğurlar" əldə olunacağını auditoriyaya çatdırır: "Hər bir Azərbaycan vətəndaşı gərək dərk etsin ki, biz artıq yeni şəraitdə yaşayırıq, biz müstəqil dövlətik, yeni iqtisadi sistem yaradırıq, yeni iqtisadiyyat yolu ilə gedirik. Mən inanıram ki, bu yolda böyük uğurlar əldə edəcəyik. Azərbaycanın iqtisadiyyatı inkişaf edəcəkdir, insanların rifahı yaxşılaşacaqdır. Biz bunun üçün əlimizdən gələnləri edirik" [XXIc.s.235].

Heydər Əliyev nitqindəki nikbinlik məntiqi təfəkkürə söykəndiyi üçün auditoriya bu nitqi ciddi qəbul edir, böyük natiqin tutarlı fikirlərini, əsaslı dəlillərini heyranlıqla qarşılayır. Bir daha nitqin inandırıcı olması üçün real faktlara, rəqəmlərə, göstəricilərə istinad etməyin əhəmiyyətini açıqlayır: "Bütün bunlar bizim qarşımızda duran vəzifələrdir. Bu gün mən bizim zavodların işi ilə tanış olarkən həmin vəzifələrin nə cür həyata keçiriləcəyinə nəzər salıram, bu barədə düşünürəm. Ona görə də bu zavodlarla bir daha tanış oluram, bu gün sizinlə görüşürəm və öz fikirlərimi, öz mülahizələrimi sizə çatdırıram.

Tam əmin ola bilərsiniz ki, biz neft sənayesinin inkişafı üçün bundan sonra bütün tədbirləri görəcəyik, sentyabrın 20-də imzalanacaq müqavilə xalqımız üçün mənfəətli olacaq, Azərbaycanı dünya iqtisadiyyatına bağlayacaq, Azərbaycanın dünyanın təcrübəli, görkəmli, inkişaf etmiş neft şirkətləri ilə müştərək işini təmin edəcəkdir. Bütün bunlar Azərbaycanın gələcəyinin daha gözəl olmasına imkan verəcəkdir” [IIc.s.242-243].

Böyük natiqin nitqlərində, məntiqi ardıcıllıq həmişə, hər yerdə gözlənilir. Nikbinliklə qurtaran nitqlərdə hadisələr ardıcıl şəkildə davam etdirilir. 19 iyul 1997-ci il tarixdə, Prezident sarayında, sosial-iqtisadi inkişafın yekunlarına həsr olunmuş müşavirədə “böhrandan çıxacağıq” nikbinlik ifadəsinə qədər “böhran içərisində olmuşuq”, “sosial-iqtisadi böhrandan tam çıxmamışıq”, “indi bu böhrandan artıq çıxırıq” ifadələri müşavirənin gedişini əks etdirə bilir: “Biz bu illər ərzində böhran içərisində olmuşuq, bu gün də hələ sosial-iqtisadi böhrandan tam çıxmamışıq. Ancaq əgər bir il, iki il bundan öncə biz bu böhranın tam içindəydiksə, indi bu böhrandan artıq çıxırıq və nəticələr onu göstərir ki, böhrandan çıxacağıq. Azərbaycanın iqtisadiyyatı, əhalinin sosial vəziyyəti gələcəkdə də ardıcıl surətdə inkişaf edəcəkdir. Bunlar birinci növbədə iqtisadi islahatların həyata keçirilməsinin və ümumiyyətlə, iqtisadiyyat sahəsində görülən bütün tədbirlərin nəticəsidir” [Xc.s.381-382].

Nikbinliklə dolu çıxışlarında o, bir filosof kimi xalqını inandırır ki, “ağır tale sınağından çıxmağın yolu” sıx birləşməkdədir: “Dünyada hər şeyin, dərdin də, əzabların da bir sonu var. O cümlədən, məcburən qatıldığımız müharibənin də. Xalqımızı əmin etmək istəyirəm ki, müqəddəs vətənimizin real müstəqilliyi və torpaqlarımızın düşmən tapdağından tam azad olacağı gün uzaqda deyildir. Hamımızın sıx birliyimizlə biz bu ağır tale sınağından qələbəylə çıxacağıq və hər kəs öz doğma od-ocağına qayıdacaqdır” [Ic.s.442-443].

Heydər Əliyev nitqinə daxilən xas olan fəlsəfilik nikbinliklə bağlı çıxışlarda da özünü büruzə verir "Qəminiz, kədəriniz nə qədər çox olsa da" deyən böyük natiq növbəti cümlədə "Gələcəyə ümidimiz böyükdür", – deyərək dialektikadakı əksliklərin vəhdəti və ziddiyyəti qanununu ortaya qoyur: "Mən bu gün, bu matəm günü bütün Azərbaycan vətəndaşlarına, Azərbaycan xalqına bu arzularla müraciət edirəm. Xalqımıza daha da dəyanətli olmağı arzulayıram, daha da dözümlü olmağı arzulayıram. Xalqımızı, Azərbaycanın bütün vətəndaşlarını əmin edirəm ki, biz bütün çətinliklərdən çıxmağa qadirik və bu çətinliklərdən çıxacağıq. Qəmimiz, kədərimiz nə qədər çox olsa da, nə qədər ağır dəqiqələr, saatlar, günlər keçirsək də gələcəyə ümidimiz böyükdür. Biz nikbinik və nikbinlik əhval-ruhiyyəsi ilə yaşayırıq, yaşamalıyıq" [IVc.s.420-421].

Heydər Əliyevin nikbinlik dolu çıxışları çətinliklərə dözümlü olmağı öyrədir. Sonda bu çətinliklərə sinə gərərək işıqlı, nurlu gələcəyə çatmaqdan danışılır. Burada insan fəlsəfəsinin şahidi oluruq – "Bu, insanın dözümlülüyünün, daxili potensialının nə qədər böyük olduğunu göstərir". Çıxış "millət çox itkilər versə də", "amma xalq yaşayıb və yaşayacaqdır" nikbinliyi ilə yekunlaşır: "Siz çətinliklərə dözmüsünüz – sürgün olunmusunuz, komendaturanın nəzarəti altında ağır şəraitdə yaşamısınız, bunların hamısından çıxmısınız, təhsil almısınız, gözəl həyat qurmusunuz, cəmiyyətdə yer tutmusunuz, vəzifə almısınız, yaşayışınız var. Bu, böyük xoşbəxtlikdir. Bu, insanın dözümlülüyünün, daxili potensialının nə qədər böyük olduğunu göstərir. Məsələn, hələ 1930, 1937, 1938-ci illərdə sizin ailələrinizi sürgün edəndə onların başına nə iş gətirdilər! Doğrudur, çox itkilər oldu, çoxları tələf oldu, öldü. Bilirəm, sizin də qohum-əqrəbanızdan ölənlər-itənlər olubdur, itkiləriniz çoxdur. Millətimiz çox itkilər veribdir, amma xalq yaşayıb və yaşayacaqdır" [Xc.s.132-133].

Nikbin nitqlərində Heydər Əliyevi təkcə Azərbaycan xalqının taleyinə cavabdeh bir prezident kimi yox, bəşəriyyətin düşdüyü vəziyyətə münasibətini bildirən filosof kimi görürük. "İnanırıq ki" anaforasından istifadə edən böyük natiq iki yerdə iki müdrik, iki fəlsəfi fikir işlətməklə YUNESKO-nun baş direktoru Federiko Mayer cənablarını Azərbaycan problemlərinə diqqət yetirməyə çağırır. "Bütün insanlar aralarında olan fərqlərə baxmayaraq, eyni tarixi köklərə malikdir", – cümləsini dərk edən bəşəriyyət bir-birini sevməyə məhkumdur fəlsəfəsini, ikinci cümlədə isə tarix fəlsəfəsinə söykənərək "Bəşəriyyətin keçmişi və bu günü bizə dəhşətli müharibələrdən xəbər verməyinə baxmayaraq inanırıq ki, onun gələcəyi sülhdür" – fikrini şüurlara hopduraraq, "sülh" deyərək nikbinlik yaradır: "Biz inanırıq ki, bütün insanlar aralarında olan fərqlərə baxmayaraq, eyni tarixi köklərə malikdir və həyatda eyni məqsədlərə nail olmaq istəyirlər. Bəşəriyyətin keçmişi və bu günü bizə dəhşətli müharibələrdən xəbər verməyinə baxmayaraq, inanırıq ki, onun gələcəyi sülhdür" [XIIc.s.150].

Heydər Əliyevin nitqində populist şüarlara yer yoxdur. Xalqdan heç bir şey gizli qalmır. "Biz faciəli bir dövrdə yaşayırıq", "Əmin ola bilərsiniz ki, xalq gücünü toplayacaq" deməklə və "əmin olun ki, həyatımın son dəqiqəsinə qədər, son nəfəsimədək bu yoldan dönməyəcəyəm" söyləməklə qətiyyət və nikbinlik nümayiş etdirir. Məhz buna görə də auditoriya – xalq dönməz liderin arxasınca getməyə qərar verir: "Biz faciəli bir dövrdə yaşayırıq. Lakin bu faciə, uğursuzluqlar Azərbaycan xalqının iradəsini qırmayıb. Xalqımızın gücü və iradəsi var və əmin ola bilərsiniz ki, xalq gücünü toplayacaq, birləşəcək, öz torpaqlarını qaytaracaq, işğal olunmuş torpaqlardan erməni silahlı qüvvələri qovulacaq və Azərbaycan Respublikasının ərazi bütövlüyü təmin ediləcəkdir.

Biz nəyin bahasına olursa-olsun, bu məqsədə çatmalıyıq. Əmin olun ki, həyatımın son dəqiqəsinə qədər, son nəfəsimədək bu yoldan dönməyəcəyəm" [Ic.s.186-187].

Gələcəyə nikbinliklə baxan ulu öndərin çıxışlarında nikbinliklə qətiyyətin sintezinin şahidi oluruq. BMT Baş Məclisinin sessiyasında Heydər Əliyevin geniş cümlələr əsasında elmi üslubda söylədiyi çıxışda "qətiyyətlə bildirirəm ki, heç kəs Azərbaycan xalqını tutduğu yoldan geri çəkilməyə məcbur edə bilməz" qətiyyətli fikri "biz ölkəmizin gələcəyinə nikbinliklə baxırıq" fikri ilə çulğalaşır: "Biz bir çox dövlətlərin böyük marağını doğuran ərazidə – Avropa və Asiyanın mühüm coğrafi-siyasi qovuşuğunda yerləşərək, geniş təbii ehtiyatlara və böyük sənaye potensialına malik olaraq, Azərbaycan xalqının qəti əzminə və inamına arxalanaraq öz müstəqilliyimizin möhkəmləndirilməsinə və demokratik islahatların, bazar islahatlarının həyata keçirilməsinə doğru yönəldilmiş bu strateji xətti aparırıq. Bu gün mən bu yüksək tribunadan qətiyyətlə bildirirəm ki, heç kəs Azərbaycan xalqını tutduğu yoldan geri çəkilməyə məcbur edə bilməz və biz ölkəmizin gələcəyinə nikbinliklə baxırıq" [IIc.s.306-307].

Heydər Əliyev nitqində nikbinlik xalq deyimləri ilə həyata keçirilir: "Yaman günün ömrü az olar" deməklə düşdüyümüz ağır vəziyyətdən çıxmağın yollarını göstərir, "əmin ola bilərsiniz" ifadəsi ilə ölkəmizin xoşbəxt gələcəyini gördüyünü vurğulayır: "Bilin ki, yaman günün ömrü az olar. Biz bu ağır vəziyyətdən çıxacağıq. Ancaq ən başlıca, mühüm məsələ, ən əsas vəzifə respublikanı müharibə vəziyyətindən çıxarmaqdır. Ona görə biz hamımız bütün bu əzab-əziyyətə dözməli, respublikamızı müharibədən çıxarmalı, xalqımızın xoşbəxt gələcəyi üçün əsas yaratmalıyıq. Sizi əmin etmək istəyirəm ki, biz bu sahədə çox ciddi tədbirlər görürük. Mən respublikanın

xoşbəxt gələcəyini görürəm və əmin ola bilərsiniz ki, biz bunların hamısına nail ola biləcəyik” [IIc.s.42-43].

Heydər Əliyevin uşaqlar auditoriyasındakı çıxışları nikbin notlarla xüsusilə zəngindir. Uşaqları həmişə cəmiyyətin “gülü-çiçəyi” adlandıran böyük öndər gələcəyimizin etibarlı əllərdə olmasını, xoşbəxt günlərin irəlidə olmasını böyük sevinc hissi ilə balaca dinləyicilərinə çatdırır: “Biz xoşbəxtik, ona görə ki, Azərbaycan xalqının əsrlər boyu böyük insanları, istedadlı adamları olubdur. Bu gün bu insanlar, istedadlı adamlar Azərbaycan xalqının müstəqilliyi uğrunda mübarizə aparanlardır, respublikamızın müstəqilliyini təmin edən adamlardır. Azərbaycanın böyük tarixi keçmişi olduğu kimi böyük də gələcəyi vardır. Azərbaycanın keçmişində və son illərində nə qədər əzab-əziyyətli mərhələlər, dövrlər olubsa, gələcəyində də o qədər xoşbəxt günlər olacaqdır” [IIIc.s.5-6].

Çıxış və nitqlərində həmişə xalqı nikbinliyə çağıran ulu öndər elə də olur ki, xalqda nikbinliyi görüb bir daha inanır ki, bu çətinliklərdən çıxacağıq. 8 mart 1995-ci il tarixdə, Beynəlxalq Qadınlar günü münasibətilə keçirilən təntənəli bayram mərasimindəki nitq buna parlaq misaldır: “Bu gün mənim həyəcanlanmağımın səbəbi odur ki, xalqımız çətin, ağır vəziyyətdə, müharibə şəraitində yaşayır – bunların hamısını mən bilirəm, bu çətinliklərə görə qəlbən əzab-əziyyət çəkirəm, çünki bunların hamısına cavabdehəm. Ancaq eyni zamanda sizi şən, xoşbəxt görəndə, bu çətinliklərə baxmayaraq, sizi xoş əhval-ruhiyyədə, nikbin görəndə mən bir daha inanıram ki, xalqımız bu çətinliklərin hamısından çıxacaqdır. Bizim qələbəmizin dayağı qadınlardır, qadınlardır, qadınlardır!” [IIIc.s.247-248].

Əmək kollektivləri, yaradıcı iş adamları ilə olan görüşlərdə də Heydər Əliyevin gələcəyə səsləyən, yaşayıb yaratmağa sövq edən nikbin nitqi işə düşür. 7 iyun 1997-ci il tarixdə, böyük Azərbaycan şairi və dramaturqu Səməd Vurğunun

"Fərhad və Şirin" pyesinin yeni quruluşda tamaşasına baxdıqdan sonra yaradıcı kollektivlə görüşdəki çıxış buna əyani misaldır: "Teatrımızın böyük tarixi, böyük ənənələri, gözəl nümunələri var və bu teatr bu gün də, gələcəkdə də yaşamalıdır. Gedən proseslərə görə son illər sizin teatrın həyatında bir qədər çətinliklər olubsa, bunlar keçib gedəcəkdir. Görürsünüz, teatr artıq yüksək səviyyədədir və yaşayacaqdır. Siz də yaşayacaqsınız və xalqımıza daim mənəvi qida verəcəksiniz, onu sevindirəcəksiniz" [Xc.s.56-57].

Nitqdə nikbinlik yaradan natiq inama söykənməzsə auditoriya üçün nikbinlik yarımçıq qalar. Pediatriya cəmiyyətlərinin Bakıda keçirilən Beynəlxalq Konqresindəki açılışındakı nitqdə (21 sentyabr 1997-ci il) "çünki mən inanıram", "xalqımız da inanır ki", "mən inanıram ki" ifadələri bu günün uşaqlarının Azərbaycanın gələcəyini yaradacaqlar inamına söykənir və bu fikir qəlblərə yol tapır, qəlbləri öz işıqlı nuru ilə doldurur: "Bu böyük tarixi nailiyyətə görə, Azərbaycanın müstəqil dövlət kimi yaşaması naminə, milli azadlığımızı daim əlimizdə saxlamağımız naminə bütün bu çətinliklərə dözürük və xalqımız dözəcəkdir. Çünki mən inanıram və xalqımız da inanır ki, Azərbaycanın xoşbəxt gələcəyi var. Mən inanıram ki, bu gün dünyaya gələn uşaqlar, körpələr XXI əsrdə Azərbaycanın gözəl gələcəyini yaradacaqlar və Azərbaycan xalqı öz müstəqil dövlətində daim azad, sərbəst yaşayacaqdır" [XIIc.s.171].

Müstəqillik dövründə Heydər Əliyevin ən çox iştirak etdiyi, baş çəkdiyi tədbirlər sırasına əlillərin respublika yaradıcılıq sərgi-müsabiqələrinin açılışları da aiddir. Vətənin, torpağın müdafiəsində şikəst, əlil olmuş insanlara qayğı və diqqətin daha da çoxaldılmasını dövlət və hökumət orqanları qarşısında bir vəzifə kimi qoyan ulu öndər onları cəmiyyətimizin tam hüquqlu üzvləri kimi quruculuq işlərində fəal olmağa çağırır

ki, bu da onlara mənən güc verir: "Əmin ola bilərsiniz, – bunu sizə və sizin simanızda Azərbaycanın bu təbəqədən olan insanlarının hamısına deyirəm, – biz bundan sonra da birinci növbədə Vətənin, torpağın müdafiəsində şikəst, əlil olmuş insanlara və onlarla bərabər, fiziki cəhətdən çatışmazlığı olan insanların hamısına qayğını və diqqəti ilbəil artıracağıq və bu, gələcəkdə proqramlarımızda daha da görkəmli yer tutacaqdır. Ümidvaram ki, Azərbaycanın dövlət və hökumət orqanlarının hamısı mənim bu çağırışımı layiqincə yerinə yetirəcəklər və biz əlillər, şikəst adamlar üçün, fiziki çatışmazlığı olan insanlar üçün – onların yaşaması, əmək fəaliyyətinə cəlb olunması, öz daxili imkanlarından, istedadlarından istifadə etmələri üçün daha da geniş şərait yaradacağıq" [XIIIc.s.163].

Nikbinliklə zəngin çıxış və nitqlər ən çox Azərbaycanın gələcəyi kimi təqdim etdiyi uşaqlar və gənclərin toplaşdığı tədbirlərdir. Uşaqları xoş əhval-ruhiyyədə görən böyük natiq sevincini gizlətmir. Poetik bir ruhla "böyük problemlər içərisində yaşayan cəmiyyətin" uşaqlardan ilham aldığını, təsəlli tapdığını vurğulayaraq "uşaqlar var, gələcək var" kimi nikbin notlarla nitqini yekunlaşdırır:

"Mən gənc istedadlarla əlaqədar sərəncam vermişəm və "Qızıl kitab" yaratmışam. Ancaq Azərbaycanda bu istedadlar o qədər çoxdur ki, yəqin bu kitab qısa müddətdə bir neçə cildə çevriləcəkdir. İstedadlı uşaqların adlarının çoxu ora düşəcəkdir. Mən onları bu gün burada da görürəm.

Mən çox sevinirəm ki, uşaqlar xoş əhval-ruhiyyədədir. Biz bu gün onları televiziya vasitəsilə burada görürük. Bu, cəmiyyətimiz üçün lazımdır. Çünki böyük problemlər içərisində yaşayan cəmiyyət, yaşlı insanlar öz çətinliklərinin öhdəsindən gəlmək üçün uşaqlardan ilham alırlar, uşaqları görüb təsəlli alırlar ki, uşaqlar var, gələcək var. Azərbaycanın gələcəyi də parlaqdır".

Gənclər auditoriyasında gələcəyə tuşlanan nikbin ruhlu nitqlər xüsusi ilə diqqətçəkən, yaddaqalandır. Ölkənin gələcəyi olan gənclər Heydər Əliyevin "ümidvaram ki" ifadəsi ilə səfərbər olunurlar: "Gənclərin vəzifəsi Azərbaycanın dövlət müstəqilliyini qorumaq, Azərbaycanda hüquqi, demokratik, dünyəvi dövlət quruculuğu prosesində fəal iştirak etmək, ölkəmizin iqtisadiyyatını, mədəniyyətini, elmini inkişaf etdirməkdir. Ümidvaram ki, Azərbaycanın bugünkü gəncləri, o cümlədən Naxçıvanın gəncləri, Naxçıvan Dövlət Universitetinin tələbələri bunların hamısına qadirdir və biz gələcəkdə onların gözəl işlərinin nəticələrinin şahidi olacağıq" [XXIIc.s.185].

Xalqın xoşbəxt gələcəyindən nikbinliklə danışan böyük natiq həmişə tarixə müraciət edir, xalqın şanlı keçmişini yaddaşlarda bir daha təzələyir "xalqımızı sındırmaq, əzmək istəyənlər olubdur" sözləri ilə auditoriyanı bir daha canlandırır. Sinonim cərgə ilə – "xalqımız itkilərdə, qurbanlar da, şəhidlər də verib" – xalqın düçar olduğu müsibətləri bir daha təkrarlayır. Son olaraq növbəti frazeoloji birləşmələrdən təşkil olunmuş sinonim cərgə – ancaq heç vaxt sınmayıbdır, iradəsindən dönməyibdir, iradəsini itirməyibdir – nikbinlik ruhunu auditoriyaya yayır: "Məlumdur ki, xalqımız əsrlər boyu böyük sınaqlardan keçibdir. Keçən əsrlərdə, dövrlərdə də xalqımızın başına bəlalar gətirən qüvvələr, xalqımıza zülm edənlər olubdur. Bizim xalqımızı sındırmaq, əzmək istəyənlər olubdur. Xalqımız itkilər də, qurbanlar da, şəhidlər də verib, ancaq heç vaxt sınmayıbdır, iradəsindən dönməyibdir, iradəsini itirməyibdir. Xalqımız məğrur xalqdır. Xalqımız ötən dövrlərdəki o sınaqlardan keçdiyi kimi, biz də bu sınaqlardan keçəcəyik, bu addımı atacağıq və müstəqil Azərbaycan Respublikasının ərazi bütövlüyünü təmin edəcəyik, Ermənistan silahlı qüvvələrini işğal etdikləri torpaqlarımızdan çıxaracağıq, siz öz yerinizə yurdunuza qayıdacaqsınız" [IXc.s.215-216].

Çıxış və nitqləri ilə gücünü, enerjisini xalqı ilə paylaşan, xalqında sabahkı günə inam, etibar yaradan böyük natiq tarixdən, tarixi şəxsiyyətlərin keçdiyi həyat yolundan nəticə çıxarır, güc alır, o həyat yollarını özümüzlə müqayisədə araşdırır, rasional olanları birmənalı şəkildə qəbul edir. Mustafa Kamal Atatürk yolunu, siyasətini qəbul edən Heydər Əliyev, onun əməllərini davam etdirərək "yaratdığı, yaşatdığı dövləti" etibarlı əllərə tapşıraraq, bugünkü nəsillərə, gənclərə əmanət edərək, özünü əbədiyyətə qovuşdurdu:

"Mustafa Kamal Atatürk cümhuriyyəti yaratdı, amma eyni zamanda da onu qurdu, yaşatdı. Şübhəsiz ki, hər bir yeni işi yaratmaq asan deyil. Bu, böyük iradə, ağıl, qəhrəmanlıq tələb edir. Ancaq qurulan hər bir şey yaşaya bilmir. Mustafa Kamal Atatürkün xidmətləri bir də ondan ibarətdir ki, o, Türkiyə Cumhuriyyətinin nəinki əsasını, təməlini qoydu, həm də onu qurdu, onun bütün təsisatlarını yaratdı, onu yaşatdı, böyük dövlət etdi, bu günkü nəsillərə, gənclərə əmanət edərək özünü əbədiyyətə qovuşdurdu" [XVIIIc.s.132-133].

Müxtəlif dillərə mənsub "islam sivilizasiyası Qafqazda" mövzusunda beynəlxalq simpoziumun iştirakçıları ilə görüşdə biz Heydər Əliyevi islam təssübkekeşi, müsəlmanları arxasınca aparmaq gücündə olan dini lider kimi görürük. "İslam harda olubsa, ora bir də gələcəkdir", – deyən natiq Azərbaycan xalqında nə dərəcədə nikbinlik yaradırsa, işğalçılarda isə torpaqları tərk etməlisiniz, – ovqatını yaradır. Nikbinliklə qətiyyətin sintezini yaradır:

"Mən güman etmirəm ki, o torpaqlardan islam əbədi olaraq silinibdir, – mən belə hesab etmirəm. İslam harda olubsa, ora bir də gələcəkdir. Mən buna inanıram. İnanıram ki, o yerlərin sahibləri – müsəlmanlar, azərbaycanlılar oraya qayıdacaqlar. Ona görə o yerləri islamın xəritəsindən heç vaxt silmək olmaz." [XVIIIc.s.376].

Məişət üslublu nitqlərində belə Heydər Əliyev nikbinlik doğurmaq, xəstəlik qarşısında əyilməmək, ölkəmizin müstəqilliyi yolunda xəstəliyi heç nə saymaq kimi fikirlərlə insanlara nümunə göstərir. “Bir də həyat tələb edir”, – deməklə işğalda olan ərazilərimizin xilası yolunda sanki, xəstələnmək haqqımız yoxdur fəlsəfi fikrini irəli sürür, siyasi liderinin arxasınca gedən xalqın qəlbini riqqətə gətirir, hər bir vətəndaşı gələcək günlərə hazırlayır: “Bəlkə də möcüzədir, amma yəqin mənim orqanizmim belədir və bir də həyat tələb edir. Hər halda, müalicədən çox razıyam və müalicədən keçən dövrdə, şübhəsiz ki, böyük bir dövr var. Ona görə də, məndə hər şey normal gedir. Ona görə, işləyə də bilirəm, səyahətə də çıxa bilirəm. Lazım olsa, indi Amerikaya da uça bilərəm” [XXIc.s.34-121]

Əminlik bildirən modal sözlərlə: “Mən əminəm ki”, “Biz əminik ki” və s. müşayiət olunan nitq sonda xalqın, ölkənin düşdüyü vəziyyətdən çıxmasına təminat verir. Respublikanın düşdüyü ağır sosial-iqtisadi vəziyyətin “mərhələ-mərhələ” həllini tapacağı inamla xalqa çatdırılır: “Şübhəsiz, bütün bunlar Azərbaycanda daxili siyasi vəziyyəti tamamilə sabitləşdirməyə imkan vermir, lakin biz əminik: son aylarda həyata keçirdiyimiz konkret tədbirləri xalqın müdafiə etməsi, cəmiyyətin, Azərbaycan əhalisinin böyük əksəriyyətinin ümumən bəyənməsi təminat verir ki, biz respublikada daxili siyasi vəziyyətin sabitləşməsinə, milli həmrəyliyə və hazırda bütün respublikanın, bütün əhalinin həyatını çətinləşdirən problemləri mərhələ-mərhələ həll etməyə müvəffəq olacağıq” [Ic.s.131-132].

Heydər Əliyev çıxışlarında nikbinlik sinonim cərgələrlə özünü göstərir. Azərbaycan xalqına xas olan keyfiyyətlər – “İnam, iradə, güc, qüdrət, daxili mənəviyyat” – sinonim cərgələrlə sıralanır. Xalqa olan inamsa – “qüdrətinə, cəsarətinə, mətanətinə də inanıram” – sinonimləri ilə həyata keçirilir.

Xalqı həmişə ağır vəziyyətdən çıxarmaq üçün nikbinliyin əhəmiyyəti birbaşa "nikbinlik əhval ruhiyyəsi" kimi ifadələrlə özünü göstərir: "Nikbinlik əhval-ruhiyyəsi, özündə olan gücü, qüdrəti yeri gələndə son həddə qədər toplayıb hərəkətə gətirmək imkanları – bunlar Azərbaycan xalqını həmişə ağır vəziyyətdən çıxarmışdır, güman edirəm ki, indi də çıxaracaqdır. Bir sözlə, mən istəyirəm siz gənclərdə həm düşdüyümüz vəziyyət haqqında düzgün təsəvvür olsun, həm də inam olsun, ümid olsun, nikbinlik olsun. İnam, iradə, güc, qüdrət, daxili mənəviyyat – bunlar bizim xalqa xas olan keyfiyyətlərdir. Buna görə də mən xalqımızın qüdrətinə də, cəsarətinə də, mətanətinə də inanıram" [Ic.s.165-166].

Bir çox hallarda böyük natiqin nikbinliklə dolu çıxışları "eşq olsun" xitabının epiforaları ilə sonuclanır. "Ümidvaram ki" nikbinlik ifadəsi ilə çıxış sona çatır: "Azərbaycan Respublikasının suverenliyi, müstəqilliyi uğrunda vuruşaraq canlarını qurban vermiş qəhrəman oğullara eşq olsun! Onların xatirəsi qəlbimizdə əbədi yaşayacaqdır. Qəhrəman Azərbaycan xalqına eşq olsun! Azərbaycan torpaqlarını fədakarlıqla müdafiə edən döyüşçülərimizə eşq olsun! Hamınıza cansağlığı, xoşbəxtlik arzulayıram. Ümidvaram ki, müharibəyə son qoyulacaq, torpaqlarımız tamamilə azad edilərək, ölkəmizin ərazi bütövlüyü təmin olunacaq və biz bu qələbəni sizinlə birlikdə bayram edəcəyik. Sağ olun" [IIc.s.186-187].

Heydər Əliyevin nitqində nikbinliyi ortaya qoyan, auditoriyanı nikbinliyə səsləyən "əminik ki", "əmin olduğumuzu bildiririk ki" ifadələri cümlənin əvvəlində təkrar olunaraq anforalarla nitqi gücləndirir. Nikbinlik əhval-ruhiyyəsini artırır. 18 sentyabr 1995-ci il tarixdə, dahi Azərbaycan bəstəkarı Üzeyir Hacıbəyovun anadan olmasının 110 illiyinə həsr olunmuş təntənəli yubiley gecəsindəki nitq anaforalarla zəngindir. Bu zənginlik hesabına nikbinlik özünün yüksək zirvəsinə

çatır: "Biz bu gün Üzeyir Hacıbəyovun 110 illik yubileyini qeyd edərək əmin olduğumuzu bildiririk ki, Üzeyir Hacıbəyovun irsi yaşayacaq və onun yaşadığı yerlərin hamısı ziyarətgaha çevriləcəkdir. Biz əminik ki, Azərbaycan torpaqları Ermənistan işğalçılarının əlindən qurtaracaqdır. Biz əminik ki, Şuşa azad olacaqdır. Biz əminik ki, bütün Qarabağ, işğal olunmuş bütün torpaqlarımız azad ediləcək, müstəqil Azərbaycan öz ərazilərinin hamısının, öz sərhədlərinin sahibi olacaqdır" [IVc.s.283-284].

Heydər Əliyevin nikbinliklə dolu nitqləri xoşbəxt gələcəyə gedən yol barəsində auditoriya üçün şübhə yeri qoymur "Şübhə yoxdur" modal sözü ilə başlayan fikirlər "bizim hamımızı gözəl gələcək gözləyir" əhval-ruhiyyəsi ilə başa çatır: "Bununla bərabər belə hesab edirəm ki, Rusiyada, Azərbaycanda və bizə yaxın olan digər ölkələrdə yaşamış əvvəlki nəsillərin adamları tarix ərzində neçə-neçə çətin illər və hətta onilliklər keçirmişlər. Lakin insanlar yaşayır, insanlar yaradır, çətinlikləri dəf edirdilər. Buna görə də heç bir şübhə yoxdur ki, ümumən xalqlarımız, o cümlədən ölkələrimizin elmi bu çətinlikləri dəf edəcəklər, biz tarixin bu çətin, mürəkkəb mərhələsini keçib gedəcəyik və şəxsən mən hesab edirəm ki, bizim hamımızı gözəl gələcək gözləyir" [Xc.s.259-260].

Heydər Əliyevin çıxışlarında nikbinliklə dolu nitq nümunələri saysız-hesabsızdır. Azərbaycan dilinin zənginliklərindən hər məqamda yerindəcə yaralanan ulu öndər sinonimlərdən, xitablardan, təkrirlərdən məharətlə istifadə edir, sonda isə "əmin olduğumu bildirmək istəyirəm ki," nikbinlik ifadəsi ilə auditoriyanı Azərbaycanımızın işıqlı gələcəyinə səsləyir. Gənclər gününə həsr edilmiş bədii-idman bayramındakı nitq yuxarıda adları çəkilən nitq vasitələri ilə zəngindir. Xitab və sinonimin birgə təsadüf etdiyi cümlələr: "Əziz övladlar, sizin kimi gəncləri, gələcəyi olan Azərbaycan basılmazdır, sarsıl-

mazdır!" Epiforalar: "Möhkəm əllərdə saxlaya bilən, xətalardan qoruya bilən, demokratik dövlətini qoruya bilən gəncliyi vardır". Sinonimlər: "Qabiliyyətini, bacarığını, gücünü göstərir"; Xitab! – "Bunlar sizlərsiniz, əziz övladlar!" – onun nikbinliklə zəngin nitqində yerli-yerində işlənmişdir:

"Əziz övladlar, sizin kimi gəncləri, gəncliyi olan Azərbaycan basılmazdır! Məni hədsiz dərəcədə sevindirən odur ki, Azərbaycanın gələcəyini möhkəm əllərdə saxlaya bilən, Azərbaycanı daim bütün xətalardan qoruya bilən, Azərbaycanın dövlət müstəqilliyini, demokratik dövlətini qoruya bilən gəncliyi var. Bunlar sizlərsiniz əziz övladlar! Siz, bu gün bu bayram günü bu sarayda öz istedadlarınızı nümayiş etdirdiniz – idman növləri, rəqslər, mahnılar. Bunlar hamısı Azərbaycan gəncliyinin yüksək istedada malik olduğunu göstərir. Azərbaycanın bu günkü gənclərinin qabiliyyətini, bacarığını, gücünü, zəkasını, yüksək mədəniyyətini göstərir. Sizi bu nailiyyətlərinizlə təbrik edir və əmin olduğumu bildirmək istəyirəm ki, siz cəmiyyətmizi günbəgün yeni nailiyyətlərlə sevindirəcəksiniz və Azərbaycanı daim yüksəldəcək, irəliyə aparacaqsınız" [XIVc.s.198-199].

# IX FƏSİL

# HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ PROQNOZLAR

Heydər Əliyev nitqinin gücü səmimiyyət, qətiyyət, poetizm, fəlsəfilik kimi nitq ünsürlərinə söykənir ki, bu nitq gələcəyi aydın görmək qabiliyyəti kimi səciyyələnən proqnozlarsız təsəvvür olunmur.

Heydər Əliyevin XX əsrin 70-80-ci illərdəki nitqləri dərindən araşdırdıqda 90-cı illərin müstəqillik dövrünün işartıları, qığılcımları o çətin dövrdən boylanır. Analitik təfəkkür əsasında ictimai-siyasi, sosial-iqtisadi inkişafın gələcək üfüqlərini görən böyük natiqin hər çıxışında auditoriya proqnostik fikirləri tutmağa çalışır. Tutmağa çalışır, ona görə ki, Heydər Əliyevin fikir və ideyalarının reallaşacağına inanır. Məhz bu inam auditoriyanı səfərbər edir. Böyük natiqin şəxsində gələcəyə, müstəqilliyimizə gedən yola işıq saçır.

Bu proqnozlar ölkə həyatının siyasi, iqtisadi, mədəni tərəflərinin müzakirə olunduğu müxtəlif çeşidli auditoriyalarda səslənir, müxtəlif üslublu nitqlərdə öz yerini tapır. Görkəmli siyasi xadim kimi, Sovetlər İttifaqında yüksək siyasi kürsülərdə əyləşən şəxsiyyət kimi Heydər Əliyevin siyasi proqnozlarla zəngin nitqləri bu gün də bütün dünya politologiya məktəbləri üçün əvəzsiz töhfədir.

1970-1987-ci illərdə Azərbaycandan kənarda ali təhsil almış mütəxəssislərin Ümümrespublika toplantısındakı nitqdə (31 avqust 1998-ci il) proqnozlar uzaq üfüqlərə necə də vaxtında hesablanmışdır: "Bəli, o illərdə mən Azərbaycanda təhsilin, respublikamızda ali məktəblərin işini təkmilləşdirmək yolunda həddindən artıq çalışarkən, Azərbaycanda kadr hazırlığı məsələsi ilə şəxsən, bilavasitə ciddi məşğul olarkən və o cümlədən sizləri respublikamızdan kənarda ali məktəblərə

göndərərkən və Azərbaycan gənclərinin o vaxtlar Sovetlər İttifaqının çoxsaylı ali hərbi məktəblərinə göndərərkən mütləq və mütləq Azərbaycanın gələcəyini, müstəqilliyini düşünürdüm.

O vaxt mən inanırdım: vaxt gələcək ki, bu kadrlar Azərbaycana lazım olacaqdır. Vaxt gələcəkdir ki, nəhayət, Azərbaycan müstəqil olacaqdır və bu kadrlar, Azərbaycan müstəqilliyini təmin edəcəklər. O vaxt gəlib çatdı. Azərbaycan artıq öz dövlət müstəqilliyinin 7-ci ilini yaşayır" [XVIIc.s.226].

Bütün Avropa ölkələri ilə bizim əlaqələrimiz genişlənməlidir. Xüsusən İngiltərə, Fransa, Almaniya və başqa Avropa ölkələri ilə (15.VI.1993-cü il).

1993-cü il çıxışından 2-3 il keçməmiş ölkə prezidentinin çıxış etdiyi Azərbaycan auditoriyası artıq Avropanın iqtisadi qüdrətli ölkələrinin dövlət başçıları ilə üzbəüz görür. Eləcə də onun həmin iclasda "Bütün müsəlman ölkələri ilə, ərəb ölkələri ilə, türkdilli ölkələrlə bizim əlaqələrimiz daha da sürətlə inkişaf etməlidir".

Yenə də bu çıxışın ardınca böyük natiqi İslam Təşkilatı Konfransının Kasablanka zirvə toplantısında, görürük.

21 sentyabr 1993-cü il tarixdə Azərbaycan Milli Elmlər Akademiyasındakı çıxış da proqnozlarla – bu gün həyata keçirilmiş fikir və müddəalarla zəngindir.

"...Azərbaycan bir müstəqil dövlət kimi öz taleyinin sahibi, öz torpaqlarının sahibi, öz hüquqlarının sahibi olacaq və gələcək firavan həyatını özü quracaqdır" [Ic.s.148].

Ən böyük proqnoz isə: "Yalnız bir şeyi vəd edə bilərəm: Azərbaycan xalqına, millətimə, torpağıma sadiq olmuşam və ömrüm boyu da sadiq olacağam. Həyatımın son dəqiqəsinədək xalqıma xidmət edəcəyəm və ömrümün bundan sonrakı illərini də xalqıma bəxş edirəm" proqnozudur.

Zaman Heydər Əliyevin proqnozlarının özünü doğrultması ilə böyük natiqə əbədi şöhrət gətirmişdir. Bu proqnozların

sağlam, möhkəm məntiqə söykəndiyindən xəbər verir: "Mənasını, məzmununu dərk etməyib, nəticəsini bilmədən moda dalınca qaçmaqla bir çox böyük səhvlər buraxa bilərik. Çox təəssüf ki, Azərbaycanda artıq belə səhvlər buraxılmışdır. Təhsilin bir hissəsi kommersiya əsasına keçirilmişdir".

Həmin tarixdə söylənilən nitqdəki fikirlər gələcəkdə yerinə yetirilmə baxımından proqnozlarla zəngindir.

Ulu öndər 15 iyunda Milli Məclisdə etdiyi çıxış siyasi, iqtisadi proqnozlarla zəngindir: "Müstəqil Azərbaycanda demokratiya inkişaf etdirilməlidir. Siyasi plüralizimə geniş yol verilməlidir. Siyasətdə və iqtisadiyyatda sərbəstlik, hürriyyət, insan azadlığı, insan haqlarının qorunması və sərbəst iqtisadiyyat, bazar iqtisadiyyatı prinsipləri bərqərar olmalıdır" [Ic.s.10].

Bu gün ölkəmizdə siyasi partiyaların seçkilərdə iştirakı, müxtəlif mətbuat orqanlarının fəaliyyəti, azad toplaşmaq hüququnun təmin olunması və s. siyasi plüralizmin tam bərqərar olmasından xəbər verir.

Eləcə də, Azərbaycan Respublikasının bazar iqtisadiyyatına, sərbəst iqtisadiyyata digər MDB ölkələrindən sürətlə keçməsi faktı dünya birlikləri tərəfindən qəbul olunan faktdır. Heydər Əliyev yenə də həmin iclasda görüləsi işləri sadalayır, tarix isə bu sadalanan işlərin həyata keçirilməsini təsdiqləyir: "Xarici siyasət sahəsində keçən bir il müddətində çox iş görülüb. Ancaq görüləsi işlər daha da çoxdur. Güman edirəm ki, Azərbaycan Respublikası demokratik dövlət kimi bütün dövlətlərlə bərabərhüquqlu münasibətlər yaratmalıdır. Bu baxımdan Türkiyə Cümhuriyyəti ilə olan əlaqələr, şübhəsiz ki, respublikanın əhalisi tərəfindən bəyənilir. Qonşu İran İslam Respublikası ilə bizim münasibətlərimiz yaxşılaşdırılmalıdır, inkişaf etdirilməlidir. Rusiya çox böyük dövlətdir, bizim şimalda olan qonşumuzdur. Şübhəsiz ki, Rusiya ilə Azərbaycan arasın-

da müstəqil prinsiplər əsasında münasibətlər bundan sonra daha da yaxşı, daha da geniş, səmərəli olmalıdır.

Keçmiş Sovetlər İttifaqına daxil olan, indi müstəqil dövlət olan bütün dövlətlərlə – Ukrayna, Belarus, Gürcüstan, Orta Asiya dövlətləri, Qazaxıstan, Pribaltika dövlətləri, Moldova ilə biz daha geniş qarşılıqlı əlaqələr yaratmalıyıq" [Ic.s.11].

Elə bu çıxışın ardınca – 28 oktyabr 1993-cü il tarixdə, Bakıda Azərbaycan Respublikası ilə İran İslam Respublikası arasında yüksək səviyyədə sənədlər imzalanır, 8 fevral 1994-cü il tarixdə isə artıq Heydər Əliyev Türkiyə Cümhuriyyəti prezidentinin iqamətgahı "Çankaya" köşkündə rəsmi qarşılanır.

Bəli, Heydər Əliyevin proqnozları həmişə özünü doğrultmaqdadır. Onun Azərbaycan xalqı haqqındakı fikirləri, xalqın ona ümid bəsləməsi kimi inamı özünü həmişə doğruldur. 23 avqust 1993-cü il tarixdə, Azərbaycan Milli Televiziyası ilə xalqa müraciətdə böyük natiqin söylədiyi fikirlər bu sıradandır: "Xalqın gücünün qarşısında heç bir qüvvə dayana bilməz. Mən də xalqın gücünə arxalanıram. Əgər xalq məni bu gün lazım bilməsə, sabah getməyə hazıram. Ancaq mənə gələn məlumatlara görə, xalq mənə ümid bəsləyir. Mən də bu ümidi doğrultmaq üçün həyatımın qalan hissəsini xalqa bağışlamışam və ona qurban verməyə hazıram" [Ic.s.99].

Zaman Heydər Əliyev ideyalarının, fikirlərinin doğruluğunu təsdiq edir. 5 oktyabr 1994-cü ildə Prezident sarayı qarşısında Bakı zəhmetkeşlərinin mitinqindəki tarixi çıxış bunun bariz nümunəsidir: "Bu gecə vaxtı, yuxunuza haram qataraq, istirahətinizi pozaraq Azərbaycan Dövlətçiliyinin qorunması naminə mənim çağırışımla buraya, Prezident sarayının qarşısına toplaşdığınıza görə sizə səmimi qəlbdən təşəkkür edirəm, çox sağ olun. Çox məmnunam ki, mənim çıxışıma səs verdiniz, şəhərin müxtəlif yerlərindən buraya toplaşdınız. Burada alovlu nitqlər səslənir, insanlar həyəcana gəlib, coşub.

Azərbaycanın hər yerində insanlar küçələrə, meydanlara çıxaraq öz mənliyini, milli qürurunu, öz dövlətçiliyini, müstəqilliyini qoruyur. Çox sağ olun, minnətdaram” [Ic.s.361].

20 iyul 1998-ci il tarixdə, Böyük Britaniyanın aparıcı kütləvi informasiya vasitələrinin yüksək vəzifəli nümayəndələri ilə görüşdəki bəyanat və suallara cavab (London, “Klaricis” mehmanxanası) siyasi sahədə böyük natiqin uzaqgörənliyi və intuisiyasından xəbər verir. Siyasi proqnozlar ustası Heydər Əliyev Ruben Xaladın “siz o zamanlar Azərbaycanın müstəqil dövlət olacağı barədə düşünürdünüzmü?” sualına verdiyi cavab buna əyani sübutdur: “Təsadüfi deyil ki, mən istefaya gedəndən sonra və xüsusən, 1990-cı ildə, hələ Sovetlər İttifaqı dağılmamışdan əvvəl artıq açıq çıxış edirdim ki, Azərbaycan müstəqil olmalıdır və Sovetlər İttifaqı dağılmalıdır. 1990-cı ilin yanvar ayında Qorbaçovun göstərişi ilə sovetlərin böyük qoşun hissəsi Bakıya yeridilib qırğın törətdikdən sonra mən Kommunist Partiyasını tərk etdim, bəyanat verdim və Azərbaycanın müstəqil olması haqqında çıxışlar etdim”.

Elə həmin görüşdə müxbir Robert Murun: “Rusiyanın gələcək taleyi barədə nə deyə bilərsiniz?” sualına yüksək səmimiyyət və təvazökarlıqla cavab verərək nitqlərinin güclü proqnozlara söykəndiyini auditoriyaya göstərir: “Mən məmnuniyyətlə cavab verərəm. Bilirisiniz, mən ümumiyyətlə, proqnoz verməkdən həmişə çəkinirəm.

Cürbəcür tədqiqatlar aparıb proqnoz vermələrə də o qədər inanmıram. Çünkü mənim böyük həyat təcrübəm var”. Təkcə bu bir neçə cümlə Heydər Əliyev nitqinin cazibədarlığından xəbər verir. İncə, qəlbətoxunmayan, məntiqə əsaslanan eyhamla jurnalistlərin tələm-tələsik proqnozlar verdiyinə işarə edir, həyat təcrübəsinə söykənməyən proqnozların həyata keçməyəcəyinə, quru yerdə qalacağına işarə edir.

Robert Murun: "Biz tədqiqat işləri aparırıq və çörəyimiz də ondan çıxır" – cümləsinə özünəməxsus incə yumorla, pərəstiş etdiyi Cəlil Məmmədquluzadə sayağı münasibət bildirir: "Elə sizin çörəyinizin çıxması üçün də müəyyən cavablar verəcəyəm. Amma siz tədqiqatçısınız, mən isə sizə əməli fəaliyyət göstərən adamam. Mən cürbəcür proqnozların həyata keçməməsinin dəfələrlə şahidi olmuşam". Sonda sualı cavablandırır. O cavabı ki, o proqnozu ki, biz bu gün onun şahidiyik: "Amma inanıram ki, Rusiyanın tutduğu bu demokratik yol inkişaf edəcəkdir. Yəni, kommunistlərin, kommunist sisteminin bərpa olunması mümkün deyildir... Proqnoz verməyərək, mən bu fikirləri sizə çatdırıram" [XVIc.s.287].

Heydər Əliyev söz verir, verdiyi sözün tarixi ilə yerinə yetirilmə arasındakı zaman insanların gözü qabağında keçir. Ölkə həyatındakı gərgin dövr – 13 avqust 1993-cü ildəki çıxışdakı kimi: "Şübhəsiz ki, son illərdə Azərbaycanın ictimai-siyasi həyatında böyük səhvlərə yol verilib. Əgər Azərbaycan xalqı özündə qüdrət və imkan taparsa, əgər Azərbaycan xalqı bizə imkan verərsə, mən sizə, bütün azərbaycanlılara söz verirəm ki, bu səhvlərin hamısını aradan qaldıracağıq, amma bizə imkan vermək lazımdır" [Ic.s.73].

10 gün keçməsinə baxmayaraq bu çıxış 24 avqust 1993-cü ildə, Bakıda, Ümumrespublika müşavirəsindəki çıxışda təsdiqini tapır. Xalq müstəqilliyimizə zidd qüvvələrə qarşı mübarizədə öz liderinin arxasınca gedir, öz həmrəyliyini bildirir: "Dünən bizə gələn məlumatlardan, telefon zənglərindən, teleqramlardan və ümumi ictimai rəydən məlum olur ki, bu müraciəti xalq çoxdan gözləyirmiş. Müraciət ümumən bəyənilir, xalq tərəfindən rəğbətlə qarşılanıb, xalqda canlanma və böyük ümid yaradıbdır ki, Azərbaycanda daha hakimiyyətsizlik yoxdur, dövlət orqanları fəaliyyətdədir və respublikanın bu ağır dövründə Azərbaycan dövlətçiliyini qoruyub saxlamağa

iqtidarı var və bundan sonra da olacaqdır. Mən dünəndən indiyə qədər bu müraciətimizə müsbət əks-səda verən bütün şəxslərə, kollektivlərə, bütün əhaliyə minnətdarlığımızı bildirirəm. Onların bizimlə həmrəy olması gücümüzü artırır, bizə daha da ürək-dirək verir, iradəmizi daha da möhkəmləndirir. Hamını əmin etmək istəyirəm ki, biz bu yoldan çəkinməyəcəyik, Azərbaycanın dövlətçiliyini, müstəqilliyini qoruyacağıq və respublikanın parçalanmasına yol verməyəcəyik" [Ic.s.106].

Heydər Əliyev nitqində səslənən fikirlər qısa zaman kəsiyində özünü doğruldur. Söz verməyin ardınca qətiyyətli addımlar gəlir: "Lənkəranda yaranmış həmin o mif haqqındakı fikir dünən, bu gün pozuldu və gördünüz ki, bizi qəti addımlar atmağa qoymurdular. Qəti addım atan kimi bu, öz nəticəsini verdi" [Ic.s.116].

Auditoriyalar Heydər Əliyevi vaxtı ilə keçmiş tarixdə dediyi fikirlərin həyata keçdiyinin şahidi olduğu üçün böyük natiqin sabaha ünvanlanan fikirlərinə də ciddi önəm verir. 17 sentyabr 1994-cü il tarixdə, Azərneftyağ istehsalat birliyində avtomatik idarəetmə mərkəzinin kollektivi ilə görüş yuxarıdakı elementlərlə zəngindir: "İndi biz toplaşdığımız yer Qaraşəhərdir. Azərbaycanda, Bakıda "Qaraşəhər" sözü qəbul olunmuş bir məfhum idi və Qaraşəhər Bakının bir hissəsi idi. Xalq, ictimaiyyət ona görə "Qara şəhər" deyirdi ki, buradakı neft emal edən zavodlar həm atmosferə, həm də bizi əhatə edən mühitə o qədər tullantılar buraxırdı ki, həmin tullantılar burada hər şeyi qara rəngə boyayırdı, bəzən burada torpaq da, evlər də qaraya çalırdı, burada işləyən insanların sifətinə baxanda bəzən onların da qara rəngə bulaşdığını görürdüm" [IIc.s.240].

Heydər Əliyevin 1993-cü il 15 iyun çıxışından 5 il keçəndən sonra, 30 avqust 1998-ci ildə Avropa Şurasının baş katibi Daniel Tarişin rəhbərlik etdiyi nümayəndə heyəti ilə görüşdəki çıxışda məhz 5 il öncəki proqnozların özünü doğ-

rultmasının şahidi oluruq: "Azərbaycanda xeyli siyasi partiya vardır. Bunlardan təxminən 31-32-si qeydiyyata alınıblar. Bəzi partiyalar isə heç qeydiyyata alınmadan fəaliyyət göstərirlər. Bu partiyalar öz fəaliyyətlərini tamamilə sərbəst həyata keçirirlər və heç kəs onların fəaliyyətini məhdudlaşdırmır. Bu partiyaların və ayrı-ayrı təşəbbüs qruplarının nümayəndələrinin prezidentliyə irəli sürdükləri 6 namizəd qeydiyyata alınmışdır" [XVIIc.s.203].

"Əminəm ki, beləliklə ayrı-ayrı ölkələrdə, o cümlədən Rusiyada, Müstəqil Dövlətlər Birliyinə daxil olan başqa ölkələrdə müstəqil Azərbaycanın diasporu formalaşacaqdır. Bu da müstəqil Azərbaycan üçün böyük dayaq olacaqdır. Bu, bizə lazımdır və buna ehtiyacımızı indi də duyuruq, hiss edirik". (1970-1987-ci illərdə xaricdə təhsil, 31 avqust 1998-ci il) [XVIIc.s.227].

Gələcək proqnostik fikirlər əsasən "Şübhə etmirəm ki", "İnanıram ki", "güman edirəm ki", "əmin olmalısan ki" ifadələri "-malı, -məli" şəkilçiləri ilə səsləndirilir: "Güman edirəm ki, vəziyyətimiz nə qədər ağır olsa da, nə qədər faciəli bir şəraitdə yaşasaq da bədbinliyə uymamalıyıq. Nikbinlik əhval-ruhiyyəsi, özündə olan gücü, qüdrəti yeri gələndə son həddə qədər toplayıb hərəkətə gətirmək imkanları – bunlar Azərbaycan xalqını həmişə ağır vəziyyətlərdən çıxarmışdır, güman edirəm ki, indi də çıxaracaqdır" [Ic.s.165-166].

Böyük natiqin proqnostik fikirləri araşdırılmaq baxımından bu gün də aktualdır. "Nezavisimaya qazeta"nın (30 avqust 1993-cü il) müxbirinin suallarının aydınlaşdırılması Heydər Əliyev proqnozlarının gücünü əks etdirir. Amma, Azərbaycan prezidenti vəzifəsini tamam ləğv etmək təklifi də var – sualına verilən cavab 20 illik bir zamandan sonra yenə də düşündürücüdür, proqnostik cəhətdən çox qiymətlidir: "Parlament idarə forması üçün gərək sabit ənənələr olsun. Bu

ənənələr isə öz-özünə meydana gəlmir. Dəqiq fəaliyyət proqramları olan güclü, qanuniləşdirilmiş partiyalar gərəkdir, onların proqramlarında zamanın şərtləri ilə səsləşən konkret məqsəd və vəzifələr nəzərdə tutulmalıdır. Qeyd edim ki, indi bizdə onlarca partiya var. Onların proqramları oxşardır, bu partiyaların başında elə adamlar dururlar ki, onlar öz əqidə və baxışlarına görə bir-birindən çox az fərqlənirlər. Parlaq liderlər yoxdur. Hər halda hələlik yoxdur. Bu partiyalar lazımi sosial bazaya malik deyildirlər və əslində, hamısı da ibtidai siyasi modelə yaxındır. Buna görə də bu gün bizim şəraitdə əsl parlament idarə forması barədə düşünmək özünü aldatmağa bərabərdir" [Ic.s.118].

"Özünü aldatmaq" frazeoloji birləşməsi ilə sonuclanan çıxış bu gün də respublikada ciddi qəbul edilir.

Qəzetin müxbiri növbəti sualında Qarabağ probleminə toxunur, problemin həlli müddəti barəsində prezidentin mülahizələrini öyrənməyə çalışır. Sualın Heydər Əliyev tərəfindən dəyərləndirilən cavabı bu gün də diplomatlar üçün, siyasi xadimlər üçün də maraqlıdır: "Parlamentin iclasında mənim seçilməyim məsələsi həll edilərkən soruşurlar ki, mən Qarabağ münaqişəsinin aradan qaldırılmasına nə kimi təminat verə bilərəm. Aydın cavab verib dedim: Mən peyğəmbər deyiləm və heç bir təminat vermirəm və heç nə vəd etmirəm. Məsələ olduqca mürəkkəbdir və əgər onu beş il ərzində nəinki həll edə bilməmiş, əksinə, son həddədək ağırlaşdırmışlarsa, indi onun həllinin qeyri-adi yollarından danışmaq ən azı sadəlövhlükdür. Bununla yanaşı qeyd edim ki, hərbi əməliyyatların bundan sonra da aparılması münaqişədə iştirak edən tərəflərin hamısı üçün daha dəhşətli faciəyə gətirib çıxaracaqdır. Buna görə də inanıram ki, xalqların müdrikliyi, nəhayət, öz bəhrəsini verəcəkdir"[Ic.s.119].

“Məsələnin olduqca mürəkkəbliyi”, “xalqların müdrikliyinin nəticə verə bilməsi” və s. ifadələr Heydər Əliyev cavabının nə dərəcədə proqnostikliyinə işarədir.

“Nezavisimaya qazeta”nın iqtisadi məsələ ilə bağlı Heydər Əliyevə ünvanlanan – Yaxın vaxtlarda Azərbaycanda iqtisadi vəziyyət necə olcaq, daha doğrusu hökumət necə hərəkət edəcək – sualına verilən cavab və həmin cavabdan keçən müddətlərdə iqtisadi vəziyyətimizin araşdırılması iqtisadçılar üçün maraqlı olardı: “İqtisadiyyat son dərəcə bərbad vəziyyətdədir. Zavod və fabriklərin əksəriyyəti boş dayanır. Bütöv sahələr böhran içərisindədir, idarəetmə kadrlarının, texniki kadrların kəskin şəkildə çatışmadığı aydın nəzərə çarpır. Halbuki vaxt var idi, respublikanın yüksəlişini məhz onlar təmin etmişdilər. İqtisadi əlaqələr qırılmışdır. Biz, əslində, bütün istiqamətlərdə iş görməliyik. İqtisadi islahatlar mümkün olan yerlərdə həyata keçirilməlidir, onlar lap köklü olsa da. Lakin sağlam haqq-hesab əsasında əvvəlki iqtisadi potensialdan da istifadə etmək vacibdir. Bəd əməllər az tutulubmuş kimi hələ bəziləri müxtəlif sıçrayış və sürətli irəliləyişdən dəm vurur. Mən bunun əleyhinəyəm: böhranın kor düyününü yavaş-yavaş açmaq, inkişafın inqilabi yoluna deyil, təkamül yoluna, transformasiya metodikasına keçmək lazımdır. Biz çox tez-tez belə çağırışlar eşidirik ki, bazar yaradılması sahəsində fəaliyyəti gücləndirmək gərəkdir. Çoxları isə bizim artıq bazar şəraitində olduğumuzdan danışaraq özlərini də, ətrafdakıları da çaş-baş salırlar. Mən belə hesab edirəm ki, biz iqtisadi mənada bazara deyil, olsa-olsa adi bazara malikik, o da ki, çox bəsitdir. Bəs bu adi bazarı iqtisadi bazara necə çevirməli? Bax, məsələ də bundadır. Bax, burada yada salmaq lazımdır ki, bazar iqtisadiyyatının və əmək bazarlarının infrastrukturlarını, texnologiyaları, vergi sistemlərini ardıcıl su-

rətdə yaratmaq və bir çox digər məsələləri yoluna qoymaq lazımdır" [Ic.s.128].

Bu müsahibənin verildiyi 30 avqust 1993-cü ildən 2 ay keçməmiş biz Prezident sarayında Heydər Əliyevin bank-maliyyə, tədiyyə sistemlərinin və idxal-ixrac əməliyyatlarının vəziyyətinə və onu yaxşılaşdırmaq sahəsində vəzifələrə həsr olunmuş Ümumrespublika müşavirəsindəki çıxışın, bu çıxışdan bir həftə sonra Prezident sarayında respublikanın sosial-iqtisadi məsələlərinə həsr olunmuş müşavirədəki çıxış, 8 dekabr 1993-cü ildə maliyyə sistemində və əhalinin taxıl məhsulları ilə təchizatında olan ciddi nöqsanların aradan qaldırılmasına həsr olunmuş müşavirədə və sair çıxışlar sözü havaya sovurmayan, sözün qiymətini bilən, sözün qədrini bilən, xalq qarşısında lider sözünün məsuliyyətini parlaq şəkildə anlayan və hər bir hərəkətində verdiyi sözü reallığa çevirmək gücündə olan lider-natiqin nitqlərinin şahidi oluruq: "Güman edirəm ki, fikirlər aydındır. Buraya dəvət olunmuş şəxslərin hamısı bu tədbirlərin yerinə yetirilməsinə məsuliyyət daşıyır və mən tələb edirəm ki, hər bir kəs öz məsuliyyətini dərk edərək, bu tədbirlərin həyata keçirilməsi ilə ciddi məşğul olsun. Gecə-gündüz çalışmaq, bu tədbirləri xalqa izah etmək, eyni zamanda xalqın vəziyyətinin yüngülləşməsi üçün zəruri iş görmək lazımdır" [Ic.s.272].

Nitqin gücü auditoriyanı inandırmaqdadır. Auditoriyanı inandırmaq səmimiyyətə söykənir. Natiqin gücü isə onun söylədiyi çıxışlarda irəli sürülən fikir və müddəaların müəyyən zamandan sonra həyata keçirilməsindədir.

Heydər Əliyevin nitqinin araşdırılması bu nitqin proqnozlarla zənginliyindədir. Verdiyi proqnozların auditoriya, ölkə və dünya miqyasında özünü doğrultması ona olan inamı artırır. Heydər Əliyevin təkcə Azərbaycan Respublikası Milli Məclisinin iclasındakı çıxışı (15 iyun 1993-cü il) proqnozlarla

zəngindir: "Keçmiş Sovetlər İttifaqının bərpa olunması, Azərbaycan Respublikasının da ora daxil olması ehtimalı haqqında bəzi şayiələr, fikirlər gəzir. Bunlar xülyadır. Mən bu fikirləri rədd edirəm və bütün Azərbaycan vətəndaşlarını bu fikirləri rədd etməyə dəvət edirəm".

"Bu xülyadır", "Mən bu fikirləri rədd edirəm" ifadələrinin nə dərəcədə dəqiq, proqnostik olmasının izaha ehtiyacı yoxdur.

"Bir sözlə Azərbaycanda qaçqınlara və köçkünlərə dövlət qayğısı, ümumxalq qayğısı artırılmalıdır. Mən bütün dövlət, hökümət orqanlarından tələb edirəm ki, öz işlərini mənim bu tələbim əsasında qursunlar. Nazirlər, komitə sədrləri, hökümət üzvləri bu işlərlə ciddi məşğul olmalıdırlar. Bu, bizim ümummilli, ümumxalq işimizdir" [XVIc.s.124].

"İşğal olunmuş torpaqlarımızdan didərgin düşmüş qaçqınlarımız, sizə üzümü tuturam. Sizin nə qədər ağır vəziyyətdə yaşadığınızı bilirik. Sizin yaşayışınız üçün əlimizdən gələni edirik və bundan sonra da edəcəyik. Sizin dözümünüz, dəyanətiniz bütün Azərbaycan xalqı üçün nümunədir" [IIc.s.12].

Bu gün ölkədə çadır şəhərçiklərinin, vaqon evlərin, yataqxanaların yerində müasir şəraitə malik qəsəbələrin, şəhərçiklərin salınması, yerindən-yurdundan, elindən-obasından qaçqın düşmüş vətəndaşlarımızın, soydaşlarımızın həmin qəsəbələrdə və şəhərciklərdə məskunlaşdırılması yuxarıdakı nitqdə verilmiş vədlərin, proqnozların özünü doğrultmasına sübutdur.

Proqnozlara söykənən nitq müxtəlifyönlü məsələlərin həllində özünü göstərir. 9 yanvar 1994-cü il tarixdə, xaricdə yaşayan soydaşlarımızın bir qrupu ilə görüşdəki çıxışdan:

"Bütün dünyada yaşayan azərbaycanlılar təşkilatlanmalıdırlar... Siz dediniz ki, Almaniyada ticarətin çoxu azərbaycanlıların əlindədir. Elə Fransada da ticarətin bir hissəsi azərbaycanlıların əlindədir. Amma onlar birləşməyiblər, bəziləri

hələ də öz vətənlərini tanımır, öz vətənlərinin olduğunu dərk etmirlər" [Ic.s.323].

Bu gün dünyanın əksər ölkələrində Azərbaycanın səfirlikləri, səfirliklərlə yanaşı diaspor təşkilatları dostluq cəmiyyətlərinin fəaliyyəti "təşkilatlanmalıdırlar" qətiyyətinin təzahürüdür, proqnozudur.

Heydər Əliyev nitqlərinin mühüm bir gücü, bəlkə də ən əsası nitqin öncəgörmələrə söykənməsindədir, bu gün söylənilən fikir və müddəaların sabah həyata keçirilməsindədəir. 1993-cü il 15 iyunda xarici siyasət sahəsindəki fikirlərə nəzər salaq: "Xarici siyasət sahəsində keçən bir il müddətində çox işlər görülüb. Ancaq görülən işlər daha da çoxdur. Güman edirəm ki, Azərbaycan Respublikası demokratik dövlət kimi bütün dövlətlərlə bərabərhüquqlu münasibətlər yaratmalıdır. Hansı dövlətin daxili quruluşu, daxili siyasəti hansı istiqamətdə getməsindən asılı olmayaraq, biz normal münasibətlər yaratmalıyıq. Birinci növbədə, bizim yaxın qonşularımızla lazımi mədəni, iqtisadi, dövlət münasibətləri yaradılmalıdır. Bu baxımdan Türkiyə Cümhuriyyəti ilə olan əlaqələr, şübhəsiz ki, respublikanın əhalisi tərəfindən bəyənilir. Qonşu İran İslam Respublikası ilə bizim münasibətlərimiz yaxşılaşdırılmalıdır, inkişaf etdirilməlidir. Rusiya çox böyük dövlətdir, bizim şimal qonşumuzdur. Şübhəsiz ki, Rusiya ilə Azərbaycan arasında müstəqil prinsiplər əsasında münasibətlər bundan sonra daha yaxşı, daha geniş, səmərəli olmalıdır. Keçmiş Sovetlər İttifaqına daxil olan, indi müstəqil dövlət olan bütün dövlətlərlə – Ukrayna, Belarus, Gürcüstan, Orta Asiya dövlətləri, Qazaxıstan, Baltikyani dövlətlər, Moldova ilə biz daha geniş, qarşılıqlı əlaqələr yaratmalıyıq. Bizim üçün bu, çox lazımdır" [Ic.s.11-12].

Bu çıxışdan 8 ay keçəndən sonra, 9 fevral 1994-cü il tarixdə, böyük natiqi Türkiyə Böyük Millət Məclisində görürük:

“İndi Azərbaycan Respublikası müstəqil bir dövlətdir. XX əsrdə bütün dünya tarixində çox böyük dəyişikliklər baş vermişdir. O cümlədən də Azərbaycan xalqının həyatında XX əsrin əvvəllərində Azərbaycanda bir neçə siyasi qüvvə, xüsusən Azərbaycanın milli azadlığı naminə çarpışan qüvvələr olmuş, onlar Azərbaycanın Müstəqilliyi, istiqlalı, milli azadlığı uğrunda mübarizə aparmışlar. O vaxtlar Azərbaycan ilə Türkiyə arasında əlaqələr sıx olmuşdur. Bütün bunların nəticəsində 1918-ci ildə Azərbaycanda ilk demokratik dövlət yaradılmışdır” [Ic.s.366-367].

“Fəaliyyət göstərəcəyəm”, “çalışacağam” kimi ifadələrlə öz xalqı qarşısında öhdəlik götürən siyasi xadimin fikirlərinin doğruluğunu, siyasi proqnozlarını zaman doğruldur. Zamanın doğrultduğu fikirlərin şahidi olan auditoriya böyük natiqin gələcəkdə bütün çıxışlarına səmimi qəlbdən inanır, öz liderinin arxasınca tərəddüdsüz və heç bir şübhəyə düşmədən gedə bilir: “Azərbaycan Respublikası artıq ümumdünya miqyasına çıxıbdır. Amerika Birləşmiş Ştatları tərəfindən son zamanlar Azərbaycan Respublikasına göstərilən müsbət münasibətlər hamımızı sevindirir və güman edirəm ki, münasibətlər daha da genişlənib inkişaf etdirilməlidir.

Bütün Avropa ölkələri ilə bizim əlaqələrimiz genişlənməlidir. Xüsusən, İngiltərə, Fransa, Almaniya ilə. Bütün müsəlman ölkələri ilə, ərəb ölkələri ilə, türkdilli ölkələrlə bizim əlaqələrimiz daha sürətlə inkişaf etməlidir. Bir sözlə, sadəcə olaraq, xarici siyasət sahəsində öz mövqeyimi bildirmək istəyirəm. Ali Sovetin sədri kimi bu istiqamətdə fəaliyyət göstərəcəyəm, hökumətin fəaliyyətinin uğurlu olması yolunda çalışacağam” [Ic.s.11-12].

Elə yuxarıda söylənilən fikirlərdən bir il keçməmiş ölkə başçısı artıq Böyük Britaniyada rəsmi görüşlər keçirir, Azərbaycan-Böyük Britaniya münasibətlərinə aydınlıq gətirir:

"Qeyd etmək istəyirəm ki, Azərbaycan prezidenti kimi, mən Böyük Britaniya Krallığına cənab baş nazir Con Meycor tərəfindən dəvət olunmuşam. Bu müddət ərzində bəzi şirkətlərin prezidentləri ilə görüşlərimiz olmuşdur. Danışıqlar çox əlverişli şəraitdə keçmişdir və mənim fikrimcə, uğurla başa çatmışdır. Böyük Britaniya Birləşmiş Krallığı ilə Azərbaycan Respublikası arasında dövlətlərarası münasibətlər haqqında ciddi sənədlərin imzalanması buna sübutdur. 8 sənəd imzalanmışdır, onlardan 6-sını cənab Meycor və mən imzalamışıq. Böyük Britaniya Birləşmiş Krallığı ilə Azərbaycan Respublikası arasında dostluq və əməkdaşlıq haqqında bəyannamə bu sənədlərin arasında mühüm yer tutur" [Ic.s.420].

"Avropa ölkələri ilə əlaqələri genişləndirməliyik", – deyən Heydər Əliyev 21 dekabr 1993-cü il tarixdə Fransaya səfər edir. "Faydalı və səmərəli görüşlər" keçirən dövlət başçısının iyun ayında söylədiyi fikirləri artıq dekabr ayında reallığa çevrilir: "Hörmətli xanımlar və cənablar, mən artıq üçüncü gündür ki, Fransada, Parisdəyəm. Mən səfərin gedişindən və nəticələrindən son dərəcə məmnunam və şadam ki, bu günlərdə Parisə, onun diqqətəlayiq yerlərinə, misilsiz memarlıq abidələrinə yenidən baxmaq, müasir Fransanın, müasir Parisin çoşqun həyatı ilə tanış olmaq üçün kiçik də olsa imkana malik oldum. Lakin başlıcası, əlbəttə, budur ki, bu müddət ərzində çox faydalı və səmərəli görüşlər keçirdim, danışıqlar apardım. Fransa prezidenti cənab Fransua Mitteran ilə görüşün, habelə onun yekunlarına əsasən imzalanmış müqavilənin – Fransa ilə Azərbaycan Respublikası arasında dostluq, qarşılıqlı anlaşma və əməkdaşlıq haqqında müqavilənin xüsusi əhəmiyyəti var" [Ic.s.292-293].

Proqnozlara söykənən nitq və çıxışlar müxtəlif ölkələrdə və çeşidli auditoriyalarda səslənir. 13 dekabr 1994-cü il tarixdə, İslam konfransı təşkilatının üzvü olan ölkələrin höku-

mət başçılarının Kasablanka zirvə toplantısı kimi nüfuzlu toplantıdakı çıxışı bu sıradandır: “Altı illik müharibənin nəticəsində Azərbaycan Respublikası ağır və iqtisadi böhran keçirməkdədir. Müharibənin xalqımıza və ölkəmizin iqtisadiyyatına vurduğu yaralara, böyük maddi zərərə baxmayaraq, biz sülhə və sabitliyə nail olmaq naminə əlimizdən gələni edirik. Bu il sentyabrın 20-də biz Xəzər dənizinin Azərbaycan sektorundakı neft yataqlarının birgə işlədilməsi üçün dünyanın bir sıra iri şirkətləri ilə müqavilə imzalamışıq. Bu, Azərbaycanın xarici investisiyalar, iqtisadi əməkdaşlıq və dünya iqtisadiyyatına inteqrasiyası üçün açıq olduğunu nümayiş etdirir. Müharibə ilə əlaqədar yaranmış ağır şəraitə baxmayaraq, biz islahatlar aparmaq, bazar münasibətlərinə əsaslanan iqtisadiyyat yaratmaq yolu ilə əzmlə irəliləyirik. Xalqımızın güzəranını yaxşılaşdırmağa çalışırıq” [IIIc.s.22-23].

Yazıçıların X qurultayında, 30 oktyabr 1997-ci ildə iqtisadiyyatımızın inkişafı, ölkəyə xarici kapitalın cəlbi, “Heydər Əliyev fondu”nun yaradılması və bu fonddan ədəbiyyatımızın, mədəniyyətimizin inkişafına istifadədən danışan böyük natiqin ideyaları bu gün Azərbaycan prezidenti İlham Əliyev tərəfindən həyata keçirilir: “Əgər üç il bundan qabaq Azərbaycanda bir müqavilə imzalandısa, indi on müqavilə imzalanıbdır. 10 müqavilənin təxmini kapital qoyuluşu, yəni sərmayə qoyuluşu, dəyəri 30 milyard dollardır... Bizim iqtisadi islahatlarımız və gördüyünüz dünya miqyaslı qlobal işlərimiz bir neçə vaxtdan, qısa müddətdən sonra iqtisadiyyatımıza böyük dəyişikliklər gətirəcəkdir” [XIIIc.s.117-118].

Heydər Əliyevin proqnostik fikirləri müxtəlif çeşidli auditoriyalarda səslənir. Azərbaycan yazıçılarının X qurultayında, 29 oktyabr 1997-ci il tarixdə, “Heydər Əliyev fondu” yaratmaq haqqında ideyanı irəli sürür: “Burada fondun yaranması haqqında da fikir söyləndi. Mən bunu görüşdə də dedim.

Bir neçə ildir belə təkliflər alıram ki, bir fond yaransın – "Heydər Əliyev fondu" – və bu fonddan mədəniyyətin, istedadlı adamların, ədəbiyyatın inkişafına və başqa sahələrə yardım üçün istifadə olunsun. İndi artıq görürəm ki, doğrudan da belə bir fondun yaranması zəruriyyəti gəlib çatıbdır, baxmayaraq ki, bir neçə ildir bu söhbət gedir. Sizinlə görüşlərdən sonra mən yəqin ki, bu fondun yaranması haqqında da qərar qəbul edəcəyəm. Əgər bunu edə bilsəm, onda, şübhəsiz ki, bu mənbədən də sizə yardımlar, kömək etmək imkanı olacaqdır" [XIIIc.s.119].

Bu gün YUNESKO-nun xoşməramlı səfiri, millət vəkili Mehriban Əliyevanın sədri olduğu "Heydər Əliyev fondu"nun Azərbaycan mədəniyyəti üçün göstərdiyi xidmətlər şəksizdir və ildən-ilə bu fondun təsir dairəsi genişlənməkdə, Heydər Əliyev ideyalarını gerçəkləşdirməkdədir.

"Kiçik və orta müəssisələrin özəlləşdirilməsi artıq həyata keşirilmişdir. Orta müəssisələr hələ tam özəlləşdirilməyibdir. İndi bizim qarşımızda iri müəssisələrin özəlləşdirilməsi proqramı durur" [XVIc.s.196].

Ölkədə kənd təsərrüfatının gələcək inkişafı barədə Heydər Əliyevin proqnozları bu gün reallığa çevrilmişdir. Hələ 18 avqust 1994-cü ildə Prezident sarayında kənd təsərrüfatına həsr olunmuş müşavirədəki üzümçülüklə bağlı söylənilən nitq buna əyani misaldır: "Mən inanıram ki, vaxt gələcək, Azərbaycan Respublikası yenə də böyük üzümçülük diyarına çevriləcəkdir. Çünki bizi əhatə edən dövlətlərdə, xüsusən də MDB ölkələrində üzüm məhsullarına çox böyük ehtiyac var, onlar bizim üçün uzunmüddətli xarici bazardır. Buna görə də həmin sahəni inkişaf etdirmək gələcəkdə iqtisadiyyatımızın güclənməsi üçün olduqca vacibdir" [IIc.s.134].

Heydər Əliyevin proqnostik ruhlu nitq və çıxışları Azərbaycan vətəndaşına, Azərbaycan insanına istinadən audito-

riyalara ünvanlanır. Kənd təsərrüfatında aparılacaq islahatların mərkəzində dayanan insan amilinə öz qiymətini verir, həmin insanın – kənd zəhmətkeşinin xarakterini açıb göstərir: "Azərbaycanın kənd zəhmətkeşləri – kəndlisi, torpaqla bağlı olan hər bir insanı həmişə namuslu, qeyrətli insan olubdur. Xalqımızın içərisində torpaqla bağlı olan adamlar həmişə Vətənə daha çox sədaqətli olan adamlardır. Onlar Vətənə daha bağlı olublar. Çünki torpağa bağlıdırlar. Mən bunu deyərək və xalqın, kənd təsərrüfatında işləyənlərin, kənd zəhmətkeşlərinin bizim apardığımız işlərə yüksək münasibətini hiss edərək – onların fikirləri bu gün burada da səsləndi – və onlara arxalanaraq, güvənərək, sizə və bütün kənd əməkçilərinə müraciət etmək istəyirəm. Əl-ələ verək, işimizi müvəffəqiyyətlə aparaq" [IIIc.s.72].

Heydər Əliyevin proqnozları təhsil sistemimizdə də həyata keçirilir. Müstəqilliyimizin ilk illərində təhsilimizin problemlərini araşdıran ulu öndər bu problemlərin öz həllini tapacağını qabaqcadan deyir: "Son illər təhsil, elm sistemində nəinki irəliləyiş yoxdur, hətta çox hallarda geridə qalmışıq, geriləmişik. Gənclərin təhsil alması əsas məsələdir. Çünki, biz müstəqil Azərbaycan Respublikasında bundan sonra da xalqımızın ümumu təhsil səviyyəsinin yüksəlməsini qarşımıza əsas vəzifə kimi qoymuşuq. Ümumi təhsil məsələsi xalqın mentalitetidir, dünya xalqları ilə müqayisə olunacağı səviyyədir. Bu gənclərin təhsili ilə sıx bağlıdır. Ona görə də, biz bu sahəyə çox fikir verməliyik. Güman edirəm ki, gənclərimiz özləri də çalışacaqlar ki, bütün imkanlardan istifadə edib yaxşı təhsil alsınlar" [Ic.s.169]

Bu gün Dövlət Tələbə Qəbulu Komissiyasının təhsilimizdə aparıcı rola malik olması cəmiyyət tərəfindən birmənalı qəbul olunur. Son illər dövlət qulluğuna kadrların seçilməsi, magistraturaya və tibb sahəsində rezidenturaya qəbullar bu qu-

rum tərəfindən müvəffəqiyyətlə həyata keçirilir. Bu qurumun işinə ulu öndərin xeyir-duası öz müsbət nəticələrini vermiş və verməkdədir: "Deməli, test üsulu indiki dövrdə bizim üçün yəqin ki, ən əlverişli üsuldur. Odur ki, biz müdafiə etməli, tətbiq etməli və daha da səmərəli şəklə salmalıyıq. Prezidentə bilavasitə tabe olan Dövlət Tələbə Qəbulu Komissiyasının yaradılması da Azərbayacanda ali təhsil, ümumiyyətlə, təhsil sahəsində yeni bir hadisədir. Mən bunu müsbət hadisə kimi qiymətləndirirəm".

Böyük natiqin proqnozlarla zəngin çıxışları təkcə siyasi və iqtisadi məsələlərə aid deyil. Bu həm də uşaq auditoriyasında səslənən proqnozlardır: "Siz – Azərbaycanın övladları, bizim əziz balalarımız, Azərbaycanın gələcəyisiniz. Sizin bugünkü həyatınız, yaşayışınız, təhsiliniz, böyüməyiniz Azərbaycan dövlətinin daim qayğısı altındadır. Mən bu gün bildirmək istəyirəm ki, Azərbaycan Respublikasında uşaqlar respublikamızın son illərdə düşdüyü ağır, bəlalı, əzab-əziyyətli günlər içində yaşayaraq, eyni zamanda öz valideynlərinin, onlara qayğı göstərən insanların, təşkilatların, xeyriyyə cəmiyyətlərinin köməyi ilə dərs keçirlər, tərbiyə alırlar, böyüyürlər və inkişaf edirlər. Mən əminəm ki, bu ağır, çətin dövrdə dünyaya gəlib böyüyən uşaqlar cəsarətli, mətin, vətənpərvər olacaqlar. Azərbaycanın xoşbəxt gələcəyi naminə həm təhsil alıb böyüyəcəklər, həm də gələcəkdə cəmiyyətdə öz yerlərini tutacaqlar. Azərbaycanın gəncləri, uşaqları ölkəmizin, xalqımızın milli sərvətidir, gələcəyidir və ümididir" [IIIc.s.56].

Bu gün ölkəmizin həyatında mühüm quruculuqla məşğul olan gənclər 1994-cü ildə ulu öndərin çıxışlarını ünvanladığı həmin gənclərdir.

Tarix boyu öz sözünün ağası olan, sözü havaya deməyən şəxslər xalq tərəfindən sevilirlər. Heydər Əliyev dilində proqnozlar həmişə özünü doğruldur. 10 fevral 1994-cü ildə Türki-

yənin iş adamlarının böyük bir qrupu ilə görüşdə çıxış edərkən iş adamlarına fürsəti əldən verməməyi, Azərbaycan sənayesinə yatırım qoymağa tələsməyi tövsiyə etmişdir. Bu çıxışdan bir neçə il keçməmiş həmin iş adamlarının əksəriyyəti səhv etdiklərini başa düşdülər: "Odur ki, bəzi şirkətlər Azərbaycanda kapital qoymaqdan, əsaslı, iri müştərək müəssisələr yaratmaqdan ehtiyat edir, bundan çəkinirlər. Mən sizə bildirmək istəyirəm ki, bundan ehtiyat etməyin, belə fikirlərə düşməyin heç bir əsası yoxdur. Azərbaycanın böyük iqtisadi potensialı var, bununla yanaşı çox böyük elmi potensialımız mövcuddur... Azərbaycanda ictimai-siyasi sabitliyə gəlincə, əmin ola bilərsiniz ki, bunlar xırda məsələlərdir. Sözün qısası, Türkiyənin iş adamları gecikməməli, fürsəti əldən verməməli, Azərbaycan kimi zəngin bir ölkədə öz işlərinin bünövrəsini qoymalıdırlar. Mən sizi bu işə dəvət edirəm" [Ic.s.392].

Heydər Əliyev nitqlərindəki proqnostik fikirlər gələcəyə inam və nikbinliklə dolu notlarla yanaşı, yeri gəldikcə sərt qətiyyətli mövqe ilə auditoriyaya çatdırılır: "Bununla əlaqədar olaraq bildirmək istəyirəm ki, mənim fikrimcə, Azərbaycan Respublikası bundan sonra onun başına nə gəlirsə-gəlsin, müstəqilliyini itirməyəcək, yenidən heç bir dövlətin tərkibinə daxil olmayacaq, heç bir başqa dövlətin əsarəti altına düşməyəcək. Keçmiş Sovetlər İttifaqının bərpa olunması, Azərbaycan Respublikasının da ora daxil olması ehtimalı haqqında bəzi şayiələr, fikirlər gəzir. Bunlar xülyadır. Mən bu fikirləri rədd etməyə dəvət edirəm" [Ic.s.9].

Müstəqilliyimizi qəbul etməyənlərin yaydığı "şayiə" və "fikirlərə" qarşı "xülyadır" formasında kəskin cavabı müstəqilliyimizin əbədiliyinə auditoriyanı tam inandırır. Növbəti qətiyyətli cümlədə bu fikirləri "rədd edən" dövlət başçısı vətəndaşları da "bu fikirləri rədd etməyə" dəvət edir. Bununla

Heydər Əliyev müstəqilliyin qorunmasının Azərbaycan vətəndaşlarının hamısının müqəddəs işi olduğunu anladır.

15 iyun 1993-cü ildəki bu çıxışdan 20 il keçir. Azərbaycan Respublikasının bu gün Dünya birliyindəki yeri, mövqeyi çıxışın proqnostikliyinə heç bir şübhə yeri qoymur.

Bu gün: “Mən birmənalı deyirəm: biz sərbəst iqtisadiyyata keçməliyik və bu yolda cürbəcür bəhanələr axtarmamalıyıq.

...İndi nə edək? Yenə də bənd-bərəni bağlayaq və deyək ki, həmin iqtisadiyyatı saxlamaq lazımdır? Nə vaxtadək saxlayaq?”.

Ritorik suallarla bəzənən, hökm bildirən “malı, məli” və “birmənalı deyirəm” qətiyyətinə söykənən nitq Azərbaycanın dünya bazar iqtisadiyyatına qovuşduğunu sübut etdi. Arxaik söz kimi işlədilən “bənd-bərə” geriliklə mübarizəyə səsləyir.

Heydər Əliyev proqnozları çox vaxt əminlik bildirən modal sözlərlə auditoriyaya yol açır: “Xüsusən bu istedadlı gənclərdən Xarici İşlər Nazirliyinin orqanlarında səmərəli istifadə etmək lazımdır. Tam əminəm ki, bu işləri düzgün qurduğumuz halda qısa bir müddətdə Azərbaycanın Xarici İşlər Nazirliyinin çoxsaylı istedadlı diplomatları, kadrları olacaqdır, onlar həm nazirliyin cürbəcür idarələrində, şöbələrində və rəhbərliyində işləyəcəklər, həm də Azərbaycanın səfirliklərində çalışacaqlar” [XVc.s.33].

Heydər Əliyevin proqnostik nitqləri güclü məntiqi araşdırmalara əsaslanır ki, məhz belə nitqlər auditoriya tərəfindən qəbul olunur, məmnunluqla qarşılanır 11 avqust 1994-cü ildə iqtisadiyyatımızla bağlı Prezident sarayında keçirdiyi müşavirədə bu özünü qabarıq biruzə verir:

“Təbiidir ki, bunu bizim kimi ölkələrdə, yəni keçmiş sovet respublikalarında tətbiq etmək çətindir. Çünki 70 il hökm sürən iqtisadi formalardan, idarəetmə formalarından başqa formalara keçmək çətindir. Əsasən ona görə ki, bu formalar bir-birinə

ziddir. Ancaq başqa yol yoxdur və biz bu yolla da gedəcəyik. Odur ki, bu sahədə lazımi tədbirlər görülməli, islahatlar aparılmalı, qanunlar hazırlanıb qəbul edilməlidir. Həm də bu yolla gedərkən müəyyən mərhələdə daha ağır vəziyyətə düşə bilərik. Buna baxmayaraq, mən bunun gələcəyini çox müsbət görürəm, çünki iqtisadiyyatı inkişaf etmiş respublikaların həyatı, onların vətəndaşlarının həyat tərzi, iqtisadiyyatın səviyyəsi göz qabağındadır. Mən buna bir də ona görə inanıram ki, Azərbaycan Respublikasının iqtisadi potensialı, təbii sərvətləri, sənaye potensialı infrastrukturu və digər imkanları çox zəngin, çox güclü, çox yüksək səviyyədədir. Əgər biz bütün bunlardan səmərəli istifadə etsək, yaxşı nəticələrə nail olarıq. Bu, bizim strateji yolumuzdur. Biz bu yolla getməliyik" [IIc.s.115-116].

Heydər Əliyev nitqlərində proqnozlar ən çox müsahibələrdə üzə çıxır. Bu müsahibələrdə gələcəyə tuşlanan proqnozlar müəyyən zaman kəsiyindən sonra reallaşır. 20 sentyabr 1994-cü il tarixdə, "Delevoy mir" qəzetinə verdiyi müsahibədə Azərbaycan xalqının həyat səviyyəsinin yaxın illərdə yüksələcəyini bəyan edir:

"– Xammal ehtiyatlarının zənginliyinə görə Azərbaycanı tez-tez gah Küveytlə, gah da Klondaykla müqayisə edirlər. Lakin respublikanın əhalisi kasıb yaşayır. Bu sosial problemi siz necə həll edəcəksiniz?

– Sosial problemlər əsasən, iqtisadi islahatların həyata keçirilməsi yolu ilə həll ediləcəkdir. Onun həyata keçirilməsi istehsalın həcmini qaldırmağa imkan verəcək, bu isə respublikanın iqtisadi və maliyyə vəziyyətini yaxşılaşdıracaqdır.

Bütün bunlar tədricən həyat səviyyəsinin yaxşılaşmasına gətirib çıxaracaqdır" [IIc.s.208].

Proqnozlar çox vaxt "şübhəsiz" modal sözünün köməyilə həyata keçirilir. Heydər Əliyev "şübhəsiz" modal sözünü nitqdə yerli-yerində işlədir, gələcəkdə həllini gözləyən məsələlərə

şübhə yeri qoymur: “Şübhəsiz, burada deyilən belə bir fikir aydındır ki, böyük müəssisələr səhmdar cəmiyyətlərə çevriləcək. Bu, təbiidir. Həm də bu, özəlləşdirmənin əsas formalarından biridir. Ona görə də bu proqram kompleks şəkildə olmalıdır, bütün sahələri əhatə etməlidir. Bu proqramda mütləq göstərilməlidir ki, hansı sahələr dövlət bölməsində qalacaq ki, onlar haqqında dövlət xüsusi plan tərtib etsin və onların fəaliyyəti dövlət tərəfindən idarə olunub, bu fəaliyyətin iqtisadi cəhətdən səmərəliliyini artırmaq üçün xüsusi bir plan tərtib edilsin. Özəlləşdiriləcək və özəlləşdirilməli olan digər sahələrdə isə, şübhəsiz, bu işlərin müddəti göstərilməlidir – özəlləşdirmə nə vaxt, hansı müddətdə getməlidir” [IIIc.s.240-241].

Qaraşəhərin vəziyyətini təsvir edib, proqram irəli sürüb bu şəhəri ağ günə çıxartdığını dilinə gətirən Heydər Əliyev auditoriyanı heyranlıqda saxlaya bilir. “Bəli” təsdiq ədatı ilə fikrini təsdiqləyir: “Bəli, biz o proqramı hazırladıq, mən həmin proqramı irəli sürdüm. Mən bu barədə məruzə edərkən, – onu arxivlərdən götürüb baxa bilərsiniz, – Qaraşəhərin vəziyyətini də təsvir etdim və dedim ki, vaxt gələcək, bu Qaraşəhər qara rəngdən xilas olacaq, burada güllər əkiləcək, yaşıllıq, ağaclar olacaq, yaraşıqlı yaşayış binaları tikiləcək və insanlar burada yaşamağa can atacaqlar”[IIc.s.241].

Növbəti nitq mərhələsində dediklərinin həyata keçdiyini auditoriyaya bəyan edir: “O vaxtdan – biz bu işə başlayandan 25 il keçmişdir. Bu, əsrin dörddə birinə bərabər vaxtdır. İndi biz tamamilə başqa bir şəraitdəyik, başqa bir dövrdəyik. İndi bura “Qara şəhər” deyən yoxdur. Artıq o söz unudulub, buralar abadlaşıb və bu iş davam etdirilir. Bunların əsasını qoyan neft emalı zavodlarının tamamilə yenidən qurulmasıdır” [IIc.s.241].

Heydər Əliyev proqnozları müxtəlif çeşidli auditoriyalarda özünü göstərir. 1 may 1997-ci il tarixdə, Mstislav Rostropoviçin 70 illik yubiley şənliklərinə gələn kütləvi infor-

masiya vasitələri nümayəndələri ilə görüşdəki bəyanatda onun Sovetlər dönəmində Rostropoviçə münasibəti açıqlanır: "Deмək istəyirəm ki, mən bu adamlara heç də dissident kimi baxmırdım, eləcə də hesab etmirdim ki, Rostropoviç dissidentdir. Mən belə düşünürdüm ki, o, düz hərəkət edir. Lakin o vaxtlar Rastropoviç və Qalina Vişnevskaya haqqında qəbul olunmuş qərara təsir göstərməyə haqqım və imkanım yox idi. Onları vətəndaşlıqdan məhrum etdilər və sair. Lakin sizə təəccüblü görünsə də, DTK generalı kimi mən həmin instansiyalarla, yəni Rastropoviçi dissident hesab edən instansiyalarla eyni rəydə deyildim" [IXc.s.265].

"Eyni zamanda deyildim" ifadəsinin müəllifinin, Rostropoviçin dostunun Sovetlər İttifaqı dövründəki sərbəst, demokratik ruhlu insanın, müstəqillik ruhuna hopmuş gələcək liderin parlaq siması görünür.

Heydər Əliyevin proqnostik nitqlərində ən çox işlətdiyi ifadələr:

– Mən inanıram ki, vaxt gələcək... – "Mən inanıram ki, vaxt gələcək, Azərbaycan Respublikası yenə də böyük üzümçülük diyarına çevriləcəkdir" [IIc.s.134].

– Mən bu günü düşünürdüm... – "Mən heç vaxt yalnız bu günü düşünərək yaşayıb, işləməmişəm. 70-ci illərdə o illəri görəndə də mən bu günü düşünürdüm" [IIc.s.156]

– Bu gün də gələcəyi düşünürəm – "Demək istəyirəm ki, mən o vaxt da bu günü düşünmüşəm. Bu gün də gələcəyi düşünürəm" [IIc.s.156].

– "Bütün bunlar tədricən həyat səviyyəsinin yaxşılaşmasına gətirib çıxaracaqdır" [IIc.s.208].

Qəti gələcək zamanda səslənən proqnostik fikirlər daim öyrənilməli, araşdırılmalı, həyatımızın bütün sahələrində öz tətbiqini tapmalıdır.

## X FƏSİL

## HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ POETİK DUYĞULAR

Siyasi natiqliyimizin banisi kimi Heydərin Əliyev çıxış və nitqlərinin araşdırılması bu gün də öz aktuallığını saxlayır. Böyük natiqin nitqində səmimiyyət, qətiyyət, nikbinlik, fəlsəfilik və s. ünsiyyət elementləri ilə yanaşı poetizim də öyrənilmək baxımından mühümdür. Azərbaycan dilinə hopmuş poetiklik Heydər Əliyev nitqlərində müxtəlif çeşidli auditoriyaları bəzəyir. Poetik dillə söylənilən çıxış və nitqlər milyonların qəlbinə yol taparaq müstəqilliyin əbədi olduğunu, sarsılmaz olduğunu şüurlara çatdırır. Poetik ruhlu çıxışlar rəsmi dövlət başçıları səviyyəsindən tutmuş beynəlxalq uşaq günlərində körpə fidanlarla görüşlərədək özünü göstərir. Bu bir daha Heydər Əliyevin canından əziz saydığı Azərbaycan dilinin dərin qatlarına, dərin laylarına bələdliyini, Heydər Əliyev və Azərbaycan dili ifadələrinin bir-birindən ayrılmaz olduğu fikrini ortaya qoyur.

"Heydər Əliyev nitqində poetizm haradandır" sualına cavabı 29 oktyabr 1997-ci ildə Azərbaycan yazıçılarının X qurultayı ərəfəsində yaşlı nəsildən olan yazıçıların bir qrupu ilə görüşdə elə böyük natiqin öz dilindən eşidirik: "Mən sizinlə neçə saat istəyirsinizsə oturmağa hazıram. Çünki ədəbiyyatı o qədər sevirəm ki, ədəbiyyatla, şeirlə, bizim mədəniyyətlə görüşmək mənim üçün həmişə çox xoşdur" [XIIIc.s.45]. O, təkcə yazıçı və şairlərlə görüşmür. O, ədəbiyyatla, şeirlə, mədəniyyətlə özü də bizim mədəniyyətlə görüşür.

Heydər Əliyev nitqlərinə daxilən xas olan poetik ruh təsadüfdən doğan bir şey deyil. Bəs bu poetik ruh, bu poetik çalarlı nitq haradan qaynaqlanır? Cavabı Heydər Əliyevin 26

mart 1998-ci ildə Respublika sarayında Süleyman Rüstəmin 90 illiyi münasibətilə təntənəli yubiley gecəsindəki nitqində görmək olar: "Xalqımız şeiri, ədəbiyyatı sevən xalqdır. Eyni zamanda şeirin, ədəbiyyatın hər bir insanın həyatında və xalqımızın, cəmiyyətimizin, millətimizin həyatında daim böyük rolu olmuşdur" [XVc.s.98].

Heydər Əliyev çıxışlarında poetik duyğuların araşdırılması heç də təsadüfi deyil. Böyük natiqin öz sözləri ilə desək, "Çünki bizim xalqımız birincisi öz istedadına görə şair, yazıçı, söz ustası olubdur. İkincisi, bizim xalqımız çoxəsrlik tarixində böyük şairlər, yazıçılar, mütəfəkkirlər yetişdiribdir" [XIIIc.s.45].

Heydər Əliyevin nitqində poetik duyğuların araşdırılması bütün dünyanın qəbul etdiyi bir həqiqəti ortaya qoyur: Azərbaycan dili poeziya dilidir. Elə bu baxımdan da Heydər Əliyev nitqini poetik duyğularsız təsəvvür etmək çətindir. Bu poetik duyğular müxtəlif situasiyalarda, məqamlarda özünəməxsus Heydər Əliyev üslubunda özünə yer tapır.

"60-cı illərdə sizin gənclərin sevimlisinə çevirmiş istedadınız bu gün də Yer kürəsinin bütün guşələrində adamların qəlbini fəth edir. Sizin ifanızda hər bir mahnı həyatın, məhəbbətin və xeyrin tərənnümünə çevrilir, zaman və məkan hüdudlarından kənara çıxır". "Qəlblərin fəth olunması", "tərənnümünə çevrilməsi" kimi frazeoloji birləşmələr, zaman və məkan kimi fəlsəfi kateqoriyalar poetizmi daha da dərinləşdirir. Poeziyaya xas olan təkrarlar, bənzətmələr böyük natiqin nitqində özünə yer tapır:

"Güclü səsiniz, coşğun temperamentiniz və yüksək vokal mədəniyyətiniz, üstəlik daim təkmiləşməyə can atmağınız sizi sönməz ulduza çevirmişdi. Çoxcəhətli istedadınız sayəsində siz hər mahnıya təkraredilməz rövnəq verirsiniz, onun ifasını bir aktyorun teatrına çevirirsiniz".

Böyük natiqin qətiyyətli çıxışları auditoriyaları poetikcəsinə səfərbər edir, poetzimlə dolu çıxışlar yaddaqalan olur. Müstəqilliyin ağır illərində, ölüm-dirim çarpışmalarında poetikcəsinə danışmaq, nitq söyləmək, auditoriyaları fəth etmək Heydər Əliyevin nitq ustalığı ilə həyata keçirilə bilir: "Heç kəs bir şey edə bilməz! Heç bir şey də məni şəxsən indiyə qədər qorxutmayıbdır və indi də qorxutmur. Mən öz üzərimə, dediyim kimi, böyük məsuliyyət götürmüşəm. Məsuliyyət də ondan ibarətdir ki, dövlətimi möhkəmləndirim, onun müstəqil bir dövlət kimi yaşamasını təmin edim və Azərbaycan xalqını birləşdirim. Kim Azərbaycanı sevirsə, kim Azərbaycanın müstəqil dövlət olmağını istəyirsə, kim Azərbaycanın işğal edilmiş torpaqlarının azad olunmasını istəyirsə, kim Azərbaycanın ərazi bütövlüyünü istəyirsə, o, bu bayraq altında, bu amal ətrafında birləşməlidir" [VIIc.s.287].

27 may 1994-cü il tarixdə Azərbaycanın istiqlal bayramına – Respublika gününə həsr olunmuş təntənəli yığıncaqdakı nitq də müstəqilliyə yönəlmiş poetik ifadələrlə zəngindir:

"Bütün çətinliklərə baxmayaraq, bu bayram günündə bildirmək istəyirəm ki, Azərbaycan Respublikasının dövləti tutduğu yolla gedir. Azərbaycanın tutduğu yol müstəqil Azərbaycan Respublikası, demokratik hüquqi cəmiyyət qurmaq yoludur. Biz bu yolla gedirik və gedəcəyik. Bizi bu yoldan heç kəs döndərə bilməyəcəkdir" [IIc.s.8-9].

Heydər Əliyev nitqində müstəqilliyimizə xidmət edən canlı və ya cansız adlandırdığımız hər bir şey qiymətlidir, əzizdir. O qazma qurğusuna "Dədə Qorqud" adı verməklə qərarını qəbul edir və hesab edir ki, hər bir azərbaycanlı üçün bu, müqəddəs və əziz ad, bu qurğu üçün ən dəyərli, ən yaxşı addır. Qazma qurğusuna ünvanlanan poetik ruhlu arzular bir daha böyük natiqin nitqlərində poetizmin yüksək yer tutmasından xəbər verir:

“Bu qazma qurğusuna “Dədə Qorqud” adı verildi. Bilirsiniz ki, bu qurğunun adı indiyədək “Kaspmorneft” olubdur. Şübhəsiz ki, bu da bizim bugünkü həyatımıza uyğun olmayan bir addır. Eyni zamanda, bu qurğu yenidən doğulubdur. Ona görə də onun yeni adı olmalıdır. Deyə bilərəm ki, mənə Azərbaycan xalqının tarixinə, ənənələrinə və ayrı-ayrı tarixi yerlərə məxsus 10-a qədər cürbəcür adlar təqdim olundu. Təqdim olunan adların hamısı doğrudan da dəyərli idi. Ancaq mən bu qurğuya “Dədə Qorqud” adı verilməsi barədə qərar qəbul etdim. Hesab edirəm ki, hər bir azərbyacanlı üçün bu müqəddəs və əziz ad, bu qurğu üçün dəyərli, görkəmli addır.

“Dədə Qorqud” qurğusuna böyük uğurlu yol arzulayıram. Bu qurğuda çalışanların hamısına cansağlığı və yeni-yeni uğurlar arzulayıram! Yaşasın “Dədə Qorqud” qurğusu! [VIIc.s.248]

Azərbaycan adı ilə bağlı hər bir məfhum Heydər Əliyevə o qədər əzizdir ki, ölkənin adının “İkinci Küveyt” kimi hallandırılmasına dözmür. Bu dözümsüzlük “bilirsiniz, ölkəmizin özünün adı var, onun adı Azərbaycandır” kimi sərt çalarlı xəbərdarlıq kimi səsləndirilir. Sonra Bakı neftinin şöhrətindən söz açılır. Sonda isə sual verən jurnalisti də vəziyyətdən çıxararaq çıxışını yekunlaşdırır: “Sual: Bəziləri Sizin ölkəni “İkinci Küveyt” adlandırırlar. Bu həqiqətdirmi?

Cavab: Bilirsiniz, ölkəmizin özünün adı var, onun adı Azərbaycandır. Vaxtilə keçmiş Sovetlər Birliyində Azərbaycan neft istehsal edən ilk, yeganə və ən böyük bir ölkə idi. Sonrakı illərdə, təxminən 1940-1950-1960-cı illərdə Sovetlər İttifaqının başqa ölkələrində yeni neft yataqları açıldı. Bu yataqlar Tatarıstanda, Başqırdıstanda, sonra Rusiyanın Orenburq vilayətində, Sibirdə neft yataqları tapıldı.

Heydər Əliyev nitqində İslam dininin bəşər tarixindəki rolu dini-məişət üslublu frazeoloji ifadələrin köməyi ilə, poe-

tik bir deyimlə auditoriyalara çatdırılır: "Bu gün biz bu əlamətdar bayrama toplaşarkən tariximizi yad etməli və tariximizə minnətdar olmalıyıq. İslam dini yaranandan indiyə qədər kürreyi-ərzin insanlarının çox bir hissəsini düz yola, ədalətə, saflığa, paklığa, yüksək mənəviyyata yüksəltmiş və onların belə yaşamasını təmin etmiş müqəddəs bir dindir. İslam dini bəşər tarixində misilsiz xidmətlər göstərmiş, insanların, müsəlmanların yüksək mənəvi-əxlaqi dəyərlərə nail olmasını təmin etmiş və bu dinə itaət edən insanları dünyanın bütün əzab-əziyyətlərindən, keşməkeşlərindən keçirib onların yaşayışını təmin etmiş, onları yaşatmışdır" [Xc.s.417-418].

Poetizm soydaşlar auditoriyasını da fəth edir. Bütün görüş boyu poetik bir emosionallıqla böyük natiq Təbrizdən danışır. "Əlini uzat, Təbrizə çatacaqsan", – deməklə bu şəhərin məsafə cəhətdən yox qəlb baxımından nə qədər yaxın olduğunu göstərir. O tikanlı məftillərə olan nifrətini gizlətmir: "Güman edirəm ki, Azərbaycanın da Şərqi Azərbaycanla, Təbrizlə ən yaxın yeri Naxçıvandır. Naxçıvandan Təbrizə avtomobillə iki saata getmək olur. Elədir, yoxsa yox? Yəqin ki, sən də elə getmisən. Ona görə də bu təbiidir. Bilirsiniz, mən Naxçıvanda doğulmuşam. Mənim gəncliyim orada keçibdir. Doğrudur, o vaxt yolları bağlamışdılar. Amma yenə də bizim üçün Təbriz, Təbriz, Təbriz! Elə bil ki, əlini uzat Təbrizə çatacaqsan. Amma o məftillər bizi qoymurdu" [XXIc.s.126].

Ölkələr arasında siyasi münasibətlərin inkişaf etdirilməsində mühüm rola malik olan nitq və çıxışlarda poetik çalarlar tez-tez gözə çarpır. 26 avqust 1997-ci il tarixdə Varşava şəhərində olarkən Polşa xalqının tarixi ilə bağlı poetik ruhda çıxış edən böyük natiq Polşa-Azərbaycan münasibətlərinin gələcəkdə güclü, davamlı təməlini qoyur. Öz nitqi ilə Polşa xalqının müstəqil Azərbaycana qarşı rəğbətini qazanır: "Polşanın azadlığı və müstəqilliyi uğrunda həlak olmuş naməlum əsgərin

məzarını bu gün mən Polşa xalqının qəhrəmanlıq hünərinə çox böyük hörmət hissi ilə ziyarət etdim. İkinci Dünya Müharibəsində Polşa xalqının necə böyük itkilərə məruz qaldığı, nə qədər qurbanlar verdiyi yaxşı məlumdur. Gözəl şəhər olan Varşava öz diqqətəlayiq qədim tarixi və memarlıq abidələri ilə birlikdə yerlə yeksan edilmişdi. Polşa xalqının zəhməti bahasına, məharəti sayəsində bərpa edilmiş gözəl Varşavaya bu gün biz hədsiz sevinc hissi ilə gəzintiyə çıxdıq. Sizin dostlarınız kimi biz şadıq ki, son illərdə Polşa Respublikasının siyasi, sosial-iqtisadi həyatında olduqca böyük dəyişikliklər baş verir” [XIIc.s.45].

Heydər Əliyev nitqinin bir gücü də poetik çalarlarla ictimai-siyasi hadisələrə izah verə bilməkdir. 7 may 1997-ci il tarixdə, İzmirdə “Bakı parkı”nın açılışı mərasimindəki çıxışda əvvəlcə Azərbaycan-Türkiyə dostluğunun, qardaşlığının tarixinə toxunur: “Bu dostluğun, qardaşlığın tarixi çox böyükdür. Əgər tarixi götürsək, bizim tariximiz də, keçmişimiz də, dilimiz də, dinimiz də, məsləkimiz də, adət-ənənələrimiz də, musiqimiz də, mədəniyyətimiz də birdir”. Sonra ümumi türklüyü böyük bir çinar ağacına bənzədərək, türk xalqlarını bu çinarın budaqları hesab edir. Ümumtürk mənəvi dəyərlərini çoxcəhətli, çoxşaxəli, çoxbudaqlı sinonim cərgə ilə türk dünyasına çatdırır: “Amma bu fərq sadəcə, bizim eyni zamanda ümumi mənəvi dəyərlərimizin, mədəni, şüuri dəyərlərimizin hamısının çoxcəhətli, çoxşaxəli, çoxbudaqlı olmasını göstərir. Yəni biz böyük bir çinar ağacının budaqlarıyıq və bu da o qədər möhkəm çinardır ki, əsrlər boyu onu nə qədər silkələdilərsə də, yıxmaq istədilərsə də, bizi bir-birimizdən ayırmaq istədilərsə də, bacarmadılar. Bizim qəlbimiz, bizi bir-birimizə bağlayan tellər, mənəviyyat dostluğumuzu, qardaşlığımızı, birliyimizi qorudu, saxladı” [IXc.s.361].

Poetik nitq tarixi köklərimizin auditoriya üçün araşdırılmasına xidmət edir. Azərbaycan-Türkiyə münasibətlərinin tarixi kök eyniliyi baxımından çözülməsini tələb kimi ortaya qoyur: "...Bu əlaqələr xalqlarımız, ölkələrimiz arasında olan tarixi köklər üzərində qurulmuşdur və keçmiş tariximizin davamıdır. Əsrlər boyu bizim xalqlarımız bir kökdən olaraq, bir kökə mənsub olaraq, bir dilə, bir dinə mənsub olaraq bərabər yaşamışlar, sıx əlaqədə olmuşlar, bir-birinə kömək etmişlər, bir-birinə dayaq olmuşlar və öz tarixlərini yaratmışlar.

Xalqlarımızın adət-ənənələrinin bir-birinə bənzərliyi, eyniliyi, mədəniyyətimizin, elmimizin bir-birinə sıx bağlı olması bizi daim bərabər etmişdir" [Vc.s.137].

Növbəti nitq məqamında poetikcəsinə prezidentin xanımına – Nəzmiyyə xanıma müraciət edir: "Nəzmiyyə xanım 27 il öncə gördüyü Bakını bu günlər bir də görür və güman edirəm ki, baş vermiş dəyişiklikləri də müşahidə edəcəkdir. Şübhəsiz ki, o müsbət hallara sevinəcək və həyatımızda yaranmış çətinliklərə, bəzi dərdlərə bizimlə birlikdə kədərlənəcək, sıxılacaqdır. Bu da təbiidir, çünki bir daha deyirəm, biz dostuq, qardaşıq və dost, qardaş da həmişə bir yerdə olmalıdır! – həm şad gündə, həm də kədərli gündə" [Vc.s.139].

Stilistik fiqur kimi "şərəfinə" epiforasını auditoriyada bir neçə dəfə səsləndirməklə böyük natiq nitqin poetikliyini yüksəldir: "Əziz dostum, qardaşım Süleyman bəy, bu gün "Gülüstan" sarayındakı ziyafət sizin şərəfinizədir. Nəzmiyyə xanımın şərəfinədir və sizinlə birlikdə buraya təşrif gətirmiş qonaqların şərəfinədir. Rica edirəm, badələrimizi qaldıraq Türkiyə Cümhuriyyətinin şərəfinə, Türkiyə xalqının şərəfinə, türk xalqının şərəfinə, türk xalqının gələcəyinin şərəfinə, Türkiyə-Azərbaycan dostluğunun şərəfinə, bizim gələcəyimizin şərəfinə! Sağ olun, əziz Süleyman bəy, Nəzmiyyə xanım, sizin şərəfinizə. Sağ olun" [Vc.s.140].

Türk-müsəlman dünyasının böyük təəssübkeşi Heydər Əliyev 11 iyun 1997-ci ildə, ona Əl-Fərabi adına Qazax Milli Dövlət Universitetinin fəxri doktoru diplomu təqdim olunarkən söylədiyi nitqdə Əl-Fərabinin "eyni dərəcədə həm Qazax xalqına, həm də Azərbaycan xalqına məxsusluğunu" ortaya qoyur. "Məhz" dəqiqləşdirici ədatının köməyilə "eyni kökə", "eyni taleyə" mənsubluğumuzu auditoriyaya çatdırır. Dilimizin, dinimizin, adət və ənənələrimizin sinonim cərgə ilə "bir, eyni, oxşar" olduğunu diqqətə çatdırır: "Sizin universitet Şərqin böyük mütəfəkkiri Əl-Fərabinin adını daşıyır. Əl-Fərabi eyni dərəcədə həm Qazax xalqına, həm də Azərbaycan xalqına və bütün türk xalqlarına məxsusdur. Məhz bu ad və bir çox digər adlar tarixən bunun rəmzi olmuşdur ki, biz eyni köklərə mənsubuq, taleyimiz birdir, adət və ənənələrimiz, mənəvi və əxlaqi-etik dəyərlərimiz də birdir, eynidir, oxşardır"[Xc.s.108].

Poetik ruhlu nitq xarici səfərlərdə parlayır, xarici auditoriyaları fəth edir. Burada xalqları tanımaq, onların xarakterindəki incəlikləri dərindən bilmək və bunları yerindəcə işlətmək natiqə böyük şöhrət gətirir. 2 avqust 1997-ci il tarixdə Hyüston şəhərində Azərbaycan prezidentinin şərəfinə təşkil edilmiş qəbulda poetik bir dillə texaslıların Amerika tarixində oynadıqları rolları, "Texas" sözünün məğrurluq, qəhrəmanlıq, cəsurluq simvolu olması Hyüston auditoriyasının diqqətinə çatdırılır: "Çox məmnunam, həddindən artıq sevinirəm ki, mənə bu gün Texasa, Hyüstona gəlmək nəsib olmuşdur və sizi salamlamaq imkanı əldə etmişəm. Texas Amerika Birləşmiş Ştatlarının tarixində çox böyük və görkəmli yer tutur. Texaslılar həmişə məğrur, azadlıqsevən olmuşlar, azadlıq uğrunda mübarizə aparmışlar. Texaslılar öz cəsurluğu, qoçaqlığı, qəhrəmanlıqları ilə məşhurdurlar. Texaslılar ABŞ-ın tarixində, Amerika qitəsinin tarixində böyük izlər buraxmışlar. Ona görə

də dünyanın hər yerində “Texas” sözü məğrurluq, qəhrəmanlıq, cəsurluq simvolu kimi qəbul olunur. Texas haqqında oxuduğum kitablardan onun haqqında aldığım məlumatlara, bütün fikirlərə qoşulmuşam və texaslılara, Texas ştatına, Hyüston şəhərinə daim böyük hörmət və ehtiramla yanaşmışam” [XIc.s.280].

Böyük natiq poetik duyğularla izah verir. Aşağıdakı cümlədə ziyalı, ziyalılıq anlayışlarını parlament iclasında anladır. Nitq hissəsi “yüksək” dörd dəfə təkrarlanır, təmsil etmək, təcəssüm etmək sinonimlik, eləcə də təhsil, intellekt, tərbiyə, əxlaq kimi sinonimlər, təkrarlar poetikliyi dərinləşdirir. Auditoriya “ziyalı” sözünün izahını bu poetik duyğularda tapır: “Hər bir xalqın onu təmsil edən qüvvələri var, onlar da bir gündə meydana çıxan qüvvələr deyil. Xalq öz içindən illər boyu, əsrlər boyu istedadlı, bacarıqlı insanları, yüksək təhsilə malik olan, yüksək intellektə malik olan, yüksək tərbiyəyə malik olan, yüksək əxlaqa malik olan insanları hazırlayır, yetişdirir və onlar xalqın tanınmış adamları, hörmətli adamları, ziyalı adamları hesab olunur. “Ziyalı” sözü məhz bu məkanı tanıyır və bu baxımdan hesab edirəm ki, yeni seçilmiş parlament Azərbaycanın, xalqımızın intellektual səviyyəsini, mədəni səviyyəsini, xalqımızın mənəvi varlığını təmsil edən, təcəssüm edən bir parlamentdir”[Vc.s.12-13].

Heydər Əliyevin rəsmi xarakterdə olan çıxışlarına belə poetik bir ruh hakim olur. İran İslam Respublikasının Şərqi Azərbaycan əyalətinin ostandarı Yəhya Məmmədzadənin başçılıq etdiyi nümayəndə heyəti ilə apardığı görüş (2 avqust 1999-cu il) İran Azərbaycanına, Təbrizə, İranda yaşayan azərbaycanlılara münasibətdə səmimiyyət və kövrəkliyin qarışdığı poetik nitq əvvəldən axıradək auditoriyanı heyran qoyur. Azərbaycanla, azərbaycançılıqla bağlı fikirlər bu mövzuda indiyədək yazılanların zirvəsini təşkil edir. Təbriz şəhərinin

təsviri, Təbriz həsrəti, Təbriz müqəddəsliyi elə çıxışın əvvəlində özünə yer alır: “Şərqi Azərbaycan, Təbriz İranın ayrılmaz bir hissəsidir. Ancaq Azərbaycan ilə İranın sərhədinin böyük bir hissəsini təşkil edir. Bir də ki, Təbriz həm İran üçün, həm də Azərbaycan, yəni bizim Azərbaycan üçün çox əziz, qiymətli və müqəddəs bir şəhərdir. Siz Təbrizdə daimi yaşayırsınız. Təbriz sizin üçün adi bir şəhərə dönübdür. Amma mən bilirəm ki, Azərbaycanda, xüsusən ötən 70 illik ayrılıq illərində insanlar Təbrizin nə qədər həsrəti ilə yaşayırdılar. Bunu dəfələrlə demişəm, mən Bakıya gəlməmişdən əvvəl 1991-ci ildən Naxçıvanda olduğum zaman keçirdiyim görüşlərdə də demişəm və bu gündə deyirəm” [XXIc.s.112-113].

Siyasi çıxışları və təbrik məktublarını poetizmlə bəzəmək dünya nitq təcrübəsində az-az rast gələn hallardandır. Bu baxımdan Heydər Əliyev nitqləri cəlbedicidir. Şeyx Şamilin 200 illiyi münasibətilə Mahaçqalda keçirilən təntənəli yubileyin iştirakçılarına təbrik məktubu bu sıradandır: “Ulu Qafqaz əsrlər boyu müxtəlif dövlətlərin təcavüzünə məruz qalsa da, bu diyarın mərd insanları əsarətə qarşı mübarizə qətiyyətini daim qoruyub saxlamışlar. Azadlıq uğrunda 25 il vuruşan Şeyx Şamil bir daha sübut etdi ki, xalqın istiqlal amalını, iradəsini və əzmini sındırmaq, məhv etmək mümkün deyildir” [XIIIc.s.141].

Təkcə bu iki cümlədə “Ulu Qafqaz”, “mərd insanlar” ifadələri, “amalını, iradəsini, əzmini” və “sındırmaq, məhv etmək” sinonim söz cərgələri nitqin poetikliyini təmin edir. Poetizm Azərbaycan xalqına Böyük Yaradanın ərmağanıdır desək, yanılmarıq. Poetik duyğular Heydər Əliyev nitqinin emosionallığını artırmaqla yanaşı müxtəlif çeşidli auditoriyalarda özünəməxsus məna və məqsəd çalarları qazanır. Məhz, poetik duyğuların hakim olduğu nitq auditoriyaları fəth

edir, qəlblərə yol açır. Poetik duyğular rəsmi dövlət başçıları ilə görüşlərdə də özünü göstərir:

"Hörmətli prezident, hörmətli dostumuz və qardaşımız Süleyman Dəmirəl. Siz dediniz ki, Türkiyənin qəlbi Azərbaycanın qəlbi ilə döyünür. Bilirsiniz və yəqin bunu bu gün bir daha hiss edəcəksiniz ki, Azərbaycanın da qəlbi daim Türkiyənin qəlbi ilə döyünür.

Azərbaycanda hər bir vətəndaş Türkiyəyə böyük məhəbbət və sevgi hissi bəsləyir. Türkiyənin yüksəlməsini, Türkiyənin artmasını istəyir, Türkiyənin daha da güclü olmasını istəyir, Türkiyənin daha da inkişaf etməsini istəyir.

Böyük sınaqlardan keçən dostluq və qardaşlıq əlaqələri bizi məhz bu yola gətirib çıxarmışdır, bizdə məhz belə məhəbbət və sevgi hissləri yaratmışdır. Bu hisslər heç vaxt sönməyəcəkdir. Bunu söndürmək də mümkün deyildir. Çünki bu, içdən gələn, qəlbdən gələn hisslərdir" [Vc.s.147]. Buradakı "Türkiyənin qəlbi Azərbaycanın qəlbi ilə döyünür" frazeoloji söz birləşməsi, eləcədə "sevgi hissi bəsləmək" kimi mürəkkəb frazeoloji birləşmələri, poetik duyğularla zəngin parçada iki dəfə "məhz" dəqiqləşdirici ədatı ilə nitq güclənir. "Bu hissləri söndürməz", "içdən gələn", "qəlbdən gələn hisslərdir" güclü poetik çalarlarla iki qardaş respublika arasındakı münasibətlərin 1995-ci ildəki əsasını qoyur. Bu günkü Türkiyə-Azərbaycan münasibətləri bu ecazkar nitqin proqnostikliyinə sübutdur.

Üzləşdiyimiz bəlaları, vaxtı ilə buraxdığımız səhvləri, "xəta"ları, ölkəmizə, məmləkətimizə qarşı olan 1990-cı il yanvar təcavüzünü poetik bir dillə böyük natiq Qazaxıstanda auditoriyalara çatdırır. Bu məqamda poetizm sinonim söz cərgələriylə həyata keçirilir. Həmin təcavüzü Azərbaycan xalqının "bədənində, qəlbində sağalmaz yaradır" frazeoloji ifadəsi ilə poetikləşdirir, poetik bir dillə də qazax xalqını "müstəqilliyi əziz tutmağa", onun qədir-qiymətini bilməyə çağırır:

"Görün o dövrün səhvləri, xətaları nəyə gətirib çıxarmışdır. Yaxud götürək Azərbaycanda 1990-cı ilin yanvar hadisələrini. O vaxt Sovet İttifaqı rəhbərliyinin Azərbaycan xalqına qarşı, Azərbaycan Respublikasına qarşı ədalətsizliyi əleyhinə xalqın etirazı Bakı şəhərində Sovet ordusu qoşunlarının iri kontingenti ilə yatırıldı, qan töküldü, çoxlu adam həlak oldu, gənclər, qadınlar, uşaqlar, qocalar Sovet qoşunlarının Azərbaycan xalqına qarşı bu hərbi təcavüzünün qurbanları oldular. Biz bunların hamısını görüb yaşadıq. Bu Azərbaycan xalqının bədənində, qəlbində sağalmaz yaradır və eyni zamanda bizə dərs oldu ki, gərək öz müstəqilliyini əziz tutasan, onun qədir-qiymətini biləsən" [Xc.s.113].

Heydər Əliyev fikirlərini çıxışlarının müəyyən məqamlarında poetik çalarlarla auditoriyaya yönəldir. Bu zaman auditoriya rəvan, səlis, düşündürücü, eyni zamanda poetikcəsinə deyilmiş nitqin təsirinə düşür. 11 iyun 1997-ci ildə Almatıda Qazaxıstan parlamentindəki çıxışı Qazax parlamentinə bir ağsaqqal öyüdü, türk təəssübkeşliyi təsiri bağışlayır. Azərbaycandakı acı təcrübəni izah edərək, onları ayıq olmağa çağırmaqla müstəqillik yoluna qədəm basmış türkdilli xalqlara öz dəyərli, əvəzsiz tövsiyələrini verir: "Ancaq Allaha şükür ki, sizin respublikanız belə hallardan uzaqdır. Mən sizin respublikanıza görə sevinirəm və qoruyun ki, respublikanızda belə hallar olmasın, qoruyun. Amma biz bütün bunları gördük, nə qədər insan həlak oldu. Bundan nə qədər ailə əzab çəkdi. Cinayət yolu tutmuş və cinayətkar əməllər, dövlət çevrilişi cəhdləri və sairə törətməyə başlamış və təcrid olunmuş insanların ailələri əziyyət çəkirlər. Bir sözlə, biz bunların hamısını görmüşük. Yaxşı ki, sizin respublikanız belə hallarla qarşılaşmayıb və Allah eləsin heç vaxt qarşılaşmasın. Mən görürəm ki, indi sizdə vəziyyət o qədər yaxşı, o qədər sabitdir ki, belə hallar heç vaxt olmayacaqdır. Ancaq bununla belə, bizim

respublikamızın bu acı təcürbəsini bilməlisiniz. Həmişə ayıq olmaq üçün bilməlisiniz" [Xc.s.97].

Həyatının ən ağır məqamlarında belə poetizm Heydər Əliyev nitqində özünə yer tapır, dinləyicilər valeh olmaqla yanaşı təhlükəli anlarda özünü itirməyən cəsarətli dövlət başçısını görürlər. Polşanın "Liçe Varşava" qəzetinin müxbirinə verdiyi müsahibədə Heydər Əliyev onun təyyarəsinə tuşlanan raketdən yox, Bakı küləyindən, Bakının küləklər şəhəri olmasından, Böyük Allahın onun həyatını xilas etməsi yolunda Bakı küləyini vasitə seçməsindən danışır: "...Sonra mən Ruminyadan qayıdarkən təyyarəni vurmağa cəhd göstərdilər. Onda Allah kömək etdi, mən özüm bir şey edə bilməzdim, çünkü bilmirdim ki, raket artıq mənim təyyarəmə doğru tuşlanmışdır. Lakin Bakı küləyi kömək etdi. Bakı küləklər şəhəridir və küləklər müxtəlif tərəflərdən əsir. Bu dəfə külək elə əsdi ki, təyyarə başqa tərəfdən yerə endi, raket isə əks tərəfdə idi. Onlar bunu sadəcə olaraq edə bilmədilər. Etsəydilər tək mən yox, təyyarədəki daha 80 adam həlak olardı" [XIIc.s.81].

"Sadə, çox kasıb həyat sürən adamlarla bir yerdə olmağı mənəvi baxımdan həyatının ən zəngin dövrü hesab etmək" poetik ifadəsi böyük şəxsiyyətlərin dilində eşidilə bilər: "...Moskvada və Bakıda yaşamağım üçün şərait olmadığına görə, doğulduğum Naxçıvan şəhərinə sığındım, orada bir müddət yaşadım. Həyat şəraitim çətin olsa da, ictimai-mənəvi mühit məndən ötrü çox yaxşı idi. Çünki sadə insanların arasında yaşayırdım, sadə, çox kasıb həyat sürən adamlarla bir yerdə idim. Əgər belə şəraitdə yaşadığım gənclik dövrünü nəzərə almasam, bəlkə də bu, həyatımın mənəvi baxımdan ən zəngin dövrü olmuşdur".

21 sentyabr 1993-cü il tarixdə, Azərbaycan Milli Elmlər Akademiyasında ziyalılarla görüşdə ölkənin vəziyyətini poetik bir dillə əks etdirir: "Baxmayaraq ki, indi respublika dağılmış

vəziyyətdədir. Təsəvvür edin ki, dənizdə qasırğanın dağıtdığı gəmini dalğalar sahilə atmışdır. Həmin gəmini yenidən tikmək, elə vəziyyətə salmaq lazımdır ki, bir daha dənizə çıxa bilsin...” [Ic.s.163].

O, qorxmur. O, Ulu Tanrıya tapınan bir insandır. Təzyiqlərə məruz qalanda belə onun nitqi poetikliyini itirmir: “Mən bəzi adamlara demişəm. Şəxsən mənim heç bir silahım yoxdur: nə topum, nə tapançam, nə də avtomatım var. Mənim idrakım var, iradəm var və xalq mənə ümid bəsləyirsə, xalq mənə bu səlahiyyəti vermişdirsə, xalqı bu ağır vəziyyətdən çıxarmağı öz öhdəmə götürmüşəmsə, güman edirəm ki, xalq məni müdafiə edəcəkdir. Ona görə də nə çevrilişdən qorxuram, nə mənə qarşı terror aktları hazırlayan qüvvələrdən qorxuram. Heç bir şeydən qoxmuram. Demişəm və indi də deyirəm: həyatımın bundan sonrakı hissəsini xalqa bağışlamışam. Xalq onu burada kəsərsə, orada da kəsiləcəkdir. Mən həyatımı xalqın sərəncamına vermişəm. Hər dəqiqə, hər saat, gecə-gündüz xalqa xidmət edirəm. Heç bir qüvvəyə xidmət etmirəm. Heç bir qüvvə də mənə təzyiq edə bilməz” [Ic.s.98-99].

O, poetik bir dillə nə topa, nə tapançaya, nə də avtomata arxalandığını söyləyir. O idraka, iradəyə, xalqına arxalanan bir lider, şəxsiyyətdir. Milyonlara yönələn bu nitqin gücü təkcə poetikliyə söykənmir. Poetiklik tək Tanrıya tapınaraq heç bir şeydən qorxmamaqdadır. Poetiklik ömrün xalqa bağışlanmasında, həyatın xalqın sərəncamına verilməsində, hər an xalqa xidmət etməkdədir: “Yox, nə deyirsiniz? Əksinə, bu illər ərzində neçə-neçə gözəl, cəsarətli, prinsipial adamlar gördüm, onlarla tanış oldum. Başqa məsələdir ki, əvvəllər onlar mənə tanış deyildilər. Bu adamlar məni axtarıb tapır, mənə ürək-dirək verir, gözdən salınmış xadimlə ünsiyyət üstündə özlərinin də rüsvay ediləcəyindən qorxmurdular. Bu, adamın

qəlbini riqqətə gətirir və unudulmazdır. Xalqa isə elə minnətdaram ki, bunu ifadə etməyə söz tapmıram” [Ic.s.47].

“Hərçənd dolanmaq, özü də şaxtalı-boranlı qışda dolanmaq bizim üçün asan olmadı. Ev-eşikləri isitmək üçün meşələrin 70 %-ə qədərinə balta çalındı, yenə də kifayət etmədi.

Hamı kimi, mən də soyuqdan, suyun yoxluğundan əzab-əziyyət çəkdim. Amma nə edəsən? Mən həmyerlilərimə elə bəri başdan dedim: Əgər soyuqdan və ya aclıqdan ölmək lazım gəlsə, onda hamımız birlikdə öləcəyik. Lakin əminəm ki, bu faciə baş verməyəcəkdir” [Ic.s.47-48].

“Rossiyski fermer” qəzetinin müxbiri ilə söhbətdə (3 avqust 1993-cü il) keçdiyi həyat yolunun çətinliklərinə də poetik dillə təəssüf etmədiyini dilə gətirir: “Bəli, mən zamanın bütün məşəqqətlərini gördüm, amma buna təəssüflənmirəm. Çünki vicdanlı və təmiz bir insan idim və belə bir insan olaraq qaldım. Mən öz bioqrafiyamdan, öz keçmişimdən qətiyyən imtina etmirəm”.

18 avqust 1997-ci il tarixdə, xalq şairi Mirvarid Dilbaziyə göndərdiyi təbrikdə səslənən sətirlər oxucunu riqqətə gətirir, auditoriya böyük azərbaycanlının – Heydər Əliyevin dilində sapa düzülmüş mirvariləri görür: “Qarabağ dərdi, Göyçə həsrəti, taleyin hökmü ilə bir-birindən uzaq düşmüş soydaşlarımızın ayrılıq ağrısı sizin poeziyanızda tarix və ibrət dərslərinə çevrilərək gənc nəsli vətənpərvərlik ruhunda tərbiyə edir” [XIIc.s.7].

Poetik duyğular Azərbaycanın görkəmli sənət adamlarına ünvanlanan təbriklərdə səmimiyyətlə səslənir. Müslüm Maqomayevin yubileyində olduğu kimi: “60-cı illərdə sizi gənclərin sevimlisinə çevirmiş istedadınız bu gün də Yer kürəsinin bütün guşələrində adamların qəlbini fəth edir. Sizin ifanızda hər bir mahnı həyatın, məhəbbətin və xeyirin tərənnümünə çevrilir, zaman və məkan hüdudlarından kənara çıxır. Güclü

səsiniz, coşğun temperamentiniz və yüksək vokal mədəniyyətiniz, üstəlik daim təkmilləşməyə can atmağınız sizi sönməz ulduza çevirmişdir” [XIIc.s.5].

Poetiklik çox vaxt məişət-bədii üslubunda özünü biruzə verir. Ürəkdən təbrik edilən Yusif sonrakı cümlədə Yusif Səmədoğlu müraciətilə xalqa təqdim edilir. Yazıçı Yusif Səmədoğlunun 60 illiyinə həsr olunmuş təntənəli mərasimdəki kimi: “Yusif, mən səni bu yubiley münasibətilə ürəkdən təbrik edirəm... Ancaq bunlarla bərabər, bəlkə də bunlara əlavə olaraq bir neçə kəlmə də demək istəyirəm. Yusif Səmədoğlu bizim millətimizin xoşbəxt insanlarından biridir. Çünki o, böyük şair, böyük insan, böyük alim Səməd Vurğunun oğludur. Səməd Vurğunun oğlu olmaq, onun tərbiyəsini almaq, onun ailəsində böyümək özü böyük bir nemətdir, böyük bir xoşbəxtlikdir. Bəlkə bu elə bəs olardı. Ancaq bununla yanaşı, bu kökün üstündə, bu ailə ab-havasının içində böyüyüb, ərsəyə gəlib atasının yolunu davam etdirmək və cəmiyyətdə özünəməxsus, məhz özünəməxsus yer tutmaq, – bu, böyük xoşbəxtlikdir, cəmiyyətimizin içində insan üçün, şübhəsiz ki, nemətdir”.

Poetik ruhlu nitq 23 aprel 1998-ci il tarixdə, Mirvarid Dilbazinin 85 illiyi münasibətilə təntənəli yubiley gecəsində də səslənir: “Sizin şeirləriniz, poemalarınız, bütün əsərləriniz neçə-neçə nəsillərə güc, inam verib və bu gün də verir, gələcəkdə də verəcəkdir. Sizin əsərləriniz Azərbaycan xalqına – insanlara, gənclərə yüksək mənəviyyat hissləri aşılayır, insanları paklığa, mənəviyyata, ülvi duyğulara çağırır. Sizin əsərləriniz insanlarımızda, xalqımızda, gənclərdə milli hisslər, duyğular, vətənpərvərlik, azadlıq hissləri, duyğuları oyadıb, dirçəldib, gücləndirib, inkişaf etdiribdir və bu günkü səviyyəyə gətirib çıxarıbdır” [XVc.s.228].

Bu poetik ruhlu nitqdə də Heydər Əliyev məntiqi ardıcıllığı gözlənilir. Azadlıq duyğularının oyanması → dirçəl-

məsi → güclənməsi → inkişaf etməsi → bugünkü səviyyəyə çatması ardıcıllığı poetizmə məntiqilik çalarları qovuşdurur. Auditoriya səbəb-nəticə əlaqələri üzərində qurulan məntiqi ardıcıllığın şahidi olur.

Poetik duyğular bəzən Azərbyacan şairlərinin şeirləri ilə auditoriyalara ayaq açır. Özbəkistanda səfərdə olan Heydər Əliyev görkəmli Azərbaycan şairi Süleyman Rüstəmin bir parça şeiri ilə Özbəkistan adlı bir türk respublikasının, çox-milyonlu özbək xalqı auditoriyasının məhəbbətini qazana bilir: "Mən bu qədim torpağa, özbək xalqına, hörmətli dostlar, sizin hamınıza bir daha dərin ehtiramımı bildirirəm. Mən sözümü görkəmli Azərbaycan şairi Süleyman Rüstəmin özbək qardaşına həsr etdiyi şeirindən bir parça ilə tamamlamaq istəyirəm:

*Candan əziz torpağını*
*Anam kimi, balam kimi sevirəm.*
*Düşmənlərin qarşısında əyilməyən başımı,*
*Qardaş kimi qarşınızda əyirəm.*

Bu sətirlər Azərbaycan xalqının özbək xalqına bəslədiyi və hər birimizin qəlbində yaşayan məhz həmin dərin hissləri ifadə edir. Mən Özbəkistanın şərəfinə, özbək xalqının şərəfinə, Özbəkistanın daha da tərəqqi etməsi şərəfinə badə qaldırmağı təklif edirəm! Özbək xalqının görkəmli oğlu, Özbəkistanın prezidenti İslam Abduqəniyeviç Kərimovun şərəfinə! Əziz dostlar, sizin sağlığınıza! Sağ olun!" [Xc.s.199].

30 avqust 1996-cı il tarixdə, xalq rəssamı Maral Rəhmanzadənin əsərlərindən ibarət yubiley sərgisinin açılışı mərasimindəki çıxışda rəssamlıq haqqında, Azərbaycan təbiəti haqqında söylənilən fikirlər bütövlüklə poetik bir ruhda səslənir. Vətən torpağının bir hissəsi olan Lahıcı abidə adlandırır.

"Nadir təbiətə malik ərazidə nadir insanlar yetişir" fəlsəfəsi ortaya qoyulur. Azərbaycanın xırda bir ada boyda olan parçası ölkə səviyyəsinə qaldırılır. Milli təəssübkeşlik hissi hər yerdə olduğu kimi bu məqamda da özünü göstərir. Sonda isə rəssamlarımıza olan sevgisini bildirir, rəssamlıq sənətinə özünün analitik təfəkkürü ilə qiymətini verir:

"Bu sərgidə mən sizin rəssamlığınızın indiyə qədər bilmədiyim bir incəliyini hiss etdim. Yaxud, siz Lahıcın gözəlliyini göstərirsiniz. Lahıc özü də Azərbaycanın bir abidəsidir. Doğrudan da orada nadir bir təbiət və nadir xüsusiyyətə malik olan mühit, nadir insanlar var. Çox nadir. Elə bil ki, xırda, balaca bir adadır, amma özünəməxsus ölkə kimi bir yerdir. Ona görə də siz ki, gedib o yerləri çəkmisiniz, bu, çox gözəldir. Oraya uzaqdan gedən adamlar o gözəlliyi daha yaxşı dərk edirlər, amma hamının oraya getməyə imkanı yoxdur.

Həm də o şeyi ki, rəssam görür, adi adam bəlkə də bunu dərk edə bilmir. Rəssam gözü ilə adi adamın gözü arasında böyük fərq var. Ona görə də sizin yaradıcılığınızın bu xüsusiyyətini mən daha yüksək qiymətləndirirəm" [VIIc.s.197].

Azərbaycan ədəbiyyatı, Azərbaycan musiqisi haqqında söhbət gedərkən poetik duyğular aşıb-daşır, mahnıya, musiqiyə olan sevginin dərəcəsi dinləyicinin gözləri qabağında canlanır: "Tofiq, sən fəxr edə bilərsən ki, 80 yaşını belə gümrah, sağlam, gözəl şəraitdə keçirirsən. Sən bundan sonra da yaradacaqsan, yazacaqsan, sevindirəcəksən, yeni-yeni mahnılar, musiqilər yaradacaqsan. Mən sənə cansağlığı arzu edirəm. Sənə yeni yaradıcılıq uğurları arzu edirəm. Biz hamımız bu dünyadan gedəcəyik. Ancaq mahnı, musiqi yaşayacaq. Tofiq Quliyevin mahnıları, musiqisi daim yaşayacaqdır. Eşq olsun musiqiyə! Eşq olsun incəsənətə! Yaşasın Tofiq Quliyev!" [XIIIc.s.215].

Poetiklik şükranlıqdadır. Bu şükürlər müstəqilliyimizin qorunmasınadır, möhkəmlənməsinədir, Azərbaycanımızadır: "Ən başlıcası isə yurdumuza, vətənimizə – Azərbaycana həsr olunmuş hər bir belə mahnı, hər bir belə musiqi insanlarımızda, məsələn, şəxsən məndə vətənpərvərlik hissi, iftixar, sevinc hissi doğurur ki, bizim Azərbaycanımız var, Azərbaycana həsr olunmuş belə mahnılar, şeirlər var və bu gün müstəqil, azad Azərbaycan var. Mənə elə gəlir ki, Müslüm Maqomayev bizim gözəl şairimiz Nəbi Xəzri ilə birlikdə bu mahnını yazanda onlar yəqin ki, gələcəyə baxmışlar, çünki bu mahnı həqiqətən azad, müstəqil Azərbaycanın himni kimi səslənir. Müslüm özü isə bu mahnını necə hissiyyatla ifa edir:

*Ömrümün mənasısan*
*Qardaşlıq dünyasısan*
*Anamın anasısan*
*Azərbaycan!".* [XIIc.s.358].

Poetiklik xüsusilə bədii gecələrdə, ədəbiyyat və mədəniyyət xadimlərinin yubileylərində özünü göstərir. 7 iyun 1997-ci ildə Azərbaycan Dövlət Akademik Milli Dram Teatrında Səməd Vurğunun "Fərhad və Şirin" pyesinin yeni quruluşda tamaşasında Heydər Əliyev poetik bir dillə həyat fəlsəfəsinin müxtəlif tərəflərini üz-üzə qoyur, insan cəmiyyəti mövcud olduqca bu tərəflərin də mövcudluğunu qəbul edir, lakin bir insan kimi "xəyanətin, satqınlığın olmaması" arzusunu da açıb söyləyir. Sonda dini üslubun tələb etdiyi kimi o, böyük şairə Allahdan rəhmət diləyir, teatr kollektivinə uğurlar arzulayır. Təkcə bu kiçik parçada Heydər Əliyev poetikliyi fəlsəfə ilə, dini üslubla, məişət elementləri ilə harmoniyada auditoriya üçün təqdim edə bilir: "Bu əsər bu gün aktualdır bir də ona görə ki, yenə də deyirəm, həm sevgi, həm məhəbbət saf və

pak olmalıdır, həm də xəyanətə, satqınlığa və vəzifəpərstliyə qarşı mübarizə aparılmalıdır. Ona görə də Səməd Vurğunun əsəri bu gün də aktualdır, 10 il də, 50 il də bundan sonra aktual olacaqdır. Nə qədər ki, insan cəmiyyəti yaşayır, insanlar arasında gedən bu proseslər daimidir. Mən istərdim ki, məhəbbət, sevgi həmişə olsun, xəyanət, satqınlıq heç vaxt olmasın. Siz də bunu istərdiniz. Ancaq bu, nə sizdən, nə də məndən asılı deyildir. Ona görə də bu, çox aktual bir əsərdir və bu əsərin indi səhnəyə gəlməsinin cəmiyyətimiz üçün, müstəqil Azərbaycan dövləti üçün və bizim insanların tərbiyəsi, kamilləşməsi, təkmilləşməsi üçün çox böyük əhəmiyyəti var. Allah Səməd Vurğuna rəhmət eləsin, güman edirəm ki, onun ruhu bu gün şad olur və Allah sizə də uzun ömür versin, teatrımıza yeni-yeni uğurlar nəsib olsun" [Xc.s.57].

Poetik duyğular Heydər Əliyev nitqində ayrı-ayrı şəxslərə yönəlir. 21 avqust 1998-ci il tarixdə, Prezident sarayında Azərbaycan ədəbiyyat, mədəniyyət, incəsənət, elm, din və idman xadimlərinin böyük bir qrupuna "Şöhrət" ordenlərinin təqdim edilməsi mərasimində Sara Qədimova haqqında şəxsi fikirləri poetikliklə zəngindir. O, Sara xanıma blokada şəraitində olan bir diyardan – Naxçıvandan zəng edir. Zəng edir ki, "o mənim, mən də onun səsini eşidim". Sonda isə "çünki Sara xanımın nə səsini, nə də özünü unutmaq olmaz" duyğuları ilə fikrini bitirir: "Sara xanım xatırladı ki, 1992-ci ildə mən Naxçıvandan ona zəng etdim. Bu belədir, doğrudur. Onda mən Naxçıvanda, çox təcrid olunmuş, blokada şəraitində yaşayan bir diyarda idim. Özüm də çətin bir şəraitdə yaşayırdım. O vaxt eşitdim ki, Sara xanımın yubileyidir. Mən ona bir məktub göndərdim. Xatirimdədir, həmin məktubu sonra televiziya ilə verdilər. O zaman Naxçıvanda televiziyada gördüm ki, filarmoniyada keçirilən tədbirdə mənim məktubumu oxudular. Mən çox məmnun oldum ki, Sara xanımın filar-

moniyadakı yubileyinə toplaşanlar həmin məktubu həyəcanla, alqışlarla qarşıladılar. Ancaq mən bu məktubla kifayətlənmədim, zəng etdim ki, o mənim, mən də onun səsini eşidim. Sara xanımı unutmaq olarmı? Mən harada olsaydım Naxçıvanda da – baxmayaraq ki, o vaxt Naxçıvan blokada şəraitində idi, – başqa yerdə də olsaydım, Sara xanımı unutmayacaqdım. Çünki Sara xanımın nə səsini, nə də özünü unutmaq olmaz" [XVIIc.s.164-165].

Heydər Əliyev nitqində poetik duyğular şairlər, yazıçılar, sənət adamlarının yubileylərində xüsusilə aşıb-daşır. Bu nitqləri dinləyən auditoriyalar sanki sərbəst vəzndə deyilmiş ilahi şeirlərin sehrinə düşür. Əliağa Vahidin 30 avqust 1996-cı il tarixdə, 100 illik yubileyindəki çıxışda poetik başlığı ayırmaq mümkün olmur. Çıxış başdan-ayağa poetik bir ruhdadır. Elə bu poetikliyin içində ədəbiyyatımızın problemləri, xalqı nikbinliyə çağırış, pessimist ovqatdan, Vahid şeirləri ilə çıxışlar auditoriyaya ünvanlanır. Böyük natiq məqsədini poetik, nikbin notlarla xalqımıza çatdırır: "Mən bu gün sizi dinləyərkən özüm üçün bir neçə nəticə çıxartdım ki, Vahid nə qədər çətin həyat tərzi keçiribsə, ağır yaşayıbsa, ona nə qədər diqqətsizlik olubsa, qayğı göstərilməyibsə də, o, çox nikbin adam olubdur. Vahid xalqımızın, respublikamızın xoşbəxt gələcəyini nə qədər gözəl tərənnüm edib, bunları açıqca deyib. Deyəsən sən oxuyurdun ki, "ölkəmiz faləzar olacaq", bunu bir də təkrar et.

Aktyor Ramiz Əzizbəyli:

*Tərənnüm eyləyəcək hər çəməndə bülbüllər,*
*Bu odlar ölkəsi bir başqa laləzar olacaq!*
*Vətən diyarında, Vahid, nə xidmət eylərsək,*
*Bu şanlı iş gələcək nəslə yadigar olacaq!* [VIIc.s.258].

Heydər Əliyevin nitqində poetizm estetik-fəlsəfi çalarlarladır. Qadınlar günü münasibtilə etdiyi çıxışda biz bunun bir daha şahidi oluruq: "Təsadüfi deyil ki, hər bir şair gözəlliyi tərənnüm edərkən birinci qadın gözəlliyi haqqında yazır. Hər bir mahnıda gözəllik sözləri səslənərkən qadın gözəlliyi haqqında deyilir. Qadın zərif bir məfhumdur. Biz qadını sevməliyik, qadına hörmət etməliyik, qadını həmişə yüksək tutmalıyıq və qadının cəmiyyətdə rolunu daim yüksəltməliyik" [XVc.s.44].

8 Mart Beynəxalq Qadınlar günü münasibətilə (7 mart 1997-ci il) Heydər Əliyev 1994-cü il oktyabr hadisələrini yada salır, qadınlarımızın dövlətçilik, müstəqillik yolunda göstərdikləri qeyrəti, namusu poetik yolla diqqətə çatdırır. Südəmər körpəsi ilə meydana gələn qadınları görərkən müstəqil "dövlətimizi heç kəs devirə bilməz" qətiyyətinə gəlib çıxır: "Mən gecə yarısı o meydanda toplaşanların qarşısına çıxarkən, oradakı insanların gözlərində parlayan nuru, işığı görərkən və o insanların cəsarətini görərkən bir daha əmin oldum ki, bizim dövlətimizi heç kim devirə bilməz. Mənə ən çox təsir edən, ürəyimdə müsbət mənada iz buraxan, məni həyəcanlandıran o oldu ki, toplaşanların içərisində çoxlu qadınlar var idi – yaşlı qadınlar, ağbirçək qadınlar, analar, gənc qadınlar var idi. Mən gənc qadınların qucağında südəmər uşaqları gördüm. Demək qadın nəinki özü gəlibdir, südəmər körpə ilə gəlib ki, Azərbaycan dövlətçiliyini müdafiə etsin. Gecə yarıdır, saat 3-4-dür, nəqliyyat yox idi, çoxları piyada gəlmişdilər... Mən heç vaxt o anları unuda bilmərəm" [XVc.s.42-43].

Heydər Əliyev poetik bir nitq ustalığı ilə siyasətlə musiqini qarşılaşdıra, onları müqayisə edə, təvazökarlıqla mahnı və musiqinin siyasətdən çətin olduğunu dilə gətirə bilir. İzahedicilik poetikliklə birgə səslənir. Digər nitqlərdə olduğu kimi, burada da hər şey izah olunur. İzahlar poetik çalarlarla oldu-

ğundan nitqin ekspressivliyi güclənir. Görkəmli müğənni və musiqiçi İosif Kobzonla görüşdə olduğu kimi: “Sizi hamı tanıyır, o cümlədən mən də görkəmli müğənni və musiqiçi kimi, qeyri-adi qabiliyyətə malik insan kimi tanıyıram. Məncə, sizin kimi yorulmaq bilməyən insan, müğənni yoxdur. Bilirsiniz, bir dəfəyə, fasiləsiz olaraq bu qədər çox və çətin mahnıları gözəl səslə və parlaq şəkildə ifa etmək – bu sizə bəxş edilmiş Allah vergisidir. Üstəlik, siz yorulmaq bilmirsiniz. Bəlkə də bunu deməyim bir o qədər də yerinə düşmür, ancaq mən də son dərəcə böyük həcmdə iş görməli oluram. Çox çıxış etmək, nitqlər söyləmək, xaricdən gələn müxtəlif nümayəndə heyətlərini qəbul edərkən çox danışmaq lazım gəlir. Həm də sadəcə olaraq söhbət etmək deyil, mən məsələləri müzakirə və həll edirəm. Amma bir var ki, işgüzar şəraitdə danışasan, bir də var oxuyasan, axı, hər mahnının öz xüsusiyyəti, öz çalarları var. Mən bunların hamısına fikir verirdim. Axı mahnıların hamısı eyni qəbildə, eyni janrda, xarakterdə deyil, hamısı eyni səslə oxunmur, hər şey dəyişir” [Xc.s.48].

Heydər Əliyev nitqində poetik izahlar da mühüm yer tutur. O mahnı haqqında danışır, o musiqini incələyir, mahnı və musiqi haqqında danışarkən belə Azərbaycanın taleyini bir an da olsa yaddan çıxartmır. Elə sonda məlum olur ki, bütün bu çıxışlar, nitqlər Azərbaycan problemlərinin həlli üçündür. 5 iyun 1999-cu ildə Respublika sarayında görkəmli müğənni və musiqiçi İosif Kobzonun Bakıda “Vida qastrolu” zamanı onunla söhbətdə Heydər Əliyev mahnı və musiqini, onun xalqların inteqrasiyası prosesindəki rolunu auditoriyaya açıqlayır: “Siz vaxtilə bir dövlətin tərkibində olan insanları, xalqları, respublikaları əlaqələndirirsiniz. Şübhəsiz, sizin ifa etdiyiniz mahnılar bu və ya başqa dərəcədə bizim respublikamızda yaşayır. Ancaq siz onları adamların yaddaşında təzələyir, canlandırırsınız. Çünki mahnı, musiqi qədər, incəsənət,

mədəniyyət qədər insanları bir-birinə heç nə bağlamır. İncəsənətin, mədəniyyətin, xüsusən də mahnının, musiqinin oynadığı rolu heç bir şey, heç bir vasitə oynaya bilməz. Siz bunu çox əla edirsiniz. Sizin bu missiyanız sadəcə olaraq qastrol səfəri, qarşıdakı yubileyinizlə əlaqədar şəhərlərdə olub konsertlər vermək deyildir. Bu, əlaqələrin, dostluğun möhkəmlənməsinə, qiymətli və əziz nə varsa, hamısını möhkəmləndirməyə xidmət edən böyük işdir" [Xc.s.49].

Respublika sarayında keçirilmiş (15 sentyabr 1998-ci il) Azərbaycan Qadınlar Qurultayındakı nitqdə Azərbaycan qadını poetik deyimlə tərənnüm edilir. Sinonim cərgələrin köməyilə Azərbaycan qadınının xüsusiyyətləri sadalanır, əsrlər boyu çəkdiyi zəhmətlər dilə gətirilir: "Azərbaycan qadını tarix boyu öz ağlı, zəkası, namusu, qeyrəti, isməti ilə, fədakarlığı, çalışqanlığı, mərdliyi, vətənpərvərliyi ilə millətinə, torpağına olan hədsiz məhəbbəti ilə və gözəlliyi, Azərbaycan xalqının xüsusiyyətləri ilə tanınmışdır. Ancaq bununla bərabər, əsrlər boyu Azərbaycan qadınının üzərinə böyük zəhmətlər düşmüşdür. O zəhməti də qadın həmişə mərdliklə, cəsarətlə çəkmişdir və heç vaxt bu zəhmətdən inciməmişdir. Tarixi keçmişimizdə Azərbaycan qadınının görkəmli nümayəndələri olmuşdur. Onların adları dünən də, bu gün də burada çəkilibdir. Ancaq bununla yanaşı, Azərbaycan qadını əsrlər boyu bir çox hüquqlardan məhrum olmuşdur" [XVIIc.s.307].

Yaqub Zurufçunun oxuduğu "Ayrılıq" mahnısının müəllifi Əli Səlimi haqqında söylədiyi poetik fikirlərdə bir daha Heydər Əliyev üçün azərbaycançılıq ideyasının nə dərəcədə əziz olduğu anlaşılır: "Naxçıvanda insanlar Əli Səliminin konsertini böyük iftixarla, böyük ruh yüksəkliyi ilə qarşıladılar. Bu yaxınlarda eşitdim ki, o, rəhmətə gedibdir. Allah rəhmət eləsin. Mən mahnılarına görə onu çox sevdim. Çox gözəl, istedadlı bir insan və bəstəkar, musiqiçi idi. Bax, budur, biz

birik, yəni burada heç nə ayrı deyildir. Əli Səlimi də, yaxud bizim Azərbaycan bəstəkarları da hamısı birdir. Hamısı bir musiqi, mahnılar yazır. Ona görə də bunları heç vaxt ayırmaq olmaz. 70 il də ayıra bilmədi, 100-200 il də olsa, ayıra bilməz" [XXIc.s.174].

Poetik çalarlı Heydər Əliyev nitqi qəlbləri riqqətə gətirən bədii frazeologizmlərlə doludur.

"Bu hissiyyatları demək mümkün deyildir" ifadəsi elə onu sübut edir ki, Heydər Əliyev nitqi poetik çalarlar olmadan keçinmir: "Azərbaycan mənim ürəyimdir. Azərbaycan mənim nəfəsimdir. Azərbaycan mənim həyatımdır. Azərbaycan haqqında hər bir vətəndaş öz ürək sözlərini deyə bilər. Mənim ürəyim daim öz doğma Vətənim Azərbaycanla bağlı, Azərbaycan haqqında hissiyyatlarla dolu olubdur. Bu hissiyyatları sözlə demək mümkün deyildir. Hətta böyük şairimiz Səməd Vurğunun dediyi sözlər də bunun hamısını əhatə etmir. Ancaq şairə ehtiyac olduğuna görə Səməd Vurğunun sözlərini bir daha təkrar etmək istəyirəm:

*El bilir ki, sən mənimsən,*
*Yurdum, yuvam məskənimsən,*
*Anam – doğma Vətənimsən.*
*Ayrılarmı könül candan?*
*Azərbaycan, Azərbaycan!*

Azərbaycan, Azərbaycan! Azərbaycanın şərəfinə, Azərbaycan xalqının şərəfinə!" [XVIIIc.s.75].

"Vətən hamı üçündür", "İş adamı da, tacir də, alim də" poetik deyimi yerinə düşür. Böyük natiq Bakıya gələn soydaşlarımızı qaranquşa, carçıya bənzətməklə ifadələri yerində işlədir: "Ona görə də mən belə hesab edirəm ki, siz buraya bir

carçi, qaranquş kimi gəlmisiniz. Ölkəmiz yeni əlaqələr qurur. Bu əlaqələr əslində yeni deyil, amma indiyədək qurulmayıb. Biz isə istəyirik ki, onu quraq. Bir halda ki, deyirsiniz Almaniyada çoxlu azərbaycanlı iş adamları var, qoy gəlsinlər; iş adamı da, tacir də, alim də – kim istəyir gəlsin. Gəlsinlər, görsünlər ki, Vətənləri var. Onlar Vətənə nə qədər çox gəlsələr, azərbaycanlıların birliyi, həmrəyliyi də möhkəmlənər" [Ic.s.322].

Ana leytmotiv kimi azərbaycançılığı həyatının böyük mənası hesab edən ulu öndər xarici ölkələrdə Azərbaycan diasporunun yaranmasını həmişə önə çıxarır: "Müstəqil Azərbaycan Respublikası hər bir azərbaycanlı üçün doğma vətəndir. Odur ki, hansı ölkədə yaşamasından asılı olmayaraq hər bir azərbaycanlı özünü daim azərbaycanlı kimi hiss etməli və Azərbaycan haqqında düşünməlidir. Azərbaycana olan sevgi və məhəbbətini heç vaxt kəsməməlidir, Azərbaycanla əlaqə yaratmalı və inkişaf etdirməlidir. Bunun üçün hər bir ölkədə yaşayan azərbaycanlılar bir-biri ilə daha sıx əlaqədə olmalı, daha mehriban olmalı, bir-birinə arxa-dayaq olmalıdırlar, bir-birinə kömək etməli, bir-birinin qayğısına qalmalıdırlar və beləliklə, biz bütün ölkələrdəki azərbaycanlıların daha yaxşı yaşamasına nail olacağıq" [Vc.s.42].

Azərbaycan Respublikasi səfirliyinin yeni binasının təntənəli açılışı mərasimindəki bu çıxışda da poetiklik böyük natiqin fikir səhnəsindən aşağı düşmür. Burada Azərbaycan və azərbaycanlılar sözü hər dəfə bir yeni çalarda, bir yeni məzmunda təkrarlanır, "daha" qüvvətləndirici ədatı ilə diaspor ideyasının frazeoloji sözlərlə – bir-birilə sıx əlaqədə olmaq, bir-birinə kömək etmək, bir-birinin qayğısına qalmaq – əsası qoyulur. Bu gün əksər ölkələrdə yaranan diaspor təşkilatlar həmin çıxışdakı öncəgörmədən xəbər verir.

Xaricdə yaşayan azərbaycanlılar auditoriyasında soydaşlarımızla söhbətdə Azərbaycan dilinin poetik imkanlarından istifadə edən Heydər Əliyev diaspor ideyasını möhkəmləndirir, bütün soydaşlarımıza "hamımızın bir Vətəni var, o da Azərbaycandır" həqiqətini çatdırır: "Amma azərbaycanlıların bir müstəqil ölkəsi, dövləti var, o da Azərbaycan Respublikasıdır. Hər bir yerdə yaşayan soydaşımız gərək bilsin, yaşadığı yer şübhəsiz ki, onun Vətənidir, amma ulu Vətəni, kökü, ata-babasının Vətəni Azərbaycandır. Ona görə də gərək o, Vətəni heç vaxt unutmasın və onunla yaşasın, Vətənin həyatı ilə maraqlansın, onun qayğısına qalsın. Ölkəmiz, dövlətimiz möhkəmləndikcə, gücləndikcə, inkişaf etdikcə, imkanlarımız artdıqca biz Azərbaycandan kənarda yaşayan soydaşlarımızla əlaqələri daha da genişləndirəcəyik və bu qayğını da, yardımı da artıracağıq. Ancaq respublikamızda yaşayan azərbaycanlıların vəziyyəti indi hələ ki, çox ağırdır" [Xc.s.130].

Heydər Əliyev çıxış etdiyi auditoriyalara mövcud olduğu məkanın, o məkanın müdrik adamlarını təqdim edir, məsələn, Amerika auditoriyasına Amerika prezidenti olmuş Con Kennedinin sözləri ilə müraciət edir. Bu müraciətin Azərbaycana da aid olduğunu Amerikada yaşayan soydaşlarımıza anladır. Sonrakı nitq mərhələsində öz ağır, çətin həyatını misal gətirərək insanları da çətinliyə, dözümə hazırlayır. Bütün bu nitq poetizimlə müşayiət olunur: "Bu görüşdə birinci çıxış edən dostumuz dedi ki, biz Azərbaycana nə etməliyik, Azərbaycan bizə nə etməlidir. Mən Vaşinqtonda gedib Kennedinin qəbrini ziyarət etdim. Orada gözəl sözlər yazılıbdır. Con Kennedi prezident andı içərkən amerikalılara müraciətlə deyibdir: "Siz düşünməyin ki, Amerika sizə nə etməlidir. Düşünün ki, siz Amerikaya nə etməlisiniz". Çünki hər insan – əgər onun əli, qolu, gözü, başı üstündədirsə – harada olursa olsun yaşaya

bilər. Bir az pis, bir az yaxşı yaşayar. Mən həyatın hər bir üzünü görmüşəm. Lap pis də, ağır da, lap yüksək şəraitdə də yaşamışam. Mən heç vaxt zəngin sərvət sahibi olmamışam. Çünki Sovet İttifaqında bu yox idi. Ancaq tutduğum vəzifəyə görə yüksək şəraitdə yaşamışam. Moskvada, Kremldə oturmuşam və böyük bir villada yaşamışam. Amma sonra oradan aşağıya düşmüşəm, gedib Naxçıvanda bir komada yaşamışam. Nə olsun? İnsan yaşayır. Mən də yaşadım. Demək istəyirəm ki, insan harada olsa yaşayacaqdır. Şərt o deyildir. Şərt odur ki, insan milləti, Vətəni, torpağı üçün nə edir. Şərt budur. Mən belə yaşamışam, indiyə qədər xalqım üçün əlimdən nə gəlib etmişəm, bundan sonra da edəcəyəm. Sizi də dəvət edirəm ki, bunu edəsiniz" [XIc.s.360].

Poetik duyğular xaricdə yaşayan soydaşlarımızla görüşlərdə də özünü göstərir. Bu poetik duyğularla Heydər Əliyev azərbaycançılıq ideyalarını həyata keçirir. "Qanı bir, qəlbi bir, fikri bir, gələcəyə baxışı bir olan" azəri övladlarını müstəqil Azərbaycan yolunda çalışmağa səsləyir: "Burada çıxış edən dostlarımız dünya ölkələrində 40 milyon azərbaycanlının yaşamasından söhbət açdılar. Bəli, belədir, bu, mənə də məlumdur. Həmin rəqəm bəlkə də bundan da çoxdur. Amma hər halda, əgər dünyada 40 milyon azərbaycanlı yaşayırsa, onlar azərbaycanlı adı daşıyırlarsa, onlarda azərbaycanlı qəlbi, qanı varsa, bu hamımızın fəxridir. Mən demirəm ki, bu 40 milyon azərbaycanlıların hamısının qəlbi, fikri, gələcəyə baxışı və Azərbaycan haqqında fikirləri bir olsa, əlbəttə ki, respublikamız da öz müstəqilliyini bundan sonra da möhkəmləndirər, inkişaf yolunu məharətlə keçə bilər və ölkəmizin hüdudlarından kənarda yaşayan soydaşlarımız bundan da yaxşı həm yaşaya, həm işləyə, həm də Vətənimiz, xalqımız üçün çox işlər görə bilərlər" [VIIc.s.17].

“Buna görə də mən çox əminəm ki, siz burada uzun illər, on illərlə yaşayaraq həm bu cəmiyyətə qatışmısınız, həm bu ölkənin həyatında fəal iştirak edirsiniz, özünüz üçün həyat qurmusunuz, yaşayırsınız, təhsil alırsınız, uşaqlarınızı böyüdür, analara təhsil verirsiniz, həm də ki, azərbaycanlılığınızı, milliyyətinizi və Azərbaycanla əlaqələrinizi qoruyub saxlamısınız. Bu çox təqdirəlayiqdir. Mən məmnunam ki, bu belədir.

Azərbaycanın dövlət başçısı, prezident kimi mən dünyanın hər yerində yaşayan azərbaycanlıları özümə doğma adam, doğma insan hesab edirəm. Hesab edirəm ki, dünyanın hər yerində yaşayan azərbaycanlılara imkan dairəsində qayğı, diqqət göstərməliyəm, kömək etməliyəm. Eyni zamanda azərbaycanlılar da harada yaşasalar da öz ana Vətəninə, doğma Vətəninə qayğı göstərməlidirlər, imkanları dairəsində kömək etməlidirlər, onu unutmamalıdırlar, öz ana Vətəninin, doğma Vətəninin qayğıları ilə yaşamalıdırlar” [Xc.s.226-227].

Poetik duyğular diaspor təşkilatlarla, xaricdə yaşayan həmvətənlərimizlə söhbətlərdə də üzə çıxır. Poetik çalarlı nitqlərlə Heydər Əliyev millilik, azərbaycançılıq ideyalarını soydaşlarımıza aşılayır, onları gələcək günlərə səfərbər edir. 28 iyul 1999-cu il tarixdə, Prezident sarayında xaricdə yaşayan həmvətənimiz, tanınmış müğənni Yaqub Zurufçu ilə görüşdəki söhbətdə poetik ruhlu nitq işə düşür, Amerikada yaşayan soydaşlarımıza öz arzularını çatdırır. Sabirsayağı millətin yuxudan oyanmasını arzu edir, “birliyə gəlməsini, yaxşılaşmasını” tələb edir: “Mənim arzum nədir? Arzum budur ki, azərbaycanlılar harada olurlarsa-olsunlar, onlarda milli hiss daha çox oyansın. Sizin də, bizim hamımızın da borcu ondan ibarətdir ki, Azərbaycandan kənarda yaşayan azərbaycanlıların milli hissiyyatlarını oyadaq. Nəinki təkcə oyadaq ki, onlar yuxudan oyansınlar, həm də onlar güclənsinlər. Bu millilik bi-

zi birliyə gətirir, yaxınlaşdırır. Bu millilik dövlətimizin əsaını yaradıbdır”[XXIc.s.100].

İnsan andına sədaqətli olmalıdır. Respublika ailə-sağlamlıq mərkəzinin açılışındakı çıxışda poetik dillə andı unutmamaq tövsiyə edilir. Vətənin, dövlətin başının üstünü qara buludlar alanda sədaqətin xüsusi önəm daşıdığını hər birimizə anladır: “Təsadüfi deyil ki, dünyada heç bir sahənin işçiləri üçün səhiyyə işçilərinin Hippokrat andı kimi andı yoxdur. Heç bir sahədə and yoxdur. Orduya gedən sədaqətlə xidmət etmək üçün and içir, başqa hərbi işdə xidmət edən and içir. Başqa sahələrdə isə heç kəs and içmir. Amma Hippokratın qədim dövrdən bizə qalan andı məhz səhiyyə işçiləri üçündür, həkimlik peşəsini seçənlər üçündür. Bu andı, ənənəni heç vaxt unutmaq lazım deyildir. Xüsusən indiki dövrdə bu prinsiplərin çox əhəmiyyəti var” [Vc.s.226-227].

Bir qrup qaçqın və telejurnalistlərlə söhbətdə poetik bir üslubda özünün televiziyadan kənarda yaşadığı həyatını auditoriya üçün açıqlayır. Dövlət başçısı olmağın məsuliyyətini xalq onun dilindən bir daha eşidir. Bu işin ağırlığı, ağır olduğu qədər də şərəfli bir iş olduğu da aydınlaşır. “Mən bu əziyyəti çəkmək üçün doğulmuşam”, “Bu da mənim taleyimdir, mən də taleyimdən razıyam” poetik duyğular auditoriyaları heyranlıqda saxlayır: “Əmin olun və sizinlə bir yerdə yaşayanlara, sizin rayonların, kəndlərin sakinlərinə çatdırın ki, mənim işimdə hər gün vaxtın əksəriyyəti bu məsələyə həsr olunur. Bunun az bir hissəsini televiziya ilə görürsünüz, amma çox hissəsini görmürsünüz. Gecəm də budur, gündüzüm də. İndi mənim bir məqsədim var, bir vədim var. Azərbaycanı bu bəladan qurtarmaq, işğal olunmuş torpqaları azad etmək və sizləri öz yerlərinizə – yurdlarınıza qaytarmaq. Bu, mənim ali vəzifəmdir, ali məqsədimdir. Bunu bəlkə Azərbaycanda

mənim qədər heç kəs istəmir. Sizin hər biriniz öz torpağınızı sevirsiniz, öz torpağınıza qayıtmaq istəyirsiniz, – bu təbiidir. Amma mən isə bütün Azərbaycan xalqının məsuliyyətini öz üzərimə götürmüşəm. Bu, mənim daxili mənəviyyatımdır, həyatımdır. Mən həyatımın məqsədini bunda görürəm, başqa heç bir şeydə yox. Məni indi həyatda başqa heç bir şey maraqlandırmır: yaşayışım yaxşıdır-pisdir, işim çoxdur, yoruluram, ya yorulmuram, əziyyət çəkirəm-çəkmirəm. Əziyyət çəkməliyəm. Mən bu əziyyəti çəkmək üçün doğulmuşam. Hər adamın bir taleyi var, bu da mənim taleyimdir. Mən də taleyimdən razıyam, baxmayaraq ki, sizin kimi mən də, – həqiqətən, burada doğru söz dediniz, – bəli, mən də köçkün olmuşam, qaçqın vəziyyətində yaşamışam, sürgün olmuşam".

Poetik ruhlu çıxışlar şəhid ailələri, qaçqın və köçkünlərlə görüşlərdə xüsusilə seçilir. Şəhidlər Xiyabanında şəhid ailələri ilə görüşdə (20 yanvarda 1998-ci il) şəhidlərin tökülən qanına verilən poetik ruhlu qiymətə heç bir yazıda, heç bir şeirdə təsadüf etmirik.

"Tökülən qan bütün xalqımızın qanıdır" deyən ulu öndər sonra "o tökülən qanın hər damlasında" nələrin mövcudluğunu izah edir. 20 yanvarda tökülən qanların indiyədək tökülən qanlara qarışan qanlar olduğunu bəyan edir. Bu tökülən qanların bayrağımızın qırmızısı ilə eyniliyini ortaya qoyaraq şəhid ailələrinin qəlbinə əminlik gətirir: "Onların şəhid olması zamanı tökülən qan bütün xalqımızın qanıdır. O qanın hər damcısında bizim xalqımızın qüdrəti var, xalqımızın qəhrəmanlığı var, xalqımızın milli azadlıq, müstəqillik arzuları vardır. O gecə tökülən qanlar müqəddəs qanlardır. Onlar bizim xalqımızın əsrlər boyu milli azadlıq, müstəqillik uğrunda tökdüyü qanlara qovuşmuş qanlardır, o gecə tökülən qanlar Azər-

baycanın müstəqilliyini nümayiş etdirən milli bayrağımızın üstündəki qandır" [XIVc.s.14].

Erməni işğalında inləyən müqəddəs torpaqlarımızın sakinləri ilə – qaçqınlarla görüşlərində Heydər Əliyevin qəlbləri riqqətə gətirən poetik nitqi işə düşür. 1 aprel 1996-cı ildə Kəlbəcərin işğalının 3-cü ildönümü ilə əlaqədar olaraq söylədiyi nitq poetiklik cəhətədən seçilən nitqlərdəndir: "Doğrudur, bu 3 il müddətində Kəlbəcərə böyük ziyan vurulubdur, zərbələr dəyibdir. Ermənistan işğalçıları o qədər vəhşidirlər, qəddardılar, insani keyfiyyətlərdən o qədər uzaqdırlar ki, onlar işğal olunmuş torpaqlarda, o cümlədən Kəlbəcərdə də nəinki insaniyyətə xas olmayan, hətta insaniyyətə zidd yabançı hərəkət edirlər. Ancaq bunların heç birisi Kəlbəcərin o məğrur dağlarını, qayalarını, meşələrini, çeşmələrini, bulaqlarını heç vaxt endirə bilməz, əyə bilməz, sındıra bilməz, eləcə də güman edirəm ki, kəlbəcərlilərin iradəsini sındıra bilməz. Ona görə də mən əminəm ki, vaxt gələcək bunların hamısı tarixdə qalacaq, Kəlbəcər işğaldan azad olacaq, kəlbəcərlilər tezliklə doğma rayonlarında öz həyatlarını quracaq, öz yerlərini, yurdlarını, evlərini, obalarını bərpa edəcəklər. Mən buna əminəm!" [VIc.s.41-42].

"Şəhidlərimizin ruhu, qəhrəmanlığı hamımızı və birinci növbədə gənclərimizi torpaqlarımızı daha cəsarətlə, daha qəhrəmanlıqla qorumağa səsləyir. Mən güman edirəm ki, gənclərimiz son illərin ağır nəticələrindən ibrət alaraq, özlərində vətənpərvərlik hisslərini daha da gücləndirəcəklər, vətəndaşlıq borclarını ödəməyi özlərinə müqəddəs vəzifə kimi qəbul edəcəklər və biz birlikdə xalqımızın müdafiə qüdrətini möhkəmləndirəcəyik, müstəqil Azərbaycan dövlətini qoruyub saxlayacayıq, Azərbaycanın ərazi bütövlüyünü təmin edəcəyik" [Ic.s.178-179].

Respublika Ali Sovetində gənclərin nümayəndələri ilə görüşdə (22 sentyabr 1993-cü il) çıxış: “Bir sözlə, mən istəyirəm siz gənclərdə həm düşdüyümüz vəziyyət haqqında düzgün təsəvvür olsun, nikbinlik olsun. İnam, iradə, güc, qüdrət, daxili mənəviyyat-bunlar bizim xalqa xas olan xüsusiyyətlərdir”.

Yeni il münasibətilə Bakı şəhərindəki uşaq evlərində və internat məktələrində tərbiyə alan uşaqlarla görüşdə (Şəhriyar adına Mədəniyyət mərkəzi, 31 dekabr 1995-ci il) çıxış: “Hər bir insan üçün dünyada uşaqlardan istəkli heç bir şey ola bilməz. Mən də həyatımda daim uşaqları sevmişəm, öz balalarımı da sevirəm. Amma, sizin hamınız mənim balamsınız. Sizi öz balam kimi sevirəm və sizi öz balam hesab edirəm. Siz burada dəfələrlə mənə müraciət edərək “Heydər baba” dediniz. Mən bununla fəxr edirəm. Mənim, deməli, Azərbaycan dövlətinin bu qədər gözəl övladları var və onlar üç yaşında, dörd, beş, altı yaşında belə istedada malikdirlər. O şeirləri ki, siz deyirsiniz, gənclərin də çoxu deyə bilməz. Siz ki, belə gözəl rəqs edirsiniz, bunu çoxları edə bilməz. O mahnıları ki, siz oxuyursunuz, onları çoxları oxuya bilməz.

Hər biriniz mənim üçün əzizsiniz, doğmasınız. Bu uşaqlıq dövrünüzdə hər birinizə şən, sağlam, firavan həyat arzulayıram”.

Heydər Əliyevin nitqində poetiklik sərbəstdir. Auditoriya sanki sərbəst vəzndə ilahi şeirin sehrinə düşür. “Onlar üç yaşında, dörd, beş, altı yaşında belə istedada malikdirlər”. Sonrakı cümlələrdə “deyə bilməz”, “oxuya bilməz”, “edə bilməz” poetik ifadələri bir babanın balalarını sevməsidir, onları gələcək günlərimizə hazırlamasıdır.

Poetik duyğularla zəngin nitq uşaqlara yönəlir, Azərbaycanımızı müdafiə edərkən “canlarını qurban verən”, “xalqının qəlbində qəhrəman kimi yaşayan” şəhidlərin uşaqlarına yönəlir.

"Sizin valideynləriniz var" ifadəsi ilə uşaqları bir an da olsa səfərbər edir, sonra isə bu valideynin Azərbaycan dövləti, Azərbaycan prezidenti olduğunu anladır: "Sizin çoxunuz atanızı, ananızı itirmisiniz, çoxlarınızın atası Vətənimizi, torpağımızı, müstəqil Azərbaycanı müdafiə edərkən şəhid olub, canını qurban verib, qəhrəmanlıq nümunələri göstərib, həyatı qəhrəman kimi tərk edibdir. Ancaq onlar sizin də, bizim də, bütün Azərbaycan xalqının qəlbində qəhrəman kimi yaşayırlar. Onlar həyatdan getməyiblər, bizimlədirlər, qəlbimizdədirlər. Onlar bu gün bu salondadırlar, sizin şən, xoşbəxt gününüzü görüb daha da sevinirlər. Ona görə də siz özünüzü heç də valideynsiz hesab etməyin. Sizin valideynləriniz var. Müstəqil Azərbaycan dövləti sizin valideyninizdir. Sizin valideyniniz Azərbaycan torpağıdır, Vətənimizdir, müstəqil Azərbaycan dövləti və onun prezidentidir. Siz buna arxayın ola bilərsiniz" [VIc.s.6-7].

2 fevral 1998-ci il tarixdə, Bakı İdman Oyunları sarayında Azərbaycan Gənclər Gününə həsr edilmiş bədi-idman bayramında gənclərə yönələn nitq poetiklik cəhətdən seçilir. Böyük natiq gənclər auditoriyasına üz tutaraq onlara "arxalandığını", "güvəndiyini" dilə gətirir, "sağlam, gözəl, istedadlı" gənclərə görə özünü xoşbəxt hesab edir: "Biz bu gün çalışaraq, çarpışaraq, müstəqil Azərbaycanın qarşısında duran ağır və çətin problemləri həll edərək, Azərbaycanın dövlət müstəqilliyini möhkəmləndirərək, iqtisadiyyatını inkişaf etdirərək sizə arxalanırıq, sizə güvənirik. Azərbaycanın bu günü və gələcəyi sizin fəaliyyətinizdən, işinizdən, sizin fədakarlığınızdan asılıdır. Məmnuniyyət hissi ilə bildirirəm ki, bu gün Azərbaycanın iftixar ediləsi gələcəyi var. Biz sizinlə fəxr edirik. Sizin varlığınız, bu gününüz və gələcəyiniz bizim qəlbimizdə böyük qürur hissi doğurur. Azərbaycanın dövlət başçısı kimi,

mən özümü xoşbəxt hesab edirəm ki, bu gün Azərbaycan xalqının sağlam, gözəl, istedadlı gəncləri var” [XIVc.s.198].

“Uşaq nədir, uşaq kimdir, uşaqların cəmiyyətdə yeri necə görünür” və sairə suallara cavab tapmaq istəyənlərə Heydər Əliyevin 31 dekabr 1998-ci il tarixdə uşaqlar üçün təşkil edilmiş yeni il yolka şənliyindəki çıxışına diqqət yetirmələri kifayət edir.

Bu çıxışda uşaqlara ünvanlanan sadə, ürəyəyatımlı, səmimi ifadələr özünə yer tapır, qəlblərə nüfuz edir. Ölkəmizin gələcəyi olan uşaqların cəmiyyətdəki yerini dəqiqləşdirir, müəyyənləşdirir. Heydər Əliyevin nitqləri çıxış günü üçün nəzərdə tutulan adi nitq deyil. Bu nitqlər gələcəyə tuşlanan, ölkənin gələcək üfüqlərinə dikilən nitqlərdir. Onun uşaq auditoriyasındakı nitqləri də bu sıradandır: “Əziz balalar, sevimli uşaqlar! Siz öz varlığınızla, istedadınızla məni hər dəfə sevindirirsiniz. Uşaq hər insan üçün, hər ailə üçün, cəmiyyətə, insanlara sevinc gətirir. Uşaq hər bir insanı yaşamağa, yaratmağa həvəsləndirir. Hər bir valideyn həyatda yaşayaraq, işləyərək, çalışaraq ilk növbədə qəlbində öz uşaqlarını, öz övladlarını düşünür, onları nəzərə alır və təsadüfi deyil ki, valıdeynlərin çoxu həmişə belə bir ifadə işlədirlər ki, mən uşaqlarım üçün yaşayıram. Uşaqlar üçün yaşamaq sözü hər bir valideynin öz uşaqlarına aiddirsə, eyni zamanda hər bir uşağa aiddir. Cəmiyyəti sizin nə qədər sevindirməyiniz, ona nə qədər ruh verməyiniz hədsiz-hüdudsuzdur” [XVIIIc.s.485].

Heydər Əliyev nitqində poetiklik fəlsəfi düşüncələrlə çulğalaşır. “Bəli, məni işdən çıxartdılar, o günləri, o çətinlikləri gördüm, onların hamısına dözdüm. Bunlar hamısı həyatdır. Həyatın yüksəlişi də olur, aşağıya düşməyi də olur, enişi də, yoxuşu da, çətinliyi də, gözəl günləri də olur”.

"Bəli" təsdiq ədatı ilə başlayan bu lakonik cümlələrdə dialektikanın əksliklərin vəhdət və ziddiyyət qanunu necə deyərlər böyük natiqin dilində işə düşür. "Yüksəliş" – "aşağıya düşmə", "eniş" – "yoxuş", "çətinlik" – "gözəl günlər" əksliklərinin elə həyat olduğu anlamını auditoriya ulu öndərin nitqində bir daha eşidir. Poetiklik kövrəklikləd̈ir. "Müharibəyə nifrət "lakin" bağlayıcısı ilə başlayan ritorik sual, izahedici cümlə ilə davam etdirilir. "Daha" qüvvətləndirici ədatı ilə kövrək bir notla fikir bitir. "Lakin nə qədər müharibə aparmaq olar? Adamlar mənasız yerə həlak olurlar, bu barədə daha danışa bilmirəm". Poetiklik təəssüflə birgə səslənir. "Uçuq-sökük", "zillət çəkmək" poetikliyi qətiyyətlə birgədir: "Uçurduqlarım isə adamlara mane olanlar idi".

Poetiklik bəzən antonimlərin köməyi ilə həyata keçirilir: uçuq-sökük, tikmək-uçurmaq:

"Bakıdakı uçuq-sökük daxmaları dağıtmışam. Adamlar həmin daxmalarda yaşamır – zillət çəkirdilər. Biz həmin adamları abad mənzillərə köçürtdük. Həyatım boyu yaxşı çox şey tikmişəm. Uçurduqlarım isə adamlara mane olanlar idi... Adamlar bunu unutmamışlar". (1992-ci ilin fevral-may hadisələri ilə bağlı bir qrup qaçqın və telejurnalistlərlə görüşdə yekun sözü, 16 iyun 1997-ci il).

Heydər Əliyev poetizmi insanlara tuşlanan poetizmdir. "Yaxşı ki, siz varsınız" poetik ifadəsi ilə xalqa arxalandığını dilə gətirir. Bir müraciətlə çevriliş cəhdinin qarşısını alan dövlət başçısı xalqının sağlam düşüncəli, saf mənəviyyatlı, yüksək amallarla yaşayan insanlar olduğunu nitqlərində nəzərə çarpdırır: "Sağ olun ki, Azərbaycanda sizin kimi insanlar var. Mənim bu fəaliyyətimi də həyata keçirmək sizin kimi insanların varlığı ilə mümkündür. Əgər sizin kimi insanlar olmasaydı, mən 1993-cü ildə vətəndaş müharibəsinin qarşısını ala

bilməzdim. Əgər sizin kimi insanlar olmasaydı, ondan sonrakı dövrdə bir neçə dəfə dövlət çevrilişi cəhdlərinin qarşısını ala bilməzdim. 1994-cü ilin oktyabrında dövlət çevrilişi cəhdinə ki başladılar, onların əlində böyük silahlar, silahlı dəstələr vardı, mənim əlimdə isə heç bir şey yox idi. Amma mənim arxamda xalq, millət var idi. Xalqa bir müraciətimlə o çevriliş cəhdinin qarşısını aldım. Ondan sonrakı zamanlarda da onların qarşısını aldım. Buna görə yaxşı ki, siz varsınız. Amma xalqımızın əksəriyyəti sizin kimi sağlam düşüncəli, saf mənəviyyatlı, yüksək amallarla yaşayan insanlardır. Məni həmişə sevindirən budur" [Xc.s.163].

İnsan fəlsəfəsi, insanın dünyagörüşü məsələsi Heydər Əliyev nitqində poetik bir yolla auditoriyalara çatdırılır. İnsanın zənginləşməsi baxımından onun dünyaya çıxışı, dünyaya inteqrasiyası prosesi rəvan, səlis bir poetik ruhda çatdırılır: "Bilirsiniz, əgər insan bir kənddə doğulursa və ömrü boyu həmin kənddə yaşayırsa, yaxud bir qəsəbədə ömrü boyu yaşayırsa, təhsil almaq, işləmək üçün başqa bir yerə getmirsə, nə qədər kitab oxusa da, başqa vasitələrdən istiafdə etsə də onun dünyagörüşü o çərçivədən çox kənara çıxa bilməz. Ancaq insan öz baxış dairəsini nə qədər genişləndirərsə, öz ölkəsindən, şəhərindən, kəndindən çıxıb başqa ölkələrdə, şəhərlərdə olanları nə qədər görüb – götürürsə və öyrənirsə, insan daha da zənginləşir. Bax, o illər mən bu prinsipi nəzərə alırdım" [XVIIc.s.215].

Heydər Əliyev nitqində fəlsəfi fikirlər poetikliklə söylənilir. "İnsan xoşbəxtliyi nədədir?" sualına yəqin ki, müxtəlif cür cavab verərlər.

Əliağa Vahidin 100 illik yubileyində o bu suala belə cavab verir: "İnsanın xoşbəxtliyi nədir?" Xoşbəxtlik təkcə o demək deyil ki, o necə yaşayıb. Xoşbəxtlik odur ki, insan 70

yaşında vəfat edib, amma 30 il də ondan sonra yaşayır. Özü də necə yaşayır! O, xalqına necə gözəl xidmət edib. Xalqını bu ağır vəziyyətdən çıxarmaq üçün görün nə qədər gözəl töhfələr, irs qoyub gedib...

Bax, bu axşamkı yubiley tədbiri də bir fəlsəfə gecəsidir. Mən bunu belə qəbul etdim. Sizin oxuduğunuz o şeirlər, dediyiniz sözlər, səslənən musiqi də fəlsəfədir. Bax, rəssam da bunu belə dərk edib. Onun çəkdiyi əsərlər çox gözəl rəsm əsərləridir və orada da fəlsəfə var" [VIIc.s.259].

Poetik duyğulu nitq fəlsəfi fikirlərin auditoriya tərəfindən dərk olunmasında önəmli yer tutur. Əlillərin birinci Ümumrespublika bədii yaradıcılıq baxış-müsabiqəsi qaliblərinin yekun konserti başa çatdıqdan sonra təbrik iştirakçıları qarşısındakı çıxışda insan, fəlsəfədə insanın yeri, insana münasibət məsələləri poetik cümlələrlə izah olunur, auditoriya filosof çıxışına qulaq kəsilir: "Bugünkü tamaşa insanın nə qədər böyük imkanlara malik olduğunu bir daha bizə göstərdi. Bizi sevindirən odur ki, fiziki cəhətdən qüsurlu, çatışmazlığı olan insanlar nikbin yaşayırlar və öz iradələrinə söykənərək istedadlarını inkişaf etdirirlər və hətta çıxış edərək onları ictimaiyyətə nümayiş etdirirlər. Bu, insanın ən gözəl xüsusiyyətlərindən biridir. Bu, insanın nə qədər yüksək mənəviyyata, nə qədər yüksək gücə, nə qədər yüksək iradəyə malik olduğunu bir daha göstərir" [XVIIIc.s.298].

Fəlsəfədə inkişafın hamar olmadığı, spiralvarlığı qəbul edilir ki, insan həyatında da gələcəyə gedən yola, inkişafa Heydər Əliyev filosofyanə, poetikcəsinə tərif verir. "Hər şeydən çox, hər şeydən artıq" müstəqil Azərbaycanın gələcəyi haqqında düşünməyi vəzifə kimi önə çəkir: "Ancaq sizin qarşınızda çox böyük vəzifələr durur, qarşınızda böyük yol var. Yol hamar deyil, asfalt yol deyil, uzun yoldur, o yolu hər

biriniz keçməlisiniz. Bu yol müstəqil Azərbaycanın gələcəyi yoludur. Hər bir Azərbaycan gənci öz həyat yolunu müstəqil Azərbaycan Respublikasının gələcəyi yolu kimi qəbul etməlidir və öz həyatını qurarkən, özünü həyatda fəaliyyətə hazırlayarkən və fəaliyyətə başlayıb onu davam etdirərkən özü haqqında da düşünməlidir, ailəsi haqqında da düşünməlidir, ancaq hər şeydən çox, hər şeydən artıq müstəqil Azərbaycanın bu günü, gələcəyi haqqında düşünməlidir. Bu, sizin vəzifələrinizdir və güman edirəm ki, hər bir Azərbaycan gənci cəmiyyətdə, Vətəndə, ölkədə öz vəzifələrini layiqincə yerinə yetirməyə çalışmalıdır" [Vc.s.307].

Böyük natiqin nitqində poetiklik içərisində bir kövrəklik yatır. Bu poetiklik hər bir insanda olduğu kimi Heydər Əliyevdə də doğulduğu məkana olan xüsusi bir sevgidir. O doğulduğu Naxçıvanı, ondan öncə Vətənini sevdiyini bir daha xatırladır. Həyatının ağır anlarında ona qoynunu açan, onu bağrına basan Naxçıvanın adını daşıyan "Naxçıvan" yatağına məsuliyyətlə yanaşmağı tələb edir. Və bu tələbini də poetik ifadələrlə izah edir: "Nəhayət, yaxşı ki, bu da baş verdi. Yatağın da adı "Naxçıvan" dır, mənim doğulduğum yerin adıdır. Ona görə bunun daha da çox məsuliyyəti var. Gərək elə edəsiniz ki, oradan hasil olan neft, ümumiyyətlə, yataqdakı işlər o birilərin hamısından yaxşı olsun. Mən doğulduğum yeri bir də ona görə sevirəm ki, 1990-cı ildə Moskvada yaşayarkən həyatım böyük təhlükə altında olduğu zaman, – o vaxt məni çox təqib edirdilər və qarşımda çox böyük məhrumiyyətlər dururdu, – Azərbaycana döndüm və Bakıda da yaşamaq mümkün olmadığına görə doğulduğum yerə, Naxçıvana getdim. Mən orada ağır, çox çətin illər keçirdim, amma Naxçıvan məni bağrına basdı, qoynuna aldı. Mən də onları yaşatdım, bəlkə də mən oraya getməsəydim, onları da böyük təhlükə

gözləyirdi. Ona görə də mən Vətənimi, doğulduğum yeri çox sevirəm. O bu ağır gündə mənə əl uzatdı, mən bunu xüsusi qiymətləndirirəm" [XIc.s.298-299].

Elə həmin görüşdə səmimiyyətin poetizm ilə harmoniyasının şahidi oluruq. Heydər Əliyev özünün sevimli şairi Şəhriyar haqqında ürək sözlərini deyir: "Şəhriyarın yubileyi haqqında mən böyük bir fərman verdim. Mən hər şeyi açıq danışıram, – hətta mənə dedilər ki, İranda kimsə inciyir, – bu, İran şairidir. Bu həm İran şairidir, həm Azərbaycan şairidir. Bunu bir-birindən ayırmaq olmaz. Biz demirik ki, Şəhriyar İran şairi deyil, İran şairidir. Amma biz deyirik, o, eyni zamanda Azərbaycan şairidir. Bu, bizim doğma şairimizdir və Azərbaycan haqqında onun yazdığı şeirlər, onun yazdığı əsərlər insanlara nə qədər mənəvi qida veribdir, nə qədər böyük ruh veribdir" [XXc.s.129].

Heydər Əliyevin poetik ruhlu cümlələrinə bəzən bir qədər yumor qarışmış olsa da kövrək reallıq yenə də öndədir. Heydər Əliyevin nitqindəki poetiklik şair və yazıçılarla olan görüşlərdə xüsusilə qabarıq şəkildə özünü biruzə verir. "Vaxtilə Anar, Yusif, Elçin və başqaları ilə gənc nəslin nümayəndələri kimi görüşürdük. Mən hesab edirəm, indi də gəncdirlər, çünki özüm də gəncəm. Ancaq necə olur-olsun, özümüzü nə qədər gənc hiss etsək də, yaş özünü göstərir, gün keçir, ay keçir, il keçir, yaş üst-üstə gəlir" [XIIIc.s.9].

Heydər Əliyevin nitqlərinə xas olan poetizmin özündə dünyanın faniliyi, əbədi olmamağı ilə yanaşı gələcəyə bir nikbinlik də hakimdir. Böyük natiqin gücü həyatı realistcəsinə qəbul etməsindədir. Bu da onun keçdiyi, özünün tez-tez işlətdiyi ifadə olan "keşməkeşli" həyat yolu ilə əlaqədardır: "Adətən, insanlar öz yanında, gözünün qabağında olanı qiymətləndirmir, keçmişdəkini, yaxud uzaqda olanı qiymətləndirir.

Amma həyatdır, heç birimiz burada daimi deyilik. Mən şübhə etmirəm ki, gələcək nəsillər bu gün burada, bu salonda oturanların hamısını yüksək qiymətləndirəcəklər. Səməd Vurğun 50 yaşında, 40 il bundan əvvəl vəfat edib. Biz onun 90 illiyini qeyd etdik. Amma Səməd Vurğun bəlkə də heç yaşadığı zaman, yaxud həyatdan gedəndən sonrakı ilk illərdə xalqın məhəbbəti nöqteyi-nəzərindən bu qədər yüksək zirvələrə qaldırılmamışdı, nəinki indi qaldırıldı, bilirsiniz, olur, tarixin elə zamanları olur ki, unudur, amma sonra xatirinə salır" [XIIIc.s.29].

"Tam əminəm ki, siz öz sözünüzün və vədlərinizin sahibisiniz. Mən sizə inanıram. Ona görə ki, siz döyüşlərdən, tufanlardan, sınaqlardan keçmiş adamlarsınız. Ona görə inanıram ki, siz o ağır müharibədən keçib öz vətəninizə qayıtmısınız. Ona görə inanıram ki, siz vətəninizi sevən adamlarsınız. Əgər sizdə vətən sevgisi, vətən məhəbbəti olmasaydı öz təşəbbüsünüzlə buraya toplaşmazdınız. Əgər sizdə vətən eşqi olmasaydı belə narahatçılıq keçirməzdiniz" (Keçmiş beynəlmiləlçi döyüşçülərlə görüş, 4 noyabr, 1993-cü il).

Heydər Əliyev poetizmi insanlara inamın önə çəkilməsidir. Dilimizin poetik zənginliklərindən, çevikliyindən yerindəcə yararlanan böyük natiq bir yerdə "Mən sizə inanıram. Ona görə ki..." işlədirsə, sonra iki yerdə "Ona görə inanıram ki..." ifadəsini işlədir.

Elə burada da poetikliyi gücləndirən sinonim cərgələr onun nitqinə xüsusi rövnəq verir: "Vətən sevgisi, vətən məhəbbəti, vətən eşqi". Azərbaycan xalqının, insanlarının yaradıcılıq potensialına həmişə nikbinliklə baxan ulu öndərin nitqləri poetikliklə zəngindir. Bu poetiklik hesabına nikbinlik həyata keçirilir. "Əlbəttə, dahilər hər il yetişmir" fəlsəfi deyimi "indiyədək olmayan əsərlər bundan sonra yaranacaqdır"

nikbinlik əhval-ruhiyyəsinə və proqnozlara söykənməklə poetik bir ruhla auditoriyaları fəth edir: “Mən hesab edirəm ki, xalqımızın, bəstəkarlarımızın yaradıcılıq potensialı tükənibdir, yox. Bu gün də, sabah da əsərlər yaranacaq. Bəzən insanlar düşünürlər ki, bu olmasa biz sabah necə yaşayacağıq? Amma sabah yeni bir istedad meydana çıxar. Əlbəttə, dahilər hər il yetişmir. Bu da təbiidir. Əgər belə olsaydı, şübhəsiz ki, onların qiyməti olmazdı. Xalqımızda istedadlar potensialı çox böyükdür. Güman edirəm, indiyədək olmayan əsərlər bundan sonra yaranacaqdır. Biz də onu görəcəyik, sonrakı nəsillər də onu görəcəklər”[VIIc.s.165].

Türkiyə Prezidenti Süleyman Dəmirəlin şərəfinə rəsmi ziyafətdə nitq. 7 dekabr 1995-ci il. Poetiklik Heydər Əliyev nitqində sadə məişət üslubu ilə təmin olunur. Aşağıdakı sadə cümlədə aydınlaşır ki, Azərbaycan xalqının gücü, xarakteri, vahid lider ətrafında birləşərək çətin, ağır vəziyyətlərində belə nikbinliyini saxlamağındadır. Burada iki yerdə “məhz” dəqiqləşdirici ədatının köməyi ilə Azərbaycan xalqının xüsusiyyəti auditoriya üçün dəqiqləşir: “Qaçqın olasan, evini, eşiyini, obanı, varını-yoxunu itirəsən, qohum-əqrəbanın bir hissəsini itirəsən, şəhidlik verəsən. Və bu cür nikbin vəziyyətdə yaşayasan – bu, məhz Azərbaycan xalqına xas olan bir xüsusiyyətdir. Məhz bizim xalqımıza xas olan bir xüsusiyyətdir” [Vc.s.175].

Poetizm məişət üslublu nitqlərdə də özünü göstərir. Azərbaycan Prezidentinin 75 illik yubileyi ilə əlaqədar Bakıya gəlmiş xarici ölkələrin nümayəndə heyətlərinin şərəfinə təşkil edilmiş rəsmi qəbuldakı (8 may 1998-ci il) nitqin sonunda qonaqlarla olan söhbət bu qəbildəndir: “Başa düşürəm ki, bəziləriniz artıq hava limanına yola düşməlidir. Əlbəttə, hamınızdan xahiş edirəm ki, gecəni burada qalasanız, axşam Bakının

seyrinə dalasınız, səhər günəşin doğduğunu müşahidə edəsiniz – bütün bunlar bizdə çox maraqlı olur. Doğrudan da, şəhərin dəniz sahilində olması xüsusi gözəllik yaradır. Lakin kimsə mənim təklifimlə razılaşa bilər, kimsə də bunu qəbul etməz, əlbəttə, bunu hərənin özü müəyyənləşdirir" [XVc.s.338-339].

Heydər Əliyevin kütləvi informasiya vasitələrinin nümayəndələrinə verdiyi müsahibələrdə də poetik çalarlı nitq nümunələrinə tez-tez rast gəlirik. 29 iyul 1998-ci il tarixdə ukraynalı jurnalist Lyubov Qorbatyukun "siyasi müvəffəqiyyətinizin sirri nədədir" sualına verdiyi cavab poetik notlarla zəngindir: "...əhalinin bir çox təbəqələrinin rəğbətini hiss etmişəm. Nəyə görə? Yəqin ona görə ki, həm Azərbaycanda respublikanın başçısı kimi, həm də Moskvada Sovetlər İttifaqının rəhbərlərindən biri kimi çoxillik fəaliyyətim insanları əmin etmişdi ki, mənə inanmaq lazımdır. İnsanlar da mənə inanırlar. Şübhəsiz ki, insanların inamı mənə güc verir və bütün bu çətinlikləri dəf etməyə imkan yaradır. Hətta mən qəzəbə gələndə, təcrid olunmuş vəziyyətdə yaşayanda da belə idi. Şübhəsiz ki, mənim həyatım ağır idi, ancaq insanların inamını hiss edirdim və bu, mənə kömək edirdi" [XVIIc.s.50-51]. Nəyə görə? – ritorik sualı ilə başlayan nitq parçası tez-tez səslənən "insanlar", "inam", "ağır həyat" və sonda "şübhəsiz ki" modal sözü ilə insanların inamının dahi şəxsiyyətə güc verməsinə şübhə yeri qoymur.

Nitqdə Heydər Əliyev poetizmi şükranlıqla birgədir: "Biz Allahın, taleyin Azərbaycan xalqına bəxş etdiyi bu sərvətləri məhz xalqın rifah halını yaxşılaşdırmaq, xalqa təqdim etmək üçün işə başlayırıq. Bu, tarixi hadisədir. Bu gün iftixar hissi ilə deyə bilərik ki, bu tarixi addımı məhz indi, müstəqil Azərbaycanda biz atırıq (20 avqust 1997-ci il). "Azərqızıl" dövlət

şirkəti ilə Amerikanın R.V-investment qrup servisis LLS" şirkəti arasında saziş).

Poetik nitq iki yerdə məhz dəqiqləşdirici ədatının köməyi ilə güclənir. Heydər Əliyev poetikliyi islam fəlsəfəsi ilə çulğalaşır. Dünyanın əbədi olmaması, faniliyi prinsipi onun "amma həyatdır, heç birimiz burada daimi deyilik" fikirləri ilə üst-üstə düşür. Səməd Vurğun timsalında xalqın məhəbbətini qazanmağın nə dərəcədə mühüm olduğunu qeyd edir: "Adətən insanlar öz yanında, gözünün qabağında olanı qiymətləndirmir, keçmişdəkini, yaxud uzaqda olanı qiymətləndirir. Amma həyatdır, heç birimiz burada daimi deyilik".

Heydər Əliyev nitqinə xas olan poetiklik iqtisadi məsələlərin çözülməsində də özünü göstərir. 16 avqust 1996-cı il tarixdə sahibkarlarla görüşdə "hər şey halallıq, təmizlik, düzlük istəyir" fikri ilə nitqinə başlayan böyük natiq poetik bir deyimlə sahibkarlara öyüd verir, onları poetikcəsinə düz yola dəvət edir, dini dəyərlərimizə söykənməyə "halal yolla getsən nə itirəcəksən, nə də qusacaqsan" həqiqətini dərk etməyə çağırır: "Dünyada hər şey halallıq istəyir, təmizlik, düzlük istəyir. Keçmişdə bizim Azərbaycanda da böyük sahibkarlar, böyük mülk sahiblərinin əksəriyyəti, – deyə bilərəm hamısı, – halal yolla, halal qazandığı pulla mülk sahibi olub, sahibkar olub.

İndi biz özəlləşməyə gedirik. İstəyirik ki, insanlar mülk sahibi olsunlar, əmlak sahibi olsunlar, sahibkar olsunlar. İndiyə qədər nə olub-olubdur, bundan sonra düz yolla, halal yolla getmək lazımdır. Yaxşı olar ki, qanuni yolla gedəsən, az qazanasan, nəinki qanunu o tərəfdən – bu tərəfdən keçəsən, bir az çox qazanasan. Onu onsuz da itirəcəksən, bir az kobud desəm, qusacaqsan. Amma halal yolla getsən nə itirəcəksən, nə də qusacaqsan" [VIIc.s.230].

Yüksək vəzifə tutmaqla təvazökarlıq arasında poetik əlaqəni auditoriya üçün açıqlayır: "Bu nazirlikdə işləyən insanlar təvazökar olmalıdırlar. Təvazökarlıq çox gözəl keyfiyyətdir. Bu Nazirliyin böyük səlahiyyətləri var, onun əlində böyük imkanlar var. Bundan sui-istifadə etmək olmaz və eyni zamanda təvazökarlıq etmək lazımdır. Hər bir şəxs təvazökar olmalıdır. Heç kəs, öyünməməlidir ki, o, böyük rütbə daşıyır, böyük paqonu, böyük səlahiyyəti var. Əksinə, nə qədər təvazökar olsanız, işinizi o qədər yaxşı apara bilərsiniz. Mən öz həyatımda bunun hamısını görmüşəm" [Xc.s.363].

Böyük natiqin dilində cəmiyyətdəki neqativ hallar, çatışmamzlıqlar, hətta, deyərdik ki, yarıtmazlıqlar və yaramazlıqlar belə poetik bir dildə tənqid olunur, tənbeh olunur, cəzalandırılır. "Bürokrat" sözünə verdiyi qiymət elə bu qəbildəndir: "Bunların bir qismi bu maneçilikləri yaradaraq öz şəxsi məqsədlərinə nail olmaq istəyirlər, bizim apardığımız siyasətə zərbə vuraraq bu yollarla qanunsuz qazanc götürmək istəyirlər. Digər hissəsi isə sadəcə, keçmiş bürokratiyanın qalıqlarıdırlar, bürokratdırlar. "Bürokrat" sözünü mən özüm ən mənfi mənada işlədirəm. Yəni bu işləri o qədər süründürürlər, o qədər ləngidirlər, insanları o qədər get-gələ salırlar ki, iş görmək istəyən adam da artıq bezir, ya çəkilir kənara, ya da çıxıb gedir. Yaxud, elə Azərbaycanın öz sahibkarını o qədər incidirlər ki, o, sərmayəsini də qoymaq istəmir, aparır onu xarici bankda gizlədir" [XXIc.s.184].

İslamda müqəddəs şəxslərin uyuduğu məkanları, ziyarətgahları poetik bir dillə təsvir edən Heydər Əliyev Təbrizə olan sevgisini heç gizlətmir: "Bəli, Məşhəddə İmam Rza bizim hamımız üçün ən yüksək zirvədir. Mən sizə deyim ki, İmam Rzanın qəbrini, məbədini ziyarət edəndə heyran olmuşdum. Heyran olmuşdum ki, İran xalqı, milləti nə qədər əsrlər

boyu bunu qoruyub saxlayıb, abadlaşdırıb, gözəlləşdirib. Doğrudan, bu ziyarət insanlarda böyük təmizlik əmələ gətirir. Mən Naxçıvanda olanda gəldim, İmam Rzanın qəbrini ziyarət etdim. Burada olanda isə getdim Məkkəni, Mədinəni ziyarət etdim. Bunlar hamısı hər bir müsəlman üçün, şübhəsiz ki, müqəddəs yerlərdir. Ancaq düz deyirsiniz, Təbrizin yerini heç nə vermir. Ona görə də mən Təbrizə gəlmək arzusundayam" [XXIc.s.135].

Dini dəyərlərimizə qiymət verərkən, dini baxışlarımızı müdafiə edərkən, İslam dinini mütərəqqi din kimi təbliğ edərkən poetik ruh Heydər Əliyevin nitqini daim müşayiət edir. Mingəçevir şəhərində 8 oktyabr 1998-ci il tarixdə, Məscid kompleksinin açılışı mərasimində olduğu kimi: "Şübhəsiz ki, indi bu cür məscidlər, dini müəssisələr insanların yardımı, insanların vəsaiti əsasında tikilir. Bu da onu göstərir ki, insanlar öz mənəvi köklərinə, keçmişinə, dininə necə sadiqdirlər. Ona görə heç kəs burada sorğu-sual etməməlidir – bu, haradan tikilib, pul haradan gəlib, haraya gedib. Əsas o deyildir. Əsas odur ki, burada təhsil almaq üçün bina tikilibdir. Ona görə mən bunu bəyənirəm, alqışlayıram və bu işi görənlərə təşəkkür edirəm" [XVIIIc.s.15].

Poetik ruh Heydər Əliyevin məişət üslublu çıxışlarına da xasdır. Türkiyə prezidenti Süleyman Dəmirələ ünvanlanan ölkələrarası münasibətlərə bir aydınlıq, bir gözəllik gətirən nitq poetizmlə doludur. Bu poetizm xalqlarımızın tarixi keçmişini, eyni dilə, eyni dinə mənsubluğumuzu sadə cümlələrlə, sinonim cərgələrlə auditoriyaya çatdırır. Auditoriya sərbəst vəzndə ağsaqqal öyüdünün sehrinə düşür: "Demək olar ki, bu günlər Türkiyə-Azərbaycan dostluğu və qardaşlığı yeni bir yüksək zirvəyə qalxıbdır. Bunun da böyük əsası, kökləri vardır. Bizim xalqımız eyni köklərə, eyni mənşəyə mənsub

olan xalqlardır. Tarixi keçmişimiz bizi bir-birimizə sıx bağlayıbdır. Azadlıq, yaşamaq uğrunda əsrlər boyu apardığımız birgə mübarizəmiz bizi bir-birinə bağlayıbdır. Biz eyni dilə, eyni dinə mənsubuq. Adətlərimiz, ənənələrimiz eynidir, yaxud bir-birinə bənzərdir. Ulu babalarımız daim dost, qardaş, bir-biri ilə sıx əlaqədə olub və bu dostluğu, qardaşlığı bizə vəsiyyət ediblər. Bu vəsiyyətə sadiq qalaraq biz bu gün Türkiyə ilə Azərbaycan arasında, xalqlarımız arasında olan dostluq və qardaşlıq əlaqələrini daha yüksək zirvələrə qaldırırıq. Bu, bizim ümumi nailiyyətimizdir, xoşbəxtliyimizdir" [Vc.s.168].

Poetiklik təbiətlə bağlı nitq məqamlarında özünü göstərir: "Mən bir çox ölkələrdə olmuşam, çox dağlar görmüşəm, amma Naxçıvandakı kimi dağlara və İlanlı dağ kimi dağa şəxsən mən rast gəlməmişəm. Bəlkə də daha maraqlı, daha gözəl dağlar var, lakin bu dağ özünəməxsusluğu ilə fərqlənir, belə dağı təbiətin özü yaradıbır. Maraqlıdır ki, günün müxtəlif vaxtlarında, günəş şüalarından asılı olaraq bu dağın rəngi köklü surətdə dəyişir. Bu nə isə nadir haldır" [XVc.s.339].

R.Mustafayev adına Azərbaycan Dövlət İncəsənət muzeyində Rusiyanın məşhur rəssamı Nikas Safronovun sərgisinin açılışındakı (15 may 1998-ci il) çıxışda Heydər Əliyev poetizmi işə düşür. Milli təəssübkeşlik hissiyyatı yenidən səslənir. Bu təəssübkeşlik bütün nitqlərində olduğu kimi məntiqə söykənir. "Maraqlıdır ki, günün müxtəlif vaxtlarında, günəş şüalarından asılı olaraq bu dağın rəngi köklü surətdə dəyişir. Bu nə isə nadir bir haldır" – fikri auditoriyanı dərindən-dərinə düşündürə bilir.

Heydər Əliyev tarixdən, tarixi hadisələrdən danışarkən yeri gəldikcə poetik nitq çalarlarından böyük ustalıqla istifadə edir. Poetik dillə tarixi, tarixi hadisələri gələcək nəsillərə çatdırır. Tarixi hadisələrin poetikləşdirilməsi isə uzun müd-

dətə yaddaqalan nitq nümunəsinə çevrilir: "Mən xoşbəxtəm və şadam ki, bu şənliklərdə iştirak edirəm və tarixi hadisənin şahidiyəm. Bu həqiqətən tarixi hadisədir, çünki dövlətin paytaxtının bir yerdən başqa yerə köçürülməsi faktları dünya tarixində o qədər də çox deyildir. Ancaq mən əminəm ki, bu gün müstəqil Qazaxıstanın paytaxtına çevrilən Astana şəhəri Qazaxıstanın həmişəlik paytaxtı olacaq və paytaxt bir daha heç yerə köçürülməyəcəkdir" [XVIc.s.36].

Heydər Əliyev nitqinə ciddi nəzər yetirdikdə məlum olur ki, tariximizin ağır illəri də auditoriyaya poetik bir dillə çatdırıla bilir. Bu zaman faciəli illər – deportasiya, repressiya illəri poetik üslubla araşdırılır. Tarixin qara günləri, gələcəyə ibrət və nümunə ola biləcək qara günləri böyük natiq tərəfindən Azərbaycan dilinin böyük imkanları hesabına açıqlanır. Bu zaman "qırıldı", "tələf oldu", "əzab-əziyyət çəkdi", repressiyanı əks etdirən sinonimləri işə düşür: "O vaxt yaşayan insanlar və doğma yerlərindən deportasiya olunanlar yaxşı xatırlayır: Ermənistanın çox gözəl iqlimə – yəni bu torpaqlar vaxtı ilə Azərbaycan torpaqları olub – malik olan yaşayış yerlərindən insanları gətirib evsiz-eşiksiz Mil-Muğan çöllərinə salanda, əlbəttə ki, onlar o şəraitdə yaşaya bilməyəcəkdirlər. Məlumdur ki, o vaxt bir çox insanlar qırıldı, tələf oldu, əzab-əziyyət çəkdilər. Hətta məlumdur ki, bəziləri burada yaşaya bilmədilər, gizli olaraq qayıdıb öz yerlərinə, evlərinə getdilər. Nə qədər əzab-əziyyət, çətinliklər çəkdilər. Hesab edirəm ki, bu da bizim xalqımıza qarşı edilən ən böyük ədalətsizlikdir" [Xc.s.10].

Böyük natiq çıxışlarında poetik dillə tarixi məsələlərə aydınlıq gətirir, necə deyərlər tarixi poetik dil ilə auditoriyalara öyrədir: "İkinci dünya müharibəsində Polşa xalqının necə böyük itkilərə məruz qaldığı, nə qədər qurbanlar verdiyi yaxşı

məlumdur. Gözəl şəhər olan Varşava öz diqqətəlayiq qədim tarixi və memarlıq abidələri ilə birlikdə yerlə yeksan edilmişdi. Polşa xalqının zəhməti bahasına, məharəti sayəsində bərpa edilmiş gözəl Varşavaya bu gün biz hədsiz sevinc hissi ilə gəzintiyə çıxdıq" [XIIc.s.42].

"Biz hamımız azərbaycanlıyıq, hamımız bir millətik" söyləyən böyük natiq bir millətin övladlarını səfərbər edir, onları "kim haralıdır" fikirlərindən uzaq durmağa çağırır. "Azərbaycanın hər bir nöqtəsi hər bir azərbaycanlı üçün Vətəndir" fikrini ortaya qoyur. 2 avqust 1996-cı il tarixdə Prezident sarayında Ağdam rayonu ictimaiyyətinin nümayəndələri ilə görüşdə olduğu kimi: "Ağdamlıların bu gün söylədikləri sözlər, fikirlər onu göstərir ki, hamının bir arzusu var: İşğal olunmuş torpaqlar tezliklə azad edilsin və vətəndaşlarımız öz yerinə-yurduna qayıtsın. Ağdamlılar da Ağdama qayıtsınlar. İşğal olunmuş hər bir torpaq bizim üçün əzizdir: Laçın da, Şuşa da, Kəlbəcər də, Ağdam da, Xocalı da, Füzuli də, Cəbrayıl da, Qubadlı da, Zəngilan da hamısı əzizdir. Ümumiyyətlə, Azərbaycanın hər bir nöqtəsi hər bir azərbaycanlı üçün əzizdir. Burada doğru deyildi – heç vaxt düşünmək lazım deyil ki, kim haralıdır. Biz hamımız azərbaycanlıyıq, hamımız bir millətik. Hamımızın bir dilimiz – Azərbaycan dilimiz var, hamımız bir dinə mənsubuq, hamımız bir millətin övladlarıyıq. Və biz müstəqilliyimizi təmin etmək üçün, ölkəmizi dirçəltmək üçün, xalqımızı dünya xalqları içərisində layiqli səviyyəyə qaldırmaq üçün bir-birimizə daha çox dayaq olmalıyıq, daha çox birləşməliyik" [VIIc.s.191].

O, poetik bir dil ilə unutqanlıq kimi, qan yaddaşının itirilməsi kimi xüsusiyyətlərdən kənarda durmağı tələb edir. "Heç kəs... unutmur və unuda bilməz, unutmamışıq və unuda

bilmərik" ifadələri ilə bizləri unutqanlıq kimi dəhşətli yaddaş pozğunluğundan xilas etməyə kömək edir.

Antroponimik sıralanmalarla xilaskar sərkərdələrin – Kazım Qarabəkir bəy, Ənvər Paşa, Nuru Paşa adlarını sıralamaqla poetik bir çıxış edir: "O ağır, çətin illərdə erməni silahlı qüvvələri Azərbaycanda – Bakıda, Azərbaycanın başqa bölgələrində, o cümlədən Qarabağ bölgəsində qırğınlıq edirdilər. O vaxt türk qardaşlarımız yenə də bizim köməyimizə gəldilər. Türkiyə ordusunun Qafqaz korpusu gəlib həm Naxçıvanda, həm də Azərbaycanın başqa bölgələrində Azərbaycan xalqına öz torpağını, öz hüquqlarını, öz evini, obasını müdafiə etməkdə yardım göstərdi. Biz bunu heç vaxt unutmarıq. Naxçıvanda heç kəs Kazım Qarabəkir bəyi unutmur və unuda bilməz. O cümlədən də Ənvər Paşanı, Nuru Paşanı heç kəs heç vaxt unutmur və unuda bilməz. Onların simasında o dövrdə, o çətin dövrdə Azərbaycana gəlib kömək etmiş türk qardaşlarımızı biz heç vaxt unutmamışıq və unuda bilmərik [Vc.s.173].

Poetik çıxışların gücü onun yaddaşlara hopmasındadır. Poetizm insan təbiətinə, xüsusilə də Azərbaycan insanının təbiətinə xasdır.

Nitqin poetikliyi frazeoloji söz birləşmələri ilə təmin olunur. Sinonim cərgələr onun nitqini axıcı edir, ədatlar isə fikri qüvvətləndirir. Ən mühümü isə odur ki, nitq elementləri bir-birilə harmonik şəkildə çulğalaşır.

Burada "Azərbaycanın dərdini çəkmək", "qara günlərin keçib getməsi", "alnıaçıq, üzüağ durmaq", "tarixin sınaqlarından çıxmaq" kimi frazeoloji ifadələr, "bax" qüvvətləndirici ədatı ilə fikrin qüvvətlənməsi, hər bir təkrarları Allaha şükürlər olsun ki, dini üslublu ifadələr yuxarıdakı fikirlərə misal ola bilər.

Poetik duyğular çox vaxt Heydər Əliyev nitqinin sonunda özünü göstərir. Sonluqlarda, xüsusilə də dostluq və əməkdaşlıq görüşlərindəki sonluqlarda poetizm özünü qabarıq biruzə verir. Auditoriyanın yaddaşlarına həkk olunur. Londonda, Adam Smit İnstitutundakı ziyafətdə (29 noyabr 1995-ci il) bir cümlə doqquz dəfə təkrarlanan "şərəfinə" sözü ilə xüsusi ecazkarlıq yaradır. Burada Heydər Əliyev nitqinə xas olan məntiqi ardıcıllıq özünü göstərir. Böyük natiq üçün ilk öncə bəşəriyyətdə sülh, əmin-amanlıq, sonra iqtisadiyyatın inkişafı, ziyafətdə olduğu ölkə – Böyük Britaniya, ən sonda isə iştirakçısı olduğu auditoriyanın hörmətli dostları, xanımları və cənabları gəlir. Auditoriya belə bir məntiqi ardıcıllıqla səslənən poetik nitqi heyranlıqla, dərklə qəbul edir: "Bəşəriyyətdə sülhün və əmin-amanlığın şərəfinə, insanlar arasında sağlam münasibətlərin və yüksək mənəviyyatın şərəfinə; qanlı müharibələrə, münaqişələrə son qoyulmasının şərəfinə; ölkələrin bir-biri ilə qarşılıqlı surətdə faydalı əməkdaşlığının şərəfinə; biznesin, biznes mədəniyyətinin şərəfinə və dostluq, qardaşlıq şərəfinə; Adam Smit institutunun himayəsi altında iqtisadiyyatın bundan sonra da inkişafının şərəfinə; hörmətli dostlar, xanımlar və cənablar, sizin hamınızın şərəfinə" [Vc.s.47-48].

Heydər Əliyev nitqində poetiklik bəzən dilimizin zənginliyinə söykənən antroponimik sıralanmalarla həyata keçirilir. Antroponimik sıralanmalar sinonim cərgələrlə çulğalaşaraq nitqin emosionallığını, poetikliyini gücləndirir. Təkcə "etibarlı əsas, möhkəm bünövrə", "sivilizasiya, tərəqqi" sinonim cərgələri bu qəbildəndir: "Bütün bunlar elə bir etibarlı əsas, elə bir möhkəm bünövrədir ki, Qazax və Azərbyacan xalqları arasında dostluq onların üzərində dayanır. Dahi əcdadlarımız – Əl-Fərabi də, Dədə Qorqud da, Alpamış da, Manas da, Nizami, Füzuli, Nəsimi, Koroğlu da bizi həmişə birləşdir-

mişlər və öz yaradıcılığı, öz hünərləri ilə xalqlarımızı sivilizasiyaya, tərəqqiyə, azadlığa, müstəqilliyə səsləmişlər. Xalqımızın fəxr edə biləcəkləri bax bu zəngin keçmişimiz indi yeni mərhələdə əməkdaşlığımız üçün zəmindir" [Xc.s.108].

Poetiklik böyük natiqin nitqində sinonim cərgələrlə həyata keçirilir. Dövlət müstəqilliyimizin yolu "uğurludur, çiçəklidir, gözəldir" deyən Heydər Əliyev poetizmi "dözmüşük", "dözəcəyik", "dözümlülük xalqımızın milli xüsusiyyətidir" birləşmələrlə ifadəsini tapır: "Bu bayram günü hər bir Azərbaycan vətəndaşı bir daha düşünməlidir ki, bizim üçün həyat, yaşayış nə qədər çətin olsa da, milli azadlıq şəraitində yaşamaq, müstəqil olmaq, müstəqil, azad dövlətdə yaşamaq hər şeydən əzizdir, üstündür. Biz bu müstəqilliyi möhkəmləndirmək və daha da yüksəklərə qaldırmaq, bu milli azadlığımızı əlimizdə daim saxlamaq naminə hər bir çətinliklərə dözmüşük, bundan sonra da dözəcəyik. Azərbaycan xalqı dözümlü xalqdır. Bu, bizim xalqımızın milli xüsusiyyətidir. Azərbaycanın dövlət müstəqilliyi yolu uğurludur, çiçəklidir, gözəldir. Bu gözəl gələcək naminə sizin hamınıza cansağlığı, xoşbəxtlik arzu edirəm" [Xc.s.29].

Azərbaycan xalqının hüquqlarının kütləvi şəkildə pozulmasını Azərbaycanın BMT-nin Ümumdünya insan hüquqları bəyannaməsinin 50 illik yubileyini keçirən dövlət komissiyasının iclasında (3 dekabr 1998-ci il) Heydər Əliyev elə bir poetik tərzdə auditoriyaya çatdırır ki, belə bir nitq yalnız heyranlıq doğura bilər. "Hesab edirəm ki," modal sözü ilə fikirlərinə münasibət bildirir, "məşğul olmalıdırlar" qətiyyətlik ifadəsinin köməyi ilə hamını bu işə cəlb edir. Üç yerdə "heç kəs" inkar əvəzliyini anafora stilistlik fiqur şəkilində işlədərək nitqin ekspressivliyini, emosionallığını yüksəldir:

“...mən hesab edirəm ki, bizim dövlət orqanlarımız, hökumət orqanlarımız bu məsələlərlə ciddi məşğul olmalıdırlar!

Kompaniya şəklində yox, mütəmadi olaraq, ardıcıl. Bizim mətbuat orqanlarımız, elmi-tədqiqat təşkilatlarımız, qeyri-dövlət təşkilatlarımız hamısı bu işlə ciddi məşğul olmalıdırlar. Bu məsələ barəsində Azərbaycanda hamı həmfikir olmalıdır. Bu məsələ barəsində iqtidar, müxalifət ola bilməz. Bu bizim ümumi mənəvi işimizdir, mənəvi borcumuzdur. Burada heç kəs özü üçün bir fayda axtarmamalıdır. Heç kəs bu məsələni özü üçün istismar etməməlidr. Heç kəs bu məsələdən öz şəxsi məqsədi üçün sui-istifadə etməməlidir”[XVIIIc.s.309].

“Mənim yaratdığım hər bir şey mənim üçün əzizdir” fəlsəfi fikrini ortaya qoyan ulu öndər bu gün bizləri bizlərə əmanət etdiyi müstəqil Azərbaycanın qayğısına qalmağa səsləyir. Sonrakı fəlsəfi məna yükü daşıyan cümlədə isə insan fəlsəfəsini ortaya qoyur: “Mənim yaratdığım hər bir şey mənim üçün əzizdir! Zavod da, fabrik də, elektrik stansiyası da, yol da, körpü də, ev də, bina da, saray da – hər bir şey. Amma mənim üçün hər şeydən əziz mənim xalqımdır, mənim Vətənimdir, mənim torpağımdır, insanlardır. Mən daim insanlara xidmət etmişəm. Bu gün də vətəndaşlarıma, xalqıma xidmət edirəm. O ağır günlərdə də xalqımdan, sıravi adamlardan, səmimi adamlardan həmişə dəstək almışam. Ona görə də mən xalqıma – Azərbaycan xalqına öz sədaqətimi bir daha bildirirəm və xalqımı yaşadan insanlara, xalqımı irəliyə aparan insanlara öz hörmət və təşəkkürümü bildirirəm” [Vc.s.218].

Burada da qüvvətləndirici “da, “də” ədatları, təkrarlar poetikliyə xidmət edən nitq vasitələri kimi özünü göstərir.

Heydər Əliyev nitqində poetik ruhlu parçaların ən çox mədəniyyətimizlə, ədəbiyyatımızla bağlı görüşlərdə təsadüf

olunacağını güman etsək də, sonda məlum olur ki, bu poetik ruh zavodla, fabriklə, iqtisadiyyatla da bağlıdır.

Təkcə Bakı Məişət Kondisionerləri zavodunun 20 illik yubileyi münasibətilə təntənəli nitqindəki çıxış buna sübutdur.

Elə zavodun tikildiyi əraziyə olan baxış, həmin ərazinin keçmişi ilə bağlı olan xatirə poetizmlə doludur: “Bu yer mənim yadımdadır. Mən ilk dəfə buraya gələndə bu yerlər çöllük –biyabanlıq idi. Bu yerlərdə daha nələr yox idi... Bura boş bir yer idi. Bu zavodda işləyənlər bilirlər ki, onun üstündə nə qədər cihazlar varsa, altında da bir o qədər cihazlar yerləşdirilib. Mən bunalrın hamısını müşahidə etmişəm. Ona görə də bu bizim üçün böyük sərvətdir”.

Zavodun tikildiyi ərazini “bu yerlədə daha nələr yox idi” deməklə auditoriyanın təsəvvüründə canlandırır və insanın nələrə qadir olduğunu dilə gətirir.

Zavodun kollektivinə təşəkkür edən böyük natiq kollektivin tərkibini də, iş stajlarını da poetikcəsinə analiz edir, auditoriya kollektivin yaxın dostunu səmimiyyətlə dinləyir: “İyirmi il müddətində burada çox adamlar işləyiblər, gəliblər, gediblər. Amma, elələri var ki, zavod tikiləndən, işə başlayandan bəri, iyirmi ildir buradadırlar. Bəziləri burada çıxış etdilər. Xüsusən, bizim hörmətli dostumuz, bu zavodun tikintisində iştirak edən başqa adamlar, zavodun veteranları, gənclər çıxış etdilər. Hamınız buradasınız. Çoxunuz iyirmi ildir işləyirsiniz. Ondan sonra gələnlər də var. Hamınıza təşəkkür edirəm” [Vc.s.217].

Poetikcəsinə deyilən “... işləyiblər, gəliblər, gediblər”, eləcə də “elələri var ki, ...iyirmi ildir buradadılar” ifadələri nitqin ekspressivliyini, auditoriyaya təsir gücünü artırır.

Bakı məişət kondisionerləri zavodunun 20 illik yubileyi münasibətilə təntənəli nitinqdə çıxış. 25 dekabr 1995-ci il [Vc.s.217].

Təntənəli mitinqin sonunda Heydər Əliyev nitqi poetikcəsinə canlı insanlardan zavoda, zavodun “hər bir divarına”, “hər bir cihazına” yönəlir. İnsanlığa xidmət edən “hər şey” onun üçün əziz olur. Və nitqini şükranlıqla, poetikliklə sona yetirir: “O vaxtlar mən uzaqlarda Azərbaycanın dərdini çəkirdim, o cümlədən daim bu kollektivin, bu zavodun da dərdini çəkirdim. Çünkü bu kollektiv, bu zavod, bax bu müəssisənin hər bir divarı, hər bir guşəsi, hər bir cihazı, bu zavodun ətrafında o vaxtlar mənim təşəbbüsümlə əkilmiş qızılgüllər, ağaclar, bir sözlə, hər şey mənim üçün əzizdir. Ona görə də o çətin illərdə mən öz dərdimi unudub, xalqımın dərdini, respublikamın dərdini çəkirdim, sizin dərdinizi, bu kollektivin dərdini çəkirdim. Allaha şükürlər olsun ki, o qara günlər keçib getdi, biz tarixin sınaqlarından çıxdıq. Mən iyirmi il bundan qabaq sizin qarşınızda idim, indi bu gün də sizin qarşınızda alnıaçıq, üzüağ durmuşam” [Vc.s.218].

Heydər Əliyev nitqlərinə poetiklik verən təkrarlar burada da özünü göstərir. “Hər bir”, “bu”, “dərdimi, dərdinizi” təkrarları diqqətəlayiq olaraq nitqi axıcı, rəvan, yaddaqalan edir.

Böyük natiqin nitqində ən çox təsadüf edən poetik çalarlı ifadələrə diqqət yetirilmişdir:

“Gecəm də budur, gündüzüm də” – Bunun az bir hissəsini televiziya ilə görürsünüz, amma, çox hissəsini görmürsünüz. Gecəm də budur, gündüzüm də [Xc.s.160].

“Mən bu əziyyəti çəkmək üçün doğulmuşam” – Məni indi həyatda başqa heç bir şey maraqlandırmır: yaşayışım yaxşıdır-pisdir, işim çoxdur, yoruluram ya yorulmuram, əziyyət

çəkirəm-çəkmirəm. Mən bu əziyyəti çəkmək üçün doğulmuşam [Xc.s.160].

"Bu da mənim taleyimdir" – Hər adamın bir taleyi var, bu da mənim taleyimdir. Mən də taleyimdən razıyam, baxmayaraq ki, sizin kimi mən də həqiqətən, burada doğru söz dediniz, – bəli, mən də köçkün olmuşam, qaçqın vəziyyətində yaşamışam, sürgün olunmuşam [Xc.s.161].

"Bədənində, qəlbində sağalmaz yaradır" – Bu Azərbaycan xalqının bədənində, qəlbində sağalmaz yaradır və eyni zamanda bizə dərs oldu ki, gərək öz müstəqilliyini əziz tutasan, onun qədir-qiymətini biləsən [Xc.s.113].

"Bax bu zəngin keçmişimiz indi yeni mərhələdə əməkdaşlığımız üçün zəmindir" – Xalqlarımızın fəxr edə biləcəkləri bax bu zəngin keçmişimiz indi yeni mərhələdə əməkdaşlığımız üçün zəmindir [Xc.s.108].

"Bu sizə bəxş edilmiş Allah vergisidir" – Bilirsiniz, bir dəfəyə, fasiləsiz olaraq bu qədər çox və çətin mahnıları gözəl səslə və parlaq şəkildə ifa etmək – bu sizə bəxş edilmiş Allah vergisidir [Xc.s.48].

"Bu qiymətli və əziz nə varsa hamısını möhkəmləndirməyə xidmət edən böyük işdir" – Bu, əlaqələrin, dostluğun möhkəmlənməsinə, qiymətli və əziz nə varsa hamısını möhkəmləndirməyə xidmət edən böyük işdir [Xc.s.49].

"Amma ulu Vətəni, kökü, ata-babasının Vətəni Azərbaycandır" – Hər bir yerdə yaşayan soydaşımız gərək bilsin, – yaşadığı yer şübhəsiz ki, onun vətənidir, amma ulu Vətəni, kökü, ata-babasının Vətəni Azərbaycandır [Xc.s.130].

"İşğal olunmuş hər bir torpaq bizim üçün əzizidir" – İşğal olunmuş hər bir torpaq bizim üçün əzizdir! Laçın da, Şuşa da, Kəlbəcər də, Ağdam da, Xocalı da, Füzuli də, Cəbrayıl da, Qubadlı da, Zəngilan da – hamısı əzizdir [VIIc.s.191].

“Lahıc özü də Azərbaycanın bir abidəsidir” – Bu sərgidə mən sizin rəssamlığınızın indiyə qədər bilmədiyim bir incəliyini hiss etdim. Siz Lahıcın gözəlliyini göstəririsiniz. Lahıc özü də Azərbaycanın bir abidəsidir [VIIc.s.197].

“Dünyada hər şey hallalıq istəyir, təmizlik, düzlük istəyir” – Keçmişdə bizim Azərbaycanda böyük sahibkarlar, böyük mülk sahiblərinin əksəriyyəti, – deyə bilərəm hamısı – halal yolla, halal qazandığı pulla mülk sahibi olub, sahibkar olub [VIIc.s.320].

“Bu qazma qurğusuna “Dədə Qorqud” adı verildi” – Bu qazma qurğusuna “Dədə Qorqud” adı verildi. Eyni zamanda, bu qurğu yenidən doğulubdur. Ona görə də onun yeni adı olmalıdır [VIIc.s.247].

“Xoşbəxtlik odur ki, insan 70 yaşında vəfat edib, amma 30 il də ondan sonra yaşayır” – İnsanın xoşbəxtliyi nədir? Xoşbəxtlik təkcə o demək deyil ki, o necə yaşayıb. Xoşbəxtlik odur ki, insan 70 yaşında vəfat edib, amma 30 il də ondan sonra yaşayır [VIIc.s.259].

“Sizin oxuduğunuz o şeirlər, dediyiniz sözlər, səslənən musiqi də fəlsəfədir” – Vahidin əsərləri başdan-başa fəlsəfədir. Bax, bu axşam ki, yubiley tədbiri də bir fəlsəfə gecəsidir. Sizin oxuduğunuz o şeirlər, dediyiniz sözlər, səslənən musiqi də fəlsəfədir [VIIc.s.259].

“Mənim həyatımın məqsədi Azərbaycandır, Azərbaycan xalqıdır, Azərbaycan Respublikasıdır, Azərbaycan vətəndaşıdır”[VIIc.s.288].

“Amma, Naxçıvan məni bağrına basdı, qoynuna aldı” – Bakıda da yaşamaq mümkün olmadığına görə doğulduğum yerə, Naxçıvana getdim. Mən orada ağır, çox çətin illər keçirdim, amma Naxçıvan məni bağrına basdı, qoynuna aldı [XIc.s.298].

"Mən həyatın hər bir üzünü görmüşəm" – Mən həyatın hər bir üzünü görmüşəm. Lap pis də, ağır da, lap yüksək şəraitdə də yaşamışam [XIc.s.360].

"Amma həyatdır, heç birimiz burada daimi deyilik" – Adətən insanlar öz yanında, gözünün qabağında olanı qiymətləndirmir, keçmişdəkini, yaxud uzaqda olanı qiymətləndirir. Amma həyatdır, heç birimiz burada daimi deyilik [XIIIc.s.29].

Poetiklik kimi nitq elementinin Heydər Əliyevin nitqlərində araşdırılmasının gələcəkdə də davam etdirilməsi ədəbiyyatşünaslarımızın, dilçilərimizin qarşısında duran vəzifələrdəndir.

# XI FƏSİL

# HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ ELMİ ÜSLUB

Elmi terminologiyalarla auditoriyalara yol açan, məntiqi təfəkkürə söykənən, ümumiləşdirmələrə və nəticələrə gətirib çıxaran elmi üslub Heydər Əliyevin nitqində araşdırılmamışdır. Bu üslub Heydər Əliyevin beynəlxalq konfranslardakı, sessiyalardakı çıxışları əsasında öyrənilmiş, digər üslublarla əlaqəyə diqqət yetirilmşdir.

Bu gün ədəbi dilin bədii, elmi, publisistik, rəsmi-işgüzar, məişət kimi funksional üslubları ayırd olunur. Ədəbi dilin funksional üslublarının hər birinin işlənmə sahəsi vardır. Elmi üslubdan akademiya və elmi müəssisələr sistemində, beynəlxalq konfrans, simpozium, treyninq və sairədə geniş istifadə olunur.

Dilçi alimlərimiz tərəfindən Heydər Əliyevin nitqləri elmi üslub baxımından demək olar ki, tədqiq olunmamışdır.

Elmi məzmun dərinliyi və məntiqi ardıcıllığa söykənən bu üslub ulu öndərimizin bir sıra beynəlxalq konfranslardakı çıxışları əsasında araşdırılmışdır. Belə ki, 1994-cü ildə Birləşmiş Millətlər Təşkilatının Baş Məclisinin 49-cu sessiyasındakı çıxışında biz siyasi natiqliyin elmi üslubunun şahidi oluruq. Bu sessiyada Heydər Əliyevə xas olan analitik təfəkkürün işə düşməsini, sağlam məntiqə söykənən təhlilləri və sessiya iştirakçılarının qəbul etdikləri nəticələri izləyirik.

BMT Baş Məclisinin 49-cu sessiyasındakı çıxışda biz Heydər Əliyevi siyasi icmal aparan alim kimi görürük. Akademik nitq öz rəvanlığı ilə davam edir: "Lakin, bəşəriyyət qarşısında duran təhlükələr hələ heç də tamamilə aradan qaldırılmamışdır. Hələ də köhnə stereotiplər mövcuddur, on illərlə davam etmiş qarşıdurma dövrü ərzində yığılıb qalmış çoxsaylı

problemlər, xüsusən tərksilah, kütləvi qırğın silahlarının məhv edilməsi sahəsindəki problemlər aradan qaldırılmamışdır...

Köhnə dünya qaydasının pozulmasının reallıqlarına çevrilmiş azğın millətçilik və separatçılıq Qafqazı, Balkan yarımadasını, yer kürəsinin başqa nöqtələrini od-alova və qana bürüyən münaqişələr doğurmuşdur. Bu münaqişələr nəinki müstəqil dövlətlərin inkişafını ləngidir, hələ möhkəmlənməmiş demokratik cəmiyyətlərin varlığı üçün birbaşa təhlükə doğurur, həm də bütün dünyada sülh və təhlükəsizlik üçün qorxu yaradır" [IIc.s.307].

Elmi üslubun tələb etdiyi terminlərə geniş yer verilməsi[1] Heydər Əliyevin bu çıxışında da özünü göstərir: "Milli müstəqillik", "söz, mətbuat, vicdan azadlıqları", "iqtisadi islahatlar", "millətçilik və separatçılıq", "təhlükəsizlik şurası", "xalqların öz müqəddəratını təyin etməsi", "qaçqınlar", "etnik münaqişələr", "qaçqın və köçkünlər", "beynəlxalq iqtisadi əməkdaşlıq", "beynəlxalq hüquq normaları" və s.

Onun BMT Baş Məclisindəki akademik çıxışı, rəvan nitqi birdən-birə ayıldıcı, qətiyyətli, amiranə bir siyasi nitqə, haqqın müdafiəsinə qalxan bir siyasətçinin nitqinə çevrilir: "Digər tərəfdən, Təhlükəsizlik Şurası da qəbul edilmiş qətnamələrin yerinə yetirilməsi mexanizmini işə salmamışdır. Belə bir sual meydana çıxır: Təhlükəsizlik Şurası nə dərəcədə ardıcıl və qətiyyətlidir, hər bir konkret halda onun səlahiyyətlərinin tətbiq dərəcəsi nə ilə müəyyən edilir?

Təhlükəsizlik Şurasının qərarlarının yerinə yetirilməməsi BMT-yə qarşı işləyir və onun beynəlxalq sülhü və təhlükə-

---

[1] Abdullayev N., Məmmədov Z. "Nitq mədəniyyətinin əsasları". Bakı, 2010. səh.236

sizliyi qoruyub saxlamaq kimi əsas vəzifəsini yerinə yetirmək bacarığına inamı poza bilər” [IIc.s.310].

BMT Baş məclisinin 49-cu sessiyasındakı çıxış elmi üslublu siyasi natiqliyin bariz nümunəsidir. Öz rəvanlığı ilə davam edən akademik nitq XX əsrin sonundakı dünyanın vəziyyətini analitik təfəkkür əsasında sessiya iştirakçılarına çatdırır: “Lakin bəşəriyyət qarşısında duran təhlükələr hələ heç də tamamilə aradan qaldırılmamışdır. Hələ də köhnə stereotiplər mövcuddur, on illərlə davam etmiş qarşıdurma dövrü ərzində yığılıb qalmış çoxsaylı problemlər, xüsusən tərksilah, kütləvi qırğın silahının məhv edilməsi sahəsindəki problemlər aradan qaldırılmamışdır. İqtisadi imkanları müxtəlif olan dövlətlərin münasibətləri də əvvəlki kimi, yenə də keçmişin bəlalarına düçar olmuşdur. Zaman ekoloji təhlükələr, əhali və inkişaf problemləri ilə əlaqədar bizi yeni-yeni sınaqlara çəkir.

Köhnə dünya qaydasının pozulmasının reallıqlarına çevrilmiş azğın millətçilik və separatçılıq Qafqazı, Balkan yarımadasını, Yer kürəsinin başqa nöqtələrini od-alova və qana bürüyən münaqişələr doğurmuşdur. Bu münaqişələr nəinki müstəqil dövlətlərin inkişafınıləngidir, hələ möhkəmlənməmiş demokratik cəmiyyətlərin varlığı üçün birbaşa təhlükə doğurur, həm də bütün dünyada sülh və təhlükəsizlik üçün qorxu yaradır” [IIc.s.307].

Elmi üsluba söykənən yuxarıdakı nitq parçasında işlədilən məcazi mənalı ifadələr: “zaman ekoloji təhlükələrlə....bizi yeni-yeni sınaqlara çəkir” və frazeoloji birləşmələr: “Yer kürəsinin başqa nöqtələrini od-alova və qana bürüyən münaqişələr doğurmuşdur” elmi üsluba xələl gətirmədən BMT tribunası səviyyəsində nitqin təsir gücünü yüksəldir.

Emosionallıq, obrazlılıq elmi üslub üçün xarakterik olmasa da, Heydər Əliyevin nitqi burada da, necə deyərlər, qəlibətəsnifata sığmır. Amma belə “kənaraçıxmalar” Heydər

Əliyevin akademik nitqinə xüsusi çalarlar verir: "Sizin bir çoxunuza "müharibə", "silahlı münaqişə" məfhumları xoşbəxtlikdən, tarixi və ya evinizdən uzaqda baş verən hadisələri xatırladırsa, mənim xalqım üçün bu, amansız reallıq, qanlı-qadalı adi günlərdir" [IIc.s.308].

Terminologiyalara söykənən elmi üslub Heydər Əliyevin konfranslardakı çıxışlarında özünü göstərir.

Bu yeni terminlər – xarici investor, transmilli korporasiya, neft şirkəti, konsorsium, infrastruktur, reabilitasiya kreditləri, valyuta-kredit sistemi, xüsusi sahibkarlıq, xarici kapital, sponsorlar, özəl mülkiyyət, aqrar sektor, əcnəbi sərmayədar, vergitutma sistemi və sairə həm də böyük natiq tərəfindən neologizmlər kimi də işlənməklə yanaşı, auditoriyalara izah olunur. "Azərbaycanda investisiya imkanları" konfransında "sponsor", "sponsorluq" terminləri təbii ki, London auditoriyası üçün yox, müstəqilliyə qədəm qoyan Azərbaycan auditoriyası üçündür desək səhv etmərik. Məhz, Londonda da, dünyanın başqa iri sənaye və siyasi mərkəzlərindəki çıxışlarında da Heydər Əliyev Azərbaycan auditoriyası üçün danışır: "Mən bu konfransın hazırlanmasının və keçirilməsinin sponsorlarına təşəkkürümü bildirmək istəyirəm".

İqtisadi məsələlərlə bağlı konfranslarda özünəməxsus iqtisadi terminologiya Heydər Əliyevin nitqində işə düşür, auditoriya böyük natiqin dilindən yeni iqtisadi terminləri mənimsəyirlər. İstanbulda "Qara dəniz regionunda yeni imkanlar" mövzusunda keçirilmiş biznes konfransında (28 aprel 1997-ci il) tez-tez işlədilən terminlər bu sıradandır: "regional ticarət", "biznes konfransı", "infrastruktur", "iqtisadi potensial", "investisiya qoyuluşu", "enerji daşıyıcıları", "nəqliyyat, energetika, rabitə sistemləri" [IXc.s.232-234].

Elmi üslubda aktiv şəkildə terminoloji leksikadan istifadə etmək mümkündür ki,[1,2] Heydər Əliyevin nitqlərində buna ciddi şəkildə əməl olunur. BMT Baş məclisinin 49-cu sessiyasındakı çıxışda (29 sentyabr 1994-cü il il) dünyadakı ictimai-siyasi vəziyyətin araşdırılması, XX əsr münaqişələr fəlsəfəsinin ortaya qoyulması kimi fikir və müddəalar siyasi terminologiyadan istifadəni zəruri edir. Elə bu sessiyada aşağıdakı terminlər: "milli müstəqillik", "siyasi plüralizm", "iqtisadi islahatlar", "söz, mətbuat, vicdan azadlıqları", "millətçilik və separatçılıq", "xalqların öz müqəddəratını təyin etməsi", "təhlükəsizlik şurası", "regional münaqişələr", "bazar iqtisadiyyatı", "qaçqın və köçkünlər", "beynəlxalq iqtisadi əməkdaşlıq", "beynəlxalq hüquq normaları" və sair böyük natiqə sessiyadakı çıxışını auditoriyaya çatdırmağa xidmət edir [IIc.s.306-314].

Elmi üsluba xas olan terminologiya Heydər Əliyevin "Aqrar islahat: problemlər və onların həlli yolları", "Sahibkarlığın strategiyası və iqtisadiyyatın yenidən qurulması" kimi beynəlxalq konfranslardakı çıxışlarında da gözlənilir. "Aqrar sektor", "iqtisadi islahatlar", "azad sahibkarlıq", "kiçik müəssisə", "islahatçılıq", "mühafizəkarlıq", "pambıqçılıq bölgələri", "sərbəst iqtisadiyyat prinsipləri", "heyvandarlığın məhsuldarlığı", "xarici investisiya", "müştərək sahibkarlıq", "iqtisadi potensial", "məhsuldar qüvvələr", "əmək ehtiyatları", "Azərbaycan sahibkarı" kimi terminlər mövzunun açar sözləri rolunu oynayır.

---

[1] Abdullayev N., Məmmədov Z. "Nitq mədəniyyətinin əsasları". Bakı, 2010. səh.236

[2] Введенская Л.А., Павлова Л.Т., Кашаева Е.Ю. "Культура речи государственного служащего". – Ростов н/Д: Феникс, 2011. с.40

Heydər Əliyevin nitqlərinin başlıca cəhəti və mühüm gücü anlayışlara verilən özünəməxsus Heydər Əliyev izahıdır. Bu izahlara heç bir ensiklopedik rəhbərlikdə rast gəlinmir. Bu izahlara bir tərəfdən elmilik, digər tərəfdən sadə xalq dilində auditoriyalara ünvanlanmaq xasdır. 17 fevral 1996-cı il tarixdə, Respublika sarayında Azərbaycan Milli Televiziyasının 40 illiyi münasibətilə təntənəli yubiley gecəsindəki çıxış "televiziya nədir" sualına geniş və hərtərəfli izahdan ibarətdir desək, heç də, yanılmarıq. Öncə televiziyaya sadə, anlaşıqlı tərif verilir, sonra televiziyanın cəmiyyətdəki rolundan bəhs edilir: "Televiziya bütün informasiya orqanlarından ən kütləvisidir. İndi heç kəs öz həyatını televiziyasız təsəvvür edə bilməz. Yəqin ki, televiziyasız yaşamaq da mümkün olmaz. Ötən 40 ildə xalqımızın iqtisadiyyatının, mədəniyyətinin, elminin inkişafında televiziya görkəmli rol oynamışdır, respublikamızın ictimai-siyasi həyatında televiziyanın fəaliyyəti əvəzsiz olmuşdur. Televiziya bir tərəfdən əhalini məlumatlandırmış və məlumatlandırır, dünyada baş verən hadisələri xalqa çatdırır, digər tərəfdən respublikamızda elm, mədəniyyət, iqtisadiyyat, təhsil və bütün başqa sahələrdə olan nailiyyətləri nümayiş etdirir, təbliğ edir, vətəndaşlarımıza çatdırır" [Vc.s.343].

Auditoriyalarda problemləri elmi şəkildə çözmək gücündə olan nitqlər daim yaddaqalandır. Respublika Ailə-Sağlamlıq Mərkəzinin açılışındakı çıxışda (29 dekabr 1995-ci il) Heydər Əliyev səhiyyənin bu gün aktual olan problemlərini peşəkar səhiyyə təşkilatçısı kimi incə təfərrüatlarına qədər açıqlayır, bu zaman tibb elmi üçün xarakterik olan terminologiyadan müvəffəqiyyətlə istifadə edir: "Dünyanın bütün insanlarının sağlamlığı üçün xas olan amillər var. Eyni zamanda dünyanın hər bir regionunun iqlim şəraitindən asılı olaraq, yaxud da bəzi genetik xüsusiyyətlərdən asılı olaraq özünəməxsus problemləri var. Ona görə də Azərbaycanın səhiyyə işçiləri, tibb

alimləri gərək həm qlobal problemləri yaxşı bilsinlər, həm də bu problemlərlə əlaqədar ölkəmizdə tədqiqat işləri, profilaktiki işlər, müalicə işləri aparsınlar. Bununla yanaşı Azərbaycanın özünəməxsus xüsusiyyətlərini nəzərə alaraq, insanların sağlamlığı ilə bağlı problemləri də araşdırsınlar. Belə problemlər var” [Vc.s.221].

Bu parçada “amillər”, “region”, “genetik xüsusiyyətlər”, “səhiyyə işçiləri”, “profilaktik işlər”, “qlobal problemlər” kimi elmi, yüksək kitab leksikasına aid sözlər çıxışa elmilik qazandırır.

Heydər Əliyevin nitqinə məxsus olan elmilik Azərbaycan dilinin geniş imkanlarından yararlanır. Nitqdə elmilik dəqiqləşdirmələr tələb edir ki, bu baxımdan dəqiqləşdirici ədatlar böyük natiqin dilində həm qüvvətləndirmək, həm də dəqiqləşdirmək xüsusiyyəti kəsb edir. Sovetlər Birliyindən qopmuş, təzəcə müstəqilliyə qədəm qoyan gənc Azərbaycan Respublikasının dünya iqtisadiyyatına inteqrasiyası üçün vacib olan konfranslarda çıxış edərək auditoriyaları inandırmaq gücündə olan Heydər Əliyev nitqi məhz araşdırılmağa layiqdir.

Belə nitqlərdən biri 29 noyabr 1995-ci il tarixdə, London şəhərində “Azərbaycanda investisiya imkanları” beynəlxalq konfransdakı nitqdir. Azərbaycanın böyük potensial imkanlara malik olmasını dəqiqləşdirmək üçün Azərbaycanın mövqeyi, geosiyasi vəziyyəti, mədəni irsi barədə ətraflı məlumat verilir: “Azərbaycan yeni, gənc müstəqil dövlətdir, müstəqil inkişaf yoluna qədəm qoymuş ölkədir, dünya birliyində öz layiqli yerini tutan, hamı tərəfindən qəbul olunmuş dünya standartları əsasında dünya iqtisadiyyatına sıx bir şəkildə qoşulmağa çalışan ölkədir. Bildiyiniz kimi, Azərbaycan Qafqazda, Avropa və Asiyanın qovuşuğunda yerləşir. Onun qədim və zəngin mədəniyyəti var. Azərbaycan bütün dövrlərdə dünya

mədəniyyətinə layiqli töhfələr vermişdir. Məhz bu zəmində də indi Azərbaycan böyük potensiala malikdir" [Vc.s.21-22].

Heydər Əliyevin beynəlxalq konfranslardakı çıxışlarında elmi üsluba daha çox yer ayrılır. Daha doğrusu, elmi konfranslar elə elmi üsluba da söykənir. Londonda "Azərbaycanda investisiya imkanları" beynəlxalq konfransdakı (29 noyabr 1995-ci il) çıxışın araşdırılması elmi üslubun Heydər Əliyev nitqində araşdırılmasına böyük töhfə olar.

Elmi üslubun tələb etdiyi iri, mürəkkəb cümlələr Heydər Əliyev nitqində də özünü bariz şəkildə göstərir. Lakin bu cümlələr sadəcə elmi üslubun tələb etdiyi kimi iri cümlələr yox, sinonimlərlə, təkrarlarla, frazeoloji birləşmələrlə və ədatlarla qüvvətlənən iri cümlələrdir:[1] "Azərbaycan yeni, gənc müstəqil dövlətdir, müstəqil inkişaf yoluna qədəm qoymuş ölkədir, dünya birliyində öz layiqli yerini tutan, hamı tərəfindən qəbul olunmuş dünya standartları əsasında dünya iqtisadiyyatına sıx bir şəkildə qoşulmağa çalışan ölkədir".

Təkcə bir cümlə ilə Azərbaycan haqqında müfəssəl məlumat verilir. "Yeni", "gənc", eləcə də "dövlət", "ölkə" sinonimləri, "ölkə" sözünün təkrarlanması cümlənin məna gücünü artırır, auditoriya sadə, anlaşıqlı bir dildə ulu öndərin fikrini qavrayır.

Elmi üsluba xas olan cəhətlərdən biri nitqin sonluğunda "beləliklə" yekunlaşdırıcı modal sözündən istifadədir ki, bu modal söz Heydər Əliyevin dilində müxtəlif çeşidli auditoriyalarda yerindəcə işlənir. Respublika sarayında, dahi Azərbaycan şairi və mütəffəkiri Məhəmməd Füzulinin anadan olmasının 500 illik yubileyinə həsr edilmiş təntənəli gecədə (8 sentyabr 1996-cı il) öncə Füzuli yaradıcılığı bir filoloq-alim

---

[1] Axundov A. "Din və mədəniyyət". Bakı, "Yazıçı", 1992. səh.110

kimi böyük natiq tərəfindən incə təfərrüatlarınadək açıqlanır, sonda isə “beləliklə” modal sözü ilə yekunlaşır: “Beləliklə, Məhəmməd Füzuli öz yaradıcılığı ilə, öz əsərləri ilə indiyədək yaşamış, indi də yaşayan və bizim hamımıza ilham verən, mənəvi qida və ruh verən əsərləri ilə sonrakı nəsillərin şair, yazıçı, bəstəkar, rəssam və heykəltəraşlarının yaradıcılığı üçün gözəl mövzular, ideyalar vermiş, onlara ilham vermiş, onların öz sənətlərinin yüksək zirvələrinə qalxmasına kömək etmişdir” [VIIIc.s.27].

Elmi üslublu çıxış və nitqlərini ən çox “beləliklə” modal sözü ilə yekunlaşdırır: “Beləliklə, milli mədəniyyətimizin, ədəbiyyatımızın inkişafının qarşısını almaq cəhdləri nə qədər çox olmuşdursa da, milli ədəbiyyatımızda, mənəviyyatımızda, mədəniyyətimizdə olan bir o qədər, bəlkə də ondan da çox olan güclər özünə cürbəcür yollar açmış və ümumbəşəri dəyərlərdən istifadə edərək daha da yüksək səviyyələrə çatmışdır” [VIIIc.s.7].

Elmi üslub üçün xarakterik olan mürəkkəb cümlə sintaktik vahidindən istifadə özünü Heydər Əliyevin İqtisadi Əməkdaşlıq Təşkilatının zirvə görüşlərindəki nitqlərində göstərir. 13 may 1997-ci il tarixli Aşqabad zirvə görüşündəki kimi: “Bakı limanının və Xəzərdəki digər limanların inkişaf etdirilməsi işləri onlara ticarət-kommersiya mərkəzləri funksiyaları verilməsi yolu ilə həyata keçirilməlidir. Bununla əlaqədar iri proqramlara ehtiyac yaranır. Elə proqramlara ki, mövcud infrastrukturu beynəlxalq standartlara yaxınlaşdırmaq məqsədilə burada həm dəmir yolunun, avtomobil magistrallarının ayrı-ayrı qovşaqlarının, həm də liman təsərrüfatının yenidən qurulması, modernləşdirilməsi və inşası nəzərdə tutulsun” [IXc.s.444].

Elə bu mürəkkəb cümlələrdə işlənmiş “modernləşdirmə”, “infrastruktur”, “ticarət-kommersiya” terminləri elmi üslubun

ayrılmaz tərkib hissəsidir və terminoloji leksikada beynəlmiləl sözlərin rolunun artmasına sübutdur.

Heydər Əliyev nitqinə xas olan elmilik, o cümlədən yazıçılar qurultayında da üzə çıxır. Türk dünyası yazıçılarının III qurultayındakı nitq tam şəkildə elmilik kəsb edir. Bu qurultayda şair və yazıçıların xalqların həyatındakı rolu mürəkkəb cümlələrin köməyilə auditoriyaya çatdırılır: "Çoxəsrlik tariximizdə xalqlarımızı yaşadan, qoruyan və bugünkü günlərə gətirib çıxaran amillərdən biri, ola bilər ki, ən əsası, bizim mədəniyyətimiz, ədəbiyyatımız, deməli, şairlərimiz, yazıçılarımızdır. Xalqlarımız tarix boyu insan həyatının bütün sahələrində, bəşəriyyətin bütün sahələrində öz istedadını, biliyini, bacarığını göstərmiş, elmi ixtiraları, qəhrəmanlıq nümunələri, böyük tarixi-memarlıq abidələri və böyük bədii əsərləri, musiqisi ilə parlaq səhifələr yazmışlar. Bunların arasında şairlərimizin, yazıçılarımızın xidməti və tariximizin yaranmasında, saxlanmasında onların əsərlərinin qiyməti çox böyükdür" [VIIIc.s.6].

Fikrin yekunlaşmasına xidmət edən "beləliklə" modal sözü Heydər Əliyevin elmi üslublu nitqləri üçün çox xarakterikdir: "Beləliklə, Azərbaycanda iri sənaye potensialı yaranıbdır" fikrinin arxasınca bu sənaye potensialı dəqiqləşdirilir: "Azərbaycanın bioiqlim şəraiti burada kənd təsərrüfatının, kənd təsərrüfatı məhsullarının istehsalı və emalının demək olar, bütün sahələrinin geniş inkişaf etməsinə imkan veribdir. Ona görə də Azərbaycan tarazlaşmış iqtisadiyyata malikdir – onun özünün xammal imkanları, emal bazası, sənaye müəssisələri var və bunlar hamısı birlikdə vahid iri iqtisadi potensial təşkil edir"

Elə bu kiçik parçada elmilik məntiqi ardıcıllıqla səciyyələnir. Cümlədaxili məntiqi ardıcıllıq burada da işə düşür: xammal imkanları-emal bazası-sənaye müəssisələri.

Elmi üslub natiqdən məsələlərə aydınlıq gətirilməsini tələb edir. Aydınlıq gətirmək elə dəqiqləşdirmək anlamındadır ki, bu da böyük natiqin nitqində "məhz" dəqiqləşdirici ədatının köməyi ilə həyata keçirilir: "Aydındır ki, hər hansı xarici investor üçün ən mühüm cəhət bu və ya digər ölkədə ictimai-siyasi şəraitin necə olmasıdır. Azərbaycanda ictimai-siyasi sabitlik təmin olunmuşdur, möhkəm təmin olunmuşdur, müvafiq təminatlar yaradılmışdır, qanunlar hökm sürür və respublika həyatının bütün sahələrinə nəzarət etməyə və məhz götürdüyümüz, gələcəkdə də inkişaf edəcək həmin iqtisadi xətti təmin etməyə qadir olan dövlət var".

Elmi, akademik üslubun tələb olunmadığı münasibətlərdə belə Heydər Əliyevin cavabları elmi-fəlsəfi çalarları özündə ehtiva edir ki, bu bir daha nitq ilə şəxsiyyətin dünyagörüşü vəhdətini ortaya qoyur.

15 yanvar 1997-ci il tarixdə, Parisdə Fransanın "TV-5" televiziya kanalının müxbirinə verdiyi müsahibədə biz bunun bir daha şahidi oluruq:

"Sual: Siz Sovet tarixini bilən bir adamsınız. İndi isə baş verən hadisələri nəzərə alaraq, müstəqil və çox güclü dövlətin rəhbərisiniz. XX əsrin hadisələri, o cümlədən Belqradda, Sofiyada baş verən hadisələr barəsində fikriniz necədir?

Cavab: "XX əsr çox mürəkkəbdir. Tezliklə biz XXI əsrə qədəm qoyacağıq və onda indiki yüzillikdə baş vermiş və baş verən hadisələrə daha düzgün qiymət vermək mümkün olacaqdır. Lakin bütün bu hadisələr ümumən qanunlardan və sairədən tez-tez kənara çıxsa da, görünür, xüsusən Avropada, keçmişdə totalitar rejim şəraitində olmuş ölkələrdə, o cümlədən Yuqoslaviyada, Bolqarıstanda, keçmiş Sovetlər İttifaqı ərazisində baş verən proseslərlə müəyyən dərəcədə əlaqədardır. Bu öklələrdə keçmiş kommunist, sosialist rejimindən, totalitar, avtoritar rejimdən demokratiyaya keçid baş verir.

Lakin bu keçid, təəssüf ki, bəzi yerlərdə xoşagəlməz hadisələrlə müşayiət olunur” [VIIIc.s.320].

XX əsri filosofyanə qiymətləndirən böyük natiq “bu gün baş verən hadisələrə qiymət verilməsi üçün zamana ehtiyac var” fəlsəfəsini ortaya qoyur.

Elmi üslub səbəb və nəticə əlaqələrinin müəyyənləşdirilməsi, ümumiləşdirmələr aparılması və son olaraq nəticələr çıxarılmasına gətirib çıxarmalıdır.[1] Elmi üslub üçün xarakterik sayılan geniş cümlələr 3-cü minilliyin astanasında Heydər Əliyevin nitqində işə düşür, genişliyi qədər də auditoriya üçün cəlbedicilik xüsusiyyətini özündə saxlayır. Təkcə, 23 ay mövcud olan Azərbaycan Xalq Cümhuriyyətinin, o dövr Azərbaycan xalqının görkəmli övladlarının fəaliyyəti 4-5 cümlə ilə xalqa çatdırılır: “Azərbaycan Xalq Cümhuriyyəti gərgin və mürəkkəb ictimai-siyasi şəraitdə cəmi 23 ay fəaliyyət göstərsə də, sonrakı nəsillərin yaddaşında xalqımızın tarixinin ən parlaq səhifələrindən biri kimi həmişə qalacaqdır. O, demokratik dövlət quruculuğu, iqtisadiyyat, mədəniyyət, təhsil, səhiyyə, hərbi quruculuq sahələrində atdığı mühüm addımları başa çatdıra bilməsə də, onun qısa müddətdə həyata keçirdiyi tədbirlər xalqımızın tarixində silinməz iz buraxmış, milli dövlətçilik ənənələrimizin bərpası işində böyük rol oynamışdır. Ən əsası odur ki, Azərbaycan Xalq Cümhuriyyəti az yaşasa da, xalqımızda azadlıq, müstəqillik fikirlərini daha da gücləndirmiş oldu. Bu cümhuriyyətin yaradılmasında müstəsna xidmətləri olan Məhəmməd Əmin Rəsulzadə, Əlimərdan bəy Topçubaşov, Fətəli Xan Xoyski, Həsən bəy Ağayev, Nəsib bəy Usubbəyov, Mehdi bəy Hacınski, Məmməd Yusuf Cəfərov, Xudadat bəy Rəfibəyov, Əkbər ağa Şeyxülislamov, Teymur

---

[1] Yusifov M. “Dahi şəxsiyyətin nitq fenomenliyi”. Bakı, səh.52

bəy Makinski, Səməd bəy Mehmandarov, Əli ağa Şıxlinski, Sultan Məcid Qənizadə, Xəlil bəy Xasməmmədov, Əhməd bəy Pepinov, Şəfi bəy Rüstəmbəyov kimi görkəmli ictimai xadimlərin xatirəsini qədirbilən Azərbaycan xalqı bu gün də böyük ehtiram hissi ilə yad edir" [XXXIc.s.297].

Elmi üslub elmi-fəlsəfi dünyagörüşə söykənir ki,[1] Heydər Əliyevin nitqi bu çıxışda da özünü göstərir. XX əsrin "elmi-texniki nailiyyətlərinin" təməlində durması, nefti əvəz edə biləcək "tam ekvivalentin tapılmaması" ideyalarını auditoriya böyük natiqin dilindən eşidir: "XX əsrdə əldə edilmiş bütün elmi-texniki nailiyyətlərin təməlində isə məhz neft durur. Enerji mənbəyi, yanacaq məhsulu kimi, nefti əvəz edə biləcək müxtəlif maddələr və üsullar tapmaq yolunda aparılan axtarışlarda bir çox uğurlar qazanılsa da, təbiətin bəşəriyyətə bəxş etdiyi bu olduqca əlverişli xammalın tam ekvivalenti hələ ki, tapılmamışdır" [XXXIc.s.287].

Bu çıxış neftlə bağlı terminlərlə zəngindir. Belə ki, neft sənayesinin inkişafından danışarkən "neft mənbələri", "neft bazaları", "xammal", "neft hasilatı", "neftayırma", "boru-prokat istehsalı", "neft kimyası" kimi terminlər çıxışda elmi üslubun formalaşmasına xidmət edir.

Elmilik Heydər Əliyevin nitqini hətta ziyafətlərdə belə tərk etmir. Məsələn, 22 dekabr 1995-ci il tarixdə, Prezident sarayında, Almaniya Federativ Respublikasının xarici işlər naziri Klaus Kinkelin şərəfinə verilən ziyafətdə Almaniyanın Avropa və dünyada mövqeyi elmi şəkildə auditoriyaya çatdırılır: "Almaniya Avropanın ən böyük ölkəsidir və mədəniyyət, elm, incəsənət sahəsində zəngin ənənələrə, zəngin demokratik ənənələrə, geniş iqtisadi və intellektual potensiala

[1] "Nitq mədəniyyəti məsələləri". II buraxılış. Bakı, "Elm", 1992. səh.165

malik ən böyük dünya ölkələrindən biridir. Alman xalqı bəşər tarixinə, bəşər sivilizasiyası tarixinə öz dahi nailiyyətləri ilə olduqca böyük töhfə vermişdir” [Vc.s.204].

Heydər Əliyev nitqi məişət üslubuna sığmır, Heydər Əliyev şəxsiyyətinə xas olan elmi-fəlsəfi dünyagörüş həmişə üzə çıxır: “Ancaq Yusif haqqında danışanda indi mən bunu qeyd edirəm, ona görə ki, Yusif də cəmiyyətimizə təkcə yazıçı kimi, mədəniyyət xadimi kimi yox, eyni zamanda görkəmli ictimai-siyasi xadim kimi daxil olubdur” [Vc.s.197].

Yusif Səmədoğluna “Yusif” müraciətilə ünvanlanan məişət üslublu parçanın davamı kimi geniş cümlə əsasında elmiliyin şahidi oluruq: “Azərbaycanın həyatı üçün və xüsusən son illərdə Azərbaycanda milli azadlıq hərəkatının inkişafı üçün, xalqımızda milli dirçəliş, milli oyanış hisslərinin yaranması və inkişafı üçün, Azərbaycanın müstəqilliyi uğrunda mübarizə üçün onun fəaliyyəti çox əhəmiyyətli, çox gərəkli olmuşdur” [Vc.s.197].

Heydər Əliyev nitqinə xas olan elmilik təkcə elmi konfranslarda yox, digər auditoriyalarda da özünü göstərir. 16 dekabr 1995-ci il tarixdə, Prezident sarayında, Azərbaycan Kinomatoqrafçılar İttifaqının yeni seçilmiş idarə heyətinin üzvləri ilə görüşdəki çıxış kinomuzun problemlərinə həsr olunmuşdur. Görüş söhbətvari xarakterdə olsa da elmilik bu görüşdən də yan keçməmişdir. İkinci dünya müharibəsi dövründə Azərbaycan neftçilərinin əməyini kino vasitəsilə qiymətləndirilməsini elmi şəkildə görüş iştırakçılarına çatdırır: “Mən o mərasimlərdə olarkən və oradakı nitqləri, çıxışları dinləyərkən daim düşünürdüm və bunu təkcə biz yox, çoxları da dəfələrlə qeyd ediblər ki, əgər Azərbaycanın nefti olmasaydı, bəlkə faşizm üzərində qələbə də mümkün olmazdı, bəlkə də faşizm gəlib bütün dünyanı məhv edəcəkdi. Bu qələbə Azərbaycanın böyük xidmətidir” [Vc.s.185].

Elə həmin görüşdə Cəlil Məmmədquluzadənin "Ölülər" pyesi haqqında böyük natiqin elmi-fəlsəfi baxışları sırf elmi üsluba söykənir. Elmi üslubun tələb etdiyi geniş cümlələr burada da özünə yer alır: "Həddindən artıq fəlsəfi bir əsərdir, insan fəlsəfəsinin ən yüksək zirvəsində olan əsərdir və hesab edirəm, bizim çatışmazlığımız, günahımız da bəlkə ondan ibarətdir ki, indiyə qədər bu əsəri təbliğ edə, dünyaya tanıtdıra bilməmişik" [Vc.s.191].

Elmi üslub, səbəb və nəticə əlaqələrinin müəyyənləşdirilməsi, ümumiləşdirmələr aparılması və son olaraq nəticələrlə yekunlaşmağa gətirib çıxarmalıdır:[1] "Zənnimcə, sübut etməyə ehtiyac yoxdur ki, belə bir vəziyyətdə biz "öz müqəddaratını təyin etmək hüququnun həyata keçirilməsi" ilə deyil, beynəlxalq hüququn kobudcasına pozulması ilə, BMT üzvü olan dövlətin suverenliyinə, ərazi bütövlüyünə və siyasi müstəqilliyinə qarşı təcavüzlə qarşılaşmışıq" [IIc.s.309]. Çıxışın belə bir nəticə ilə yekunlaşması ayıldıcı ağır çəkic zərbələrini andırır. Azərbaycan reallıqlarını görmək istəməyən, bu yolda süstlük və fəaliyyətsizlik göstərənləri bu həqiqətləri görməyə vadar edir.

Heydər Əliyev elmi üslubunun gücü öncəgörmələrə, proqnozlara əsaslanmasındadır. 1994-cü il tarixdə Bakıda keçirilmiş "Sahibkarlığın strategiyası və iqtisadiyyatın yenidən qurulması" mövzusunda beynəlxalq konfransdakı çıxış nikbinlik və öncəgörmələrlə zəngindir: "Bütün bu vəzifələr qarşımızda durur və konfrans iştirakçılarını əmin etmək istəyirəm ki, biz bütün sahələrdə-sənayedə, aqrar bölmədə, ticarətdə, məişət sahəsində, bütün infrastrukturda iqtisadi islahatların fəal şəkildə həyata keçirilməsi yolu ilə getmək əzmindəyik.

[1] Həsənova S. "Nitq mədəniyyəti və üslubiyyat". Bakı, 2005. səh.55

Biz Azərbaycan iqtisadiyyatının bu islahatlar, bu imkanlar vasitəsilə dirçəlməsi üçün fəal surətdə irəliləyəcəyik. Ümid edirik ki, Azərbaycanın böyük iqtisadi və intellektual potensialı, zəngin təbii ehtiyatları və məhsuldar qüvvələri məhz həmin yolla hərəkətə gətiriləcək və ölkə iqtisadiyyatının səviyyəsi qaldırılacaq. Onun böhran vəziyyətindən çıxması təmin ediləcək və respublikamızın əhalisinin daha yaxşı yaşaması üçün şərait yaradılacaqdır. Belə imkanlar var və şəxsən mən əminəm ki, biz bu yolla gedərək müvəffəqiyyətlərə nail olacağıq. Biz bu sahədə də tutduğumuz yoldan dönməyəcəyik" [IIc.s.212-213].

Bu gün ulu öndərin həmin ecazkar çıxışından 16 il keçmişdir. Möhtərəm prezidentimiz İlham Əliyev tərəfindən ulu öndərin qarşıya qoyduğu vəzifələr təmin edilmiş, ümidlər doğrulmuş, ölkə iqtisadiyyatının səviyyəsi qaldırılmış, respublika əhalisinin daha yaxşı yaşaması üçün şərait yaradılmışdır.

Elmi üsluba söykənən bu çıxışlar nitq mədəniyyətimizin bütün incəliklərini özündə əks etdirir. "Aqrar islahat: problemlər və onların həlli yolları" mövzusundakı çıxışı ilə ulu öndər sanki kənd təsərrüfatı akademiyalarının bitkiçilik və heyvandarlıq kafedralarında elmi şura iclaslarının aparıcı aliminə çevrilir. Amma, bu çıxışlar təkcə kənd təsərrüfatı sahəsi ilə məhdudlaşsaydı o, Heydər Əliyev çıxışı olmazdı. Elə bu çıxışın özündə böyük natiq Azərbaycan xalqının aqrar mədəniyyətini, onun şanlı keçmişini, tarixini və ədəbiyyatını nəinki xarici qonaqlara, elə özümüzə də öyrədir: "Qarabağ zonasında-indiki Ağcabədi, Bərdə rayonlarında və başqa yerlərdə pambıq əkini sahələri o vaxt Cavanşirlər nəslinin əlində idi. Vaxtilə mən arxiv materiallari ilə tanış olarkən öyrəndim ki, 1912-ci ildə Tiflisdə Qafqaz pambıqçılarının 2-ci qurultayında Azərbaycanın nümayəndəsi Həmidə xanım Cavanşir – böyük yazıçımız Cəlil Məmmədquluzadənin həyat yoldaşı –

torpaq sahibi kimi çıxış edərək pambıqçılığın problemlərindən danışmışdı” [IIc.s.586].

Böyük natiq kənd təsərrüfatı göstəricilərinə söykənən elmi üslubdan tarixi-məişət üslubuna keçməklə auditoriyanı canlandırır və yenidən rəqəmlər, faktlar dili ilə çıxışını, necə deyərlər, öz yerinə, öz məcrasına-elmi üsluba qaytarır.

Akademik nitq üçün mühüm hesab olunan rəqəmlərin dili ilə elmi şəkildə auditoriyanı inandırmaq Heydər Əliyev çıxışlarında mühüm yer tutur: “Mən Azərbaycan tərəfinin dəhşətli itkilərini sizə deməliyəm. 20 mindən çox adam həlak olmuşdur, 100 minə yaxın adam yaralanmış və xəsarət almışdır, 6 min adam əsir düşmüşdür, 1 milyondan çox azərbaycanlı-ölkə əhalisinin təxminən 15%-i qaçqın vəziyyətinə düşmüşdür və çadır şəhərciklərində yaşayır” [IIc.s.309]. Bu cümlələrin ardınca dinləyicilərin beyninə situasiyanı aydınlığı ilə hopdura bilir: “Onlar öz vətənində evsiz-eşiksiz qalmışlar, yayın istisindən, qışın soyuğundan, epidemiyalardan əzab çəkirlər, ən zəruri şeylərə ehtiyac duyurlar” [IIc.s.309]. Elmi üslubdan bədii, məişət üslubuna keçən ulu öndər yenidən rəqəmlər dilinə - elmi üsluba qayıdır: “Azərbaycanın işğal edilmiş ərazilərində 700 şəhər və kənd dağıdılmışdır” [IIc.s.309].

Elmi üslub faktların və rəqəmlərin sadalanmasını tələb edir ki, Heydər Əliyevin çıxışlarında rəqəmlərin bədahətən söylənməsi auditoriyanı rəqəmlərin cansıxıcılığından xilas edir: “70-ci illərin axırlarında, 80-ci illərin əvvəllərində Azərbaycan Respublikası kənd təsərrüfatı sahəsində ən yüksək iqtisadi göstəricilərə nail olmuşdu. O illərdə Azərbaycanda hər il orta hesabla 1.5 milyon ton buğda, 800 min ton pambıq, 1.5 milyon ton üzüm, 650-700 min ton tərəvəz məhsulları, 300 min ton meyvə, 25 min ton çay yarpağı, 55-60 min ton tütün, təxminən 5 min ton barama, 130-140 min ton ət və digər kənd təsərrüfatı məhsulları istehsal edilirdi. 1993-cü ili

götürsək, 1 milyon 100 min ton buğda, habelə təxminən 200 min ton üzüm, 285 min ton pambıq istehsal edilib. Başqa məhsulların istehsalı da o qədər aşağı düşüb ki, onları heç dilə gətirmək istəmirəm" [IIc.s.585]. Bu çıxışda da Heydər Əliyev nitqinin təküslubluğa sığmadığının şahidi oluruq. "...Onları heç dilə gətirmək istəmirəm" – frazeoloji söz birləşməsinin köməyi ilə bədii üslub elmi üslubla çulğalaşaraq nitqin ecazkarlığını artırır, müqayisəli şəkildə istehsalın necə aşağı düşməsini dinləyicinin nəzərinə çarpdırır.

Heydər Əliyevin 1994-cü il noyabrın 14-də Bakıda keçirilən "Qaçqınlar haqqında qanunvericilik, insan hüquqları və miqrasiya məsələlərinə dair" beynəlxalq konfransdakı çıxışında da digər akademik nitqlərində olduğu kimi, burada da elmi üslub gözlənilir. Mövzunun dinləyicilərə çatdırılmasında vacib sayılan, elmi üslubun əsasını təşkil edən terminologiya yerli-yerində işlədilir: "Azərbaycan xalqı", "beynəlxalq hüquq orqanları", "beynəlxalq təşkilatlar", "humanitar kömək", "ərazi bütövlüyü", "işğal", "insan hüquqları", "məcburi köçkünlərin statusu", "qaçqınlar", "sərhədlərin toxunulmazlığı" və s.

Rəqəmlər dilinə, iri cümlələrə istinad edən elmi üslub bu konfransda da Heydər Əliyev çıxışında sərrastlıqla gözlənilir: "1988-ci ildən sonra Ermənistan Respublikasının ərazisindən qovulan 200 mindən artiq azərbaycanlı, 50 mindən çox Axıska türkü, Dağlıq Qarabağın ərazisindən-doğma yurdlarından qovulmuş azərbaycanlılar və nəhayət Dağlıq Qarabağın ətrafındakı yeddi rayondan zorakılıqla qovulmuş azərbaycanlılar birlikdə bir milyon qaçqınlar ordusu təşkil edir" [IIc.s.506].

Dilçi alimlərin nitqin elmi üslubu barədə söylədiyi fikirlər: "Dinləyicilər və ya oxucular mahiyyətə maraq göstərdiklərinə görə nitqdə əlavə cəlbedici vasitələrdən, bədii ifadələrdən, kəskin jestlərdən, mimikalardan istifadə etməyə ehtiyac

qalmır" – Heydər Əliyevin nitqindəki elmi üslubla uzlaşmır. Reallıqda isə bu sirr deyil ki, "mahiyyətə maraq" heç də "nitqdə cəlbedici vasitələrdən" istifadəni inkar etmir. Əksinə, monotonluqdan, yeknəsəqlikdən yorulmaq təhlükəsini gözəl anlayan ulu öndər "ehtiyac" olmayan vasitələrdən yerindəcə yararlanır.

Auditoriyanın başının üstünü ala biləcək "mahiyyətə marağın" azalması təhlükəsini dinləyicilər sezmədən belə sovuşdurur. Ritorik sualların işlənmədiyi və ya az işləndiyi elmi üslubda ritorik suallar öz layiqli yerini alır. Heydər Əliyevin akademik nitqində ritorik suallar dinləyicilərini sona qədər dinləməyə səfərbər edir "...ancaq bir milyon insan-azərbaycanlı öz yerindən, yurdundan qovulmuşdur, evini, əmlakını itirmişdir, dədə-babalarının qəbirlərindən məhrum olmuşdur. Bəs bu, insan hüquqlarının kütləvi surətdə, dəhşətli şəkildə pozulması deyilmi?

Belə olan halda bir milyon vətəndaşın-azərbaycanlının hüquqlarının kütləvi surətdə pozulması haqqında nə üçün həyəcan təbili vurulmur, nə üçün hay-küy qalxmır, nə üçün bu parlamentlərdə müzakirə olunmur? Beynəlxalq təşkilatlar nə üçün bu barədə öz cəsarətli fikirlərini bildirmirlər? Bunu anlamq mümkün deyildir" [IIc.s.509].

Bu fəsili yekunlaşdırsaq deyə bilərik ki, ulu öndərin çıxış və nitqlərində elmi üslubun bütün tələbləri gözlənilmiş, elmi üslubun xarakterik əlamətləri olan terminlərdən, sadə, geniş və mürəkkəb cümlə kimi sintaktik vahidlərdən istifadə edilmişdir.

# XII FƏSİL

## HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ PUBLİSİSTİK ÜSLUB

Nitqin publisistik üslubundan demək olar ki, hər cür auditoriyada istifadə etmək olar. Bu, ən çox ictimai-siyasi məsələlərə həsr olunmuş nitqlərdə, yığıncaqlarda, yazılarda tətbiq edilir. Bu üslubda digər üslubların əlamətlərindən – terminlərdən, bədii ifadələrdən, dəlil və misallardan və sair istifadə etmək mümkündür.

Publisistik nitq əsasən mühakimələr şəklində qurulur, natiq dinləyicilərin ağlına müraciət edərək onları bu və ya digər fikrin doğruluğuna çalışır, yeri gəldikcə onların hissinə təsir göstərib başqa fikirlərdən yayındırmağa, öz fikirlərinin arxasınca aparmağa çalışır.[1]

Bu üslubda siyasi, sosial, iqtisadi məsələlər, həyatda baş verən müxtəlif hadisələr, faktlar sadə şəkildə öz ifadəsini tapır.[2] Publisistik üslubda stilistik fiqurlardan da geniş istifadə olunur ki, Heydər Əliyev nitqləri bu fiqurlarla zəngindir. Epifora tipli fiqurlara az yer verildiyi dilçiliklə müqayisədə biz bunu böyük natiqin əksər nitq və çıxışlarında görə bilirik: “Biz Nizamidən, Füzulidən danışarkən onları təkcə şair kimi deyil, böyük filosoflar kimi, dünyaya, dünya mədəniyyətinə, elminə böyük töhfələr vermiş mütəfəkkirlər kimi tanıtmalıyıq. Biz Füzulini təkcə “Leyli və Məcnun” poemasının müəllifi kimi yox, dünya miqyaslı filosof kimi, böyük alim kimi dünyaya tanıtmalıyıq.

---

[1] Muradov B., Bayramov H. “Nitq mədəniyyəti”. Bakı, 2008. səh.17

[2] Hüseynov S. “Nitq mədəniyyəti”. (Dərslik). Bakı, “Yazıçı”, 2010. səh.173

...Məhz Azərbaycan xalqına mənsub olan Nəsimi kimi nadir bir şəxsiyyəti dünya ictimaiyyətinə, elminə, dünya mədəniyyətinə tanıtmaq, şübhəsiz ki, xalqımızın hörmətini qaldırmaq deməkdir". Heydər Əliyevin publisistik üslubunda yüksək kitab leksikasına (dilinə) uyğun olmaqla yanaşı sadə xalq dili də üstünlük təşkil edir. Bu qəbildən olan sözləri aşağıdakı kimi təsnif etmək mümkündür.

Siyasət aləmi: "....ələlxüsus 1988-ci ildə bəzi qrupların mənə qarşı ədalətsiz hərəkətlərini görəndən sonra bir daha siyasət aləminə qayıtmaq istəmirdim".

Publisistik üslubu bəzi müəlliflər ictimai-siyasi üsluba aid edirlər. Bu üslub milli-ictimai təfəkkürü ifadə edir və mətbuatla funksionallaşır. Publisistik üslub müxtəlif mövqe və maraqları əks etdirir. Bu üslub XIX əsrin ikinci yarısında ana dilində qəzetlərin nəşrə başlaması ilə əlaqələndirirlər. Bu üslub kütləviliyi və işlənmə dərəcəsinə görə ən üstün üslubdur.[1]

Publisistik üslubun ənənələrinə uyğun olaraq Heydər Əliyevin 15 iyun 1993-cü il tarixdə, Milli Məclisin iclasındakı nitqində standart siyasi, ictimai sözlər işlədilir. Siyasi hərəkatlar, siyasi qüvvələr; – (Həmin dövrdə ayrı-ayrı siyasi hərəkatlar, ayrı-ayrı siyasi qüvvələr Azərbaycanı qurmaq, Azərbaycanın mənliyini müdafiə etmək, xalqımızın qazandığı nailiyyətləri saxlamaq, onlara ləkə vurulmasına, onların dağıdılmasına yol verməmək əzmində olmuşlar).

Mətbuat azadlığı, söz azadlığı: "Azərbaycanda bütün vətəndaşların bərabər hüquqlara malik olması, vicdan azadlığı, dil azadlığı, din azadlığı, söz azadlığı yolu ilə gedən partiyadır".

---

[1] Həsənova S. "Nitq mədəniyyəti və üslubiyyat". Bakı, 2005.

Çoxpartiyalı sistem, demokratik cəmiyyət, demokratik dövlət, hüquqi dövlət: "Özümün siyasi fəaliyyətdən kənar olduğum vaxtlarda, indi isə Azərbaycanın prezidenti kimi mən Azərbaycanda çoxpartiyalı sistemin bərqərar olması üçün şərait yaratmağa çalışıram və hesab edirəm ki, Azərbaycanda çoxpartiyalı sistem olmalıdır, Azərbaycan çoxpartiyalı sistem şəraitində demokratik cəmiyyət, demokratik dövlət, hüquqi dövlət qurmaq yolu ilə getməlidir".

Bu çıxışda Heydər Əliyev nitqində standart ictimai-siyasi sözlər üstünlük təşkil edir: "Azərbaycan Respublikası, Azərbaycan xalqı, Azərbaycan vətəndaşı, ərazi bütövlüyü, müdafiə qüdrəti, müstəqil dövlət, siyasi plüralizm, çoxpartiyalı cəmiyyət".

Heydər Əliyev öz publisistik nitq və çıxışlarında alınma sözlərdən də yeri gəldikcə istifadə edir. Və bu sözlər nitqin təmizliyinə, aydınlığına xələl gətirmir.

Yaş senzi – "Məsələn, burada Əli Nağıyev dedi ki, Heydər Əliyevi müdafiə etmək, yaxud seçkilərdə yaş senzini – bu senzi mənə görə qoymuşdular – götürmək üçün fəallar, həvəskarlar, heç bir təmənna güdmədən bu işdə çalışan adamlar vardı".

Prezident – "İndi mən Bakıdayam, Azərbaycandayam, bir prezident kimi Azərbaycana rərbərlik edirəm".

Heca ilə əmələ gəlmiş sözlər: – ictimai-siyasi (Yeni Azərbaycan Partiyası Azərbaycanda son illər gedən ictimai-siyasi proseslərdə formalaşmış, üzə çıxmış və nəhayət, müəyyən mütəşəkkil bir şəkil almış və bu xalqına, ölkəsinə, millətinə xidmət etmək istəyən vətənpərvər insanların təşəbbüsü ilə olmuşdur).

Heydər Əliyevin publisistik üslublu nitqlərində işlətdiyi sinonim cərgələrdə sözlərin bir qismi yüksək kitab leksi-

kasına, bir qismi isə sadə məişət leksikasına aid olur ki, nitq bütün auditoriya tərəfindən başa düşülür:

"Bu partiya keçmişdə, məsələn, vaxtilə çar Rusiyası dövründə bir çox partiyalar kimi gizli, qeyri-leqal şəraitdə yaranmasa da, tam gizli olmasa da hər halda müəyyən dərəcədə gizli şəraitdə yaranmışdır".

Digər bir nitqində böyük natiq sınaq mərhələsi – saf-çürük mərhələsi sözlərini işlədir ki, sınaq mərhələsi əgər kitab dilinə aid olursa, saf-çürük mərhələsi isə sadə xalq dilində deyilir. Və bu zaman saf-çürük sözü nitqin ekspressiyasını artırır: "Əmin idim ki, Yeni Azərbaycan Partiyası yaşayacaq və müəyyən mərhələdən keçərək daha da möhkəmlənəcək. Ona görə də bəlkə bu mərhələ sizin üçün həm sınaq mərhələsi olsun, həm də Yeni Azərbaycan Partiyasında, xalq arasında deyildiyi kimi, saf-çürük mərhələsi olsun".

Publisistik üslub standart sözlərlə yanaşı ekspressiv, mənalı, emosional nitq vasitələri ilə özünü göstərir ki, Heydər Əliyevin çıxışları bunlarla zəngindir: "Azərbaycan bir müstəqil dövlət kimi öz taleyinin sahibi, öz torpaqlarının sahibi, öz hüquqlarının sahibi olacaq və gələcək firavan həyatını özü quracaqdır!"

Belə ki, frazeoloji birləşmələr nitqin məna gücünü artırmaqla yanaşı Heydər Əliyev dilində aktiv siyasətə xidmət edir.[1]

Göz dikməmək – Azərbaycan Respublikasının sülhsevər siyasətini, sərhədlərinin toxunulmazlığını qəbul edən Beynəlxalq qanunlara hörmətini ifadə edir: "Azərbaycan Respublikası, Azərbaycan xalqı qəsbkarlıq etmir, başqa respublika-

[1] "Heydər Əliyev dil haqqında və Heydər Əliyevin dili". Bakı, "Elm", 1998. səh.101

nın, başqa xalqın, başqa dövlətin torpaqlarına göz dikmir, hücum etmir, yalnız müdafiə olunur".

Bulanıq su, bulanıq göl – mənəviyyatımızın durulması, təmizlənməsi kimi başa düşülür: "Biz bulanıq göl içindəyik. Bəli, hamımızın gücü ilə gərək bu palçıqdan, bulanıq sudan çıxaq, təmizlənək. Gərək hər kəs birinci növbədə xalqın ümumi mənəviyyatına sədaqət göstərərək öz mənəviyyatını nümayiş etdirsin və xalqı bu vəziyyətdən çıxarmağa kömək etsin".

Göz dikmək – Heydər Əliyevin Akademiyadakı bu çıxışında əxlaq və mənəviyyat sarıdan korluq çəkən adamların səviyyəsizliyinə işarə olunur: "Biz Bakıda Nəriman Nərimanovun ev-muzeyini yaratmışıq, özü də böyük bir çətinliklə düzəlmişik. Eşidirəm ki, sonra vəzifəyə gələn adamlardan kim isə gözünü bu evə dikib. Bəs bu hansı mənəviyyata sığışar?" [Ic.s.159].

Şəhərə sığınmaq – Naxçıvan əhalisinin içərisində yaşamağı, sadə vətəndaşların əhatəsində olmağı hər şeydən üstün tutur: "Mən yenidən siyasi fəaliyyətə başlamaq fikrində olmamışam, sadəcə olaraq, Moskvada və Bakıda yaşamağım üçün şərait olmadığına görə, doğulduğum Naxçıvan şəhərinə sığındım, orada bir müddət yaşadım".

Boyun qaçırmaq – bu frazeoloji birləşmə Heydər Əliyev dilində xalqın, respublikanın ehtiyacı varsa siyasi mübarizədən çəkinməməyi nəzərdə tutur: "Xalqın mənə ehtiyacı olduğunu duyarkən bu fikirdən boyun qaçırmadım".

Özünü kənara çəkmək – bu da boyun qaçırmamaq frazeoloji birləşməsi ilə sinonimdir ki, elə Heydər Əliyevin nitqinin bir xüsusiyyəti də, bir məziyyəti də frazeoloji birləşmələrin sinonimlər şəklində işlənmişdir:

"...Ancaq doğrudan da, əgər indi Azərbaycan xalqının, respublikasının mənə ehtiyacı varsa, özümü kənara çəkə bilmərəm".

Heydər Əliyevin publisistik üslublu çıxış və nitqlərində publisistik stilə uyğun olaraq əvvəlcə informasiyalar verilir, ikinci mərhələdə isə dinləyicilərə təsir olunur.[1] Məlumatları dinləyicilərə çatdırarkən Heydər Əliyev nitqinə xas olan məntiqi ardıcıllıq işə düşür. "Moskva, Sank-Peterburq, MDB və Baltik ölkələri jurnalistlərinin böyük bir qrupu ilə görüşündəki müsahibələrdə" bunun bariz nümunəsini görürük: "Tarixdən bilirsiniz ki, 1918-ci ildə Aərbaycanda ilk dəfə demokratik cümhuriyyət yaradıldı, bu cümhuriyyətin hökuməti 23 ay mövcud oldu, 1920-ci ilin aprelində isə Sovet hakimiyyəti qurulması ilə əlaqədar onun varlığına son qoyuldu. 1920-ci ildən 1922-ci ilədək Azərbaycan Sovet Sosialist Respublikasının müəyyən müstəqilliyi vardı, yəni o hər hansı digər dövlət qurumuna daxil olmayan respublika idi, amma kommunist partiyası, kommunist rejimi, deməli, ÜK(b)P və ya Rusiya Kommunist Partiyası tərəfindən idarə edilirdi. Azərbaycan 1922-ci ildən Sovet İttifaqının tərkibində olmuş və 1991-ci ilin axırlarında Sovet İttifaqının dağılması ilə əlaqədar müstəqil dövlətə çevrilmişdir" [XVIc.s.188].

Publisistik üslubda nitqin ekspressivliyini artırmaq üçün sinonimlərdən, frazeologizmlərdən də yeri gəldikcə istifadə olunur[2] ki, Heydər Əliyev nitqləri özünəməxsus sinonim cərgələrlə zəngindir. Aərbaycan dilinin sinonim zənginliyi böyük natiqin dilində auditoriyaları öz cazibəsində saxlayır.

Bu sinonimlər həm də müstəqilliyimizin əbədi olmağı ilə bağlı fikirlərdir: "Bilirsiniz ki, biz öz müstəqilliyimizi təsdiq etmək, onu toxunulmaz etmək, əbədiləşdirmək, enməz etmək

---

[1] Abdullayev A. "Nitq mədəniyyəti və natiqlik məharəti haqqında". Bakı, 1968. səh.236

[2] Введенская Л.А., Павлова Л.Т., Кашаева Е.Ю. "Культура речи государственного служащего". – Ростов н/Д: Феникс, 2011. с.56

üçün Dünya Birliyində Azərbaycanın bu gün nə olduğunu və gələcəkdə nə cür ölkə olacağını sübut etməliyik”, gah ədalətli seçkilərlə bağlı fikirlərdə, “ümidvaram ki, bu seçkilərin tam demokratik, azad, sərbəst, ədalətli keçirilməsinə nail olacağıq”, gah da erməni xislətini dünyaya açmaq üçün işlədilir: “Həmin təbliğat bu ölkələrdə əksər insanların beynini doldurmuşdur ki, ermənilər yazıq, məzlum millətdir, guya vaxtilə türklər erməniləri qırıblar, soyqırımı olubdur, guya indi onları azərbaycanlılar qırır, ermənilərə yardım etmək lazımdır”.

Heydər Əliyev sinonimləri çox vaxt kitab dili – kitab leksikası ilə sadə, loru dilin leksikası yanaşı olur ki, bu da auditoriyanın cəlbi üçün, auditoriyanın nitqi tam qavraması üçün vacibdir. “Bu təbiidir, buna pis, mənfi münasibət göstərmək olmaz, biz özümüz buna maraqlıyıq”, “Amma biz bu kökün bir budağıyıq, budaq, şaxə kimi inkişaf etmişik”. Bu üslub üçün frazeoloji birləşmələr də xasdır. Frazeoloji birləşmələr Heydər Əliyev nitqində xüsusi bir bölmə olacaqdır ki, bu görüşdə də yeri gəldikcə işlənmişdir: “Heç kəs azərbaycanlıların qaşına-gözünə aşiq olub Azərbaycana gəlmir”, “Biz özümüzü bir ölkənin quyruğuna bağlaya bilmərik. Biz heç kəsin quyruğuna bağlanan xalq deyilik. Biz böyük xalqıq, öz adımız, öz dilimiz, ədəbiyyatımız, mədəniyyətimiz, musiqimiz və öz ölkəmiz var”.

Publisistik üslub yeri gəldikcə modal sözlərdən istifadəni tələb edir. Modal sözlər böyük natiqin çıxış və nitqlərində xüsusi bir sehrlə cümlələri bəzəyir, auditoriyanı canlandırır. Ən çox “bilirsiniz”, “bilirsiniz ki”, “şübhəsiz ki”, “təsəvvür edin”, “həqiqətən” və s. Bu çıxışda da həmişəki kimi auditoriyaya verilən və natiqin özü tərəfindən cavablanan ritorik suallar auditoriyaya gəlir: “...Dağlıq Qarabağ Ermənistana bağlansın. Bu mümkündürmü? Dedim ki, biz buna razı ola bilmərik. Amma siz necə buna razı ola bilərsinizmi? Dünya

ictimaiyyəti, dünya birliyi buna razı ola bilərmi? Yox, heç bir ölkə buna razı ola bilməz”. Bu kiçik parçada ritorik sual, inkar ədatı, nida cümləsi hamısı harmoniya yaradaraq nitqin emosionallığını, auditoriyalara ayıldıcı təsir gücünü artırır.

Heydər Əliyev nitqində publisistik üslubu müxtəlif çeşidli auditoriyalarda araşdırdıqda məlum olur ki, bu üslub geniş yayılması ilə seçilir.

9 fevral 1994-cü ildə Heydər Əliyevin Türkiyə Böyük Millətlər Məclisindəki çıxışda publisistik üslubun tədqiqi Heydər Əliyev nitqində bu üslubun mühüm yer tutduğunu göstərir.

Publisistik üslub üçün xarakterik sayılan standart ifadələr, cümlələr bu çıxışda da özünü göstərir: “Bu da tam həqiqətdir ki, XX əsrdə Azərbaycan dünya mədəniyyətinə, dünya elminə böyük töhfələr vermişdir. Bizim böyük alimlər, yazıçılar, şairlər, memarlar, rəssamlar, bəstəkarlar, musiqiçilər həm Azərbaycan xalqının elmini, mədəniyyətini, təhsilini zənginləşdirmiş, həm də bütün dünya mədəniyyətinə, elminə böyük töhfələr vermişdir” [Ic.s.367].

Nitqin emosionallığını, ekspressivliyini artıran sinonimlər Heydər Əliyevin publisistik üslublu nitqlərində də özünü göstərir. Elə Türkiyə Böyük Millətlər Məclisindəki çıxışda da sinonimlər onun nitqinə xüsusi bir ecazkarlıq verir: – Türkiyə xalqı tərəfindən seçilmiş millət vəkilləri, xalq elçiləri kimi sizə və sizin simanızda bütün Türkiyə xalqına Azərbaycan xalqından səmimi qəlbdən gələn salamları, məhəbbəti, sevgini və hörməti bildirmək istəyirəm” [Ic.s.367].

Heydər Əliyevin nitqləri təkcə anaforalarla yox, həm də epiforalarla – cümlənin sonunda təkrarlanan ifadələrlə də zəngindir. Belə epiforalar publisistik üslub üçün də xarakterikdir: “Bunu Azərbaycan xalqı heç vaxt unutmayıb və unutmayacaqdır. Azərbaycan xalqı həmin ağır dövrdə türk xalqı-

nın ona göstərdiyi köməyi və yardımı heç vaxt unutmayacaqdır” [Ic.s.367].

Publisistik üslub üçün müxtəlif leksikalar, frazeologizmlər xarakterikdir ki, bunların da içərisində ictimai-siyasi leksika bu çıxışda özünə geniş yer tapmışdır: “Bu baxımdan Azərbaycanda demokratiyanın inkişafına bütün sahələrdə bərqərar olmasına imkan yaradılmış və yaradılacaqdır. Respublikanın daxili həyatında çoxpartiyalı sistem artıq bərqərar edilmişdir. Hazırda Azərbaycanda 40-dək siyasi partiya və ictimai təşkilat fəaliyyət göstərir. Azərbaycanda vicdan azadlığı, din azadlığı, dil azadlığı tamamilə təmin olunmuşdur. Bütün bunlar gənc, müstəqil Azərbaycan Respublikasının demokratiya, siyasi plüralizm və bazar iqtisadiyyatı sahəsində atdığı ilk addımlardır. Onlar əlbəttə, daha iri, daha güclü olmalıdır. Lakin siz razı olarsınız ki, bunun üçün həm şərait, həm də vaxt lazımdır” [Ic.s.368].

Burada “çoxpartiyalı sistem”, “vicdan azadlığı”, “din azadlığı”, “siyasi plüralizm”, “bazar iqtisadiyyatı” kimi terminlər ictimai-siyasi leksikaya aid olur. Bu çıxışda da stilistik fiqur kimi ritorik sualdan istifadə edilir.

Ritorik sualın köməyilə Heydər Əliyev auditoriya üçün həqiqəti açıqlayır: “Ancaq bir həqiqəti bilməlisiniz. Keçən ilin sentyabrında Azərbaycan Respublikası Müstəqil Dövlətlər Birliyinə daxil olmuşdur. Bəzən xarici ölkələrin, o cümlədən Türkiyənin də mətbuatında belə yazılar gedir ki, guya Azərbaycan Respublikasının MDB-yə daxil olması onun istiqlaliyyətini əlindən alır. Bu, yanlış fikirdir. Keçmiş Sovetlər İttifaqına daxil olan 15 respublikadan 12-si, o cümlədən Azərbaycan indi MDB-nin üzvüdür. Biz bu birliyə daxil olmaqla nə uduzduq? Heç nə uduzmadıq, amma qazandığımız o oldu ki, biz MDB-yə daxil olanda vaxtilə möhkəm, sıx əlaqələrimiz olan həmin respublikalarla əlaqələri saxlayaraq, həm iqtisa-

diyyatımızın inkişafı üçün müəyyən şərait yaradırıq, həm də Azərbaycanın müstəqilliyini təmin edərək, Ermənistanın respublikamıza qarşı təcavüzkarlığını həmin dövlətlərə sübut etmək üçün imkanımız olur" [Ic.s.372].

Publisistik üslub müxtəlif çeşidli auditoriyalarda özünü biruzə verir. İqtisadiyyatla bağlı Heydər Əliyevin çoxsaylı çıxışlardan birinin əsasında publisistik üslub araşdırılmışdır. Prezident sarayında bank-maliyyə, tədiyyə sistemlərinin və idxal-ixrac əməliyyatlarının vəziyyətinə və onu yaxşılaşdırmaq sahəsində vəzifələrə həsr olunmuş Ümumrespublika müşavirəsindəki Heydər Əliyevin çıxışı publisistik üslubda ölkə iqtisadiyyatının, iqtisadiyyatın inkişafına mane olan amillərin və s. öyrənilməsinə həsr olunmuşdur.

Ölkə həyatının o dövrdə ən aktual, ən vacib məsələlərin həllinə yönələn bu çıxış publisistik üslubun gözəl nümunələrindən sayılır. Nitqin əsasını ümumədəbi sözlərlə yanaşı iqtisadi terminlər təşkil edir. Elmi üslub üçün daha çox xarakterik olan terminlərə – bu çıxışda iqtisadi terminlərə xeyli yer ayrılmışdır. Bu terminlərin şifahi nitqdə sadalanması iqtisadi sahədə Heydər Əliyev təfəkkürünün geniş diapozonuna işarədir. İqtisadçılar qarşısındakı bu çıxış sadə xalq dilində iqtisadçı alimlərə nə etməyi anladır, necə etməyi öyrədir.

Öncə iqtisadi terminlərin çıxışda çoxsaylı verilməsi diqqəti çəkir: "inflyasiya", "debitor borc", "xarici investisiya", "strateji malların ixracı", "valyuta fondu", "bank kreditləri", "klirinq hesablaşmaları", "səhmdar müəssisələr".

İctimai-siyasi (Bu müstəqillik dünyada, o cümlədən 70-ci, 80-cı illərdən başlayaraq gedən ictimai-siyasi proseslərin məntiqi nəticəsidir) [Ic.s.156-160].

Elmi-mədəni (Buna Azərbaycan Respubliaksının təbii sərvətləri, iqtisadi, elmi-mədəni, intellektual potensialı imkan verir.) [Ic.s.157].

İqtisadi-siyasi (Azərbaycan keçmiş, sosialist sisteminə, keçmiş iqtisadi-siyasi sistemə qayıtmamalıdır) [Ic.s.157].

Marksizm-leninizm (Məsələn, o zaman tarixçilər bir şəxsin fəlsəfi görüşlərini araşdırarkən, bir əsər yazarkən çalışırdılar ki, bunu marksizm-leninizm ideologiyasına uyğunlaşdırsınlar.

Hərbi-siyasi (Ona görə də mən demişəm və bir daha deyirəm: əgər 1990-cı il yanvarın 20-də Azərbaycan xalqına qarşı hərbi-siyasi təcavüz edilmişdirsə və bu böyük cinayətdirsə, onun ört-basdır edilməsi bundan da ağır cinayətdir və xalqa qarşı böyük xəyanətdir) [Ic.s.341].

İdxal-ixrac (Bu gün əsasən respublikamızın maliyyə vəziyyəti, istehsal edilən mallardan istifadə eyni zamanda idxal-ixrac əməliyyatlarının səviyyəsi məsələrini aydınlaşdırmaq lazımdır) [Ic.s.257].

Maliyyə-kredit (Çıxışların hamısı onu göstərdi ki, Azərbaycanın iqtisadiyyatı, maliyyə-kredit vəziyyəti çox ağır haldadır...) [Ic.s.257].

Tədqiqatçılar publisistik üslubun iki əsas funksiyasını diqqətə çatdırırlar ki, bu funksiyalar Heydər Əliyevin nitqində də gözlənilir. Elmlər akademiyasındakı ziyalılarla görüşündəki kimi. Elə bu çıxışın özündə üslubun hər iki funksiyası nitq mədəniyyətimizin öyrənilməsi baxımından çox qiymətlidir. Burada informasiya funksiyası kimi böyük natiq Azərbaycan xalqının tarixində görkəmli rol oynamış elm və ədəbiyyat xadimləri haqqında dinləyicilərə məlumat verir. Bu məqamda da özünəməxsus Heydər Əliyev nitq üslubu özünü göstərir. Bu, quru, standart yeknəsək informasiyalar deyil, auditoriyanı düşündürən, tariximizə, onun şanlı keçmişinə hörmətə çağıran, yeknəsəklikdən uzaq informasiyalardır: "Nizami Gəncəvinin 840 illiyini böyük bir yubiley kimi qeyd edəndə bizə çox yerdə irad tuturdular ki, 840 il yuvarlaq tarix

deyildir. Ancaq biz sübut etdik ki, Nizami Gəncəvi elə bir şəxsiyyətdir, tarixdə, dünya mədəniyyətində elə bir iz qoyub getmişdir ki, onun yubileyi hər il keçirilə bilər” [Ic.s.156].

Sonra Məhəmməd Füzuli barəsində akademiya işçilərinə məlumat xarakterli öyrədici bir nitq parçası bəxş edilir.

Publisistik üslubun tələb etdiyi standart dil vasitələri bu çıxışda da özünü göstərir: “iqtisadi əlaqələr”, “sosial gərginlik”, “iqtisadi böhran”, “vergi sistemi”, “vergi siyasəti”, “sosialist iqtisadiyyatı”, “sosializm sistemi”, “keçid dövrü”, “iqtisadiyyat komissiyası”, “gömrük işçiləri”, “gömrük siyasəti”, “gömrük komitəsi”. Bu çıxış sırf bank-maliyyə, idxal-ixrac əməliyyatlarının araşdırılmasına yönəldiyi üçün ekspressiv, emosional nitq vasitələrinə az yer ayrılmışdır. Ritorik suallarla nitqin 3-4 yerində iqtisadiyyat məsələlərindəki əyintilər auditoriyanın diqqətinə sərrastcasına çatdırılır: “Bizdə isə 1917-1920-ci illərdə bu yol qırılmış, yeni bir iqtisadi xətt götürülmüşdür. 70 il ərzində bu yeni iqtisadiyyat müəyyən müsbət nəticələr də vermiş, lakin ümumdünya miqyasında qəbul olunmamışdır. İndi nə edək? Nə vaxtadək saxlayaq?” Sosialist iqtisadiyyatına, geriyə yolun qalmadığını natiq “bəli” təsdiq ədatı, nida cümləsi ilə auditoriyaya fikrini çatdırır, sonda isə qətiyyətli cümlə dövlət başçısının bu sahədəki fikrini ifadə edir: “Bəzi yerlərdə ola bilər, fabriklərdə, zavodlarda istehsalı aşağı salmışlar ki, sonradan bunları özəlləşdirsinlər. Bəli, belə hallar var. Lakin biz yenidən bunları sosializm sisteminə qaytarmayacağıq ki! Ona görə də sərbəstləşdirmə, özəlləşdirmə getməlidir”.

Publisistik üslubda dil vasitələrindən, xüsusilə sual cümlələrindən də nitqin məna gücünü artırmaq üçün istifadə olunur: “Çox düşündük, nəhayət, mən o binanın Akademiyanın Əlyazmalar Fonduna verilməsi haqqında qərar qəbul etdim.

Nə üçün? Çünki Əlyazmalar Fondu, əsrlərdən bəri qalmış o kitablar bizim üçün böyük bir sərvətdir".

"Gələn il Füzulinin 500 illiyi tamam olacaq. Biz bu yubileyə yaxşı hazırlaşmalıyıq. Biz Füzulinin təkcə "Leyli və Məcnun" poemasının müəllifi kimi yox, dünya miqyaslı filosof kimi, böyük alim kimi dünyaya tanıtmalıyıq" [Ic.s.157].

Sonrakı informasiya mərhələsində böyük natiq Nəsimi, Bəhmənyar, Nəsirəddin Tusi haqqında danışır: "Nəsimi də yalnız şair deyil, həm də alim, filosofdur. Eyni zamanda böyük alimlərimiz – Bəhmənyar, Nəsirəddin Tusi və başqalarını qeyd etmək istəyirəm".

Akademiya auditoriyası sonrakı mərhələdə böyük natiqin dilində aşağıdakı informasiya tipli məlumatları eşidir: "Xalqımızın böyük şəxsiyyətlərinin həm yaradıcılığını, həm də Azərbaycan xalqı qarşısındakı xidmətlərini daim tədqiq etmək, şübhəsiz ki, mühüm vəzifələrdən biridir. Məsələn, Mirzə Fətəli Axundov kimi şəxsiyyətlərin. Gələn il Abbasqulu Ağa Bakıxanovun 200 illiyi, Ülvi Rəcəbin 90 illiyi, Əlağa Vahidin 100 illiyi tamam olur. Bunlar Azərbaycanın böyük şəxsiyyətləridir".

Yuxarıdakı informasiya funksiyası böyük natiqin nitqində quru informasiya yığını deyil. Bu, canlı, dolğun, mənalı bir informasiyadır. Sonda bu informasiyaları qavrayan auditoriyanı nəticələr çıxarmağa çağırır: "Müstəqil dövlət Heydər Əliyevin publisistik ruhlu, publisistik üslublu çıxışlarında nitqin ekspressivliyini artıran sinonim cərgələrdən geniş istifadə olunur. Bu sinonim cərgələr bəzən sadə leksikada – sadə xalq dilində, bəzən də yüksək kitab dilində özünü biruzə verir.

"İndi də Azərbaycanın qeyrətli, namuslu, cəsarətli oğulları Vətəni qoruyaraq şəhid olurlar, canlarını qurban verirlər".

"Xalqın ağlı, zəkası, biliyi birləşməlidir". "Bəzən də siz bunun şahidi olursunuz, demokratiyanı özbaşınalıq kimi, qa-

nunsuzluq kimi, xaos kimi anlayan adamlar, hətta dövlət başında olan adamlar Azərbaycanı gətirib bu ağır vəziyyətə salıblar”. Əgər bu sinonim cərgədə özbaşınalıq sadə xalq dilindədirsə, qanunsuzluq yüksək kitab leksikasında, xaos isə alınma sözdür.

“Əziz soydaşlar, dostlar! Xanımlar və cənablar!” –girişi ilə nitqinə başlayan böyük natiq Böyük Britaniyada yaşayan azərbaycanlılarla görüşdə öncə səfərinin məqsədini sadə, aydın, lakonik cümlələrlə auditoriyaya çatdırır: “Bilirsiniz ki, biz öz müstəqilliyimizi dünyada təsdiq etmək, onu toxunulmaz etmək, əbədiləşdirmək, enməz etmək üçün Dünya Birliyində Azərbaycanın bu gün nə olduğunu və gələcəkdə nə cür ölkə olacağını sübut etməliyik. Çünkü keçmişdə iki əsr çar Rusiyasının, sonra isə Sovetlər İttifaqının tərkibində olan Azərbaycan öz nefti, mədəniyyəti, musiqisi, alimləri ilə nə qədər məşhur olmuşdursa, ancaq bir ölkə, dövlət kimi tanınmamışdır” [XVIc.s.400-413].

Bütün publisistik çıxışlarında olduğu kimi burada da standart söz vasitələri yeri gəldikcə işlədilir: “dövlət müstəqilliyi, hərbi münaqişə, erməni diasporu, neft yataqları, qazma qurğuları, xarici şirkətlər, Qarabağ məsələsi, beynəlxalq hüquq normaları, ATƏT-in prinsipləri, ərazi bütövlüyü, beynəlxalq təşkilatlar, daxili sabitlik, silahlı dəstələr, atəşkəs rejimi, bazar iqtisadiyyatı, demokratik cəmiyyət, prezident seçkiləri, Azərbaycan dili, rus dili, türkdilli xalqlar və s.” Bu standart sözlər içində gah terminlərə, gah neologizmlərə, əsasən də ümumədəbi sözlərə rast gəlirik.

Nitqin emosionallığını, ekspressivliyini artıran sinonimlər Heydər Əliyevin publisistik üslublu nitqlərində də özünü göstərir. Elə Türkiyə Böyük Millətlər Məclisindəki çıxışda da sinonimlər onun nitqinə xüsusi bir ecazkarlıq verir:

"səmimi qəlbdən gələn salamları, məhəbbəti, sevgini və hörməti...." – Türkiyə xalqı tərəfindən seçilmiş millət vəkilləri, xalq elçiləri kimi sizə və sizin simanızda bütün Türkiyə xalqına Azərbaycan xalqından səmimi qəlbdən gələn salamları, məhəbbəti, sevgini və hörməti bildirmək istəyirəm"

"mötəbər və nüfuzlu" – Hər dəfə də düşünürdüm ki, bu mötəbər və nüfuzlu Böyük Millət Məclisi – türk xalqının həyatında dəyərli və diqqətəlayiq işlər görən bu məclis nə qədər də qüdrətli və nə qədər də məqsədyönlü siyasət aparan bir məclisdir;

"təməl, bünövrə", "möhkəm, davamlı" – Onun qoyduğu təməl, bünövrə o qədər möhkəm, o qədər davamlı olmuşdur ki, 70 il ərzində türk xalqı, Türkiyə cəmiyyəti, Türkiyə dövləti bütün sınaqlardan çıxmışdır, indi də uğurla irəliləyir;

"müstəqillliyi, istiqlalı, milli azadlığı" – XX əsrin əvvəllərində Azərbaycanda bir neçə siyasi qüvvə, xüsusən Azərbaycanın milli azadlığı naminə çarpışan qüvvələr olmuş, onlar Azərbaycanın müstəqilliyi, istiqlalı, milli azaadlığı uğrunda mübarizə aparmışlar;

"qan tökülməsinin, qırğının tərəfdarı deyilik" – Biz qan tökülməsinin əsla tərəfdarı deyilik, qırğının tərəfdarı deyilik.

Publisistik üslub dini münasibətləri də əhatə edir ki, bu sahədə Heydər Əliyevin nitqi öz ecazkarlığı ilə seçilir. 29 iyul 1994-cü il tarixdə Səudiyyə Ərəbistanına müqəddəs Məkkə və Mədinə şəhərlərinə ziyarətdən sonra Bakıda, Təzəpir məscidində, din xadimləri ilə görüşdə İslam dinimizin tarixi, bu günü, gələcəyi, bu dinlə bağlı müasir fikirlər publisistik üslubun tələbləri əsasında auditoriyaya açıqlanır. Üslub üçün xarakterik olan standartlıq burada da özünü göstərir: "Mətbuat, televiziya və digər informasiya orqanları vasitəsilə sizə məlumdur ki, mən Səudiyyə Ərəbistanın məliki, iki müqəddəs şəhərin xadimi Fəhd ibn Əbdül Əziz əl Səud cənablarının

dəvəti ilə bu ölkədə rəsmi səfərdə olmuşam və həmin ölkədəki müqəddəs yerləri ziyarət etmişəm, respublikamız üçün çox əhəmiyyətli olan danışıqlar aparmışam. Müsəlman aləmində, ərəb dünyasında, ümümən dünyada görkəmli yer tutan Səudiyyə Ərəbistanı ilə Azərbaycan arasında əlaqələr yaranması üçün lazımi üşlər görmüşəm" [IIc.s.81].

Yuxarıdakı parçada standart ifadələr – "mətbuat, televiziya, informasiya orqanları", "rəsmi səfərdə olmaq", "müqəddəs yerləri ziyarət etmək", "danışıqlar aparmaq" publisistik üslubun tələblərinə uyğun olaraq işlədilir. Dindarlar auditoriyasında publisistik üslüba çox xarakter olmayan, lakin böyük natiqin dilində çoxsaylı sinonimlər yerli-yerində, ustalıqla işlədilir. Təkcə bu çıxışda işlədilən sinonimlərə diqqət yetirsək Heydər Əliyev publisistik üslubunun özünəməxsusluğunun şahidi oluruq.

"Dözümlü, dəyanətli, cəsarətli" – Xalqımız dözümlü, dəyanətli, cəsarətli olsun ki, biz düşmənin təcavüzünün qarşısını ala bilək.

"Yaralanmış, xəsarət almış, əlil olmuş" – Mənim Allahdan arzum, diləyim bu oldu ki, Vətən yolunda yaralanmış, xəsarət almış, əlil olmuş adamların sağalmasına kömək etsin, onların gələcəkdə sağlam yaşamasının təmin olunmasına yardım etsin. "Allah evi, məscid" – Respublikamızda da mən ilk addımı Allah evinə, məscidə atmışam, sizin qarşısınızda çıxış edirəm.

"Qüdrətli, möhkəm" – Bizim qüdrətli, möhkəm ordumuz olmalıdır, ona görə ki, müstəqil Azərbaycan dövləti daim qüdrətli olsun.

"Kin-küdurət, ədavət, qisasçılıq" – Bəzi adamlar da bir-birinə qarşı kin-küdurət, ədavət qisasçılıq hissləri yaranıb. Bunların hamısını kənara qoymaq lazımdır.

Sabit və sərbəst söz birləşmələri Heydər Əliyevin dini məsələlərlə bağlı publisistik çalarlı nitqlərində də geniş istifadə olunur.

"səmimi qəlbdən salamlamaq" – Sizin hamınızı və sizin simanızda islam dininə etiqad edənləri, bütün azərbaycanlıları, müsəlmanları səmimi qəlbdən salamlayıram [Ic.s.81].

"müstəqilliyin ilk addımları" – Azərbaycan Respublikası öz müstəqilliyinin ilk addımlarını atır.

"özünü o yerlərlə bağlamaq" – Mən Məkkədə, Kəbənin önündə müsahibə verərkən demişdim və bunu bir daha təkrar edirəm ki, müqəddəs yerləri ziyarət etmək, özünü o yerlərlə bağlamaq mənim illərlə, on illərlə ürəyimdə gəzdirdiyim ən böyük arzum idi [Ic.s.82].

"gözümə, alnıma basdım" – Peyğəmbərin namaz qıldığı Minbərin pilləsində oturub, Quranı öpüb gözümə, alnıma basdım.

Heydər Əliyev nitqində publisistik üslub sənayenin və kənd təsərrüfatının inkişafı ilə bağlı keçirilən beynəlxalq konfranslarda da özünü parlaq şəkildə biruzə verir.

Böyük natiqin 9 dekabr 1994-cü il tarixdə müstəqilliyimizin ilk kövrək illərində Respublika Ali Sovetində "Aqrar islahat: problemlər və onların həlli yolları" mövzusundakı beynəlxalq konfransdakı çıxışı publisistik üslubun bütün çalarlarını özündə əks etdirir. Bu çıxışda da standart nitq vasitələri ekspressiv, emosional ifadəli nitq hissələri ilə çulğalaşır.

Öncə standart söz, ifadə və cümlələrə diqqət yetirək. Aqrar islahatın auditoriyanın dərki üçün aşağıdakı standart ifadələrdən geniş istifadə olunmuşdur:

"Azərbaycan iqtisadiyyatı", "aqrar sahə", "aqrar sənaye", "sərbəst iqtisadiyyat", "kənd təsərrüfatı məhsulları istehsal etmək", "iqtisadi göstəricilər", "sahibkarlıq", "iqtisadiyyatın bütün sahələrində islahat aparmaq", "kollektiv təsərrüfat

sistemi”, “sosialist idarəetmə sistemi”, “ciddi islahatlar həyata keçirmək”, “iqtisadi göstəricilərə nail olmaq”, “pambıqçılıq”, “Azərbaycanda pambıq istehsalı”.

Publisistik üslubun mövcud iki əsas funksiyasından biri də informasiya funksiyasıdır ki, bu çıxışda aqrar islahata qədərki vəziyyət izah olunur.

Bu izah standart ifadələrlə auditoriyaya yol açır: “Azərbaycan iqtisadiyyatının böyük bir hissəsini aqrar sahə təşkil edir. Bu sahə iqtisadiyyatımızın, yəni bizim iqtisadi sahədə istehsalın təxminən 40-42 faizinə bərabərdir. Azərbaycan Respublikasında həm əhalinin ərzaq malları ilə, həm də sənayenin bir çox sahələrinin xammal ilə təmin edilməsi aqrar sahə ilə bağlıdır.

Azərbaycanın təbiətinə, iqliminə, torpağına, ərazisinə görə aqrar sahəmiz böyük imkanlara malikdir. Bu imkanlardan daha səmərəli istifadə etmək, onların hamısını, Azərbaycan xalqının rifahı naminə yönəltmək dövlətimizin və aqrar sahədə aparılmalı olan islahatların əsas məqsədidir” [IIc.s.582].

Heydər Əliyev nitqi təküslubluluğa sığmayan bir nitqdir ki, burada bütün üslublar harmonik şəkildə çulğalaşır. Onun nitqində publisistik üslubu digər üslublarla əlaqədə öyrənmək gələcəkdə dilçilk baxımından kifayət qədər zəngin dil materialı verir.

# XIII FƏSİL

# HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ MƏİŞƏT ÜSLUBU

Məişət üslublu nitqlərində Heydər Əliyevin cəsarəti, qorxmazlığı, xalqına olan sədaqəti, özü demiş "xalqın yolunda özünü qurban verməyi" kimi cizgiləri açıqlanır.

Xalqın yolunda heç nədən çəkinməyən bir lider-natiq nitqinin şahidi oluruq. Biləsuvar, Cəlilabad, Masallı, Lənkəran, Astara, Yardımlı və Lerik rayonlarından seçilmiş xalq deputatları və həmin rayonlardan olan rəhbər işçilər və ziyalılarla görüşün (3 avqust 1993-cü il) giriş hissəsində dediyi fikirlər diqqət çəkir, maraq doğurur: "Mən ona da dedim, sizə də deyirəm, Heydər Əliyevin bir ömrü var, onun da çoxu gedib, azı qalıb, nə vaxt kəsiləcək o vaxt da kəsiləcək. Mən demişəm və bir də deyirəm, ömrümün bundan qalan hissəsini xalqıma bağışlamışam, xalqım da bundan nə qədər istifadə edəcək, o qədər də istifadə edəcək. Ola bilər 5 gün olsun, ola bilər bir ay olsun, ola bilər ondan çox olsun, ondan da artıq olsun. Ona görə Əlikram kimi adamların məni hədələməyi, bir onun yox, ümumiyyətlə, məni hədələyən adamların hamısına deyirəm, heç birisi güman etməsin ki, bu hədələr məni bir şeydən çəkindirə bilər, xalqın yolunda mən özümü qurban verməyə hazıram, bu harada baş verəcək mənim üçün fərqi yoxdur. Ancaq bu cür tərbiyəsizlik, bu cür ədəbsizlik şübhəsiz ki, məni narahat edir. Ona görə də bunların hamısını sizə çatdırıram" [Ic.s.55].

"Bundan əlavə, son vaxtlar mənə əziz olan çox adamı itirmişəm. Həyat yoldaşım Zərifə Əzizova 1985-ci ildə vəfat etmişdir. Tanınmış oftalmoloq idi. Üstəlik, musiqi də bəstələyir, gözəl piano çalır, oxuyurdu. Biz otuz il birlikdə ömür

sürmüşdük. Bu yaxınlarda böyük qardaşlarım və bacım dünyalarını dəyişmişlər. Ailədə səkkiz uşaq idik. Atam dəmir yolunda fəhlə idi, gecə-gündüz işləyirdi. Bizi anamız boya-başa çatdırmışdır. Məndən böyük qardaşlarımdan biri akademik idi, Azərbaycanda Elmlər Akademiyasını yaratmışdı, o biri rəssam idi. Məni də ki, tanıyırsınız. Kiçik qardaşlarım və bacılarım sağdırlar. İndi Bakıda onlardan birinin mənzilində yaşayıram. Uşaqlarından birinin çox da böyük olmayan otağını məndən ötrü ayırmışlar. Orada taxt var. Mənə bəs edir" [Ic.s.55].

"Sobesednik"in müxbirinə müsahibəsi ilə tanış olarkən böyük natiqin bizlərə Heydər Əliyev şəxsiyyətinin gücünü anlamaqda kömək etdiyinin şahidi oluruq.

Böyük natiq öz nitqi ilə Heydər Əliyevin görkəmli ictimai-siyasi xadim olduğunu, onun şəxsiyyətindəki ülvi, dərin cizgiləri Azərbaycan xalqına, bütün dünyaya açıb göstərir. Musiqi bəstələyən, gözəl piano çalıb-oxuyan tanınmış oftalmoloq, alim Zərifə Əliyeva ilə otuz il birgə ömür sürmək, Azərbaycanda Elmlər Akademiyasının yaradıcılarından biri Həsən Əliyevin qardaşı olmaq, külfət içində boya-başa çatmaq, gecə-gündüz işləyib, dəmir yolunda fəhləlik etməklə böyük külfət dolandıran Əlirza kişinin və cəfakeş İzzət ananın övladı olmaq! İçərisində bir taxt olan kiçik bir otağa sığınmaq! Heydər Əliyev fikir, düşüncə, təfəkkür insanlarına ağlın, düşüncənin kiçik otağa, kiçik qəfəsə sığmadığını bir daha göstərir. "Böyüklüyə gedən yol çətinlikdən keçir" fikrini bir daha öz həyatı ilə dünyaya sübut edir: "Əgər belədirsə, əvəzini görəcəksiniz. Yeri gəlmişkən, yəqin siz Allaha inanmırsınız... – Əvvəllər bu barədə sadəcə olaraq düşünmürdüm. İndi inanıram. – Nə vadar etmişdir – Yəqin ki, yaş" ("Rossiyski fermer" qəzetinin müxbiri ilə söhbət). [Ic.s.47].

Heydər Əliyevin ictimai-məişət üslublu nitqləri əksər hallarda özünü müsahibə və söhbətlərdə göstərir. Bu müsahibələrdə Heydər Əliyev şəxsiyyətinin çoxcəhətliliyi dinləyicilər üçün açılır. Aşağıda müxbirin verdiyi sualı cavablandırarkən milyonlara örnək, nümunə ola biləcək Heydər Əliyev əxlaqı üzə çıxır:

"– Sirr deyilsə, siz bu qüvvəni haradan alırsınız, axı bu yaxınlarda yetmiş yaşınız oldu, yoxsa sizə yoq kömək edir? Hər halda belə şayiələr gəzir.

– "Xeyr, mən yoqla məşğul olmamışam və məşğul olmuram. Görünür, təbiətin özü mənə hansısa bir qüvvə verib. Xarakterim isə qüvvə və bacarığımı səfərbərliyə almağa vadar edir. Daha nə deyim? Ömrümdə heç vaxt siqaret çəkməmişəm. İçkini də rəmzi olaraq dilimə vurmuşam – sağlıq deyiləndə badəni ancaq qaldırmaqla kifayətlənmişəm".

Heydər Əliyev səxavəti həyatda olduğu kimi onun yubiley tədbirlərində yubilyarlara tuşlanan təbrik nitqlərində də görünür. Necə ki, 12 iyun 1998-ci il tarixində Prezident iqamətgahında, zəmanəmizin görkəmli musiqiçisi Mstislav Rostropoviçə ölkəmizin ali "Şöhrət" ordeninin təqdim olunması mərasimindəki nitqdə bunu görürük: "Əziz Slava, sizə möhkəm cansağlığı arzulayıram. Şadam ki, səhhətiniz yaxşıdır, mən bunu görürəm. Mən sizdən bir qədər yaşlıyam, lakin biz bir nəslin adamlarıyıq. Ona görə də kimin səhhətinin necə olduğunu uzaqdan müəyyənləşdirə bilərəm. Allaha şükür ki, səhhətiniz çox yaxşıdır. Qoy o, daha da möhkəm olsun, çünki, sizin planlarınız, niyyətləriniz elədir ki, onları həyata keçirmək üçün ən azı hələ bu qədər də ömür gərəkdir. İstəyirəm ki, bunların hamısı çin olsun" [XVIc.s.264-265].

Məişət üslublu çıxışlarda Heydər Əliyev dühasının bir çox xarakterləri xalq üçün, millət üçün açılmış olur. Respublika sarayında görkəmli bəstəkar, Azərbaycanın xalq artisti Tofiq

Quliyevin 80 illiyinə həsr edilmiş yubiley gecəsindəki çıxış (19 noyabr 1997-ci il) bu qəbildəndir: "Əziz Tofiq! Mən sənin 80 illik yubileyin münasibətilə sənə təbrik məktubu göndərmişəm. Onu da bil ki, mən göndərdiyim və ümumiyyətlə, yazdığım məktubların hamısını əvvəldən axıradək özüm yazıram. Siz də, hamınız da bilirsiniz ki, mənim dediyim sözlərin də hamısı öz beynimdən gələn sözlərdir, heç vaxt əlimdə kağız olmayıbdır... Ancaq hesab edirəm, sən bu yubileydə mənim haqqımda o qədər sözlər dedin ki, mən buraya gəldim sənə deyəm ki, bu sənin yubileyindir, bu gün sənin günündür" [XIIIc.s.297].

Heydər Əliyevin məişət üslubuna bəzən satirik çalarlar qarışır. Polad məntiqə söykənən yumoristik, satirik çalarlar auditoriyanı güldürməkdən çox düşündürür. Belə nitq uzun illər yaddaqalan Sabirsayağı, Cəlilsayağı nitqə çevrilir: "Lakin bilməliyik ki, böhran içindəyik və müharibə şəraitində yaşayırıq, Vətənimizi qorumalıyıq, bir milyondan artıq qaçqını saxlamalıyıq. Bunu hamımız bilməliyik. İqtisadçı nəyi isə əsas tutaraq hesabladığı 37 min manatlıq "istehlak səbətindən" söz saldı. O, buraya 500 adda şey daxil etmişdir. Bu ki, lap padşah yaşayışı olur! Yaxud hər adama gündə 1 kiloqram ağartı məhsulları nəzərdə tutur. Lap yaxşı vaxtlarda belə, burada oturanların hansı bir gündə bu qədər ağartı yeyib?.. Yaxud sən deyirsən ki, hər adam ildə bir dənə yorğan almalıdır. Mənim özüm 30 il bundan əvvəlki yorğanda yatıram. Axı kim ildə bir dənə yorğan alır? Eləcə də balış. Onun da yalnız üzünü dəyişdirirlər. Hətta müstəqil respublikamız gələcəkdə zəngin yaşayanda da belə şeylərin mümkünlüyünə mən inanmıram" [IIc.s.247].

Məişət məsələlərində incə təfərrüatlara varan böyük natiq əsas vəzifənin, ümdə borcun "Vətəni qorumaq", "qaçqınları

saxlamaq" dan ibarət olduğunu müşavirə iştirakçılarının diqqətinə çatdırır.

Heydər Əliyevin məişət üslublu nitq və çıxışları sonda dövlətçilik və elmi səviyyəyə gəlib çıxır. 21 mart 1998-ci ildə Şirvanşahlar sarayı muzeyinin həyətində ziyalılarla söhbət bu qəbildəndir. "Niyazi Rzayev: Mən həyatımın 60 ilini Azərbaycanın orta əsr memarlıq abidələrinin bərpasına həsr etmişəm. Şirvanşahlar sarayında 50-ci illərdən işləyirəm. 81 yaşım var. Məni bu abidə yaşadır.

Heydər Əliyev: 81 nə yaşdır ki! Sən çox cavan görünürsən. Gördüyünüz işlər çox gözəldir. Mən sizin işinizi yüksək qiymətləndirirəm. Bunların hamısını biz bərpa edib, əvvəlki vəziyyətə gətirib çıxarsaq, gələcək nəsillər üçün böyük iş görmüş olarıq". Məişət üslublu söhbət, nitq sonda tarixi abidələrimizin qorunması işinə ciddi tələb qoyaraq, varislik ənənələrini saxlamağa çağırır. Elə həmin görüşdə Azərbaycan dövlətinin, dövlətçiliyinin qədim olduğunu qətiyyətlə açıb göstərir. "Niyazi Rzayev: Çox adamlar yazır ki, Azərbaycanda nə padşah, nə də saray olubdur. Heydər Əliyev: Azərbaycanda padşah da olub, saray da olubdur. Ona görə də biz bu işi tamamlayıb göstərməliyik ki, saray da olubdur" [IIc.s.167].

Fransanın milli bayramı – Bastiliyanın alınması günü münasibətilə Fransanın Azərbaycandakı səfirliyinin təşkil etdiyi rəsmi qəbuldakı nitq məişət üslublu nitq olaraq Azərbaycan-Fransa münasibətlərinin inkişafına xidmət edir. Siyasi hadisə olan Bastiliyanın alınması ilə fransızların futbol üzrə dünya çempionu olmalarının üst-üstə düşməsini dilə gətirib fransız xalqını təbrik edir: "Bu futbol yarışlarını mən də televiziya vasitəsilə izləyirdim. Gizlətmirəm, çox həvəslə gözləyirdim ki, Fransa yığma futbol komandası qalib gəlsin. Düzü, heç inanmırdım ki, onlar dünya çempionatının qalibi olacaqlar. Ancaq bizim dostlarımız sübut etdilər ki, fransız xalqı başqa

sahələrdə olduğu kimi, futbol yarışlarında da böyük nailiyyətlər əldə edə bilər. Bu yarışları televiziya ekranlarından izləyənlərin hamısı, o cümlədən mən də bütün fransızların bu qələbə üçün nə qədər çalışdıqlarının şahidi olduq. Bu qələbə fransızlara böyük sevinc gətirdi. Ona görə də bu gün ikiqat bayramdır. Onlardan biri Bastiliyanın alınması, digəri isə fransızların futbol üzrə dünya çempionu olması bayramıdır. Mən bu bayram münasibətilə sizi ürəkdən təbrik edirəm" [XVc.s.396-397].

Məişət üslublu nitqlərdə mədəniyyətimizin qorunması yolunda necə deyərlər, mübarizəyə qalxır. Mədəniyyətimizə ayrı-ayrı adamların köməyini yox, dövlət qayğısını tələb edir. Xalqın mədəni səviyyəsinin, mentalitetinin yüksəlməsində teatrın xüsusi rolunu qeyd edir. Ritorik sualların köməyi ilə nitqin təsir gücü yüksəlir, məişət üslublu nitq şüurları oyandırmaq gücünə yetir: "Deyirlər ki, sağ olsun filankəslər, mədəniyyətə kömək edirlər. Lakin mən bunu bu şəkildə qəbul edə bilmərəm. Necə yəni, dövlətin teatrı təmir etməyə imkanı yoxdur? Bu, nə məsələdir? Mən hələ görməmişəm, deyirlər ki, ayrı-ayrı adamlar özlərinə üç mərtəbəli bağ evləri, binalar tikdirmişlər. Allah sağlıqlarına qismət eləsin, heç kəsə paxıllığım yoxdur. Ancaq birinci növbədə teatr tikmək lazımdır. Xalq üçün, onun mədəniyyətinin inkişafı üçün teatrın nə qədər əhəmiyyətli olduğunu yaxşı bilirsiniz. Bir daha deyirəm, o dövrdə ötən əsrin sonunda və XX əsrin əvvəlində qabaqcıl fikirli, xalqın mədəniyyəti haqqında düşünən, həm də imkanlı adamlar teatrın qayğısına qalırdılarsa, indi dövlətin bizim əlimizdə olduğu bir vaxtda nə üçün qayğını hiss etmirik" [XVIc.s.48].

18 sentyabr 1994-cü il tarixdə böyük drijor və bəstəkar Niyazinin ev-muzeyinin təntənəli açılışında çıxış ilk baxışda səmimi təsir bağışlayan, sadə və izahedici cümlələrin köməyi

ilə həyata keçirilən məişət üslublu nitqdir. Çıxışın diqqətlə araşdırılmasından sonra məlum olur ki, bu nitqi ilə Heydər Əliyev Azərbaycan musiqisinin inkişafının, bu musiqinin təşəkkülündə əvəzsiz xidmətləri olan dahi insanlarımızın rolunu analiz edən musiqişünas alim kimi çıxış edir. Eləcə də, bu çıxışların məzmunundan Azərbaycan musiqisinin inkişafında Heydər Əliyevin unudulmaz xidmətləri görünməkdədir: “Yadımdadır, Niyazinin Sosialist Əməyi Qəhrəmanı adı alması üçün təşəbbüs göstərdim. Bilirsiniz ki, o vaxtlar bizim bir neçə yazıçımız, şairimiz və bəstəkarımızdan mərhum Qara Qarayev, Fikrət Əmirov Sosialist Əməyi Qəhrəmanı adına layiq görülmüşdülər. Niyazinin də bu adı almasına çalışdım. Qəribə bir hal meydana çıxdı. Mən bu təklifi irəli sürəndə Moskvada araşdırdılar ki, bəstəkarlardan, yazıçılardan, şairlərdən, alimlərdən Sosialist Əməyi Qəhrəmanı var, ancaq drijorlardan yoxdur. Mənə dedilər ki, bəs necə ola bilər ki, Rusiyanın, Ukraynanın və başqa böyük millətlərin, yaxud respublikaların drijorlarından, Moskvanın məşhur simfonik orkestrlərinə və ya Böyük Teatrın orkestrinə rəhbərlik edən drijorlardan heç biri Sosialist Əməyi Qəhrəmanı adı almayıb, amma siz təklif və xahiş edirsiniz ki, Niyaziyə belə ad verilsin.

O vaxtlar mən bu söhbətləri Sovet İttifaqının ən yüksək səviyyələrində aparırdım. Onlarla danışarkən və öz təklifimi əsaslandırarkən deyirdim ki, əgər həmin drijorlar Sosialist Əməyi Qəhrəmanına layiqdirlərsə və siz indiyədək bu adı onlara verməmisinizsə, bu, bəlkə də sizin səhvinizdir və öz işinizdir. Amma mən hesab edirəm və Azərbaycan Respublikası adından bildirirəm ki, bu adama layiq olan ad indiyədək ona təqdim edilməmişdir. Axı Niyazi layiqlilərdən ən layiqlisidir. Şübhəsiz ki, mənim bu sözlərimin qarşısında durmaq çətin idi. Odur ki, təklifim qəbul edildi və Niyazi keçmiş

Sovet İttifaqının drijorları arasında birinci olaraq Sosialist Əməyi Qəhrəmanı adını aldı” [IIc.s.250].

Təkcə bu ictimai-məişət üslublu nitqdə Heydər Əliyevə xas olan keyfiyyətlər bir-bir açılır. Burada “bu bəlkə də sizin səhvinizdir və öz işinizdir” deyimi onu qətiyyətli dövlət başçısı kimi auditoriyaya bir daha tanıdır. Qətiyyətlilik Heydər Əliyev dilində o dövr üçün mümkünsüz görünən bir ittiham kimi səslənir: “Amma mən hesab edirəm və Azərbaycan Respublikası adından bildirirəm ki, bu adama layiq olan ad indiyədək ona təqdim olunmamışdır” [IIc.s.250].

Xəstəxanalarda, ziyarətgahlarda ulu öndərin keçirdiyi görüşlər məişət üslublu xarakter daşıyır desək, səhv etmərik. Burada da Azərbaycanın apardığı siyasət, müstəqilliyə yönələn fikirlər öndə olur. 26 may 1998-ci il tarixdə Respublika Səhiyyə Nazirliyinin Mərkəzi Kilinik Xəstəxanasında görkəmli ədəbiyyat və incəsənət xadimləri ilə görüşdəki söhbətdə xalq yazıçısı Yusif Səmədoğluna verdiyi təskinlik maraqlı nitq nümunəsidir.

Bu gün həkim-xəstə münasibətlərini ehtiva edən deontologiya elmi baxımından bu təskinlikverici nitq həkimlərin əlində mühüm təsir vasitəsi rolunu oynaya bilər: “Sənin bu xəstəliyin ötüb keçəcəkdir. İnşallah, hər şey keçəcək və ayağa duracaqsan. Mən bilirəm, çünki özüm də vaxtilə xəstə olmuşam. Bilirsiniz ki, mən üç ay Moskvada xəstəxanada yatmışam. Özü də elə xəstə idim ki, deyirdilər heç ayağa dura bilməyəcəkdir. Çoxları da deyirdi ki, o, ayağa dursa yaşaya bilməyəcəkdir... Sonra xəstəxanadan da çıxdım və iki aydan sonra vəzifədən də getdim. Ondan sonra da, Allaha şükürlər olsun ki, yaşayıram. İndi sən də sağalacaqsan, duracaqsan və on illərlə yaşayacaqsan” [IXc.s.144].

Matəm mərasimlərində söylənilən nitq və çıxışlar məişət üslubuna aid edilir ki, burada da özünəməxsus Heydər Əliyev

nitqi auditoriyaları valeh edir. Məişət nitqi sadə cümlələrin köməyi ilə həyata keçirilir. 7 aprel 1997-ci il tarixdə, Şəhriyar adına Mədəniyyət Mərkəzində, tibb elmləri doktoru, əməkdar elm xadimi, dövlət mükafatı laureatı Tamerlan Əziz oğlu Əliyevin matəm mərasimindəki çıxış əsasən məişət üslubu xarakteri daşıyır. "Tamerlan" müraciəti haqqında danışılan insanın natiqə yaxınlığından xəbər verir: "Hörmətli dostlar! Tamerlanın vəfatı bizim ailəmiz üçün ağır, böyük itkidir. Eyni zamanda Tamerlanın vəfatı Azərbaycanın tibb elmi üçün, Azərbaycanın elmi, ali təhsili üçün böyük itkidir" [IXc.s.144].

Dəfn mərasimlərində söylənilən nitqlərdə haqqında söhbət gedən adamların şəxsiyyəti, cəmiyyətdə tutduğu mövqeyi, xalq qarşısındakı xidmətləri önə çəkilir. Özünəməxsus Heydər Əliyev nitqi məişət üslublu çıxışlarda da öz əksini tapır. Əgər çıxışın başlanğıcında Tamerlan Əliyev haqqında sadə, yığcam, yerinə düşən, səmimi cümlələr yer tutursa: "Əlli il müddətində mən Tamerlanı yaxşı tanımışam, onun həyatını, fəaliyyətini həmişə müşahidə etmişəm. O, özü çox istedadlı bir insan, fitri istedada malik adam olubdur. Bununla yanaşı çox fədakar, əməksevər, işgüzar adam olubdur. Seçdiyi peşəni daim sevib və bu sevgi ilə, məhəbbətlə peşəsinə, insanlara xidmət edib və cəmiyyətdə özünə layiqli yer tutubdur" [IXc.s.144].

Çıxışın növbəti ardıcıllığında natiq, necə deyərlər, üslubu dəyişir. Məişət üslubundan publisistik üsluba keçən Heydər Əliyev "tibb, səhiyyə" sahələrinin mühümlüyünü, o sahələrdə çalışan insanların "ehtirama" layiq olduqlarını diqqətə çatdırır. Publisistik üslubdan "xəstələrin ömrünü uzadıbdır. Ancaq indi özü həyatdan gedibdir" poetik deyimlərlə – bədii üsluba keçir: "Tibb, səhiyyə hər bir insan üçün çox vacib olan sahədir. Özünü tibb, səhiyyə işinə, insanların sağlamlığının keşiyində durmaq işinə həsr edən adamlar həqiqətən çox yüksək hörmət və ehtirama layiq olan insanlardır. Azərbaycanda belə insan-

ların içərisində Tamerlan Əliyevin xüsusi yeri olubdur. O doğrudan da Azərbaycanda tibb elminin inkişafına öz töhfələrini verib, xidmətlərini göstərib, minlərlə, on minlərlə insanları müalicə edib, onların ömrünü uzadıbdır. Ancaq indi özü həyatdan gedibdir" [IXc.s.145].

Çıxışının əksər yerlərində dost, qohum kimi "Tamerlan" deyə müraciət edirsə, Azərbaycan səhiyyəsinin inkişafında mühüm rola malik alim kimi "Tamerlan Əliyev" müraciəti səslənir.

Məişət üslublu, xüsusən də matəm mərasimlərində natiqlərin hazırlaşmağa imkanı olmayan belə nitqlər spontan hesab edilir.[1] Heydər Əliyev təfəkkürü, fikirləşməyə ehtiyacı olmayan natiq burada da mərasim iştirakçılarını məftun edir. "Tamerlan həddindən artıq təvazökar bir adam idi. Bəlkə də onun təvazökarlığı bəzən ifrat dərəcəyə gəlib çatırdı, o qədər təvazökar idi. Sadə, çox sadə bir insan idi, ancaq çox zəkalı, çox mədəni, çox xeyirxah, insanpərvər, sülhsevər insan idi. O, daim insanlar arasında xoş münasibətlər yaranmasına çalışırdı, daim xeyirxahlıq edirdi, insanları bir-birinə yaxınlaşdırmağa çalışırdı" [IXc.s.145].

"Çox" qüvvətləndirici ədatından bir neçə yerdə istifadə edən böyük natiq Tamerlan Əliyev timsalında əsl insan necə olmalıdır sualına cavab verir.

Məişət üslublu nitqlər xatirələr söyləməyi tələb edir ki, Heydər Əliyevə məxsus "xatirimdədir" modal sözü xatirələri çözələyir: "Mənim xatirimdədir, gənc vaxtlarında da müəyyən bir gün işə gecikmiş olsun, yaxud üzərinə düşən vəzifəni yerinə yetirməmiş olsun və ya işində bir səhlənkarlığa yol vermiş olsun – belə şeylər mümkün deyildi. O qədər məsu-

---

[1] Hüseynov S. "Nitq mədəniyyəti" (Dərslik). Bakı, "Yazıçı", 2010. səh.114

liyyətli idi ki, öz işinə, peşəsinə o qədər məsuliyyətli yanaşırdı ki, bəzən bu, insanları təəccübləndirirdi” [IXc.s.145].

Məişət üslublu nitqlərdə böyük natiq haqqında danışdığı insanların hansı kökə, nəsilə mənsubluğunu, əsil-nəcabətini iştirakçılara çatdırır, tanıdır: “Alicənablığı, yüksək mədəniyyəti, ziyalılığı, fədakarlığı, sadəliyi, insanpərvərliyi ilə həqiqətən o, atasının – mərhum Əziz Əliyevin xüsusiyyətlərinin əksəriyyətini özündə əks etdirirdi. Bu gün Tamerlanı son mənzilə yola salarkən demək olar ki, o, atası Əziz Əliyevin layiqli oğlu olmuşdur”[IXc.s.144-145].

Matəm mərasimindəki çıxışını dini üsluba xas olan cümlələrlə yekunlaşdırır: “Mən dostum Tamerlanın müqəddəs cənazəsi qarşısında baş əyirəm. Allahdan ona rəhmət diləyirəm” [IXc.s.145-146].

Məişət üslubuna aid edilə biləcək matəm, vidalaşma mərasimlərində Heydər Əliyevin yarıməişət, yarıpublisistik nitqi özünü göstərir: “Xəlil Rza bir vətəndaş, bir insan kimi bütün xüsusiyyətləri ilə həmişə sevilmişdir. Mən daim onun yaradıcılığına, insanlığına, vətəndaşlığına, ən çox da cəsurluğuna, əyilməzliyinə, öz ideyalarından dönməzliyinə hörmət etmişəm, onu yüksək qiymətləndirmişəm. Ona görə də bu itki bütün Azərbaycan xalqı kimi, mənim üçün də böyük bir itkidir. Güman edirəm ki, Xəlil Rzanın parlaq həyatı, onun böyük vətəndaşlığı, milli azadlıq uğrunda mübarizliyi bütün azərbaycanlılar üçün nümunə olacaqdır. Əminəm ki, Xəlil Rza Azərbaycan xalqının qəlbində daim yaşayacaqdır” [IIc.s.97].

“Mənim üçün də böyük itkidir” deməklə Xəlil Rzaya olan şəxsi münasibətlərini dilə gətirən böyük natiq “Xəlil Rza Azərbaycan xalqının qəlbində daim yaşayacaqdır” sözləri ilə şairin itkisinin miqyasını milyonlara çatdırır.

Bu üslub ən çox ziyafətlərdə, yubileylərdə reallığa yaxın təriflərlə, xoş və səmimi sözlərlə həyata keçirilir. Böyük

natiqin bu sahədə də nitqləri öyrənilmək baxımından mühümdür: “Sizin hamınıza cansağlığı, səadət, italyan xalqına xoş həyat, sülh və sabitlik, eyni zamanda belə gözəl temperament, həyat eşqi, şuxluq arzulamaq istəyirəm. İtalyanlar hamıya sübut ediblər ki, onlar yaxşı işləyə, dünya sivilizasiyasını incəsənət, mədəniyyət inciləri ilə zənginləşdirə, ən yüksək texnologiyaya malik istehsal yarada, elmi-texniki tərəqqiyə böyük töhfə verə bilirlər. Eyni zamanda yaxşı istirahət etməyi, spagetti yeməyi və əla İtaliya şərabı içməyi bacarırlar. Mən sizə həmişə belə gözəl həyat arzulayıram” [XIIc.s.246].

Təkcə bu nitq göstərir ki, natiq İtaliya xalqına məxsus xüsusiyyətləri, onların dünya sivilizasiyasındakı yerini incədən-incə bilir. Və ziyafət məqamında uzaq, müstəqilliyə təzəcə qədəm qoymuş bir ölkənin prezidenti, Heydər Əliyev italyan auditoriyasını fəth edə, İtaliya-Azərbaycan münasibətlərinə xoş ovqat gətirə bilir.

İtaliyada, “Palatso Taveria” sarayında Azərbaycan Prezidentinin şərəfinə verilən ziyafətdə (26 sentyabr 1997-ci il) nəvəsinin anadan olması münasibətilə ürəkdən gələn, qəlbdən süzülən, qəlbləri riqqətə gətirən kövrək notlarla məişət üslublu çıxış edir. “Baba sevinci necə olur” sualına bu çıxışda səmimi cavab tapmaq olar: “Çox sağ olun. Dünyaya yenicə gəlmiş nəvəmi yada salmaqla isə siz məni çox kövrəltdiniz. Bu mənim həyatımda, ailəmin həyatında çox böyük hadisədir. İndi mənim altı nəvəm var. Mən bu hadisədən çox sevinirəm. Şadam ki, burada, məhz Romada, bu qədim binada, bu gözəl şəraitdə həmin hadisə münasibətilə, nəvəmin sağlığına badə qaldırdınız. Sizə təşəkkür edirəm” [XIIc.s.109].

Heydər Əliyevin xarici ölkələrdəki Azərbaycan diasporu, eləcə də icmaları ilə görüşləri ictimai-məişət nitqinə çox uyğun gəlir. Bu nitqlərdə də çıxışların ana xəttini Azərbaycanın müstəqilliyi təşkil edir. Hər bir görüş, hər bir söhbət müs-

təqilliyimizə xidmət edir. Bu çıxışlar çox vaxt ağsaqqal öyüdü xarakterindədir: "Əziz oğlum, əziz qardaşım, bu, Azərbaycana xidmət deyildir. Bilirsiniz, Azərbaycanın içərisində olanlar Azərbaycandadır. Azərbaycan demokratik hüquqi dövlət qurur" (Polşadakı Azərbaycan icmasının nümayəndələri ilə görüşdə söhbət və çıxış, 27 avqust 1997-ci il). [XIIIc.s.213].

Bəzən də bu məişət nitqi sərt ağsaqqal tələbi kimi səslənir. Auditoriyanı səfərbər edərək necə deyərlər çaşqınlıqdan, tərəddüddən çıxarır, düz yola, doğru yola yönəldir: "Ona görə də siz ağlınızı başınıza yığın, cavan adamlarsınız, öz işinizlə məşğul olun. Əgər təbliğat işi ilə məşğul olursunuzsa, Azərbaycan dövlətinin, hökumətinin siyasətini, Azərbaycanın nailiyyətlərini təbliğ edin. Əgər edə bilmirsinizsə, qurtarın bu işləri, gedin ticarətinizlə məşğul olun. Sağ olun" [XIIIc.s.214]

Məişət üslublu nitqlərdə Heydər Əliyev poetizmi, fəlsəfəsi çox vaxt işə düşür, görüş iştirakçılarını heyran qoyur. Digər nitqlərində olduğu kimi burada da görüş keçirilən gün, saat, an bədiiləşir. "Sizinlə birlikdə Xəzər dənizinin içindən günəşin qalxmasını müşahidə etdik. Gözəl bir mənzərədir. İnsanlar gecə yatıb səhər işığını səbirsizliklə gözləyirlər. İnsanlar həmişə qaranlıqdan işığa çıxmağa çalışırlar. İnsanlar həmişə günəşin çıxmasının həsrətində olublar. Bu saatlarda bu hissiyyatları sizinlə birlikdə keçiririk" [XIIc.s.95].

Ankaranın mərkəzi küçələrindən birinə Azərbaycan prospekti adı verilməsinə həsr olunmuş təntənəli mərasimdəki (6 may 1997-ci il) çıxış: "Bu gün hava da, günəş də, Azərbaycan caddəsindəki, xoş əhval-ruhiyyə də – hamısı Türkiyə-Azərbaycan dostluğuna olan münasibətdir. Məhz belə bir bahar günündə, günəşin gözəl şüaları altında, gözəl əhval-ruhiyyə ilə, insanların sevinci ilə bu caddəyə Azərbaycan caddəsi adının verilməsini məmnuniyyətlə qəbul edirəm və buraya toplaşanlara, Ankaranın bələdiyyə başkanına və mənim əziz dos-

tum, qardaşım, cümhurbaşkanı Süleyman Dəmirələ hörmət və ehtiramımı, təşəkkürümü bildirirəm” [IXc.s.433].

Heydər Əliyev nitqlərinin xüsusilə açıq havada etdiyi çıxışların baş verdiyi günlərin “meteorologiyasını” necə deyərlər özünə məxsus şəkildə bədiiləşdirir, yaddaqalan edir, insanları həmin günü duymağa çağırır. “Allahın hər günü gözəldir” anlamını ortaya qoyur.

Azərbaycan ictimai-siyasi natiqliyinin yaradıcılarından biri kimi Heydər Əliyevin nitqlərində məişət üslubu sona qədər davam etmir. Bu üslub öz yerini elmi, publisistik üslublara verərək, yenə də öz yerinə qayıdır. 15 aprel 1997-ci il tarixdə Bakı İncəsənət Mərkəzində məşhur heykəltəraş, xalq rəssamı Ömər Eldarovun görkəmli oftalmoloq, akademik Zərifə Əliyevanın xatirəsinə həsr etdiyi “Elegiya” əsərinin – mərmər abidənin və bu abidədən bəhs edən albomun təqdimat mərasimindəki çıxış məişət üslubu xarakteri daşıyır. Çıxış sadə, izahedici, təsirli cümlələrlə başlayır: “Hörmətli dostlar! Bu gün bizim üçün əziz, eyni zamanda kədərli gündür. Əzizdir o mənada ki, Zərifə xanımın xatirə günüdür. Kədərlidir o mənada ki, Zərifə xanım 12 ildir bizdən ayrılıbdır. Ancaq bu hadisə bu gün bizim buraya toplanmağımızda bir məna daşımır. Ailəmiz üçün bir xatirə günü olaraq biz bu günü həmişə yad edirik. Eyni zamanda, bu gün Zərifə xanımın surətini əks etdirən gözəl bir incəsənət, heykəltəraşlıq əsəri nümayiş etdirilir. Ona görə də bu, bizim respublikamızın mədəniyyətində, heykəltəraşlıq, incəsənət sahəsində yeni bir əsərin meydana çıxmasını nümayiş etdirir” [IXc.s.296].

Heydər Əliyev ictimai-məişət üslublu nitqlərində “xatirimdədir” modal sözün köməyi ilə auditoriyanı sanki özü ilə bərabər keçmiş tarixə aparır. Xalq qarşısında, dövlət qarşısındakı xidmətləri ilə gənc nəslin dövlətçilik, müstəqillik yolunda inkişafına şəxsi nümunə göstərir: “Xatirimdədir, burada

yaşayan insanlara nəqliyyat xidməti çox çətin idi. Mən buraya sürətlə metropoliten xətti çəkilməsi ilə məşğul oldum. Xatirimdədir və burada iştirak edənlərin bəziləri də o vaxt bizimlə bərabər idilər, – biz buraya gələn metro xəttinin stansiyasını böyük bir bayram kimi, böyük təntənə ilə açdıq. Yeni böyük binalar tikməyə başladıq, ağaclar əkməyə başladıq.

Həddindən artıq, gözəl bir guşə alınıbdır. Mənə deyirlər ki, axşamlar buraya minlərlə insan gəlir istirahət edir, bir-biri ilə görüşürlər. Uşaqlar burada əylənirlər, oynayırlar. Bu hələ işin başlanğıcıdır. Ümidvaram ki, siz buranı daha da gözəlləşdirəcəksiniz, buranın yaşıllığı, gül-çiçəklərini daha da zənginləşdirəcəksiniz, bu parkın gözəlliyinin pozulmasına yol verməyəcəksininiz" (Bakının Nizami rayonunda – 8-ci kilometr qəsəbəsinin Cəmşid Naxçıvanski küçəsində Heydər Əliyev parkının açılışı mərasimində nitq, 10 may 1997-ci il). [XIIc.s.246].

Heydər Əliyevin məişət üslublu çıxış və nitqlərini qətiyyət tərk etmir. Azsaylı auditoriyada belə qətiyyət özünü göstərir: "Bu gün biz Bülbülün ev-muzeyindəyik və onun ailə üzvləri ilə görüşürük. Onun həyat yoldaşı Adilə xanım, Polad və ailənin digər üzvləri hamısı bir yerdədirlər. Bu gün mən çox iftixar hissi keçirirəm ki, biz Bülbülün 100 illik yubileyini təntənə ilə keçirməyə nail ola bilmişik. Problemlərimiz çoxdur, amma eyni zamanda biz problemlər, başımıza gələn faciələrə görə aylarla inildəməməliyik. Biz bu dərdi çəkərək, problemləri aradan qaldırmağa çalışaraq, eyni zamanda insanları da, mədəniyyətimizi də yaşatmalıyıq və tariximizi də qiymətləndirməliyik" [VIIc.s.14].

"Aylarla inildəməməliyik", "yaşatmalıyıq", "qiymətləndirməliyik" qətiyyətli ifadələri ev-muzeyindəki məişət üslublu nitqə qətiyyətlilik çalarları hopdurur. Qətiyyətli dövlət başçısının nitqi burada da hakim olur.

Görkəmli dövlət xadimi Heydər Əliyevin nitqində məişət üslubu özünəməxsus çalarlarla auditoriyalara yol açır. Sadə, xalq dilində səslənən məişət üslubunda belə Heydər Əliyevin nitq qəlibi özünü göstərməyə bilməz. İlk baxışda məişət üslubu kimi görünən nitq özündə siyasi, fəlsəfi, milli, elmi, dini dəyərlərimizi ehtiva edir. Məişət üslublu nitq müxtəlif çeşidli auditoriyalarda səslənir ki, Heydər Əliyevin xarici ölkələrə olan səfərlərində Azərbayacan diasporları ilə görüşlər bu qəbildəndir. Bu görüşlərdəki məişət üslublu nitqlər səmimiyyətə söykənir. 1 iyul 1996-cı il tarixdə, Almaniyadakı Azərbaycan cəmiyyətlərinin sədrləri və Azərbaycan cəmiyyətləri federasiyasının nümayəndələri ilə görüşündəki çıxışdakı kimi: "Mən bu gün sizinlə görüşümdən çox məmnunam. Bilirsiniz ki, mən Almaniyaya iki saat bundan əvvəl gəlmişəm. Bu, mənim Almaniyada ilk görüşümdür. Bu da soydaşlarımızla, həmvətənlərimizlə, Almaniyada, Mərkəzi Avropada yaşayan azərbaycanlıların nümayəndələri ilə görüşdür" [VIIc.s.14].

Yenə də orada diaspor üzvləri ilə söhbətdə qısa zaman kəsiyində tarixi-məntiqi ardıcıllıq prinsipini əsas tutaraq Almaniyadakı soydaşlarımıza geniş məlumat verir. Bir neçə sadə cümlə ilə XX əsr Azərbaycan dövlətçiliyinin bütün mərhələlərini auditoriyaya asan bir dillə anladır: "Bilirsiniz ki, indiki Azərbaycan keçmiş Sovetlər İttifaqının tərkibində bir müttəfiq respublika idi. O vaxt da Azərbaycan yaşayırdı. 1918-ci ildə ilk demokratik Azərbaycan Cümhuriyyəti yarandı. Bu cümhuriyyət 23 aydan sonra süquta yetdi. Ondan sonra Azərbaycanda Sovet hakimiyyəti mövcud oldu. Azərbaycanda Sovet Sosialist Respublikası yarandı. Bu respublika da iki il yaşayandan sonra çar Rusiyasının əvvəlki ərazisində yaranmış respublikaları birləşdirən Sovetlər İttifaqının tərkibinə daxil oldu. Biz bütün bu mərhələləri yaşadıq. Nəhayət, 1991-ci ilə

gəlib çatdıq. Azərbaycan XX əsrin sonunda Sovetlər İttifaqının dağılması ilə əlaqədar və dünyada gedən ictimai-siyasi hadisələrdən bəhrələnərək öz dövlət müstəqilliyini bəyan etdi və müstəqil dövlət qurmağa başladı" [VIIc.s.16].

Diaspor təşkilatın üzvləri ilə ilk baxışda məişət xarakterli söhbətin içində Azərbaycan dövlətinin bir əsrdə keçdiyi yol xronoloji olaraq sadalanır. Bu ağır və şərəfli yol dinləyicilərə çatdırılır.

Məişət üslublu nitqlər böyük natiqin müxtəlif çeşidli auditoriyalardakı çıxışlarında daha çox təsadüf edir. Dini üslublu nitqlərdə məişət xarakterli söhbətlərə yer verilsə də sonda, bu məişət xarakterli söhbətlər İslamın təbliğinə çevrilir: "Bilirsiniz ki, keçmiş zamanlarda bizim ulu babalarımız nə qədər çətinliklərin öhdəsindən gələrək piyada, o vaxtkı nəqliyyat vasitələrindən istifadə edərək, neçə aylar vaxt sərf edərək gedib Məkkəni, Mədinəni ziyarət edirdilər. Hər bir müsəlman bu ziyarəti edəndən sonra onda böyük bir dəyişiklik əmələ gəlir. Sizə belə bir xoşbəxtlik qismət, nəsib olubdur. Mən bundan ötrü çox şadam" [XVc.s.83].

Məişət üslublu nitqlərində böyük natiq səmimidir. Bu səmimi söhbətlərdə digər üslublarda olduğu kimi xalqımızın tarixi yaddaşlarda bir daha təzələnir, bir daha xatırlanır: "Arif Babayev də bizim böyük müğənnimizdir. Bu yaxınlarda 60 yaşı tamam oldu, onu təbrik etdim. Arzu edirəm 100 yaşın olsun. Böyük xanəndəmiz Xan Şuşinskinin yerini tutmusan, onun sənətinin davamçısısan. Allahdan arzu edirəm ki, həmişə belə olsun" [XVc.s.79].

Heydər Əliyev nitqində səslənən məişət üslubu sadə cümlələrlə böyük məntiqdən xəbər verir. Məntiqi təfəkkürə söykənən məişət üslubu auditoriya tərəfindən ciddi qəbul olunur: "Lakin bugünkü müzakirə göstərir ki, verilmiş vədlər yerinə yetirilməmişdir. Burada kənd təsərrüfatı naziri bəzi

obyektiv səbəblərdən danışdı – guya yağış yağdı, zəmilərdə taxıl yerə yatdı. Əlbəttə, yağış da yağa bilər, hava da pis keçə bilər. Lakin kənd təsərrüfatı işləri həmişə gərək elə aparılsın ki, bəzi təbii hallar nəzərə alınaraq, müəyyənləşdirilmiş miqdarda məhsul götürülsün. Axı elə bir il olurmu ki, yağış yağmasın, qar yağmasın, külək əsməsin və ya təbii fəlakət baş verməsin? Heç cür belə il ola bilməz. Hər il haradasa təbii bir hadisə baş verir" [IIc.s.458-460].

Ankara yaxınlığındakı Bilkənd Universiteti şəhərciyində dahi Azərbaycan şairi Məhəmməd Füzulinin anadan olmasının 500 illiyinə həsr olunmuş yubiley şənliklərinin təntənəli açılışındakı çıxışda bütün üslublar harmonik şəkildə çulğalaşır. Özündə siyasi fikir və düşüncəni ehtiva edən Heydər Əliyev nitqi dinləyiciləri heyran qoyur! "Bu gün daha bir baxımdan əlamətdar gündür. Türkiyə Cümhuriyyətinin prezidenti, əziz dostumuz və qardaşımız, Azərbaycan xalqının sevimli dostu, hörmətli Süleyman Dəmirəlin doğum günüdür. Biz buna "anadan olan günüdür" deyirik. Bu, təsadüfi deyil. 500 il bundan öncə Füzuli doğulub, 70 il bundan öncə də müasir dövrdə türk dünyasının böyük şəxsiyyəti, böyük insan, böyük ictimai-siyasi dövlət xadimi, hörmətli Süleyman Dəmirəl doğulmuşdur. Bu onu göstərir ki, Füzuli dünyası, Füzuli nəsli davam edir, dünya birliyinə, dünya mədəniyyətinə insanlar bəxş edir" [IIc.s.460].

Böyük natiq dilə yüksək səviyyədə müqəddəs bir varlıq kimi baxır. Hər bir məqamda azərbaycan dilini göz bəbəyi kimi qoruyur. "Biz buna anadan olan gündür" deməklə formalaşmış, bu gününə gəlib çatmış dilləri bir-birinə qarışdırmamağı, dilləri bir-birinin içində əritməməyi tələb edir. "Füzuli nəsli davam edir" deməklə türk dilli xalqların bir ulu türk ağacının şaxələri, budaqları olması ideyasını səsləndirir [XIIc.s.271].

Heydər Əliyevin ictimai-məişət üslublu çıxış və nitqlərində auditoriyanın maraq və təəccübünə, eləcə də heyranlığına səbəb olan, həyatındakı əlamətdar günləri dünya tarixindəki əlamətdar günlərlə məntiqi müqayisələridir. Bunlardan biri 3 oktyabr 1993-cü ildir ki, bu tarixdə Heydər Əliyev müstəqil Respublikamızın prezidenti seçilib. Digər mühüm bir gün 14 iyul 1969-cu ilə təsadüf edir ki, həmin gün Heydər Əliyev Azərbaycanın sovetlər dönəmində birinci şəxsi – Azərbaycan Kommunist Partiyası Mərkəzi Komitəsinin birinci katibi təyin olunur. 14 iyul Fransa inqilabı, 3 oktyabr Almaniyanın birləşmə günlərini auditoriyaya xatırladan böyük natiq Almaniya ilə Azərbaycan arasındakı münasibətlərinə xoş ovqat gətirmiş olur: "Hörmətli səfir, siz 3 oktyabr gününün mənim üçün də əlamətdar olduğunu xatırladınız. Bu həqiqətən belədir. Mənim həyatımda əlamətdar günlər çoxdur. Ancaq bunlardan ikisi ən əlamətdar gündür. İkincisi də 3 oktyabr günüdür. Bu da Almaniyanın birləşməsi ilə bir günə düşür. Güman edirəm ki, bu təsadüf yaxşı təsadüfdür. Çünki həm Fransa inqilabına – Bastilya gününə, həm də Almaniyanın birləşməsi gününə böyük hörmətim var. Həyatımdakı əlamətdar günlərin bu günlərlə üst-üstə düşməsi məni yalnız sevindirə bilər. Mən təşəkkür edirəm".

Modal söz "xatirimdədir" burada da böyük natiqin dilində keçmişin xatırlanmasına aparır. "Azərbaycan tarixində mühüm yer tutan şəxsiyyətlərin" sıralanması XX əsrin 70-ci illərini dinləyicilərin yadına salır. "Xatirimdədir ki, biz o vaxt ilk dəfə böyük bəstəkarımız, dahi Üzeyir Hacıbəyovun ev-muzeyini yaratdıq. Sonra böyük şairimiz Səməd Vurğunun ev-muzeyini yaratdıq. O vaxt biz Azərbaycanın tarxində mühüm yer tutmuş böyük şəxsiyyətlər Üzeyir Hacıbəyovun, Səməd Vurğunun ev-muzeylərindən sonra Bülbülün ev-muzeyinin yaradılması haqqında qərar qəbul etdik. Mən o günləri aylarla xatırlayı-

ram". Bu kiçik məişət üslublu nitq parçasında fəhmli, diqqətcil dinləyici quruluşdan, hansı dövrdə yaşamaqdan asılı olmayaraq Heydər Əliyev və Azərbaycan mədəniyyətinə qayğının vəhdətini görə bilir. Heydər Əliyev şəxsiyyətinin Azərbaycan xalqı qarşısındakı xidmətləri bir-bir səhifələnir.

Məişət üslublu nitqlərdə Heydər Əliyev problemləri çözə, problemin dərinliyi ilə auditoriyaları tanış edə bilir. Auditoriya sadə, anlaşıqlı, poetik cümlələrlə problemin daxilinə nüfuz edə bilir. 4 mart 2000-ci il tarixdə Rusiya jurnalistlərinin böyük bir qrupu ilə görüşdəki söhbətdə məhz məişət üslubunun köməyi ilə qaçqınlarımızın düşdüyü ağır vəziyyət izah olunur: "Onlar 8 ildir çadırlarda yaşayırlar. Axı çadır da tab gətirmir – gah qar, gah yağış yağır, gah da qızmar yay olur. Onların bu çadırlarda necə yaşadıqlarını təsəvvürə gətirmək çətindir. Mən vaxtaşırı bu düşərgələrə gedirəm və hər dəfə də oradan, demək olar, xəstə halda qayıdıram" [XXVc.s.256]. Təkcə "axı, çadır da tab gətirmir" poetik deyimlə Heydər Əliyev qaçqınların belə dözülməz şəraitdə necə tablaşdığını xarici jurnalistlərə anladır. Elə həmin görüşdə dünya şöhrətli musiqiçi Rostropoviçin qaçqınların vəziyyəti ilə əlaqədar ağlamasını, göz yaşları tökməsini misal gətirir. Bu misalla da dünyanı, dünya siyasi birliklərini, mütərəqqi bəşəriyyəti qaçqın probleminə biganə qalmamağa çağırır: "Bir dostum var – Rostropoviç, siz onu tanıyırsınız, onun özü bakılıdır, buraya gedib-gəlir. İki il əvvəl buraya gəldikdə məhz çadırlarda yaşayan qaçqınların yanına getmək istədiyini bildirdi. Təbii ki, biz ona kömək etdik, vertolyot verdik. O, oraya gedib qayıtdı, axşam isə mən onunla görüşdüm və gördüm ki, ağlayır, göz yaşları dayanmır. O deyirdi: mən heç təsəvvür etməzdim ki, adamlar bu cür şəraitdə yaşaya bilərlər, özü də illərlə" [XXVc.s.258].

Yenə də həmin görüşdə xalqımızın tarixinə düşmüş qaçqınlıq illəri böyük natiqin yarıpoetik, yarıməişət üslublu

nitqində öz təsvirini tapır. Bir kiçik parçada "bax", "axı" ədatlarının köməyilə qaçqın həyatı öz güclü əksini tapır: "Bilirsiniz, bu çadırlarda uşaqlar doğulur, insanlar həyatdan köçür, nikahlar bağlanılır. Bir dəfə orada olarkən gördüm ki, bir neçə qadın sacda çörək bişirir. Görürəm ki, çoxlu çörək bişiriblər. Şoruşuram: Xahiş etdim ki, toy olanda məni də çağırsınlar. Axı toylar tez-tez olmur. Mən oraya getdim. Doğrudur, həmin vaxtadək burada bir neft şirkətindən xahiş etdim, bu şirkət çadır şəhərciyinin mərkəzində toy etmək, müxtəlif tədbirlər keçirmək mümkün olan ev tikdirdi. Mən oraya getdim. Bu ev təxminən yüz adam tuturdu, daha bir neçə yüz adam isə evin ətrafına, bu toya toplaşmışdı. Son 20 ildə və ya hətta 30 ildə toya getdiyim yadımda deyildir. Bu toyda isə oldum. Orada iki cüt gənc ailə qururdu. Belə ağır şəraitdə yaşamalarına baxmayaraq, qızlar da, oğlanlar da, valideynləri də xoşbəxt idilər. Mən onlarla birlikdə oldum, oxuduq, oynadıq. Yəni, başa düşürsünüzmü, insan ən ağır şəraitə alışır" [XXVc.s.258-259].

Bu məişət üslublu nitq "Xoşbəxtlik" anlayışına tərif axtaranlar üçün ən tutarlı cavabdır. Eləcə də insan güclü varlıqdır" fəlsəfəsini də burada tapmaq olur.

"Dövlət Başçısının vətəndaşına münasibəti necə olmalıdır" sualının da cavabı burada öz əksini tapır.

# XIV FƏSİL

# HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ DİNİ ÜSLUBUN YERİ

Müxtəlif tədqiqatçılar nitqdə üslublara təsnifat verirlər ki, onların biri də dini üslubdur. Din ocaqlarında, dindarlar qarşısında çıxış və nitqlərə imkan verilmədiyi Sovetlər dövründə dini üslubdan danışmaq, təsnifatlarda dini üslubu ayırmaq mümkünsüz idi. Dini üslubdan dini mərasimlərdə, din ocaqlarında, beynəlxalq dini konfranslarda istifadə olunur[1] ki, Heydər Əliyevin nitqində dini üslubun da özünəməxsus yeri var. Bu üslubun natiqlər qarşısında qoyduğu tələblər böyük natiq tərəfindən təkcə yerinə yetirilmir, özünəməxsus Heydər Əliyev nitq qəlibində cilalanaraq bu gün ilahiyyatçılar, din alimləri, dini dərsləri tədris edənlər üçün örnək olan, nümunə olan nitqə çevrilir.

Heydər Əliyev nitqində dini üslubun yerini müəyyənləşdirmək məqsədilə onun din ocaqlarında, dini mərasimlərdə, dindarlar və eləcə də geniş auditoriya qarşısında, İstanbulda keçirilən beynəlxalq "Sülh və səbir" konfransındakı, eləcə də İslam Konfransı Təşkilatının Kasablanka zirvə toplantısındakı çıxışları əsas götürülmüşdür.

Heydər Əliyev nitqində bu üslub sadə, aydın, ardıcıl cümlələrlə dinləyicilərə çatdırılır: "Kəbəni görmək, müqəddəs Qara Daşı öpmək, ona toxunmaq, onu ziyarət etmək, Kəbənin içərisinə daxil olmaq, orada namaz qılmaq, dua etmək mənə nəsib oldu" [IIc.s.82-83].

---

[1] Muradov B., Bayramov H. "Nitq mədəniyyəti". Bakı, 2008. səh.95

Eləcə də: “Mən Mədinədə Həzrəti Məhəmməd Peyğəmbərin qəbrini ziyarət etdim. Peyğəmbərin namaz qıldığı minbərin pilləsində oturub, Quranı öpüb gözümə, alnıma basdım” [IIc.s.82-83].

Bu sadə cümlələrdəki “Quranı öpüb gözümə basdım”, “Quranı öpüb alnıma basdım” mürəkkəb frazeoloji birləşmələr böyük natiqin dinimizə olan sonsuz məhəbbətindən xəbər verir. Elə bu sadə cümlələrlə də dini auditoriyalar fəth olunur.

Terminologoyaya söykənən elmi üslub böyük natiqin dini mərasimlərdəki çıxışlarına da hopur. Dinləyici din ocaqlarında akademik, elmi üslubun auditoriyanı işıqlandırdığının şahidi olur. Belə terminologiyalar sırasına “Allah-təala”, “Həzrəti Peyğəmbər”, “şəhidlər”, “səbir, təmkin”, “Kərbəla şəhidləri”, “orucluq”, “qurban bayramı”, “aşura günü” və s. aiddir.

Heydər Əliyevin 13 dekabr 1994-cü il tarixdə, Kasablanka zirvə toplantısındakı çıxışı bu gün də öz qüvvəsində qalan, müasirliklə səslənən, bu gün də kəskin ehtiyac duyduğumuz bir çıxışdır. Bu tam elmi üslubda dini araşdırmadır desək yanılmarıq: “Biz haqlı olaraq fəxr edə bilərik ki, islam dünyası ümumbəşəri sivilizasiyaya öz layiqli töhfəsini vermişdir və neçə əsrdir ki, onun mənəvi inkişafına və təkmilləşdirilməsinə kömək edir”.

Bu çıxış elmi-dini terminologiyaya söykənən, rabitəli geniş cümlələrlə davam edən bir elmi üslubdadır: “Bu gün dünyada mürəkkəb, ziddiyyətli proseslər getməkdədir, viranedici qlobal müharibələrin qarşısının alınması, dünyanın təhlükəsizliyinin yeni təminliyinin qoyulması kimi müsbət meyillər regional münaqişələrin artması ilə, yırtıcı millətçiliklə və dövrün başqa bəlaları ilə qarşılaşır. Bizim ölkələrimiz bu proseslərin qaynağındadırlar və biz beynəlxalq təhlükəsizliyin möhkəmlənməsinə, sülh və tərəqqi qüvvələrinin

qələbəsinə layiqli yardım etməliyik, öz səylərimizi göstərməliyik” [IIIc.s.19-20].

Elmi üslub Heydər Əliyevin dini xarakterli çıxışlarında özünü bariz şəkildə göstərir. 10 fevral 1994-cü il İstanbulda “Sülh və səbir” beynəlxalq dini konfrans nümayəndələri qarşısındakı çıxış Heydər Əliyevin dini məsələləri elmi üslubda araşdırması baxımından xüsusi maraq doğurur. Elmi üslub üçün xarakterik olan terminologiya burada da özünü göstərir: “Vicdana çağırış”, “sülh və barış”, “dini xarakter”, “dini mənsubiyyət”, “etnik münaqişələr” [Ic.s.386-387].

Geniş cümlələr üzərində qurulan elmi üslub böyük natiqin dilində bu konfransda da səslənir. Dünyanın qarşısında bu gün fəlsəfədə ziddiyyətlər və münaqişələr probleminin araşdırılmasına yönələn bir nitqdir: “Təəssüf ki, son illərdə, iyirminci əsrin son mərhələsində dünyanın müxtəlif regionlarında sülh pozulmuş, insanlar arasında, dövlətlər arasında, ayrı-ayrı qruplar arasında toqquşmalar, vuruşmalar, müharibə gedir və bunların hamısı insanların rahat yaşamasına mane olur. Əsrimizin sonunda dünyada gedən ictimai-siyasi prosesləri təbii hesab edərək, heç vəchlə razılaşmaq olmaz ki, bu proseslər müharibə yolu ilə, toqquşmalar yolu ilə, qan tökmək yolu ilə getsin” [Ic.s.386-387].

Heydər Əliyev nitqində dini üslub elmi üslubla çulğalaşaraq dini terminologiyalardan geniş istifadəni önə çıxarır. Böyük natiqin nitqinin gücü üslubları dəyişmək yolu ilə auditoriyanı həmişə cansıxıcılıqdan, yeknəsəqlikdən azad etməsindədir. Dini-elmi üslubda danışan natiq məişət üslubuna keçərək dindarlar üçün asan qavranılan nitq yaradır. Heydər Əliyevin məişət üslublu nitqini belə öyrədicilik və düşündürücülük xüsusiyyəti tərk etmir:

“İnsan hər bir səfərdən, ziyarətdən qayıdarkən bir töhfə gətirir. Oradan gələn ən böyük töhfə mənə verilmiş Qurani-

Kərimdir... Gətirdiyim bu Quranı və çox gözəl səslə oxunan Quran ayəsi yazılmış kassetləri şəxsən Təzəpir məscidinə hədiyyə edirəm. Mən oradan, müqəddəs Kəbənin müqəddəs "Zəmzəm" suyundan da bir qədər gətirmişəm, onu da Təzəpir məscidinə verirəm. Güman edirəm ki, bu gün Təzəpir məscidinə toplaşanlar mənim Kəbədən, Məkkədən gətirdiyim "Zəmzəm" suyundan istifadə edəcəklər" [IIc.s.82-83].

İslam dinimizin təbliğində onun sadə, aydın dillə söylədiyi nitqlər əvəzsizdir. Ziyarətgahlara gedərək, islamımızla bağlı fikirləri geniş kütlələr qarşısında bəyan edərək, Azərbaycanın qapılarını öz dini missiyalarını, öz fitnəkar missiyalarını yaymaq istəyən dini-missioner təşkilatların üzünə birdəfəlik bağlayır. Heydər Əliyev simasında İslam dininin güclü təminatçısının, qarantının müqaviməti ilə üzləşən dini-missioner təşkilatlar geri çəkilməyə məcbur olurlar. Öz şəxsi həyatından nümunələr gətirməklə dinimizin böyük təbliğatçısı missiyasını şərəflə yerinə yetirir: "Bilirsiniz, İmam Həzrət Əli bizim üçün müqəddəs şəxsiyyətdir. Bu ad da müqəddəs addır və Həzrət Əlinin o biri adı da Heydərdir. Xoşbəxtəm ki, valideynlərim mənə bu adı veriblər və mən də bu adı çox böyük iftixar hissi ilə daşıyıram. Amma, düzü mən bilmirdim ki, Marağinin belə bir əsəri var ("Heydərnamə" əsəri). Bunu siz bu gün mənim üçün açdınız. Çox sağ olun, mən sizə təşəkkür edirəm" [IIc.s.17].

Heydər Əliyevin dini üslubdakı çıxışları dövlətçilik elementləri ilə zəngindir. Gənc nəslin dövlətçilik ideyalarını mənimsəməsində, dini inancların dövlətçilik ilə harmoniyasını yaratmaqda bu üslub çox dəyərlidir.

Dövlətçilik, dövləti sevmək ənənəsi Heydər Əliyevin nitqinin əsasını təşkil edir ki, bu ənənə onun dini çıxışlarında mühüm yer tutur. Təzəpir məscidində dindarlar qarşısında çıxış edən Heydər Əliyev Allahın Kəbə evində etdiyi duaları dilə

gətirməklə dövlətçiliyimizə, müstəqilliyimizə, ordu quruculuğumuza olan sevgini, bu sevginin Allah tərəfindən həyata keçirilməsinə etdiyi duanı dilə gətirir: “Biz müstəqil dövlətik. Müstəqil dövlətin özünəməxsus qüdrəti olmalıdır. Bu qüdrətin əsasını xalq və onun bir hissəsi olan ordu təşkil edir. Bizim güclü ordumuz olmalıdır... O müqəddəs yerlərdə mənim Allahdan arzum bu olub ki, müstəqil Azərbaycan dövlətinin qüdrətini daha da artırsın (Yerdən səslər: Amin)” [IIc.s.83-84].

Dini mərasimlərimizi bugünkü dövlətçiliyimizlə əlaqələndirmək, dini dəyərlərimizi bugünkü vətənpərvərliklə bağlaya bilmək böyük natiqin dini üslublu çıxışları üçün səciyyəvidir: “Yağı düşmən torpaqlarımıza hücum edir. Azərbaycanın cəsarətli oğulları Vətənimizi müdafiə edir və bu yolda Həzrəti İmam Hüseyn kimi şəhid olurlar. Biz Vətən, torpaq, din yolunda canından keçmiş bütün şəhidlərin şücaəti qarşısında Kərbəla müsibətilə əlaqədar keçirilən bu mərasimdə bir daha baş əyir, onların xatirəsini qəlbimizdə daim yaşatmağa söz veririk.

Bu gün müsəlmanlar üçün matəm, Aşura günüdür. Bu gün biz dinimizə, adət-ənənlərimizə sadiq olaraq Təzəpir məscidinə toplaşmışıq və haqq-ədalət yolunda şəhid olan Həzrət Hüseynin xatirəsini yad edirik. Bu münasibətlə mən sizə, bütün Azərbaycan müsəlmanlarına başsağlığı verirəm və hamınıza səbir diləyirəm. Allahdan onu diləyirəm ki, hər bir azərbaycanlıya, hər bir müsəlmana səbir versin”.

Bu gün biz haqq yolunda şəhidliyin müqəddəs olduğunu qeyd edirik. Xalqımız əsrlər boyu özünün yaşaması, torpağının qorunması, haqq, ədalət üçün şəhidlər vermişdir. Son illərdə də Azərbaycan xalqı şəhidlər verir. Vətən, torpaq yolunda şəhid olan hər bir Azərbaycan vətəndaşı, müsəlman əbədiyyətə qovuşur, necə ki, bizim müqəddəs imamlarımız əbədiyyətə qovuşublar.

"Son illər xalqımız Ermənistanın təcavüzü ilə əlaqədar olaraq çox şəhidlər verib. Azərbaycanın qəhrəman övladları – oğlanları, qızları həyatlarını qurban veriblər, şəhid olublar. Biz bu gün onların ruhunu yad edirik. Onlar bizim bu günümüzün, gələcək nəsillərimizin həyatı üçün, Vətənimizin, torpaqlarımızın qorunması üçün şəhid olublar. Biz bu gün onların ruhuna dua oxuyuruq" [IIc.s.26-28].

Bunun naminə biz müsəlman ölkələrinin inkişafına mane olan əngəlləri aradan qaldırmalı, bir-birimizə yardım əli uzatmalıyıq, parçalanmanın və təklənmənin qarşısını almalıyıq, dara düşən qardaşlarımıza birlikdə kömək etməliyik, qanlı müharibələrin və silahlı münaqişələrin alovunu söndürməliyik.

Auditoriya dinimizin tarixini, onun məruz qaldığı repressiyaları, bu təzyiq və repressiyalara, təqib və qadağanlara sinə gərən insanların fədakarlığını Heydər Əliyevin dilindən eşidərək, heyranlıqla qarşılayır: "Biz fəxr edə bilərik ki, xalqımız çox dəyərli xalqdır və zaman-zaman, əsrlər boyu cür-bəcür məhrumiyyətlərə məruz qalaraq bütün bu adət-ənənləri unutmayıbdır. Nə vaxt ki, rəsmi dairələr bunu qadağan edib yaxud da buna mənfi münasibət göstərib, insanlar bunu qəlbində, öz ailəsində, evində yaşadıblar. Hətta bizim bəzi fədakar insanlar bu adət-ənənələrimizi yaşatdıqlarına görə əziyyətlər çəkiblər, bəzən də məhrumiyyətlərə, cəzalara məhkum olublar" [IIc.s.27-28].

İslam tariximizdəki ibrətamiz hadisələri çağımızla əlaqələndirən böyük natiq auditoriyanı keçmişimizi unutmamağa çağırır: "Biz bundan sonra da Qurani-Şərifin, Həzrəti Məhəmməd peyğəmbərin qoyduğu yol ilə gedəcəyik və haqq-ədalət, vətən yolunda şəhid olmuş Həzrəti İmam Hüseynin və onun bütün silahdaşlarının qəhrəmanlığını, şəhidliyini heç vaxt unutmayacağıq" [IIc.s.27-28].

Heydər Əliyev fəaliyyəti dövründə dini ziyarətgahlarda görülən abadlıq işlərini saymaqla qurtarmaz. O bu cür abadlıq işlərini "ümumxalq işi" adlandıraraq belə bərpa, təmir işlərini "milli-mənəvi köklərimizə sadiqlik və gələcək nəsillərə örnək" kimi qiymətləndirir. 19 dekabr 2000-ci il tarixdə, Mir-mövsüm ağanın ziyarətgahında söylədiyi tarixi nitq yuxa-rıdakılara canlı sübutdur: "Mirmövsüm ağa burada 1950-ci ildə dəfn olunubdur. Mən ...keçən dəfə buraya gələndə ancaq onun qəbrini və ətrafdakı tikilini gördüm. Amma indi burada geniş bir kompleks yaranıbdır. O vaxt bunu mənə demişdilər. Amma bu dərəcədə təsəvvür edə bilməzdim. Çox gözəldir, mən bəyənirəm. Burada zəhmət çəkənlərin hamısına təşəkkür edirəm və bütün işlərin görülməsi üçün öz arzuları ilə nəzir, yaxud başqa kömək verən adamların da hamısına təşəkkür edirəm. Çünki bu bizim ümumxalq işimizdir. Bu bizim öz dərin, qədim milli-mənəvi köklərimizə sadiqliyimizi nümayiş etdirir və gələcək nəsillər üçün örnək olur" [XVc.s.245].

Pasxa bayramı münasibətilə Respublika Pravoslav xris-tianlarına təbrik Heydər Əliyev nitqində Azərbaycan xalqının digər dinlərə tolerant münasibətinin bariz nümunəsidir:

"Əziz həmvətənlərim!

Sizi müqəddəs bayramınız – Pasxa münasibətilə ürəkdən təbrik edir və bu əziz gündə Ulu Tanrıdan hamınıza can sağlığı, xoşbəxtlik və böyük uğurlar diləyirəm.

Azərbaycan milliyətindən və dinindən asılı olmayaraq müxtəlif xalqların nümayəndələrinin doğma vətənidir. Onlar həmişə mehriban qardaşlıq, qarşılıqlı anlaşma və sıx əmək-daşlıq şəraitində yaşamış, vətənin sevincini də, kədərini də birgə bölüşmüşlər. Öz tarixi ənənələrinə sadiq qalan müs-təqil, demokratik Azərbaycan dövlətində bu gün dilindən, dinindən, etnik mənsubiyyətindən asılı olmadan bütün vətən-

daşların vicdan azadlığı, dini etiqad sərbəstliyi təmin edilmişdir” [IIIc.s.388].

“Dini tolerantlıq nədir” sualına ən gözəl cavab kimi böyük natiqin İstanbuldakı “Sülh və səbir” beynəlxalq dini konfransdakı çıxışından bir parçanı göstərə bilərik: “Azərbaycanda tarixən çox millətlər yaşamışdır. Burada azərbaycanlılarla yanaşı ruslar, ermənilər, yəhudilər, gürcülər, ukraynalılar və başqaları da yaşamış və gələcəkdə də yaşayacaqlar. Azərbaycan Respublikasının çoxmillətli dövlət olmasını ölkəmiz üçün böyük üstünlük hesab edirik” [IIIc.s.389].

Dini tolerantlıq baxımından Heydər Əliyevin qeyri-islam dinində olan ölkə vətəndaşlarına təbriklərdəki girişlər diqqətə layiqdir: “Əziz pravoslav həmvətənlər!”, “Əziz xristian həmvətənlərim!”, “Hörmətli həmvətənlərim!”, “Sizi – respublikanın bütün xristianlarını İsa peyğəmbərin mübarək doğum günü – Müqəddəs Milad bayramı münasibətilə ürəkdən təbrik edirəm”, “Əziz həmvətənlər! Sizi dünya yəhudilərinin tövbə və mənəvi saflıq günü olan Roş-Ha-Şana – təzə il münasibətilə ürəkdən təbrik edir, hamınıza cansağlığı, xoşbəxtlik arzulayıram” [Ic.s.319, XVc.s.282].

Bu təbrik nitqlərində böyük natiq yəhudi və xristian icmalarının üzvlərini öz övladlıq borclarına, vətəndaşlıq mövqeyinə sadiq qalmağa çağırır: “Əminəm ki, müstəqil Azərbaycanın ictimai-siyasi və mədəni həyatında, dövlət müstəqilliyimizin daha da möhkəmləndirilməsində bundan sonra da yaxından iştirak edəcək, doğulub yaşadığınız vətənə övladlıq borcunu layiqincə yerinə yetirəcəksiniz”.

“Azərbaycan ölkəmizdə yaşayan bütün xalqların doğma vətənidir” – deyən Heydər Əliyev sadə, qəlbləri riqqətə gətirən, ağsaqqalcasına və müdrikcəsinə sözlərlə həmin xalqların bayramlarını təbrik edir: “Əziz bayramınızı bir daha səmimi qəlbdən təbrik edirəm. Qoy bu müqəddəs Pasxa bayramı

günlərində edilən bütün xoş diləklər və xeyir-dualar yerinə yetsin, xalqımız xoşbəxt və firavan həyata qovuşsun".

"Qoy" əmr ədatı ilə güclənən fikir "diləklər yerinə yetsin", "firavan həyata qovuşsun" frazeoloji söz birləşmələri ilə xristian həmvətənlərin qəlblərinə yol açır, onların bu vətəni özününkü hesab edərək, müstəqillik yolunda övladlıq borclarını yerinə yetirməyə çağırır.

Dini üslubda Heydər Əliyevin ziyarətgaha toplaşanlar qarşısındakı çıxışları çox vaxt sadə olduğu qədər məntiqi ardıcıllığa söykənən, anlaşıqlı, eləcə də dərin, fəlsəfi tutuma malik olur: "Xalqımız milli azadlığa çıxıb, dövlətimiz artıq müstəqildir, heç kəsdən asılı deyil. Deməli, biz öz evimizi necə istəsək, eləcə də quracağıq. "Ev" deyəndə mən Azərbaycanı nəzərdə tuturam. Yaxşı çalışsaq, bu evi işıqlı quracağıq. Əgər biganə qalsaq, bəzi hallarda pozğunluğa yol versək bu binanı yaxşı tikə bilməyəcəyik. Gəlin, hamımız əl-ələ verərək müstəqil Azərbaycanın, böyük Azərbaycan xalqının binasını, möhtəşəm binanı birlikdə gözəl tikək"[Ic.s.481-482].

Dünya fəlsəfi fikirinin formalaşmasında İslam fəlsəfəsinin mühüm yer tutduğunu gözəl bilən ulu öndər bu dünyada insan həyatının əbədi olmadığını nitqində ecazkarlıqla səsləndirir: "Əlbəttə ki, bu gün Azərbaycanda Heydər Əliyev Prezidentdir, müəyyən bir vaxtdan sonra başqa bir adam prezident olacaqdır. Bu dünyada heç kəs əbədi, daimi deyil, heç kəs bu dünyanı tutub axıra qədər qalmayacaqdır. Bu təbii bir şeydir" [XVc.s.248].

Maddiyyatla mənəviyyat arasındakı nisbətin birincinin xeyrinə pozulması fəlsəfəsini ortaya qoyur: "Hamımız sovet hakimiyyətinin, sovet ideologiyasının qanun-qaydaları ilə yaşayırdıq. Bir az loru dildə desək, onda qarnımız daha dolu idi. Ancaq qəlbimiz dolu deyildi, boş idi. İnsan isə təkcə qarın üçün yaşamır. Azərbaycan xalqı əsrlər boyu, islam dinini qə-

bul edəndən sonra dini adət-ənənələri, dini mənəvi dəyərlərimizi hər şeydən üstün tutubdur" [XVc.s.246].

Dini üslublu nitqlərində onun nikbinliklə dolu fikirləri auditoriyanı gələcəyə inamla baxmağa səsləyir: "Bu onu göstərir ki, bizim ənənələrimiz mənəvi, milli, dini dəyərlərimiz ölməzdir və bundan sonra da yaşayacaqdır. Biz, bizim nəsil, hamımız birlikdə – indi yaşayan insanlar xoşbəxtdirlər ki, bu günə gəlib çatmışıq, bizim müstəqil ölkəmiz, müstəqil dövlətimiz var, öz taleyimizin sahibiyik, dini, mənəvi, milli adət-ənənələrimizi bərpa etmişik və daha da geniş təbliğ edirik".

Sabahkı günə inam, nikbinlik Heydər Əliyevin dini üslublu çıxışlarını, dindarlarla olan görüşlərini tərk etmir. Böyük natiq xoşbəxt günlərə aparan yolun dözümdən, dəyanətdən keçdiyini addımbaşı xatırladır: "Xalqımız bundan sonra ulu babalarının yolu ilə, Həzrəti Məhəmməd peyğəmbərin qoyduğu yol ilə gedəcək və xoşbəxt gələcəyə çatacaqdır. Azərbaycan xalqı bu çətinliklərin hamısına dözür və güman edirəm ki, bundan sonra da dözəcəkdir" [Ic.s.577-578].

Başqa bir görüşdə – Zuğulba pansionatında məskunlaşmış köçkünlərin qarşısında – xalqımızın nikbinliyini, bu xalqın qürurunu saxladığını, ən ağır hallarda belə tarixinə, adət-ənənələrinə sadiqliyini dilə gətirir. Bu zaman sinonim cərgələrin köməyi ilə auditoriyanı çətin günlərə hazırlayır: "Burada Şuşadan, Laçından, Xocalıdan qaçqın düşmüş soydaşlarımız – bacılarımız, qardaşlarımız, övladlarımız məskunlaşıblar. Bu, xalqımızın ağır şəraitdə yaşadığını göstərir. Ancaq xalqımız nikbindir, başını heç vaxt aşağı tutmayıb, sınmayıb, əyilməyib, heç vaxt diz çökməyib. Ona görə də bu ağır gündə, bəlalı gündə də biz adət-ənənələrimizi unutmuruq, Qurban bayramını qeyd edirik" [Ic.s.354].

Dini üslubda çıxışlar edən ulu öndər insanların dini azadlıqlarının qorunmasında qətiyyətli dövlət başçısı kimi çıxış

edir, vətəndaşlar onun simasında dini azadlığın təminatçısını, qarantını görürlər: “Azərbaycanın prezidenti kimi, mən dəfələrlə qeyd etmişəm ki, ölkəmizin vətəndaşları dini, irqi mənsubiyyətindən, siyasi baxışlarından asılı olmayaraq eyni hüquqlara malikdirlər və onların hüquqları Azərbaycan dövləti tərəfindən qorunur. Əmin ola bilərsiniz ki, biz bu prinsiplərimizə daim sadiq qalacağıq və Azərbaycan vətəndaşlarının din, dil mənsubiyyətindən və siyasi baxışlarından asıl olmayaraq bir-biri ilə münaqişəyə girməsinə gələcəkdə də yol verməyəcəyik” [Ic.s.243].

Ramazan bayramı münasibətilə Qafqaz müsəlmanları idarəsinin sədri Şeyxülislam Hacı Allahşükür Paşazadə ilə görüşdəki çıxış dinimizin, mənəviyyatımızın qorunmasına yönələn, qətiyyətlilik ruhunda olan bir çıxışdır: “Bildiyiniz kimi, mən həmişə Azərbaycanda xalqımızın mənəviyyatının qorunması üçün çalışmışam, mənəviyyatımıza zidd olan hər bir hala qarşı mübarizə aparmışam. Biz bu prosesdə əxlaqsızlığın inkişaf etməsinə, yayılmasına, mənəviyyatsızlığın yayılmasına yol verə bilmərik”.

Heydər Əliyev çıxışlarının əsasını təşkil edən səmimiyyət, təvazökarlıq dini üslubda da auditoriyanı bəzəyir, canlandırır.

Təvazökarlıqla söylənən fikirlər onu dini auditoriyanın gözündə göylərə qaldırır: “Mən bilirəm ki, sizin hamınız dindar adamlarsınız, bu sözləri sizə deməyim bəlkə də artıqdır. Yerdən səslər: Möhtərəm Prezident, çox xoşdur. Hamısını qəbul edirik”.

Yaxud: “Siz bu işləri məndən yaxşı bilirsiniz. Ancaq bir halda ki, görüşmüşük, öz fikirlərimi sizə çatdırmaq istəyirəm. Hər halda, pezidentin də fikrini bilmək sizin üçün artıq olmaz. Yerdən səslər: Allah sizə cansağlığı versin, kölgəniz bizim üstümüzdən əskik olmasın!” [XVc.s.248].

Heydər Əliyevin dini üslubdakı çıxışlarına poetik bir ruh hakimdir. Bu poetizm dindarların qəlbinə yol salır, onların qəlbini riqqətə gətirir. Mirmövsüm ağanın qəbri üzərində ucaldılmış kompleksin tikintisi ilə bağlı birnəfəsə söylədiyi poetikcəsinə fikirlər bu qəbildəndir: “Bunların hamısı olduqca təqdirəlayiqdir və burada zəhmət çəkən, əziyyət çəkən, qəlbən bu işi görən adamların hamısının əməyini bir daha, bir daha yüksək qiymətləndirirəm. İndi bizim ölkəmizdə də, hər yerdə də böyük-böyük tikinti işləri gedir. Tikinti belədir ki, bu kiməsə lazımdır, kimsə ona vəsaitini qoyur, kimsə də o tikintini aparır, oradan pul qazanır. Amma burada isə belə deyildir. Bura bütün xalqa, millətə lazımdır, getdiymiz Allah yolunda lazımdır və bunu da xalq özü edir. Heç kəs bunun sifarişini də vermir, müstəqil olaraq vəsaitini də vermir. Heç kəs bunun inşaatını da aparmır. Hamısını xalq özü aparır. Nə üçün? Ancaq qəlbinin hökmü ilə! Yəni özünün mənəvi dəyərlərə bağlılığı ilə, İslam dininə bağlılığı ilə, Qurani-Kərimə bağlılığı ilə bu işləri görür. Ona görə də mən burada gördüklərimdən çox məmnunam” [XVc.s.246].

Kompleksə can yandıranlara “bir daha, bir daha” qüvvətləndirici ədatının köməyi ilə minnətdarlıq edən natiq “heç kəs bunun sifarişini də vermir, heç kəs bunun inşaatını da aparmır” sözlərinin arxasınca “Nə üçün?” ritorik sualını verərək “Ancaq qəlbinin hökmü ilə” cavabı ilə auditoriyanı riqqətə gətirə, kövrək, islamımıza içdən gələn sevgilər yaşada bilir, insanların öz qəlblərinin hökmü ilə bu abidəni yaratmalarını milyonlara örnək, nümunə kimi göstərir.

Dini xarakterdə olmayan çıxışlar əgər alqışlarla qarşılanırsa, auditoriya öz heyranlığını biruzə verirsə, dini xarakterli çıxışlar auditoriya tərəfindən müxtəlif duaların səslənməsi ilə özünü göstərir.

Şüvəlanda Mirmövsüm ağanın qəbrini ziyarət (14 mart 1994-cü il) edərkən: “Bu müqəddəs bayramı sizinlə bir yerdə keçirməyimdən çox məmnunam. Bu müqəddəs amallar bizim hamımızı xoşbəxt gələcəyə aparacaqdır” (Auditoriya: “Allah-təala sizi bizə çox görməsin. Bu müqəddəs gün sizi hifz eyləsin!”) [Ic.s.480].

Başqa bir çıxışda: “Arzu edirəm ki, gələn Ramazan bayramını qələbədən sonra qeyd edək” – “Amin, inşallah” sədaları Heydər Əliyev nitqinə dindarlar auditoriyasının rəğbətini əks etdirir.

Şəhidlər, qaçqın və köçkün həmvətənlər dini üslublu çıxışlarda böyük natiqin nitq və çıxışlarının ana xəttini təşkil edir: “Bu əziz gündə şəhidlərimizin xatirəsini yad edərək əmin olduğumu bildirirəm ki, onların ruhlarının şad olacağı, torpaqlarımızın erməni qəsbkarlarının tapdağından azad ediləcəyi, qaçqın və köçkün həmvətənlərimizin öz doğma yurdlarına qayıdacağı an uzaqda deyildir” [XXIVc.s.226].

Azərbaycanın bugünkü müstəqilliyi yolunda bütün şüurlu həyatını, sağlamlığını fəda edən ulu öndərin nitq və çıxışlarında şəhidlər özünəməxsus Heydər Əliyev dili ilə tərənnüm edilir. Necə deyərlər, hər şey şəhidlərə layiq! Əsrarəngiz bir dillə, qəlbləri riqqətə gətirən bir nitq ilə şəhidlər xalqımıza, dünya ictimaiyyətinə təqdim olunur, tanıdılır.

20 Yanvar şəhidləri mürəkkəbləri ürək qanı olan şair və yazıçılarımızın əsərlərində, rəssamlarımızın boyası ürək qanı olan tablolarında, heykəltəraşların daşlaşmış, daş yaddaşa dönmüş şəhid heykəllərində tərənnüm edilmişdir. Şəhidləri hər kəs özünəməxsus sevgi ilə həmişə xatırlayır. Əsər yaza bilməyən göz yaşı ilə, rəsm çəkə bilməyən ürək göynədən ağısı, bayatısı ilə, heykəl qoya bilməyən ürək ağrısı ilə xatırlayır.

Heydər Əliyev fəlsəfi düşüncəsi şəhidlərə münasibətdə də özünü göstərir: “Onların həlak olması bizim üçün, ailə üzvləri

üçün böyük itkidir, faciədir. Ancaq eyni zamanda onların şəhid olması xalqımızın qəhrəmanlıq rəmzidir" [XIVc.s.141]. Burada faciə və qəhrəmanlıq kimi əksliklərin vəhdətinin elə azadlıq olması anlamı ortaya qoyulur: "Bununla belə, nə qədər kədərli olsa da 20 Yanvar gününü xatırlayarkən hər birimiz eyni zamanda böyük iftixar hissi keçiririk. Çünki xalqımız həmin təcavüz qarşısında özünün əyilməzliyini, sarsılmazlığını bütün dünyaya sübut etdi. Ona görə də bu gün bizim üçün həm matəm günü, həm də iftixar günüdür" [XIVc.s.142].

Çıxış və nitqlərində heç vaxt pessimist ovqatın, bədbinliyin yer almadığı Heydər Əliyev nitqi nikbinliklə doludur. Bu, nikbin notlar üzərində qurulan, xalqı səfərbər etməyə, xalqı gələcəyə aparmağa qadir Heydər Əliyev nitqidir: "Mən bu günə də, sabaha da böyük nikbinliklə baxıram və sizi də bu sızıltıdan, iniltidən uzaqlaşaraq gələcəyə baxmağa dəvət edirəm. Gələcəyimiz isə Azərbaycan Respublikasının müstəqilliyinin möhkəmlənməsi, onun ərazi bütövlüyünün təmin olunmasıdır" [Vc.s.296].

Ulu öndər 20 Yanvar hadisələrinə, 20 Yanvar şəhidlərinə fərqli nöqteyi-nəzərlərlə yanaşır. Çıxış və nitqlərində öncəgörmələrə söykənən Heydər Əliyev 20 yanvarı "dönüş nöqtəsi", "dönüş mərhələsi" adlandıraraq ölkəmizin qarşısında açılan müstəqillik, istiqlaliyyət üfüqlərini bizlərə göstərir: "Ancaq bir şey həqiqətdir ki, 1990-cı ilin 20 Yanvarı Azərbaycan xalqının həyatında dönüş mərhələsi, dönüş nötqəsi olmuşdur."

20 Yanvar faciəsinə ürəkdən yanan ulu öndər vətəndaş və dövlət başçısı mövqelərini yaxınlaşdırır, 20 Yanvar faciəsinə münasibətdə sarsılmaz mövqedən çıxış edərək məsələlərin ədalətlə çözülməsini tələb edir, Azərbaycan xalqının namus, şərəf, milli mənlik məsələlərində geriyə yolunun qalmadığını göstərir: "Demək istəyirəm ki, mən bu faciəyə həmişə ürəkdən

yanaraq həm də vətəndaşlıq borcumu yerinə yetirməyə çalışmışam və bu gün də həmin mövqedəyəm, sabah da həmin mövqedə olacağam. Birinci növbədə ədalət naminə, eyni zamanda Azərbaycan xalqının namusunu, şərəfini, milli mənliyini qorumaq naminə".

Tarixi bizə öyrədən ulu öndər şəhidlik tariximizi də bizlərə özünün sadə, anlaşıqlı, lakonik fikirləri ilə aşılayır. 20 Yanvar şəhidliyinin tariximizdəki xüsusi əhəmiyyətini qeyd edir, xalqımızı qələbəyə, milli müstəqilliyə, suverenliyə gətirib çıxaran 20 Yanvar faciəsini, 20 Yanvar şəhidliyini xüsusi bir hadisə, xüsusi bir olay kimi xalqımıza tanıdır: "Xalqımız tarix boyu çox şəhidlər veribdir. Xalqımız isə çoxəsrlik və zəngin tarixə malikdir. Şəhidlərimiz çoxdur, lakin hər dövrdə şəhid olanların tarixdə öz yeri var və hər dövrdə baş vermiş hadisələrin öz əhəmiyyəti var. 1990-cı ilin 20 Yanvar faciəsi bu baxımdan xüsusi əhəmiyyət kəsb edir. Ona görə də bu hadisə xüsusi qeyd olunmalıdır" [XIVc.s.143].

Heydər Əliyev 20 Yanvar faciəsi deyirsə növbəti cümləsində bu faciəni "iftixar hissimiz", "qəhrəmanlıq nümunəsi", "qəhrəmanlıq və rəşadət səhifəsi" və sair adlandırmaqla, sənət adamlarını, incəsənət xadimlərini "ölümün gözünə dik baxan", "qəhrəmanlıqla, cəsurluqla təcavüzkarın qarşısına çıxan" şəhid obrazları yaratmağa çağırır. Əzilən, döyülən, sındırılan xalq obrazı yox, haqqını tələb etməyi bacaran, dünya xalqları sırasında öz şərəfli yerini tuta bilən xalq obrazı, şəhid obrazı yaratmağı tələb edən bir qətiyyətli dövlət başçısı kimi çıxış edir: "20 yanvar hadisələrini bir faciə kimi təsvir etmək azdır. 20 yanvar Azərbaycan xalqının milli azadlıq uğrunda, öz mənliyini müdafiə etmək yolunda göstərdiyi qəhrəmanlıq nümunəsidir. Ona görə də qəhrəman Azərbaycan balalarının tankın altına düşüb əzilməsi faktını göstərməklə kifayətlənməyib, onların qəhrəmanlığını, cəsurluğunu, ölümün gözünə

dik baxaraq təcavüzkarın qarşısına çıxmalarını da təsvir etmək lazımdır” [IIIc.s.130].

O şəhidliyi qəhrəmanlıq rəmzi kimi dəyərləndirir, 20 Yanvarda şəhidlərin tökülən qanını milli bayrağımızın üstündəki qırmızı rəng ilə eyniləşdirir, 20 Yanvarda milli azadlıq, müstəqillik uğrunda xalqımızın tökülən qanının ilk qan yox, qanlara qovuşmuş qan kimi qiymətləndirir: “O gecə tökülən qanlar müqəddəs qanlardır. Onlar bizim xalqımızın əsrlər boyu milli azadlıq, müstəqillik uğrunda tökdüyü qanlara qovuşmuş qanlardır, o gecə tökülən qanlar Azərbaycanın müstəqilliyini nümayiş etdirən milli bayrağımızın üstündəki qandır” [XIVc.s.142].

Şəhidlərin timsalında Azərbaycan xalqının dünya xalqları arasında tutduğu yeri müəyyənləşdirir, xalqın nələrə qadir olduğunu anladır: “Biz fəxr edirik ki, Azərbaycan xalqı qəhrəman xalqdır. Biz fəxr edirik ki, Azərbaycan xalqı öz milli mənliyini, öz milli azadlığını qorumaq üçün həlak olmağa, şəhid olmağa hazırdır. Biz fəxr edirik ki, bu azadlıq yolunda özünü qurban etmiş şəhidlərimiz var, onların qəhrəmanlığı, onların ruhu bizim qəlbimizdə daim yaşayacaq. Onlar əbədiyyətə qovuşublar. Onların xatirəsi bizim üçün əbədidir. Ona görə də mən sizə başsağlığı verərək, eyni zamanda sizi təbrik edirəm ki, Azərbaycan xalqı bundan sonra özünü qorumağa qadirdir. Azərbaycan xalqı öz mənliyini müdafiə etməyə qadirdir” [XIVc.s.142].

Azərbaycan xalqının öz şəhidlərinə, müstəqillik yolunda, vətən yolunda, dinimiz yolunda əziz canlarını fəda edən övladlarına olan sevgisi Heydər Əliyev dilində həzinliklə, kövrəkliklə və eləcə də qətiyyətlə səslənir:

“Mən Moskvadan bu gün gec qayıtdım. Orada işlərimi qurtaran kimi qayıtdım. Hava artıq qaralmışdı, Şəhidlər Xiyabanına gəldim. Məzarların üzərində nə qədər güllər, nə qədər

qərənfillər...Bəzən düşünürəm ki, Azərbaycanda bu qədər gül-çiçək varmı? Xalqımız şəhidləri nə qədər böyük hörmət və ehtiramla yad edir. Eyni zamanda xainləri lənətləyir, cinayətkarları məhkum edir" [Vc.s.295].

Müqəddəs kitabımızın Əl-İmran surəsinin 169-170-ci ayələrində oxuyuruq: "Ölmüş bilməyin heç vaxt Allah yolunda öldürülənləri. Diridir onlar, Rəblərinin dərgahında ruzisinə çatıblar. Sevinirlər Allahın bol nemətinə. Üzülməzlər dərd əlindən." Bu ayələrin məzmununa uyğun olaraq Heydər Əliyevin Şəhidlər Xiyabanındakı söylədiyi nitq dünyanın əbədi olmadığı islam fəlsəfi fikrini ortaya qoyaraq şəhidlərin həmişə qəlbimizdə yaşayacaqlarını bir daha dilə gətirir: "Dünyaya gələn hər bir insan bu dünyanı tərk edəcəkdir. Bu dünya heç kim üçün əbədi deyildir. Ancaq öz əməlləri ilə xalqa, millətə sədaqəti ilə, xalqın milli istiqlaliyyət ruhunu yüksəklərə qaldırmaları ilə dünyalarını dəyişənlər ən müqəddəs insanlardır. Onlar cismən bu dünyadan gediblər, ancaq ruhən bizim qəlbimizdədilər. Bu gün şəhidlər xiyabanına ümumxalq axını və hər bir Azərbaycan vətəndaşının gəlib bu müqəddəs qəbirləri ziyarət etmək arzusu və ziyarəti onu sübut edir ki, onlar – bu şəhidlər bütün xalqımızın qəlbində yaşayırlar. Onlar heç vaxt unudulmayacaqlar" [XIVc.s.142].

Heydər Əliyev 20 Yanvar şəhidlərinin adlarının əbədiləşdirilməsini bütün ziyalılar, sənət adamlarının qarşısında bir vəzifə kimi qoyur, bunu bir vətəndaşlıq borcu kimi tələb edir:

"Çünki müasir rəssamlarımız, heykəltəraşlarımız, yazıçılarımız bu hadisələrin canlı şahididirlər. Əgər indi onlar bu əsərləri yaratmasalar gələcək nəsillər bu hadisələri ancaq ayrı –ayrı kitablardan, xatirələrdən öyrənəcəklər. Halbuki biz hamımız bunun canlı şahidiyik. Ona görə bu əsərləri yaratmaq lazımdır. Yenə də deyirəm. Bu yaradıcılığın əsas istiqaməti Azərbaycan xalqının qəhrəmanlığı, milli azadlıq uğrunda mü-

barizəsi, bununla əlaqədar Azərbaycana edilmiş hərbi təcavüz və bu təcavüz nəticəsində baş vermiş faciəli hadisələr olmalıdır" [IIIc.s.130].

Şəhidlər xiyabanını ulu öndər Azərbaycanın ən böyük abidəsi adlandırır: "O şəhidlər burada – Azərbaycanın, Bakının ən mötəbər, gözəl guşəsində əbədiyyətə qovuşublar. Biz onların məzarları qarşısındayıq. Biz bu məzarları daim yad edəcəyik" [IIIc.s.137].

Öz nitqi ilə bizlərə qədirbilənlik dərsi öyrədən ulu öndər bugünkü müstəqillik üçün hansı ünvanlara, kimlərə minnətdar olmağımızı yaddaşımızdan silməməyə çağırır:

"Xalqımızın tarixində çox əzəmətli, qiymətli abidələr var. Ancaq Şəhidlər Xiyabanı, 20-ci əsrin sonunda Azərbaycan xalqının milli azadlıq uğrunda özünü qurban vermiş şəhidlərinin məzarları, Azərbaycan Respublikasının, Azərbaycan torpağının ən müqəddəs yeridir və ən qiymətli abidəsidir. Biz bu gün bu abidəyə, bu məzarların qarşısına gəlmişik. Bu gün biz bu qəhrəman, cəsur, rəşadətli Azərbaycan övladlarının məzarı qarşısındayıq. Onların qəhrəmanlığının əbədi yaşayacağını bir də bəyan edirik və onlara deyirik ki, sizin qəhrəmanlığınız nəticəsində indi xalqımız öz milli azdlığına nail olubdur" [IIIc.s.137-138].

"Allah səbirliləri sevir" kəlamı Müqəddəs kitabımız Quranın kəlamlarından mühümüdür. Ulu öndər də hər birimizi bax elə o səbirə, səbirlilər cərgəsində olmağa səsləyir: "Allah Azərbaycan xalqına səbir versin. Allah sizə, valideynlərə, şəhidlərin ailələrinə, qohum-əqrabasına səbir versin. Səbir versin ki, biz xalqımızı daha xoşbəxt gələcəyə apara bilək, səbir versin ki, biz xalqımızı bu bəladan çıxara bilək. Səbir versin ki, Azərbaycan xalqı öz müstəqilliyini möhkəmləndirib əbədi edə bilsin. Allah şəhidlərə rəhmət eləsin!" [IIIc.s.140]

Şəhidlərlə bağlı xalqın dini dəyərlərinə böyük sayğı göstərən bir lider danışığının, dini üslublu bir rəvan, gözəl nitqin, eyni zamanda yanan, közərən qəlblərə sərin su səpən, səbir adlı dərmanla yaralarımızı sarıyan bir lider nitqinin şahidi oluruq: “Mən şəhidlərin ailələrinə Allahdan səbir diləyirəm. Allah bütün şəhidlərə rəhmət etsin. Yanvar faciəsi şəhidlərinə, Azərbaycan torpaqlarının müdafiəsində, Respublikamızın ərazi bütövlüyünün keşiyində şəhid olanların hamısına Allah rəhmət etsin. Bütün şəhidlərin ailələrinə, qohum-əqrəbalarına Allahdan səbir diləyirəm. Ona görə səbir diləyirəm ki, xalqımızın bütün bu çətin mərhələlərdən keçib gedəcəyinə inanıram. Xalqımız öz müstəqilliyini qoruyub saxlayacaqdır. Buna əmin ola bilərsiniz. Müstəqil Azərbaycan günü-gündən inkişaf edəcək, ancaq bu günlər heç vaxt unudulmayacaqdır. Heç vaxt unudulmayacaqdır!” [Vc.s.296].

Heydər Əliyevin nitq və çıxışlarından irəli gələn fikir və müddəalar həmişə təzədir, müasirdir. Şəhidlərin ruhu naminə hamını birləşməyə çağıran ulu öndərin ideyaları bu gün bu ziddiyyətli, bu qarmaqarışıq dövrümüzdə çox aktualdır. Bu çağırış bizləri – Azərbaycan Respublikası vətəndaşlarını, qüdrətli Azərbaycana sığınan soydaşlarımızı bir ideya, bir amal – azərbaycançılıq uğrunda möhtərəm prezidentimiz İlham Əliyevin ətrafında birləşməyə çağırır: “Mən azadlığımız uğrunda mübarizədə ölməzliyə qovuşmuş oğul və qizlarımızın ailələrinə, yaxınlarına və əzizlərinə başsağlığı verir və bu hüzünlü çağlarımızda şəhidlərimizin ruhu naminə hamını birləşməyə çağırıram”.

O, azərbaycançılıq ideyalarını daim diqqət mərkəzində saxlayır: “Müsəlmanların qardaşlıq rəmzi olan mübarək Qurban bayramında arzu edirəm ki, bütün dünya azərbaycanlılarının qarşılıqlı qayğı və məhəbbəti artsın, onların Azər-

baycanla əlaqələri güclənsin, soydaşlarımız arasında həmrəylik hissləri möhkəmlənsin”.

Heydər Əliyevin dini bayramların təbriki ilə əlaqədar çıxışları əsasən “qoy” əmr ədatı ilə yekunlaşır. Ramazan bayramı münasibətilə Azərbaycan xalqına təbrik belə tamamlanır: “Qoy bu əziz günlərdə etdiyiniz bütün pak niyyətlər gerçəkləşsin!”[XIIc.s.160].

Azərbaycanın yəhudi icmasına göndərdiyi təbrik məktubu da “qoy” ədatı ilə sonuclanır: “Qoy Roş-Ha-Şana hər birinizin ocağına ruzi, xeyir-bərəkət gətirsin, evlərinizdən sevinc əskik olmasın”.

Qurban bayramı münasibətilə Azərbaycan xalqına olan təbrikdə də sonda “qoy” ədatı ilə nitq güclənir: “Qoy bu ilki Qurban bayramı da bütün azərbaycanlıların, o cümlədən xaricdə yaşayan soydaşlarımızın bir-birinə qayğı və diqqətinin artırılması, cəmiyyətdə milli həmrəyliyin daha da möhkəmləndirilməsi işinə öz töhfəsini versin!”.

Azərbaycanın pravoslav xristianlarına Milad bayramı ilə əlaqədar göndərdiyi təbrikdə: “Qoy, bu bayram ailələrinizə sevinc, süfrələrinizə bərəkət, həyatınıza firavanlıq və əmin-amanlıq gətirsin!” cümləsi “qoy” ədatının köməyi ilə nitqin emosionallığını artırır.

Dini üslubda böyük natiqin çıxışları bir sıra frazeoloji söz birləşmələri ilə bəzənir, cilalanır. Bu frazeoloji söz birləşmələri sankı dini üslubun boyuna biçilmişdir. Məhz bu frazeoloji söz birləşmələri dindarlar auditoriyasını fəth edir: “Bu əziz bayram günündə müqəddəs şəhid ruhlarının narahat-narahat dolaşdığı Azərbaycanın hər bir övladına – dözümlü və mətanətli xalqıma cansağlığı, Orucluq bayramından doğan xoş əhval-ruhiyyə, əmin amanlıq və xoşbəxtlik arzulayıram” [Ic.s.479-480].

"Şəhid ruhlarının narahat-narahat dolaşması" ifadəsi kifayət edər ki, böyük natiq Azərbaycan dilinin dərin qatlarına asanlıqla enərək qəlbləri riqqətə gətirsin. Dini üslub özünü çox vaxt dini-məişət üslubu formasında göstərir və bu zaman frazeoloji söz birləşmələri ümumişlək məişət sözləri ilə harmoniya təşkil edərək auditoriyaya yol açır: "Mübarək Qurban bayramı adətən insanlar arasında umu-küsülərin, kin-küdurətin aradan qaldırılması, yaxınların yad olunması, cəmiyyətdə mehribanlıq və qardaşlıq tellərinin möhkəmləndirilməsi üçün ən gözəl münasibət olmuşdur". Qardaşlıq tellərinin möhkəmləndirilməsi frazeologizmləri umu-küsü, kin-küdurət məişət sözləri ilə çulğalaşaraq dindarların qəlbini oxşayır.

Frazeoloji söz birləşmələri ilə yanaşı dini üslublu çıxışlarında Heydər Əliyevin tez-tez müraciət etdiyi sinonimlər nitqin ecazkarlığını artıran nitq vahidlərindəndir.[1] Bu sinonimlərlə gah İslam dininin təməl prinsiplərini insanlara çatdırır: "İslam dini yaranandan indiyə qədər kürreyi-ərzin insanlarının çox bir hissəsini düz yola, ədalətə, saflığa, paklığa, yüksək mənəviyyata yönəltmiş və onların belə yaşamasını təmin etmiş müqəddəs bir dindir"[VIIc.s.63].

Gah da səbəb-nəticə fəlsəfəsini ortaya qoyaraq müqəddəs ocaqlarımızın yaranmasını izah edir: "Görürsünüz, bəzən faciə özündən sonra böyük bir abidə doğurur, böyük bir müqəddəs ocaq, ibadətgah, ziyarətgah doğurur".

Başqa bir sinonim cərgədə böyük natiq islam yolunda insanlarımızın fədakarlığını dindarlar qarşısında dilə gətirir: "Ancaq hamımız bilirik, – əgər məscid də dağılmışdısa, dini də qadağan etməyə çalışmışdılarsa və etmişdilərsə, insanlar öz məsləkindən, əqidəsindən, dinindən, əxlaqından dönməmişlər".

[1] "Nitq mədəniyyəti məsələləri". Bakı, 1981. səh.25

"Allaha şükürlər olsun ki" Heydər Əliyevin dilindən düşmür. Bu artıq modal söz kimi dilçiliyimizə düşən ifadədir. Bu ifadə müxtəlif auditoriyalarda, müxtəlif məqamlarda işlədilir:

"Türk dünyası yazıçılarının qurultayı üçüncü dəfədir ki, toplaşır. Bu qurultay ilk dəfə 1992-ci ildə Türkiyədə, Ankarada öz əsasını qoymuş və Allaha şükürlər olsun ki, artıq ənənəyə çevrilmişdir" [VIIIc.s.5-6].

Hər bir əlverişli məqamda dinimiz, islam dinimiz böyük natiq tərəfdən təbliğ edilir, kütlələrin şüuruna yeridilir:

"Məhəmməd Füzuli Azərbaycan xalqının böyük şairi, alimi, filosofu olaraq, eyni zamanda bütün türkdilli, türksoylu xalqlara, bütün türk, İslam dünyasına mənsubdur" [VIIIc.s.23].

"Hazırda sülhə nail olmaq üçün beynəlxalq həmrəyliyin, təcavüzkara beynəlxalq səviyyədə təzyiq göstərilməsinin çox böyük əhəmiyyəti var. İslam Konfransı təşkilatı kimi nüfuzlu təşkilat və onun hər bir üzvü tərəfindən təzyiq göstərilməsi də son dərəcə vacibdir. Ona görə də hörmətli görüş iştirakçıları, mən sizə üz tutub xahiş edirəm ki, siyasi iradənizi qətiyyətlə bildirəsiniz və Azərbaycan dövlətinin ərazi bütövlüyü uğrunda bizim ədalətli mübarizəmizə tərəfdar çıxasınız" [IIIc.s.20].

Kasablanka Zirvə görüşündə böyük natiq Azərbaycan müsəlmanlarının başına gətirilmiş müsibətləri, erməni təcavüzünü diqqətə çatdırır:

"Sizə məlum olduğu kimi, Azərbaycan xalqı qonşu Ermənistan Respublikasının təcavüzünə məruz qalmış, bunun nəticəsində Azərbaycan ərazisinin 20 faizindən çoxu işğal edilmişdir. Ermənistan silahlı qüvvələrinin Azərbaycan Respublikasında işğal etdikləri Dağlıq Qarabağ regionunda və ona bitişik yeddi digər rayonda ən qədim mədəniyyət abidələri məhv edilmiş, bütün məscidlər dağıdılmış, müsəlman məzarları təhqir olunmuş, Qurani-Kərimin nüsxələri yandırılmışdır.

Ən qədim müsəlman sivilizasiyasının bütün izləri yer üzündən silinir" [IIIc.s.20-21].

Erməni təcavüzünü diqqətə çatdıran böyük natiq konfrans iştirakçılarını "təzyiq göstərilməsi də son dərəcə vacibdir", "siyasi iradənizi qətiyyətlə bildirəsiniz", "ədalətli mübarizəmizə tərəfdar çıxasınız" kimi qətiyyətli ifadələrlə auditoriyanı müsəlman borcunu yerinə yetirməyə çağırır: "Təhlükəsizliyə və Əməkdaşlığa dair müşavirənin iştirakçısı olan dövlətlərin səyləri və bizim onlarla konstruktiv əməkdaşlığımız sayəsində mümkün olmuşdur.

Münaqişənin tamamilə aradan qaldırılması üçün ermənilərin bütün silahlı birləşmələrinin işğal edilmiş Azərbaycan ərazilərindən çıxarılmasını, qaçqınların doğma yurdlarına qaytarılmasını, Azərbaycanın bütün ərazisi üzərində onun suveren hüquqlarının bərpa edilməsini nəzərdə tutan siyasi saziş bağlanmalıdır.

Lakin Ermənistan Respublikası işğal olunmuş ərazilərin azad edilməsinə dair Birləşmiş Millətlər Təşkilatı Təhlükəsizlik Şurasının müvafiq qətnamələrini yerinə yetirməkdən boyun qaçırır" [IIIc.s.21-22].

Dini üslubda Heydər Əliyevin işlətdiyi frazeoloji birləşmələr digər üslublarda az təsadüf edilir:

– Mən bizi dar ayaqda tək qoymayanların hamısına minnətdaram;

– Bosniya və Herseqovinada son vaxtlar yaranmış vəziyyət xüsusi təşviş və ürək ağrısı doğurur;

– Dini üslublu nitqlərində Heydər Əliyev müsəlmanları səfərbər edir, onları həmrəyliyə səsləyir: "Azərbaycan Respublikasının prezidenti kimi mən öz qardaşlarımla – müsəlman dövlətlərinin başçıları ilə şəxsi münasibətlər yaratmağa, aramızda həmrəyliyi möhkəmlətməyə böyük əhəmiyyət verirəm. Əminəm ki, Mərakeşdəki Zirvə görüşü Azərbaycanın

bütün islam dünyası ilə əməkdaşlığının genişlənməsinə və dərinləşməsinə kömək edəcəkdir” [IIIc.s.20-21].

Dini üslublu nitqində neqativ hallara, əyintilərə qarşı “təəssüf olsun ki” modal sözündən istifadə edir, sonda isə “bu gün din birdir və onu parçalamaq olmaz”, “yol vermək olmaz” qətiyyətli ifadələrlə təəssüf doğuran halların aradan qaldırılmasına çağırır: “Təəssüf olsun ki, İslamın təbliğində, dinin təbliğində bəzən əyintilərə yol verilir. Mən bu gün burada, din xadimlərinin, Həccə getmiş adamların qarşısında bu sözləri deməyi zəruri hesab edirəm, dinimizdən bəzən sui istifadə, öz məqsədləri üçün istifadə etmək istəyənlər də var. İslam dinindən bəzən ölkəmizdə sabitliyi pozmaq, aranı qarışdırmaq, insanları bir-biri ilə vuruşdurmaq, onları qarşı-qarşıya qoymaq üçün istifadə etmək istəyənlər də vardır. Bəzən içərimizə təxribat salmaq istəyənlər də var. İslam dini Azərbaycan Respublikasının dinidir. Respublikamızda yaşayan əhalinin əksəriyyəti İslam dininə etiqad edir. Ancaq bu din birdir və onu parçalamaq olmaz. Ayrı-ayrı adamlar dindən istifadə etməyə çalışmamalıdır. Din vasitəsilə bizim ölkəyə haradansa kənardan kiminsə təsir etməsinə yol vermək olmaz” [IIIc.s.439-440].

Müqəddəs yerlərdə, ziyarətgahlarda, ibadətgahlarda xalq qarşısında çıxış etməyin ciddi qarşılanacağını gözəl bilən böyük natiq “əmin edirəm ki”, “inanıram ki” ifadələri ilə xalq ruhuna yaxın çıxış edir. Elə oradaca qətiyyətli ifadələr işlətməyi də məqbul hesab edir: “Ona görə də bu gün, bu müqəddəs gündə, bayram günündə, bu müqəddəs yerdə mən sizi və bütün Azərbaycan xalqını əmin edirəm ki, Azərbaycanın ərazi bütövlüyünün bərpa olunması yolunda biz gecə-gündüz çalışırıq və çalışacağıq. Əminəm ki, işğal edilmiş torpaqlarımız azad olacaq, Azərbaycanın ərazi bütövlüyü təmin ediləcək, didərgin düşmüş vətəndaşlarımız öz yerinə-yurduna dö-

